*Bu kitab “**İlyas Əfəndiyev**. Seçilmiş əsərləri. Yeddi cilddə. II cild”*
(*Bakı, Çinar çap, 2002*) *nəşri əsasında təkrar nəşrə hazırlanmışdır.*

Tərtibatçı: **Elçin**

Redaktorlar: **Vaqif Bəhmənli**
**Umud Rəhimoğlu**

**894.3613 - dc 21**
**AZE**
**Əfəndiyev İlyas. Seçilmiş əsərləri.** Üç cilddə. II cild. Bakı, “AVRASİYA PRESS”, 2005, 336 səh.

XX yüzillik Azərbaycan ədəbiyyatının inkişafında müstəsna xidmətlər göstərən görkəmli ədib, xalq yazıçısı İlyas Əfəndiyevin seçilmiş əsərləri üççildliyinin II cildinə pyesləri daxil edilmişdir. “Atayevlər ailəsi”, “Hökmüdar və qızı”, “Xurşudbanu Natəvan”, “Məhv olmuş gündəliklər”, “Sən həmişə mənimləsən, yaxud boy çiçəyi”, “Sevgililərin cəhənnəmdə vüsalı” əsərlərinin hər biri milli dramaturgiyanın qızıl fonduna daxil olmuş, dərin psixologizmi, bənzərsiz üslubu, parlaq və bitkin obrazları, çağdaşlığı ifadə edən aktual ideyaları, nəhayət dramaturji keyfiyyətləri ilə sevilib seçilmiş, öz müəllifinə halal və qibtə olunacaq şöhrət gətirmişdir.

Təqdim olunan bu əsərlər rejissor nəsillərinin yozumunda təkrar-təkrar tamaşaya qoyulmuşdur. Onların bir çoxu hazırda da səhnədədir.

**ISBN 9952-421-05-0**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**“Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında”**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir



## ATAYEVLƏR AİLƏSİ

### İ Ş T İ R A K E D İ R L Ə R

X o s r o v A t a y e v
İ l d ı r ı m A t a y e v
D i l ş a d
R e y h a n
M e h r i c a n
C a h a n g i r
S a d ı q S a d ı q o v
L ə t a f ə t
Ş a h s u v a r o v
X u d u ş
A ğ a s ə l i m
Z a b i t ə
K a p i t a n

## BİRİNCİ PƏRDƏ

### BİRİNCİ ŞƏKİL

Xosrov Atayevin evi. Reyhan pianino çalır. Mehrican otağa daxil olur və dayanıb musiqini dinləyir. Reyhan, nəhayət, son akkordu vuraraq,dərindən nəfəs alır. Üzündə xoşbəxt bir ifadə var.

M e h r i c a n. Qəribədir, həmişə mənim ürəyim dolu olanda gəlib görürəm sən bu mahnını çalırsan.

R e y h a n. Biz bu mahnıya ilk dəfə Cahangirlə birlikdə qulaq asmışıq. O gecə institutumuzda konsert vardı. O da bacısı ilə konsertə gəlmişdi. Biz birinci dəfə idi ki, bir-birimizi görürdük. Bacısı məni onunla tanış etdi...

M e h r i c a n. Sonra?

R e y h a n (*gülümsəyərək*). Sonrasını özün bilirsən...

M e h r i c a n (*xəyal içində*). Sevgi həyatın mənasıdır! Sevmək yaşamaq deməkdir!

R e y h a n (*zarafatyana*). Yoxsa, bir adama vurulub eləmisən?

Mehrican "yox" mənasında başını tərpədir.

R e y h a n. Bəs haradan bilirsən?

M e h r i c a n. Hiss edirəm. Korlar işığı, gözəlliyi necə duyurlarsa, mən də məhəbbəti eləcə hiss edirəm. Sən xoşbəxtsən, Reyhan... Sevirsən... Özü də, Cahangir kimi yaxşı bir oğlanı...

R e y h a n. Peşkəşdir.

M e h r i c a n (*eyni zarafatla*). Təşəkkür edirəm.

R e y h a n (*ciddi*). Sev, Mehrican! Sevgisiz könül günəşsiz bağça kimidir.

M e h r i c a n. Mən istərdim sevdiyim oğlan, qocalıb belimiz bükülənə qədər öz məhəbbətinə sadiq qalsın. Təbiəti ipək kimi yumşaq, qəlbi bu yaz səması kimi geniş, dərin olsun! Mən də pərvanə kimi onun başına fırlanım. Tikdiyimiz binaların hər naxışında ona olan sevgimin işığını hiss edim.

R e y h a n (*gülümsəyir*). Hər bir arzunun həqiqət olması onun şiddətindən asılıdır deyirlər. Mənə elə gəlir ki, biz sənin qəhrəmanını tezliklə görəcəyik.

M e h r i c a n. Eh, kim bilir! Odur, Lətafət də gəlir. (*Hər ikisi pəncərədən baxır*) Yadındadırmı, o bizimlə texnikumda oxuyanda nə qədər şən, nə qədər səmimi bir qız idi.

R e y h a n. İndisə daş-qaşa tutulmuş buz heykələ bənzəyir.

M e h r i c a n. Mən onun taleyinə acıyıram.

R e y h a n. Mən isə, əksinə. Onu görəndə əsəbiləşirəm.

M e h r i c a n. Sən də yamanca amansızsan. Neyləsin, bir işdir olub.

R e y h a n. İnsanın taleyi – onun iradəsidir, Mehrican! Nə üçün o, Sadıqova gedirdi? Kim məcbur edirdi?

Lətafət daxil olur. Bu, iyirmi dörd yaşında gözəl bir qadındır. Barmaqlarında brilyant qaşlı üzüklər parlayır. Üzündə əsəbi, soyuq bir ifadə var. Qızları görərkən qaşlarını çatıb daha məğrur bir görkəm alır.

L ə t a f ə t. Salam.

R e y h a n. Salam, Lilya. Neçə gündür haradasan, görünmürsən?

L ə t a f ə t. Harada olacağam, evdə, eşikdə.

M e h r i c a n. Lilya, bütün günü evdə oturmaqdan darıxmırsan?

L ə t a f ə t. Nə edək, hamı sizin kimi mühəndis olmaz ki...

R e y h a n. Sən əvvəllər adama belə cavab verməzdin.

L ə t a f ə t. Mən bura sizdən əxlaq dərsi almağa gəlməmişəm. Xalam haradadır?

R e y h a n. Bilmirəm. Harada olsa, bu saat gələr.

M e h r i c a n. Nə üçün bizimlə həmişə acıqlı danışırsan, Lilya? Axı biz bir vaxt yoldaş idik.

L ə t a f ə t (*istehza ilə gülümsəyir*). Bir vaxt...

M e h r i c a n. Doğru demirəmmi?

L ə t a f ə t. Nə isə... (*Əsəbi halda qalxıb pəncərədən baxır*)

Dilşad daxil olur. Bu, qırx yaşında, ucaboylu, dəblə geyinmiş gözəl bir qadındır.

D i l ş a d. Salam, qızlar. (*Reyhana*) Xəbərin var, deyirlər İldırım Atayev gəlir.

R e y h a n (*sevinclə*). Nə danışırsınız?! Doğrudanmı əmim gəlir? Bu nə yaxşı xəbər oldu.

D i l ş a d. Elə mən özüm də çox sevinirəm. (*Gülümsəyir*) Doğrudur, o vaxt aramızda bir balaca giley-güzar olmuşdu. Ancaq bunun eybi yoxdur. Zaman yavaş-yavaş axan güclü bir çay kimi hər şeyi yuyub aparır. Güman edirəm ki, biz onunla yeni bir dost kimi görüşəcəyik.

R e y h a n. İldırım əmim kinli adam deyil.

D i l ş a d. Gərək də olmasın. O indi yüksək vəzifə sahibidir. Nazir müavinidir. (*Gülümsəyir*) Böyüklərin qəlbi geniş olmalıdır. (*Pauza. Ətrafı gözdən keçirərək*) Təəssüf ki, İldırım Atayev bizim ev-eşikdə çox az dəyişiklik görəcək.

M e h r i c a n. Evinizdə nə çatmır ki? Mədəni bir ailə üçün nə lazımdısa, hamısı varınızdır.

D i l ş a d. Var, əlbəttə, var. Ancaq... (*Qısa pauza*) İndi Məlahətgildəydim. Otuz minə Moskvadan təzə mebel gətirdiblər. Elə gözəldir ki, baxdıqca baxmaq istəyirsən.

R e y h a n. Məlahətin əri böyük mühəndisdir. Kitabları, məqalələri çap olunur. Yüz minlərlə qonorar alır...

D i l ş a d (*gülümsəyir*). Nə olsun, Xosrov Atayevin də əlinin altında onlarca mühəndis işləyir.

R e y h a n. Kim olur-olsun. Qol çəkib aldığı maaşına görə də ev-eşiyidir...

D i l ş a d (*güzgünün qabağında saçlarını düzəldir*). Eh, qızlar... Sizə dil yetirmək çətindir. Görürsən, Mehrican, bu son vaxtlar necə xarab olmuşam. Yaz mənə düşmür...

M e h r i c a n. Siz həmişə gözəlsiniz, Dilşad xanım.

D i l ş a d (*bərkdən gülərək*). Doğrudanmı? Yox, daha qocalıram. Ağ tükləri görürsənmi? Deyir hər şey vaxta baxsa da, vaxt heç nəyə baxmır. Ömrü tutub saxlamaq mümkün deyil. Üzümüzə gələn ay otuz doqquzu bitirib, qırxa keçirəm.

M e h r i c a n. Nə olar? Hər yaşın öz gözəlliyi var.

D i l ş a d. Gəncliyi heç bir şey əvəz etməz!.. (*Qısa pauza*) Bayaq küçədə bizim cavan müstəntiqi gördüm.

M e h r i c a n. Cahangiri deyirsiniz?

D i l ş a d. Bəli. Özünü yaman ciddi tutur. (*Gülümsəyir*) Ancaq heç yaşına yaraşmır.

R e y h a n (*Mehricana*). Gedək mənim otağıma, təzə layihə barəsində səninlə danışmaq istəyirəm.

M e h r i c a n. Gedək.

Reyhan, Mehrican o biri otağa keçirlər. Dilşad,
Reyhanın ardınca uzun bir nəzər salır.

D i l ş a d. Xanımın xətrinə dəydi. Eh, Lilya... Bu dünyada heç kəsə yaxşılıq yoxdur. Mən istəyirəm bu, Şahsuvarova getsin. Yaxşı dolanışığı, gələcəyi parlaq... Özü də nə qədər nəzakətli, qədirbilən adamdır!

L ə t a f ə t. Bəyəm, Şahsuvarovun elə fikri var?

D i l ş a d. Hələlik açıq demir. Ancaq mən hiss edirəm ki, var. Bilirsən, Lilya, Şahsuvarov qohum olmalı oğlandır. İndi elə adamları əliçıraqlı gəzsən tapmazsan! (*Pauza*) Nə xəyala getdin?

L ə t a f ə t. Heç, fikir edirəm ki, Reyhanla Şahsuvarovunku yaxşı tutar.

D i l ş a d. Əlbəttə! Yoxsa, Cahangir? Eh, Lilya, biz qadınların bəzən ağlımız gözümüzdə olur. (*Pauza*) Ona görə də, sən, Sadığa getmək istəməyib, deyəndə ki, "qocadır, sir-sifəti xoşuma gəlmir", mənim acığım tuturdu. İndi görürsən səni necə saxlayır? Barmaqlarında brilyant üzüklər, boynunda yeddi qatar mirvari, qabağında qulluqçun...

L ə t a f ə t (*hövsələsiz*). Ey, ay xala...

D i l ş a d (*qəzəbli*). Nə "ey..." Bircə de görüm, cavan oğlan sənin qədrini onun kimi biləcəkdimi? Ürəyin indiki kimi sakit olacaqdımı? Lilya, birdəfəlik başa düş ki, məhəbbət-zad boş şeydir. Əgər, xoşbəxt

olmaq istəyirsənsə, özünü çox sev! Bildinmi? Ancaq özünü! (*Pauza*) Eşitdim Sadıq gələn ay səni göndərir Kislovodska.

L ə t a f ə t. Mən getmək istəmirəm.

D i l ş a d. Axmaq! Niyə istəmirsən? Cavan gəlinsən, get, gəz, istirahət elə! İnsan dünyaya bir dəfə gəlir, Lilya! Gözəlliyin, cavanlığın qədrini bil! Bu kağızın arasındakı nədir?

L ə t a f ə t. Paltarlıqdır. Sadıq sənin üçün göndərib.

D i l ş a d (*açıb baxır*). Oy, Lilya, nə gözəl parçadır, heç kəsin əynində belə şey görməmişəm! Afərin, Sadıq! Vallah, zövqü var. Özü də mənə necə yaraşır! Ancaq mən bunu nə cür tikib geyəcəyəm? Atayev bilsə ki, bəxşişdir, dünyanı dağıdar.

L ə t a f ə t. Biz ki, özgə deyilik.

D i l ş a d. Onun üçün nə özgə, nə qohum!.. (*Pauza*) Gərək gizlədib ad günümdə çıxaram, bəlkə onda bir söz demədi. Eh, Lilya...

Qapının zəngi çalınır. Dilşad gedib qapını açır. Əvvəlcə Sadıq Sadıqov, sonra Xuduş ilə Ağasəlim gəlirlər. Sadıqov əlli beş yaşında, gödək, yoğun, sifəti qırmızı bir kişidir. Gözlərində hiyləgər bir ifadə hiss olunur. Təzə kostyum geyib, şlyapa qoymuşdur. Lakin şlyapa onun tüksüz və ətli başında çox yöndəmsiz görünür. Xuduş qırx səkkiz yaşında əzgil qurusu kimi arıq, bir az donqar, ovurdları batıq, gözlərində daim qorxaq bir ifadə olan, çox ehtiyatla danışan kişidir. Ayıq qaz kimi qulağı həmişə səsdədir. Ağasəlim isə, otuz beş yaşında, uzun, yekəpər bir adamdır. Üzündə nadan və davakar bir ifadə var. Sözü gec başa düşəndir.

D i l ş a d. Oho... Nə yaxşı qonaqlar gəlir... Buyurun... Buyurun...

S a d ı q o v. Salam. Liliçka da buradaymış...

D i l ş a d. Sən lap Lilyanı bizim əlimizdən almısan, Sadıq.

S a d ı q o v. Hi-hi... heylə deməyin, Dilşad xanım, biz ölənəcən sizin qulunuz...

D i l ş a d. Pəh-pəh... yamanca şirindilli kişisən. (*Xuduş ilə Ağasəlimə*) Niyə ayaq üstə dayanmısınız, əyləşin...

X u d u ş. Siz Allah, narahat olmayın.

A ğ a s ə l i m. Canım, evdir, gəlmisiniz, əyləşin də. (*Stul çəkib oturur, sonra Sadıqovla Xuduş da əyləşirlər*)

D i l ş a d. Sadıqov, səndən çıxmayan iş. Nə əcəb bizi yad eləmisən?

S a d ı q o v. Düzünü axtarırsınızsa, işimiz düşüb.

D i l ş a d. Bilirəm ki, işiniz düşməsə, gəlməzsiniz.

X u d u ş. Vallah, Dilşad xanım, nə qədər danlasanız yeri var.

D i l ş a d. Ah, kişilər, diliniz olmasaydı, qarğa-quzğun sizi didərdi.

X u d u ş. Düz sözə nə demək olar?!

A ğ a s ə l i m. Mətləbə keç, canım, xanıma başağrısı vermə.

D i l ş a d. Yox, yox, xoşdur.

S a d ı q o v. Ağasəlim doğru deyir. Atayevin də nahara gələn vaxtıdır. Bilirsiniz, Dilşad xanım, sizinlə bu təzə qohum olmaq istəyən oğlan bizi yaman incidir.

D i l ş a d. Kim?

S a d ı q o v. Cahangir.

D i l ş a d. Onun sizinlə nə işi?

X u d u ş. Heç bilirik?

A ğ a s ə l i m. A canım, axı, niyə him-cimlə danışırsınız?.. Dilşad xanım, müxtəsəri budur ki, sizinlə təzə qohum olmaq istəyən müstəntiq Cahangir yoldaş tikintidə böyük bir yoxlama başlatdırıb.

D i l ş a d. Nə üçün?

X u d u ş. Bilmirik?

D i l ş a d. Nə olar, qoyun yoxlatdırsın, yoxsa...

S a d ı q o v. Ürəyinizə heç nə gəlməsin, Dilşad xanım. Özünüz bilirsiniz ki, mən olan yerdə dövlətin bir qəpiyinə kəm baxmaq olmaz.

D i l ş a d. Bilirəm...

S a d ı q o v. Məni yandıran odur ki, xalq malını göz bəbəyin kimi qoru, can qoy, indi də durub sənin işindən şübhələnsinlər. İdarəyə də komissiya töksünlər.

X u d u ş. Heç deməli deyil.

S a d ı q o v. Bu məni biabır etməkdir, camaat arasında nüfuzdan salmaqdır.

D i l ş a d. Yaxşı, Cahangir nə üçün belə etdiyinin səbəbini demir?

S a d ı q o v (*əlini çırparaq*). Doğrusu, heç soruşmamışam da. Qoy nə edir-etsin. Mən özümdən arxayın olmasam, Atayevin evinə ayaq basmaram. Ancaq, bayaq dedim, camaat içində arıma gəlir. Mən öz işim üçün təşəkkür gözləyirəm, mükafat gözləyirəm... (*Pauza*)

D i l ş a d (*telefonla zəng edir*). Allo... Milis rəisi əvəzi Şahsuvarovu ver! Ziyad! Xahiş edirəm bizə gələsiniz, sizinlə vacib işim var. Gözləyirəm. (*Dəstəyi qoyur*)

A ğ a s ə l i m. Qanınızı qaraltmayın, canım. Yüz heylə iş qurban olsun sizin bir xoş sifətinizə.

X u d u ş. Qanı qaralmasın, neyləsin? Bu boyda adamları da saya salmır. Bəyəm o bilmir ki, Sadıqov, Dilşad xanımın yeznəsidir?

D i l ş a d (*təmkinlə*). Siz gedin işinizdə olun. Şahsuvarov gəlsin, öyrənərəm görüm bu nə məsələdir.

S a d ı q o v. Sizin canınız üçün, çox o yan-bu yan eləsə, birbaş mərkəzə teleqram vuracağam!

D i l ş a d (*sərt*). Hələlik heç bir şey lazım deyil. Dedim ki, gedin işinizdə olun!

X u d u ş. Çox sağ olun. Sizsiz bir günümüz olmasın...

D i l ş a d. Belə komplimentləri sonraya saxlayın.

X u d u ş (*irişərək*). Sonraya saxlamalı şey yoxdur.

D i l ş a d (*acıqlı*). Yaxşı, yaxşı!..

A ğ a s ə l i m. Gəl bəri, canım, xanıma başağrısı vermə.

S a d ı q o v. Liliçka, sən qalırsan, yoxsa...

L ə t a f ə t (*acıqlı*). Qalıram.

S a d ı q o v. Neynək, əyləş. (*Ərklə*) Xala-bala ki, tapışdınız, sizi bir-birinizdən ayırmaq çətindir! Gedək, uşaqlar!

Çıxırlar.

D i l ş a d. Ax... Mən bircə öldüyüm günü bilmirəm. O Cahangiri görən kimi tanıdım ki, nə yuvanın quşudur. Sən bir üzə bax. Cəsarətə bax. Bilə-bilə ki, Sadıqov mənim qohumumdur, bu cür həngamə çıxarır. Eybi yoxdur! Olsun!

Bayırda maşın səsi eşidilir. Reyhanla Mehrican yüyürərək içəri girirlər.

R e y h a n. İldırım əmim gəlir!.. İldırım əmim gəlir!.. (Bayıra qaçır)

Pauza.

Dilşadın üzü tutqun bir hal alır. Mehrican maraqla pəncərədən baxır. İldırım Atayev Reyhanla qol-qola daxil olur. Bu, otuz doqquz yaşında, ortaboylu, yaraşıqlı bir adamdır. Saçları vaxtından əvvəl ağarmışdır. Üzündə daim mehriban və ağıllı bir ifadə vardır. Elə bil ki, hər şey bu adama çoxdan məlumdur. Sadə, lakin modaya uyğun kostyum geymişdir.

D i l ş a d. Xoş gəlmisiniz, İldırım...

İ l d ı r ı m  A t a y e v. Sağ olun... Mən buradan gedəndən bəri hər şey o qədər dəyişilmişdir ki... Əgər, səhv etmirəmsə, bu, Dilşad xanımın bacısı qızı Lətafətdir. (*Əl tutuşur*)

R e y h a n. Sizin yaddaşınız əvvəlki kimi itidir. Əmi, tanış olun, bu da mənim yaxın rəfiqəm Mehricandır.

İ l d ı r ı m A t a y e v. Tanış olmağıma çox şadam.

D i l ş a d. Saçları nə yaman ağartmısınız, İldırım!

İ l d ı r ı m A t a y e v. Amma siz heç dəyişməmisiniz.

D i l ş a d (*gülür*). Doğrudanmı?

R e y h a n. Fikir eləməyin, əmi, saçlarınız ağarsa da, özünüz həmişəki kimi gənc və gözəlsiniz.

İ l d ı r ı m A t a y e v (*qızararaq Mehricana baxır. Sonra zarafat-yana*). Sağ ol, qardaş qızı. Sən belə komplimentlərdən əmin üçün çox de. Yaxşı, bəs Xosrov haradadır? Bu gün ki, bazardır.

D i l ş a d. Özünüz xasiyyətini bilirsiniz. Onun üçün nə istirahət günü...

İ l d ı r ı m A t a y e v. Necədir? Gümrahdırmı?

D i l ş a d. Yaxşıdır, əvvəlkindən də gümrahdır.

M e h r i c a n. İcazənizlə mən gedim.

R e y h a n. Nə tez?

M e h r i c a n. Nənəm gözləyəcək.

R e y h a n. Elə isə get. Ancaq mütləq gələrsən.

M e h r i c a n. Yaxşı, sağ olun. (*Çıxır*)

İ l d ı r ı m A t a y e v (*Reyhana*). Rəfiqən nə iş görür?

R e y h a n. Arxitektordur...

İ l d ı r ı m A t a y e v. Aha...

P ə r d ə

## İKİNCİ ŞƏKİL

Həmin otaq. Reyhan və Mehrican evdədirlər.

M e h r i c a n (*fikirli*). İndi mən sizə gələndə İldırım Atayev bağçanızdakı böyük yasəmən ağacının dibini boşaldırdı. Özü də elə qəmgin idi ki....

R e y h a n. Bu ağac əmimin keçmiş nişanlısı Firəngizdən yadigardır. Səkkiz il qabaq həmin ağacı o əkmişdir.

M e h r i c a n. Bəyəm, İldırım Atayevin nişanlısı var idi? (*Reyhan başı ilə təsdiq edir*) Bəs necə oldu?

R e y h a n. Ayrıldılar.

M e h r i c a n. Nə üçün? Bir danışsana...

R e y h a n. O zaman əmim burada mühəndis işləyirdi. Firəngiz də bağçılıq aqronomu idi. Həmin yasəmən ağacı əkilən yaz toyları olacaqdı. Ancaq heç gözlənilmədiyi halda birdən aralarına narazılıq düşdü.

M e h r i c a n. Nə üçün?

R e y h a n. Əmimgilin kontorunda Lida adlı cavan bir planovik işləyirdi. Olduqca gözəl, şən, zarafatcıl bir polyak qızı idi. Özü də Dilşad xanımın dostu idi. Tez-tez, demək olar ki, hər gün bizə gəlirdi.

M e h r i c a n. İldırım Atayev də sizinlə olurdu?

R e y h a n. Bəli. Birdən belə bir şayiə çıxdı ki, guya, İldırım əmim Lidaya vurulmuşdur. Özləri də tezliklə evlənəcəklər.

M e h r i c a n. Firəngiz də bunu eşidib başladı qısqanmağa.

R e y h a n. Halbuki əmimlə Lidanın arasında səmimi dostluqdan başqa ayrı bir hiss yox idi. Ancaq fitilə od necə qoyulmuşdusa, söndürmək mümkün olmadı. İldırım əmim nə qədər çalışdı, Firəngizi inandıra bilmədi. Axırda ikisi də inada düşüb ayrıldı. Firəngiz başqa yerə dəyişilərək, çıxıb getdi.

M e h r i c a n. Yaxşı, bəs, məsələnin kökü haradan qalxmışdı?

R e y h a n. Buradan. Bizim bu evimizdən!

M e h r i c a n. Nə danışırsan, Reyhan!

R e y h a n. Bilirsənmi, Dilşad xanım əmimin Firəngizlə evlənməsinə dözə bilmirdi.

M e h r i c a n. Axı, nə üçün?

R e y h a n. Çünki Firəngiz hər cəhətdən ondan üstün idi. Təhsildə... gözəllikdə... Ona görə də, Dilşad xanım hər gün Lidanı evə qonaq çağırır, elə vəziyyət yaradırdı ki, Firəngiz də, istər-istəməz, qısqanmağa vadar olurdu...

Pauza.

M e h r i c a n. Hər halda, Firəngiz böyük səhv etmişdir.

R e y h a n. Sonralar bunu o özü etiraf edirdi.

M e h r i c a n. İndi ərdədir?

R e y h a n. Deyirlər ərdədir. (*Pauza*)

M e h r i c a n. İldırım Atayev onu çoxmu sevirdi?

R e y h a n. Yəqin ki, çox sevirdi. Yadımdadır, Firəngiz çıxıb gedəndən sonra, elə bil, əmim bir günün içində qocaldı. (*Pauza*)

İldırım Atayev daxil olur.

R e y h a n. Əmi, bu qədər işlədin, yorulmadın?

İ l d ı r ı m A t a y e v (*gülümsəyir*). Yorulana nə lazımdır?

R e y h a n (*eyni zarafatla*). Bir stəkan ətirli çay.

İ l d ı r ı m A t a y e v. Afərin!

R e y h a n. Bu dəqiqə. (*O biri otağa qaçır*)

İ l d ı r ı m A t a y e v. Bağçaya baxıram, fikir edirəm ki, səkkiz il necə tez keçdi. Mənim körpə qoyub getdiyim fidanlar indi böyük ağac olub.

M e h r i c a n. Yəqin ki, burada hər şey sizə keçmişləri xatırladır...

İ l d ı r ı m A t a y e v. Bəzən keçmişləri xatırlamaq da çox ağır olur.

M e h r i c a n. Elə xatirələr var ki, onlar nə qədər acı olsa da, yenə gözəldir.

İ l d ı r ı m A t a y e v (*gülümsəyir*). Siz yaşda olanda mənə də elə gəlirdi. Mən də elə güman edirdim ki, hər kədərli xatirənin özündə də bir gözəllik, bir romantika var. Ancaq sonralar gördüm ki, yox, iztirab iztirabdır! Ona görə də, çalışın xoşbəxt olun. İtirilmiş bir səadət bir də çətin geri qayıdır...

Pauza. Reyhan çay gətirir.

R e y h a n (*stəkanı işığa tutaraq*). Necədir, əmi?

İ l d ı r ı m A t a y e v. Əla! (*Çayı alıb qabağına qoyur. Zarafatyana*) Demək, Mehrican xanımın çəkdiyi layihələri Reyhan həyata keçirir.

R e y h a n. Elədir ki, var.

İ l d ı r ı m A t a y e v. Mən sizin yoldaşlığınıza qibtə edirəm.

R e y h a n. Biz buna çox şadıq. Füzuli küçəsində tikdiyimiz yaşayış binası xoşuna gəlirmi?

İ l d ı r ı m A t a y e v. Ümumiyyətlə, yaxşıdır. Üslubunuzdakı genişlik, sərbəstlik, sadə, lakin gözəl olmaq cəhdi mənə xüsusilə xoş gəldi. Sütunların başlıqları, tağların quruluşu cazibədardır. Baxdıqca adam özündə, nə isə, fərəhli bir şey duyur.

R e y h a n. Ax, doğrudanmı? Biz həmişə bu barədə narahat olurduq, əmi.

İ l d ı r ı m  A t a y e v. Ancaq mənə elə gəlir ki, naxışların ümumi ahəngi bir az da ciddi olsaydı...

M e h r i c a n (*qızararaq*). Bu, çox amansız tənqid oldu.

İ l d ı r ı m (*gülümsəyir*). Axı, mən hiss edirəm ki, siz sənətdə hər şeyin bizim Köndələnçay kimi sakit axması tərəfdarı deyilsiniz.

R e y h a n. Doğrudur!

İ l d ı r ı m. Elə isə, əminin sözlərindən pərt olmayın! Qoy sizin bu ilk əsərinizdə parlayan istedad qığılcımları gələcəkdə sönməz bir od, bir alov olsun!

R e y h a n. Gələcəyi kim bilir?!

İ l d ı r ı m  A t a y e v. "Kim bilir"i əkiblər, bitməyib. İradə istedadın anasıdır! (*Otaqdan çıxır*)

M e h r i c a n (*İldırım Atayevin ardınca baxaraq, həyəcanla*). Nə üçün onun səadətinə mane olurlar?!

R e y h a n. Çünki analığıma belə lazım idi. (*Pauza*) Əmimin başına gətirdiyini indi də mənim başıma gətirmək istəyir. Görmürsənmi? Hər vasitə ilə Cahangiri mənim gözümdən salmağa çalışır.

M e h r i c a n. Ancaq mən elə güman edirəm ki, heç bir fırtına həqiqi məhəbbəti sarsıda bilməz!

R e y h a n (*fikirli*). Doğrudan da elədir.

Cahangir gəlir. O, iyirmi dörd yaşında yaraşıqlı bir oğlandır. Üzündə bir az sərt görünən açıq və ağıllı ifadə vardır. Hərəkətləri qəti və sərbəstdir.

R e y h a n (*Cahangirin əlindən tutaraq*). Adını çək, qulağını bur. Bir az qabaq sənin barəndə danışırdıq, Cahangir.

C a h a n g i r. Mən də gələ-gələ fikirləşirdim ki, sizi mütləq bir yerdə görəcəyəm.

M e h r i c a n. Yoxsa, qısqanırsınız?

C a h a n g i r. Eh... Bəlkə də...

M e h r i c a n. Əslində, mən qısqanmalıyam ki, on beş illik yoldaşımı əlimdən alırsınız. Sizin toyunuzdan sonra lap tək qalacağam.

R e y h a n. Yaxşı, yaxşı, ürəyimi xarab eləmə.

C a h a n g i r (*Mehricanın əlindən tutur*). Qardaşınız ölməyib ki, siz tək qalasınız!

R e y h a n. Biz üçümüz də həmişə bir yerdə olacağıq.

C a h a n g i r. Həmişə!

R e y h a n (*Cahangirə*). Eşitdim sən bizim tikinti kontorunda böyük bir işin üstünü açmısan.

C a h a n g i r. Bəli, açmaq üzrəyəm.

R e y h a n. Deyilənə görə, Sadıqovun özü də dolaşır.

C a h a n g i r. Deyəsən, elədir.

M e h r i c a n. Görürsünüz, biz gecələri ömrümüzdən borc alıb, zəhmət çəkirik, tikirik. Onlar isə...

R e y h a n. Kim olursa-olsun, amansız ol, Cahangir!!

Ziyad Şahsuvarov gəlir. Bu, otuz yeddi-otuz səkkiz yaşlarında bir adamdır. Özünü çox sadə və nəzakətli aparmağa çalışmasına baxmayaraq, gözlərində daim şüşə parıltısı kimi soyuq bir ifadə var. Bahalı parçadan kostyum geyinmişdir, Cahangirin burada olması ona pis təsir edir. Lakin o, bu hissiniməharətlə gizlədərək, özünü şad göstərir.

Ş a h s u v a r o v. Salamlar... Mən söhbətinizə mane olmadım ki?

R e y h a n. Xeyr. Buyurun, əyləşin.

Ş a h s u v a r o v. Rica edirəm, zəhmət çəkməyin. (*Oturur*) İstirahət günü olanda adam lap darıxır. Xüsusən mənim kimi heç bir kəsi olmayanlar.

R e y h a n. Niyə elə deyirsiniz? Sizi ki, bütün şəhər tanıyır.

Ş a h s u v a r o v. Hər bir tanışa da dost deyib, ülfət bağlamaq olmur, Reyhan xanım.

C a h a n g i r. Əlbəttə. Adam öz qəlbinə yaxın olanlarla görüşüb-danışmaq istəyir.

Ş a h s u v a r o v (*Cahangirin sözlərindəki istehzanı hiss edir. Lakin üzə vurmur*). Doğrudur.

C a h a n g i r. Mən arzu edirəm ki, hamı sizin kimi incə təbiətli olaydı, Şahsuvarov.

Ş a h s u v a r o v (*gülümsəyərək*). Siz kompliment deməkdə həddindən artıq səxavətlisiniz, yoldaş müstəntiq!

C a h a n g i r. Bunun eybi yoxdur. Özünüz bilirsiniz ki, insanda səxavət gözəl keyfiyyətdir.

Ş a h s u v a r o v. Şübhəsiz. (*Zarafatyana*) Vaxta ki, Cahangir məni incə təbiətli adam hesab edir, o zaman rica edirəm bir şey çalasınız, qulaq asaq.

R e y h a n. Əziz qonaqlara hörmət borcumuzdur.

Ş a h s u v a r o v. Təşəkkür edirəm.

R e y h a n (*pianinonun qabağında oturaraq*). Nə çalım?

Ş a h s u v a r o v. Ürəyiniz nə istəyirsə.

R e y h a n. Bəlkə mənim ürəyim istəyən sizə xoş gəlmədi?

Ş a h s u v a r o v. Ola bilməz.

R e y h a n. Kaş ki, mən sizin bu etimadınızı doğruldaydım.

Çalır. Cahangir qalxıb pəncərədən bağçaya tamaşa edir. Mehrican da onun yanına gəlir və onlar nə haqqındasa danışırlar. Şahsuvarov, Reyhanın yanındakı stola söykənir.

Ş a h s u v a r o v (*yalnız Reyhanın eşidə biləcəyi bir səslə*). Srağagün axşam mən evinizin yanından keçirdim, siz onda da bu sonatanı çalırdınız. Dayanıb xeyli qulaq asdım.

R e y h a n (*gülümsəyərək*). Doğrudanmı?

Ş a h s u v a r o v. Lakin, sizə qulaq asdıqca, özümü elə bədbəxt hiss edirdim ki.

R e y h a n. Nə üçün?

Ş a h s u v a r o v. Bilmirəm.

R e y h a n. Görünür, siz o gecə çox sentimental bir əhvali-ruhiyyədəymişsiniz.

Ş a h s u v a r o v (*pərt olaraq*). Hər halda, mənim o gecəki vəziyyətim istehzadan çox mərhəmətə layiqdi.

R e y h a n. Yoxsa, mən sizin xətrinizə dəydim?

Ş a h s u v a r o v. Xətrimə dəyəndə nə olar! Siz mənim sinəmə dalbadal on güllə sıxsaydınız, bir dəfə "uf" deməzdim.

R e y h a n. Siz lap keçmiş rıtsarlar kimi danışırsınız. (*Qaşlarını çataraq, ayağa qalxır*)

Dilşad və Lətafət gəlirlər.

D i l ş a d. Oho... Şahsuvarov... Mən dedim, bəs, gəlmədiniz.

Ş a h s u v a r o v. Necə ola bilər ki, siz çağırasınız, mən gəlməyim?

D i l ş a d. Sağ olun. Siz qədirbilən adamsınız.

Ş a h s u v a r o v. Siz məni utandırırsınız, Dilşad xanım...

D i l ş a d. Siz həddindən artıq təvazökarsınız, yoldaş naçalnik. Xoş gəlmisiniz. Bəs, ayaq üstə nə üçün? Reyhan, qonaqlara yaxşı qulluq eləmirsən. Rica edirəm, əyləşin...

C a h a n g i r. Zəhmət çəkməyin. Bütün günü oturmaqdan yoruluruq.

D i l ş a d. Sizdən incimişəm. Bizə gec-gec gəlirsiniz.

C a h a n g i r. İş-güc...

D i l ş a d (*mənalı tərzdə gülümsəyərək*). Bilirəm, bilirəm... Son vaxtlar işiniz yaman çoxdur.

R e y h a n. Cahangir, gedək. Mehricanın düzəltdiyi yeni maketi sənə göstərmək istəyirəm.

C a h a n g i r. Gedək.

Reyhan, Cahangir və Mehrican o biri otağa keçirlər.

D i l ş a d. Ziyad, Sadıqovun əhvalatından sizin xəbəriniz varmı?

Ş a h s u v a r o v. Bəli, xəbərim var.

D i l ş a d. Bu necə məsələdir?

Ş a h s u v a r o v. Hamısını burada danışmaq mümkün deyil. Ancaq, hər halda, çox ciddi məsələdir.

D i l ş a d. Bəs, fikriniz nədir?

Ş a h s u v a r o v. Mən əlimdən gələn köməyi etməyə çalışıram. Lətafət xanım özü də bilir. Ancaq qorxuram mənim köməyim müsbət bir nəticə verməsin.

D i l ş a d. Nə üçün?

Ş a h s u v a r o v. Çünki Sadıqovgilin işini Cahangir açıb.

D i l ş a d. Nə olsun ki?

Ş a h s u v a r o v. Qanuna görə, biz onlara təsir göstərə bilmərik.

D i l ş a d. Orasını mən də bilirəm.

Ş a h s u v a r o v. Başqa bir yol düşünməyə imkan yoxdur. Çünki özünüz bilirsiniz, prokurorun da, Cahangirin də mənimlə araları soyuqdur.

D i l ş a d. Bəs, necə olsun?

Ş a h s u v a r o v. Siz bu barədə yoldaş Atayevlə danışsaydınız, pis olmazdı.

D i l ş a d. Atayevə elə söz demək olar?

Ş a h s u v a r o v. Bilirsiniz, Dilşad xanım, siz ağıllı qadın olduğunuz üçün mən hər şeyi açıq danışmaq istəyirəm. Atayevin bu işə qarışmağı mütləq vacibdir! Əgər, Sadıqov dolaşsa...

D i l ş a d. Başa düşürəm.

Ş a h s u v a r o v. Digər tərəfdən, Cahangir işində fanatik bir adamdır. Onu ancaq Atayev kimi böyük avtoritet öz yerində oturda bilər. (*Pauza*) Görürsünüz, onun yerinə mən olsam, utandığımdan sizin üzünüzə baxa bilməzdim. Amma o...

D i l ş a d. Amma o bu evdə özünü elə aparır ki, guya, mənim yeznəmi dolaşdırıb tutmaq istəməsinin bizə heç dəxli yoxdur.

Ş a h s u v a r o v. Sizi inandırıram ki, o elə də düşünür. (*Pauza*)

D i l ş a d. Siz haqlısınız. Mən bu barədə mütləq Atayevlə danışmalıyam. Lap dalaşsa da, danışmalıyam. Mənə və mənim qohumlarıma hörmət eləmək onun borcudur.

Ş a h s u v a r o v. Əlbəttə.

D i l ş a d. Siz əyləşin, mən bir mətbəxə baş çəkim, gəlim.

Ş a h s u v a r o v. Buyurun.

Dilşad çıxır.

Ş a h s u v a r o v. Niyə mənə elə qanlı-qanlı baxırsan, Lilya?

L ə t a f ə t. Hələ bir danışırsan da...

Ş a h s u v a r o v. Axı nə olub?

L ə t a f ə t. Özün bilirsən!

Ş a h s u v a r o v. Sənin canın üçün, heç bir şey bilmirəm.

L ə t a f ə t. Axşam gələrsən, deyərəm.

Ş a h s u v a r o v. Bəlkə gələ bilmədim.

L ə t a f ə t. Aydındır.

Ş a h s u v a r o v. Ürəyinə ayrı şey gəlməsin. Qonaq çağırıblar. Getməsəm, yaxşı düşməz.

L ə t a f ə t. Demək, o qonaqlıqdakılar sənin üçün məndən artıqdır?

Ş a h s u v a r o v. Nə danışırsan, Lilya...

L ə t a f ə t. Gələrsən! Eşitdinmi?

Ş a h s u v a r o v. Baş üstə!

D i l ş a d (*balaca məcməyidə çay, mürəbbə gətirir*). Bu, siz xoşlayan qızılgül mürəbbəsidir. Özüm bişirmişəm.

Ş a h s u v a r o v. Nə zəhmət çəkirsiniz...

D i l ş a d. Təki sizin kimi dostlar üçün zəhmət çəkək.

Ş a h s u v a r o v. Doğrusu, bu evə elə öyrənmişəm ki, bir gün gəlməyəndə ürəyim darıxır.

D i l ş a d. Mən sizi öz ailəmizin bir üzvü hesab edirəm, Ziyad.

Ş a h s u v a r o v. Mən bunu bilirəm, Dilşad xanım.

D i l ş a d. Elə zənn edirəm ki, biz bir-birimiz üçün qənimət adamlarıq.

Ş a h s u v a r o v. Biz bir-birimizi anlayıb qiymətləndirməyi bacarırıq, Dilşad xanım.

D i l ş a d. Şübhəsiz.

Cahangir, Reyhan və Mehrican gəlirlər.

C a h a n g i r. Mən sizin yerinizə olsaydım, maketi müsabiqəyə göndərərdim.

R e y h a n. Mehrican yenə də bəzi dəyişikliklər eləmək fikrindədir.

C a h a n g i r. Lap yaxşı.

D i l ş a d (*Cahangirə*). Əyləşin, çay için.

C a h a n g i r. Sağ olun. Axşam tikinti işçiləri üçün mühazirə oxuyacağam. Gedib bir az hazırlaşmaq lazımdır.

M e h r i c a n. Mühazirəniz nə mövzudadır?

C a h a n g i r. "Ailə və cəmiyyət".

Ş a h s u v a r o v. Gözəl mövzudur. Vaxtım olsaydı, məmnuniyyətlə qulaq asardım.

D i l ş a d. Siz müstəntiq adamsınız. Mühazirə ilə nə işiniz var?

C a h a n g i r. Bizim vəzifəmiz yalnız cinayətləri tapıb meydana çıxarmaqla bitmir, Dilşad xanım. Biz, eyni zamanda, bu cinayətləri doğuran səbəblərin kökünü kəsməyə çalışırıq. Biz istəyirik ki, adamlar mənəvi cəhətdən daha kamil, daha gözəl olsunlar. Biz istəyirik ki, cinayət sözü zehinlərdən silinib getsin.

R e y h a n. Ona görə də, hər bir müstəntiq, eyni zamanda, bir müəllim olmalıdır.

C a h a n g i r. Doğrudur.

Xosrov Atayev gəlir. Bu, qırx beş yaşında, ucaboylu, yaraşıqlı bir kişidir.

X o s r o v  A t a y e v. Salam.

Ş a h s u v a r o v. Salam, yoldaş Atayev.

X o s r o v  A t a y e v. Deyirlər İldırım gəlib, bəs hanı?

R e y h a n. Bu saat, ata... (*O biri otağa qaçır*)

D i l ş a d (*əl-ayağa düşərək*). Səhərdən haradasan? Bu vaxtacan ac qalmaq olar?

X o s r o v  A t a y e v. İşim çox idi, Dilşad.

D i l ş a d. İş öz yerində, insana can da lazımdır.

X o s r o v  A t a y e v (*gülümsəyir*). Doğrudur.

D i l ş a d. Həmişə "doğrudur" deyirsən, amma əməl eləmirsən. Ver şlyapanı.

X o s r o v  A t a y e v. Zəhmət çəkmə. (*Özü gedib asır*)
D i l ş a d. Qabaqca nahar edəcəksən, yoxsa...
X o s r o v  A t a y e v. Ürəyim yanır.
D i l ş a d. Görürsənmi, vaxtlı-vaxtında yeyib-içmədiyin üçün iştahadan kəsilmisən. Yox, belə olmaz. Axı, mən sənin üçün rejim qoymuşam.
X o s r o v  A t a y e v. Bu dəfə bağışla. Söz verirəm ki, bir də rejimi pozmayım.
D i l ş a d. Yaxşı, görək.

İldırım Atayevlə Reyhan gəlir.

İ l d ı r ı m  A t a y e v. Xosrov, Salam! (*Qardaşını diqqətlə nəzərdən keçirərək*) Yaxşısan, gümrahsan.
X o s r o v  A t a y e v. Sən də yaxşısan... Bircə de görüm məzuniyyətə çıxmısan, yoxsa...
İ l d ı r ı m  A t a y e v. Xeyr, iş üçün gəlmişəm.
D i l ş a d. Amma mən dedim, bəs, siz məxsus bizimlə görüşə gəlmisiniz.
İ l d ı r ı m  A t a y e v. Həm ziyarət, həm ticarət. (*Xosrova*) Şəhəriniz qiyamət olub. Köhnə evlərin yerlərini tanımaq olmur.
Ş a h s u v a r o v. Yoldaş Atayev ki, belə başlayıb, çox çəkməz bura Bakını da ötər.
İ l d ı r ı m  A t a y e v (*Şahsuvarova diqqətlə baxaraq, zarafatyana*). Bakı dayanıb sizi gözləmir. O da tərəqqi edir, böyüyür.
Ş a h s u v a r o v (*tutularaq*). Şübhəsiz.
İ l d ı r ı m  A t a y e v. Tikmək qardaşımın çoxdankı ehtirasıdır.
X o s r o v  A t a y e v. Dünyada tikməkdən, qurmaqdan da gözəl nə var?! (*Cahangirlə Şahsuvarova*) Əlbəttə, mən belə deməklə siz inzibatçıları özümüzdən ayırmıram.
D i l ş a d. Söhbət dananı qurda verər, xahiş edirəm yemək otağına buyurasınız. Xosrov da səhərdən acdır.
C a h a n g i r. İcazənizlə mən gedim.
D i l ş a d. Heç elə şey yoxdur. İldırımın gəlişi münasibəti ilə hamımız bir yerdə nahar edəcəyik.
X o s r o v  A t a y e v. Doğrudur. Siz buyurun əyləşin, mən bu dəqiqə gəlirəm.

Dilşadla Xosrov Atayevdən başqa hamı o biri otağa keçir.
Xosrov Atayev saçını darayır.

D i l ş a d. Bu gün bizim evlənməyimizin düz on ili tamam olur, Xosrov.

X o s r o v  A t a y e v. Gərək məni bağışlayasan. İldırımın gəldiyini eşidib evə tələsdiyim üçün sənə hədiyyə ala bilmədim. Sabah mütləq!

D i l ş a d (*gülümsəyir*). Eybi yoxdur. Borclu borclunun sağlığını istər. Bir də ki, qocalar hədiyyəsiz də keçinər.

X o s r o v  A t a y e v (*onun əlindən tutaraq*). Sən indi də on il bundan qabaqkı kimi gözəlsən. (*Saçlarından öpür*)

D i l ş a d (*ona qısılaraq*). Amma mənə elə gəlir ki, sən daha məni əvvəlki kimi istəmirsən.

X o s r o v  A t a y e v. Əksinə. İllər keçdikcə, mən səni daha çox istəməyə başlayıram. Bu məlun şübhə haradan ağlına gəlibdir?

D i l ş a d. Bəzən olur ki, bütün günü evə gəlmirsən.

X o s r o v  A t a y e v. Neyləyim... Səbəbini özün bilirsən. (*Pauza*)

D i l ş a d. Sənin xəbərin varmı ki, bizim dostumuz Cahangir mənim gözümün ağı-qarası bircə bacım qızının ərini dolaşdırmaq istəyir?

X o s r o v  A t a y e v (*qaşlarını çataraq*). Təqsiri olmayan adamı heç kəs dolaşdıra bilməz.

D i l ş a d. Sən hamını öz arşınınla ölçmə, Xosrov. Əgər, Sadıqovun başına bir iş gəlsə, o yazıq qızın halı necə ola bilər? Savadı az, qohum-qardaşı yox...

X o s r o v  A t a y e v. Nə üçün sən onu təhsildən ayırıb verdin Sadıqova? Axı, mən o vaxt sənə dedim...

D i l ş a d. Bu söhbətlər gecdir, Xosrov. Sən kömək elə, Lətafət bədbəxt olmasın!

X o s r o v  A t a y e v. Nə cür kömək edim?

D i l ş a d. Qoyma əri dolaşsın!

X o s r o v  A t a y e v. Bayaq dedim, günahı olmayan adamı heç kəs dolaşdıra bilməz!

D i l ş a d. Sən hamıya verəcəyin rəsmi cavabı mənə də verirsən.

X o s r o v  A t a y e v (*acığını unudaraq*). Dilşad! Axırıncı dəfə səndən xahiş edirəm: əgər, bizim aramızdakı onillik məhəbbətin məhv olmasını istəmirsənsə, bir də məndən belə şeylər xahiş etmə! Mən xalqa qulluq elədiyim bu otuz ildə ona xəyanət etməmişəm, etməyəcəyəm də. (*Çevrilib iti addımlarla o biri otağa keçir*)

D i l ş a d (*onun ardınca qəzəbli bir nəzər salaraq*). Ah... Siz Atayevlər!..

P ə r d ə

## ÜÇÜNCÜ ŞƏKİL

Xosrov Atayevin evi. İldırım Atayev qəzet oxuyur. Xosrov Atayev nə isə yazır. Dilşad bir qutu papiros gətirib onun qabağına qoyaraq çıxır. Onun hərəkətlərindəki gizli acığı Atayev qardaşları hiss edirlər.

İ l d ı r ı m A t a y e v (*qəzeti stolun üstünə qoyur*). Uşaqlıqdan bizim bir-birimizdən gizli sözümüz olmayıb, Xosrov, açığını deyim ki, sənin ailə həyatın məni kədərləndirir.

X o s r o v A t a y e v. Niyə axı? Səbəbi nədir?

İ l d ı r ı m A t a y e v. Bizim hər ikimiz xalq uğrunda, onun böyük arzuları uğrunda çarpışırıq, elə deyilmi?

X o s r o v A t a y e v. Əlbəttə, elədir! Başqa cür ola bilər ki?

İ l d ı r ı m A t a y e v. Və mən bilirəm ki, sənin üçün xalqın mənafeyindən yüksək, müqəddəs heç nə yoxdur!

X o s r o v A t a y e v. Şübhəsiz!

İ l d ı r ı m A t a y e v. Lakin mənə elə gəlir ki, sənin əqidənlə, işinlə ailə həyatın arasında çox dərin bir ziddiyyət əmələ gəlmişdir.

X o s r o v A t a y e v. Sən bunu nəyə əsasən deyirsən?

İ l d ı r ı m A t a y e v. Görüb-eşitdiklərimə əsasən!

Pauza.

X o s r o v A t a y e v. Bu daşın haradan atıldığını bilirəm. Sən Reyhanın sözlərinə çox da əhəmiyyət vermə. Özün bilirsən ki, ögey ana ilə övladın ulduzu çətin barışır.

İ l d ı r ı m A t a y e v. Yox, Xosrov! Mən istəyirəm ki, sən bizim bu söhbətimiz ətrafında çox ciddi düşünəsən! Sonra gec olar...

X o s r o v A t a y e v (*tutularaq*). Məncə, hər kəs kiminlə yaşadığını daha yaxşı bilir.

Əsəbi halda qalxıb telefon aparatına yaxınlaşır. İldırım çıxır.

X o s r o v  A t a y e v (*zəng edir*). Milis idarəsini verin. Şahsuvarov haradadır? Xahiş edirəm onu tapıb mənim yanıma göndərəsiniz. (*Dəstəyi asır. Uzun pauza, ağır addımlarla o biri otağa keçir*)

Səhnə bir an boş qalır. İldırımla Mehrican daxil olurlar.

İ l d ı r ı m  A t a y e v. Siz nə isə soruşmaq istəyirsiniz. Bəs, niyə susursunuz?

M e h r i c a n. Qorxuram mənim sualım sizə həddindən artıq cəsarətli görünsün.

İ l d ı r ı m  A t a y e v. Cəsarət – mərdlik deməkdir! Rica edirəm, danışın!

M e h r i c a n. Mən səkkiz il bundan qabaq sizin başınıza gələn əhvalatı eşitmişəm. Ona görə də, mənə elə gəlir ki, dünən sizin xoşbəxtlik haqqında dediklərinizlə bu ağır xatirə arasında bir əlaqə vardır. Doğrudanmı siz öz səadətinizi həmişəlik itirilmiş hesab edirsiniz?

İ l d ı r ı m  A t a y e v. Əlbəttə, yox!.. Bizim ümumi idealımız o qədər yüksək, o qədər gözəldir ki... Lakin bununla bərabər... (*Pauza*) Siz qoca bağban haqqındakı nağılı eşitmisinizmi?

M e h r i c a n. Xeyr.

İ l d ı r ı m  A t a y e v. Deyir, əlli il idi ki, qoca bağban gözəl ağaclar becərirdi. Əlli il idi ki, adamlar onun yetişdirdiyi meyvələrdən yeyib mənfəətbərdar olurdular. Axır bir gün qoca hiss elədi ki, daha bu dünyadan köçmək üzrədir. Adamlar tökülüb gəldilər. Kimi qocaya soyuq şərbət hazırladı, kimi dərman verdi, kimi yastığını düzəltdi. Qoca bağban isə uzaqlara baxıb "ah" çəkdi. O vaxt bir cavan oğlan soruşdu ki, nəyin qüssəsini eləyirsən, ay baba? Gününü görüb, dövranını keçirmisən, camaat başına and içir. Bağban dedi: heç nəyin fikrini çəkmirəm, hamınızdan da çox razıyam. Ancaq kaş rəhmətlik qarım indi yanımda olaydı...

Pauza.

M e h r i c a n (*mütəəssir*). Nə üçün siz özünüzü qoca bağbanla müqayisə edirsiniz? Əgər, səhv etmirəmsə, sizin hələ otuz doqquz yaşınız var.

İ l d ı r ı m  A t a y e v. Ola bilər ki, indi də öz taleyini mənimlə bağlamaq istəyən bir qadın tapılsın. Lakin siz özünüz də inkar etməzsiniz ki, bu istəklə əsl məhəbbət arasında payızla yaz qədər böyük fərq

vardır. Mən isə (*gülümsəyir*), etiraf edirəm ki, bu barədə bir az xud-pəsəndəm. Mənə elə gəlir ki, məhəbbətdə orta hal yoxdur. Ya həqiqi sevgi, ya nifrət!

M e h r i c a n. Doğrudur. Lakin nə üçün siz elə zənn edirsiniz ki, bu həqiqi sevgi sizə aid ola bilməz? Bəlkə indi sizi, sizin təsəvvür etdiyinizdən də artıq sevən gənc bir qız vardır və əgər, o sizi istədi-yinin yarısı qədər özünün sevildiyini bilsəydi...

İ l d ı r ı m A t a y e v. Yoxsa, siz mənə təsəlli vermək istəyirsiniz?

M e h r i c a n. Mən bilirəm, sizin kimi ağıllı adamların buna ehtiyacı yoxdur.

İ l d ı r ı m A t a y e v. Elə isə... (*Həyəcanlı halda susur. Gərgin pauza*)

M e h r i c a n. Rica edirəm Reyhana deyəsiniz ki, mən gəlib onu gözlədim, hələlik.

İ l d ı r ı m A t a y e v. Hara? Dayanın! Bu belə qurtara bilməz.

Mehrican çıxır. İldırım Atayev də həyəcanla onun ardınca gedir. Səhnə bir anboş qalır. Sadıqov başını içəri salıb baxır. Sonra qayıdıb yoldaşlarına gəlmək üçün işarə edir. Sadıqov, Xuduş, Ağasəlim daxil olurlar.

X u d u ş. İndicə Mehricanın dalınca tələsik bağçaya düşən ministr Atayev deyildi?

S a d ı q o v. Özü idi. Gəldiyi iki gün deyil, eşqbazlığa başlayıb. Görəsən, Dilşad hardadır?

X u d u ş. Amanın günüdür, Sadıq, bu dəfə zəli kimi yapış yaxasından, əl çəkmə.

A ğ a s ə l i m. Canım, ispalkom deyirsən burada, ministr deyirsən burada, müstəntiq deyirsən burada...

X u d u ş. Dilşad xanım kimi əflatun burada.

A ğ a s ə l i m. Düzəltsinlər də.

S a d ı q o v. Dayanın, səs-küy salmayın görək. (*O biri otağa keçir*)

X u d u ş (*pıçıltı ilə*). Bu zalım qızı qəsd qoysa, bizim işimizi düzəldər.

A ğ a s ə l i m. Qəsd qoysun da. Ondan nə gedir, hər nə getsə bizdən gedəcək.

X u d u ş. Dünən yenə də mən yazıq Şahsuvarovun cibinə düz üççə dənə ötürdüm.

A ğ a s ə l i m. Üç yüz?

X u d u ş. Başına at təpib nədir? Şahsuvarov uşaq-zaddır? Üç min!

A ğ a s ə l i m. Özündən də hələ bir kömək-zad görmürük.

X u d u ş. Bütün iş Cahangirdədir. Di gəl ki, zalım oğluna bir yol tapa bilmirik.

A ğ a s ə l i m. Sən öləsən, bir dəli şeytan deyir ki, gir onun kabinetinə. On beş mini çırp stolunun üstünə!

X u d u ş (*dəhşətlə*). Bıy!.. Bıy!.. Nə danışırsan! İstəyirsən üçümüzü də tutub bassın dama? Amanın bir günüdür, bu sözü burada dedin, bir də heç yerdə demə!

Sadıqovla Dilşad danışa-danışa gəlirlər.

S a d ı q o v. Mən əminəm ki, İldırım Atayev sizin sözünüzü yerə salmaz.

X u d u ş. Amanın bir günüdür, Dilşad xanım. Belə fürsət ələ düşməz. İldırım Atayev istəsə, o işi bir dəqiqədə ləğv etdirər.

A ğ a s ə l i m. Zarafat deyil, dövlət nazirinin müavinidir.

S a d ı q o v. Dilşad xanım, bəlkə Liliçkaya deyim, onu bir qonaq çağıraq?

D i l ş a d (*amiranə*). Lazım deyil! Gəlməz.

X u d u ş. Bu gün gəlmişdi bizim idarəyə.

S a d ı q o v. Kişinin qulağını yaman doldurubdur.

D i l ş a d. Bəs, sən nə dedin?

S a d ı q o v. Dedim, məndən nə istəyirlər? Bir canım var, onu da salmışam azara. Gecələr ürəyimin ağrısından yata bilmirəm. Həkimlər də hey dad eləyir ki, "Sadıqov, get kurorta... Sadıqov, get müalicəyə..." Amma mən beş ildə bir dəfə də məzuniyyətə çıxmamışam. Oğlum yox, qızım yox. Əlləşib-vuruşmağım kimin üçündür? Özümlə arvadım gündə heç bir kilo çörək yemirik.

D i l ş a d. Yaxşı demisən. (*Pəncərədən görərək*) Budur, özü də gəlir.

S a d ı q o v. Onda biz gedək.

X u d u ş. Amanın bir günüdür, Dilşad xanım, ölmüşük, bizi yerdən götürün.

S a d ı q o v (*gedib qayıdır*). Lap yadımdan çıxmışdı. Dilşad xanım, xahiş edirəm, axşam bizə buyurasız.

D i l ş a d. Nə var ki?

S a d ı q o v. Sıxıntı çəkməkdən bağrımız çatladı. Dedim yığışaq, bir az ürəyimiz açılsın.

D i l ş a d (*bərkdən gülərək*). Dünya dağılsa da, Sadıqov kefindən qalmaz. Yaxşı. (*Sadıqovgil gedirlər*) Bu axmaqlar elə bilirlər ki, İldırım Atayev mənim əziz-xələfimdir.

İ l d ı r ı m A t a y e v (*gəlir*). İndi buradan çıxanlar tikinti təchizatı idarəsinin işçiləri deyildilərmi?

D i l ş a d. Bəli, onlar idi.

İ l d ı r ı m A t a y e v. Niyə gəlmişdilər?

D i l ş a d. Heç... elə-belə... Axı, Sadıqov bizim Lətafətin əridir. (*Qısa pauza*)

İ l d ı r ı m A t a y e v. Onların buraya gəlib-getmələrindən Xosrovun xəbəri varmı?

D i l ş a d. Kimlərin?

İ l d ı r ı m A t a y e v. Sadıqovun... Xuduşun... Ağasəlimin.

D i l ş a d. Bilmirəm. Siz bunu nə üçün soruşursunuz ki?

İ l d ı r ı m A t a y e v. Ona görə ki, bura Xosrov Atayevin evidir!..

D i l ş a d (*gülümsəyir*). Yoxsa, mənim burada heç bir hüququm yoxdur?

İ l d ı r ı m A t a y e v. Kim deyir ki, yoxdur?! Ancaq elə güman edirəm ki, sizin kimi Xosrov Atayev də öz evinə gəlib-gedənlərin kim olduqlarını bilməlidir.

D i l ş a d. Əgər, yad adam olsaydılar, başqa. Dedim ki, Sadıqov mənim yeznəmdir.

İ l d ı r ı m A t a y e v. Bəs Xuduş, Ağasəlim?..

D i l ş a d. Onlar da Sadığın yoldaşlarıdır. Deyə bilmərəm ki, gəlməyin.

İ l d ı r ı m A t a y e v. Bəlkə onların böyük bir cinayətdə ittiham edildiklərini bilmirsiniz?

D i l ş a d. Bilirəm.

İ l d ı r ı m A t a y e v. Elə isə, bu cür adamların şəhər sovetinin sədri Xosrov Atayevin evinə bu qədər mərhəm olmaları sizə qəribə görünmürmü?

D i l ş a d. Onların təqsirkar olub-olmadıqları hələlik sual altındadır.

İ l d ı r ı m A t a y e v. Onların məsuliyyətə alınmasını birinci Xosrov Atayev təklif etmişdir.

D i l ş a d (*gülümsəyir*). Kor atlanar, öz kəndini çapar.

İ l d ı r ı m  A t a y e v. Dilşad xanım!

D i l ş a d (*əsəbi*). Siz hamınız məni ögey hesab edirsiniz. Mən sizdən kömək gözləyirəm. Amma sizin biriniz mənim yeznəmin həbsə alınmağına hökm verir, o biriniz onun mənim evimə gəlib-getməyini qadağan edir...

İ l d ı r ı m  A t a y e v. Yaddan çıxarmayın ki, sizin əriniz dövlət xadimidir! Onu camaat seçib...

D i l ş a d. Mən də həmin camaatın biriyəm! Özüm də Xosrov Atayevi sizdən az istəmirəm.

İ l d ı r ı m  A t a y e v (*kəskin təbəssümlə*). Ola bilər.

D i l ş a d (*odlanaraq*). Siz məndən nə istəyirsiniz?

İ l d ı r ı m  A t a y e v (qəzəbli). Mən istəyirəm ki, xalq qarşısında, hökumət qarşısında cinayət məsuliyyəti daşıyan adamlar bu evə ayaq basmasınlar!

Xosrov Atayev daxil olur.

X o s r o v  A t a y e v. Salam! Nə olub? Niyə belə dayanmısınız?

İ l d ı r ı m  A t a y e v. Heç bir şey.

X o s r o v  A t a y e v. Bu gün tikinti işləri ilə tanış ola bildinmi?

İ l d ı r ı m  A t a y e v. Oldum.

X o s r o v  A t a y e v. Vəziyyəti necə görürsən?

İ l d ı r ı m  A t a y e v. Danışarıq... (*O biri otağa keçir*)

X o s r o v  A t a y e v (*Dilşada*). Doğrusunu de görüm, niyə bikefsən? Yoxsa, məndən gizlədirsən?

D i l ş a d. Nəyi gizlədəcəyəm? Qardaşın mənimlə keçmişlərin haqq-hesabını çəkməyə başlayıb. Guya ki, o zaman Firəngizin onu atıb getməsinə mən təqsirkaram.

X o s r o v  A t a y e v (*hirslənir*). Xahiş edirəm, bu köhnə söhbətləri buraxın getsin. (*O biri otağa keçir*)

D i l ş a d (*onun ardınca öz-özünə*). Ax, siz Atayevlər!

Şahsuvarov daxil olur.

D i l ş a d. Nədir, Ziyad, gözümə birtəhər dəyirsən?..

Ş a h s u v a r o v. İşlər yaxşı deyil, Dilşad xanım! (*Ahəstə səslə*) Atayev evdədirmi?

D i l ş a d. Sözünü danış.

Ş a h s u v a r o v. Mən elə güman edirdim ki, İldırım Atayevin gəlişi indiki ab-havanı bir qədər yumşaldacaq. Ancaq, əksinə oldu...

D i l ş a d. Mən bunu əvvəlcədən bilirdim...

Ş a h s u v a r o v. Gələn kimi bütün aləmi qatıb bir-birinə. Bu gün düz iki saat prokurorla söhbət edib, sonra məni çağırtdırıb.

D i l ş a d. Sizdən nə istəyir?

Ş a h s u v a r o v. Guya, mən niyə Sadıqovgilin işinin üstünü vaxtında açmamışam. Bütün tikintiləri bir-bir gəzib. Eşitdiyimə görə, özü də Bakıya teleqram vurub, böyük komissiya tələb edib.

D i l ş a d. Görürsünüzmü?

Ş a h s u v a r o v. Heç olmasa, öz qardaşını da nəzərə almır.

D i l ş a d. Ziyad, birdəfəlik bilin ki, Atayevlər üçün istər qardaş, istər yad... Heç bir təfavütü yoxdur.

Ş a h s u v a r o v. Bu cür getsə, vəziyyət çox pis olacaq.

D i l ş a d. Bütün işlərin mayası o Cahangirdir.

Reyhanla Cahangir daxil olurlar. Reyhan o biri otağa keçir.

C a h a n g i r. Salam, Şahsuvarov, bu gün biz nə tez-tez görüşürük!

D i l ş a d. Görünür, ürəkləriniz bir-birinə yaxındır.

C a h a n g i r. Gərək də elə olsun. O, milis naçalniki, mən də ki...

D i l ş a d (*zarafatyana*). Siz də ki, rəhmsiz bir müstəntiq.

C a h a n g i r. Niyə elə deyirsiniz, Dilşad xanım?

D i l ş a d (*gülümsəyərək*). Rəhmsiz olmasanız, bizim yazıq Sadığı elə sıxışdırmazsınız.

C a h a n g i r. Özünüz bilirsiniz ki, dünyada səbəbsiz şey yoxdur.

D i l ş a d. Şübhəsiz. Ancaq indiyə qədər heç kəs Sadıqovdan bir pislik görməyib. Niyə elə siz gələn kimi təqsirkar oldu?

C a h a n g i r. Mən görürəm ki, bizim söhbətimiz zarafat dairəsindən çıxır. Ona görə də, sizin sualınıza cavab verməliyəm. Sadıqovun başçılıq etdiyi idarənin yoxlanılmasını tək mən yox, xalq tələb edir! İçində yaşadığımız bu gözəl binaları tikən fəhlələr tələb edir.

D i l ş a d (*əsəbi*). Nə üçün? Sadıqov neyləyib?

C a h a n g i r. Təəssüf ki, mən bu barədə hələlik sizə heç bir söz deyə bilməyəcəyəm.

D i l ş a d. Siz çox "mən-mən" deməyin, dəvədən böyük fil var.

C a h a n g i r. Bu misal çoxdan köhnəlmişdir. Ona görə də, şəhərimizdə ən mötəbər adamlardan birinin həyat yoldaşı olan sizə, onu işlətməyi məsləhət görmürəm...

D i l ş a d. Rica edirəm, mənə əxlaq dərsi verməyəsiniz.

C a h a n g i r. Mən hüquqşünasam. Dilşad xanım, dövlət qanunlarını düzgün dərk etməyənləri başa salmaq bizim borcumuzdur.

D i l ş a d. Yox, artıq dözülməzdir. Bu... bu...

Ş a h s u v a r o v. Əsəbiləşməyin, Dilşad xanım. (*Ona su verir*) İçin. Yoldaş müstəntiq vəzifəsinə görə çox gəncdir. Gəncləri isə bağışlamaq olar.

C a h a n g i r (*Şahsuvarova*). Mən Dilşad xanıma təhqiredici bir söz demədiyim üçün sizin bu miyançılığınız da yersizdir.

Ş a h s u v a r o v. Siz mənimlə həddindən artıq açıq danışırsınız, yoldaş müstəntiq. Ancaq eybi yoxdur. Vəzifələrimiz bizim mümkün qədər səbrli və nəzakətli olmağımızı tələb edir.

C a h a n g i r. Bu barədə sizə çatan olmaz. Siz nəzakətdə ad çıxarmısınız.

R e y h a n (*gələrək*). İldırım əmim sizi gözləyir, Cahangir...

C a h a n g i r. Gedək.

Reyhanla Cahangir o biri otağa keçirlər.

Ş a h s u v a r o v. Bu qədər də azğınlıq olar?! Eşitdinizmi? İldırım Atayevin yanına gəlibmiş.

Dilşad ona cavab verməyərək, qəzəbli halda telefonun dəstəyini götürür.

D i l ş a d. Prokurorun kvartirasını ver! Tez! Alo! Kimdir? Salam, yoldaş Hüseynov! Kefiniz-zadınız necədir? Gülsüm bacı nə təhərdir? Niyə heç bizlərə sarı gəlib-eləmir? Nə olsun? İş-güc elə hamının var. Yox, boynunuza alın ki, bizə məhəl qoymursunuz... (*Bərkdən gülür*) Zarafat edirəm. Bura baxın, Hüseynov! Mən sizin o müstəntiqin əlindən yaman hirslənmişəm. Sizin canınız üçün, lap adamın əsəblərinə toxunur. Əşi, nə olacaq! Bütün işini-gücünü buraxıb düşüb bizim o yazıq Sadığın üstünə. Özünüz bilirsiniz ki, Sadıqov suyu üfürüb içən adamdır. Xahiş edirəm, o Cahangirə balaca bir qulaqburması verəsiniz. Bəlkə cavandır, başa düşmür... Necə? Necə? Nə üçün qarışmayım? Mən nə danışdığımı çox yaxşı bilirəm, yoldaş Hüseynov! Nə təhər?! Əgər doğrusunu bilmək istəsəniz, sizin bu hərəkətiniz Atayevə

sataşmaqdır! Bəli, bəli!.. Biz də bir şey qanırıq!.. Müstəntiqin beli sizə bağlı olmasa, gəlib məni evimin içində təhqir etməz! Ancaq onu bilin ki, Atayevlər ailəsi girməli kol deyil! (*Dəstəyi qəzəblə yerinə çırpır*) Gədələr! Elə bil ki, hamısı dilbir olublar. (*O, kəskin hərəkətlə geri çevrilir*)

Xosrov Atayev, Cahangir və Reyhan gəlirlər.

X o s r o v  A t a y e v (*Şahsuvarova*). Mən səni axtarırdım.

Ş a h s u v a r o v. Ona görə gəlmişəm, yoldaş Atayev.

X o s r o v  A t a y e v. Eşitdiyimə görə, Sadıqov çox namuslu bir işçi olan baş mühasibi nə üçünsə iki ay bundan qabaq işdən çıxarıb. Onu təcili surətdə tapmaq lazımdır, başa düşürsənmi?

Ş a h s u v a r o v. Aydındır, yoldaş Atayev.

X o s r o v  A t a y e v. Mən səndən xahiş edirəm, təchizat idarəsində baş vermiş bu cinayətin köklərini tapıb meydana çıxartmaqda bütün gücünlə Cahangirə kömək edəsən. Qoy o vicdansızlar bilsinlər ki, ədalətdən qaçıb qurtarmaq olmaz!

P ə r d ə

# **İKİNCİ PƏRDƏ**

## DÖRDÜNCÜ ŞƏKİL

Sadıq Sadıqovun evi. Bahalı mebellər. Ortada üstü cürbəcür yeməklərlə dolu böyük stol. Qapının zəngi vurulur. Lətafət tələsik addımlarla gedib açır.

Ş a h s u v a r o v. Lilya! Səni görəndə ürəyim necə çırpınır.

L ə t a f ə t. Mən səndən küsmüşəm, Ziyad.

Ş a h s u v a r o v. Elə demə, özümü öldürərəm.

L ə t a f ə t. Heç birinə inanmıram.

Ş a h s u v a r o v. Nə üçün?

L ə t a f ə t. Deyirlər sən başqasını sevirsən.

Ş a h s u v a r o v. Belə zarafatları burax, Lilya! Mənim üçün dünyada ancaq sənsən!

L ə t a f ə t. Bəs Reyhan?

Ş a h s u v a r o v. Nə danışırsan? Onun ki, sevgilisi var.

L ə t a f ə t. Nə olsun? Xalam istəyir ki, o sənə getsin. Xalam da bir şey istəməsin, istədi, qurtardı.

Ş a h s u v a r o v. Xalanın elə arzusu olduğunu sən haradan bildin?

L ə t a f ə t. Görürsən necə maraqlanırsan?

Ş a h s u v a r o v. Sən Allah, boşla.

L ə t a f ə t. Yox, Ziyad, düzünü de, sən, doğrudanmı, Reyhanla evlənmək fikrindəsən?

Ş a h s u v a r o v. Heç yatsam yuxuma da girməz.

L ə t a f ə t (*onun əlindən tutaraq*). And iç!

Ş a h s u v a r o v. Sənin əziz canın üçün!

L ə t a f ə t (*ona qısılaraq*). Ax, Ziyad, mən sənsiz bir gün də yaşaya bilmərəm.

Ş a h s u v a r o v. Mən sənsiz nəinki bir gün, heç bir dəqiqə də yaşaya bilmərəm, Lilya...

L ə t a f ə t. Elə isə nə üçün tərpənmirsən? Niyə məni bu əzablardan qurtarmırsan? Ax... Sən bilsən ki, mən ona nə qədər nifrət edirəm!

Ş a h s u v a r o v. Bilirəm... Hamısını bilirəm. Ancaq bir qədər də səbr etmək lazımdır. Sənin ona getdiyin cəmi iki ildir. Bu tezliklə boşanıb mənə gəlsən, yaxşı çıxmaz.

L ə t a f ə t. Nə üçün?

Ş a h s u v a r o v. Mənə məişət pozğunu adı verərlər. Deyərlər xalqın təzə arvadını boşatdırıb aldı.

L ə t a f ə t. Cəhənnəmə ki! Qoy nə deyirlər desinlər. Yoxsa qorxursan?

Ş a h s u v a r o v (*gülümsəyir*). Nədən qorxacağam? Ancaq...

L ə t a f ə t. Sevən adam heç nəyi gözə gətirməz, Ziyad! Mən hər şeyə razıyam, təki səninlə bir yerdə olum.

Sadıqov gəlir.

S a d ı q o v (*gülür*). Hi-hi... Sən məndən qabaq gəlmisən.

Ş a h s u v a r o v. Əsl dost gərək elə olsun.

L ə t a f ə t. Sənə yüz dəfə demişəm ki, şlyapanı elə qoyma.

S a d ı q o v. Axı, məndə nə təqsir var, Liliçka? Evimizdə bişməyib, qonşudan gəlməyib. Hi-hi... Atam baqqal Məşədi Kərim

rəhmətliyin bir kürkü var idi ki, içinə üç adam yerləşərdi. Belinə də bir qurşaq dolayardı ki, düz on iki arşın. İndi onun oğlu şlyapa? Hi-hi...

L ə t a f ə t. Yaxşı... yaxşı... tez ol, Şahsuvarov bayaqdan səni gözləyir.

S a d ı q o v. Liliçka, mən indi xalat geyim, yoxsa?

L ə t a f ə t. Ox... qonaqların yanında xalatla oturacaqsan?

S a d ı q o v (*gülür*). Hi-hi... Şahsuvarov ki, özümüzünküdür.

L ə t a f ə t. Sənə yüz dəfə demişəm belə gülmə.

S a d ı q o v. Eh, Liliçka, gülməyib nə edəcəyəm... Beş günlük dünyadır, ye, iç, kef çək! Atam Məşədi Kərimin də pulu çox idi, axırı nə oldu? İnsan bu fani dünyaya bir dəfə gəlir. Ömər Xəyyam demişkən, sabah yıxılıb ölsən, yeddi min il bundan qabaq ölənlə sənin heç bir fərqin olmayacaq! Elə deyilmi, Şahsuvarov?

Ş a h s u v a r o v. Elədir.

S a d ı q o v. İskəndər Zülqərneyə qalmayan dünya kimə qalacaq? Ye, iç, kef çək, vəssalam. (*Oxuya-oxuya o biri otağa keçir*)

Mixək əkdim ləyəndə,
Ay mixək boynun əyəndə...

Ş a h s u v a r o v (*bərkdən gülərək*). Bu, doğrudan da, idiot imiş!

L ə t a f ə t. Sən isə günü günə satırsan.

Ş a h s u v a r o v. Lilya! Yox, yox, üççə ay da gözlə.

L ə t a f ə t. Neynək, üç ay da dözərəm. (*Onunla yanaşı dayanaraq, güzgüyə baxır*) Görürsənmi, bir-birimizə necə yaraşırıq! İkimiz də bir boyda.

Ş a h s u v a r o v. İkimiz də gözəl...

S a d ı q o v (*daxil olur*). Hi-hi... Siz nə münasibətlə belə qoşa dayanmısınız?

Ş a h s u v a r o v. Lilya mənimlə mübahisə edir ki, biz bir boydayıq.

S a d ı q o v. Yox, Liliçka, Şahsuvarov səndən bir az hündürdür.

L ə t a f ə t. Xeyr, bir boydayıq.

S a d ı q o v. Bir az...

L ə t a f ə t (*qışqırır*). Dedim ki, bir boydayıq!

S a d ı q o v. Düzdür, Liliçka, bir boydasınız...

Qapının zəngi çalınır. Sadıqov gedib açır. Xuduş, Ağasəlim və arvadı Zabitə daxil olurlar.

S a d ı q o v. Gəlin çıxın də...

X u d u ş. Bıy, yoldaş Şahsuvarov da burdaymış...

A ğ a s ə l i m. Yoldaş Şahsuvarovsuz bir günümüz olmasın!

S a d ı q o v (*qədəhləri tez doldiraraq*). Eləsə, götürün bunu ekspromtom vuraq yoldaş Şahsuvarovun sağlığına! Uşaqlar, siz öləsiniz, elə bilirəm dədəm rəhmətlik Məşədi Kərimin iki oğlu varmış.

Ş a h s u v a r o v. Sən mənim böyük qardaşımsan!

S a d ı q o v. Qoy bir səni öpüm, qardaş.

Öpüşürlər.

A ğ a s ə l i m. Yaxşı oğlanlara can qurban!

S a d ı q o v. Sağ ol, qardaş. (*Birnəfəsə içir*)

X u d u ş. Sən bizim üstümüzdən əskik olmayasan, naçalnik... (*İçir*)

Ş a h s u v a r o v. Sağ olun, dostlar! (*İçir*)

S a d ı q o v. Hə, indi əyləşin...

Z a b i t ə. Bəs Dilşad xanım gəlməyəcək? Liliçka, bəlkə zəng eləyəsən? (*Qapının zəngi çalınır*) Aha... gəldi... (*Tələsik gedir açır*) Buyurun, buyurun.

Dilşad daxil olur. Hamı ayağa qalxır.

D i l ş a d. Əyləşin, əyləşin.

S a d ı q o v. Yuxarı başa keçin.

Ş a h s u v a r o v. Bura buyurun...

Əyləşirlər.

D i l ş a d. Zabitə, xoş gördük... Aya-günə dönmüsən...

Z a b i t ə. Vallah, üç-dörd gündür başımız yaman qarışıb...

A ğ a s ə l i m. Mərdimazara lənət!

X u d u ş. Min lənət!

S a d ı q o v. Qədəhləri doldurun, canım. Qan qaraltmaq vaxtı deyil.

Ş a h s u v a r o v. Varam Sadıqov. Dünyada heç bir şeyi vecinə alan deyil.

S a d ı q o v. Sizin kimi dostları olan nədən qorxacaq? (*Oxuyur*)

Mixək əkdim ləyəndə,
Ay mixək boynun əyəndə...

D i l ş a d (*gülümsəyir*). Deyəsən, yeznəm dəmdir.

S a d ı q o v. Yeznə anadan elə dəm doğulub, Dilşad xanım. Nəyin dərdini çəkəcəyəm? Bir özüməm, bir də Liliçka. Tikinti idarəsi olmasın, aztorq olsun, hara getsəm bir parça çörəyim var.

X u d u ş. Mən təklif edirəm bu qədəhləri qaldıraq hamımızın böyüyümüz, ağsaqqalımız yoldaş Atayevin və onun həyat yoldaşı Dilşad xanımın sağlığına!

S a d ı q o v. Afərin!

X u d u ş. Allah Dilşad xanımı həmişə qollu-budaqlı eləsin. Biz də onun kölgəsində yavaş-yavaş dolanaq.

A ğ a s ə l i m. Dilşad xanım, onu bilin ki, bu canı sizin yolunuzda qurban verməyə hazıram.

X u d u ş. Mən fəxr edirəm ki, Dilşad xanım bizim bu şəhərimizdə yaşayır.

S ə s l ə r. Doğrudur... Doğrudur...

S a d ı q o v. Hi-hi... Vallah, mən yaşda Dilşad xanımdan böyük də olsam, həmişə özümü onun yanında uşaq kimi hiss edirəm.

A ğ a s ə l i m. Dilşad xanım ministrə bərabər adamdır.

S a d ı q o v. Afərin! Bax, söz odur!

D i l ş a d. Yaxşı, çox tərifləməyin, sonra nəzərə gətirərsiniz. (*Gülüşürlər*)

Ş a h s u v a r o v. Sağ ol, Dilşad xanım!

D i l ş a d (*Zabitəyə*). Nə gözəl üzüyün var! Ortadakı brilyantdır?

Z a b i t ə. Bəli, brilyantdır.

D i l ş a d. Brilyant daş-qaşın padşahıdır. Gör necə işıq verir! (*Ağasəlim Zabitəyə göz vurur*)

Z a b i t ə (*üzüyü çıxarıb Dilşad xanıma uzadaraq*). Peşkəşdir.

D i l ş a d. Yox... yox... Nə danışırsınız... Sağ olun.

A ğ a s ə l i m. Xoşunuza gəlir, götürəcəksiniz.

D i l ş a d. Siz lap gerçəkləmisiniz, elə şey olar?

A ğ a s ə l i m. Niyə olmur, canım? Yüz elə brilyantlar qurban olsun sizin bir xoş sifətinizə. Xahiş edirəm, taxın barmağınıza.

D i l ş a d. Yox, götürmərəm.

A ğ a s ə l i m. Sizin canınız üçün, götürməsəniz, bu saat çıxıb gedəcəyik.

X u d u ş. Dilşad xanım, mən Ağasəlimin xasiyyətini bilirəm. Dedi, qurtardı, gərək götürəsiniz...

S a d ı q o v. Bəxşişi geri qaytarmaq yaxşı deyil.

D i l ş a d. Siz adamı lap məcbur edirsiniz. (*Zabitə üzüyü Dilşad xanımın barmağına taxır*)

Ş a h s u v a r o v. İndisə bu qədəhləri qaldıracağıq bizim əzizimiz Sadıqovun sağlığına. Sadıqov çox nadir tapılan adamlardandır. Adı Sadıq olduğu kimi, özü də dostluqda sadiqdir.

S a d ı q o v (*mütəəssir*). Bəs, atam Məşədi Kərimi görsəydiniz...

L ə t a f ə t. Ox, yenə də Məşədi Kərim...

Ş a h s u v a r o v. Siz nə üçün acıqlanırsınız, Lilya? Ot öz kökü üstə bitər. Görün rəhmətlik Məşədi Kərim necə adammış ki, ondan belə oğul əmələ gəlib. Sağ ol, Sadıq. (*Məna ilə gülümsəyərək*) Bülbül ol, amma qəfəsdə olma!

X u d u ş. İnşallah, olmarıq!..

S a d ı q o v (*Şahsuvarova*). Qoy bir səni öpüm, qardaş.

X u d u ş. Sizin bu sədaqətiniz lap mənim ürəyimi köyrəltdi.

A ğ a s ə l i m (*sərxoş halda*). Dost yolunda gərək can qoyasan... Bir üzük nədir ki...

D i l ş a d (*Şahsuvarova*). Yoxsa, bunun gözü qalıb üzüyün dalınca?

Ş a h s u v a r o v. Siz ona nə fikir verirsiniz? Görmürsünüz qanmazın biridir?

A ğ a s ə l i m. Dünyada hər şeyin başı puldur. Pul olmasaydı, bizim bu məclisimiz də olmazdı. Pul olmasaydı, sədaqət də olmazdı. Dünya pul üstündə bərqərardır! Pulu isə, biz kimin sayəsində qazanırıq? Əlbəttə, yaxşı dostların! Odur ki...

S a d ı q o v. Yox, dayan. (*Təntənə ilə ayağa qalxaraq*) Mən yoldaş Ağasəlimin sözləri ilə qətiyyən şərik deyiləm. Pul nədir? Əl çirki? Pul elə bir zibildir ki, gərək Ağasəlim belə bir məclisdə onun heç adını da tutmayaydı!

A ğ a s ə l i m (*yavaş səslə Xuduşa*). Bura bax, adə... Arvadının üstündə iki yüz manatlıq daş-qaş var, amma pulu pisləyir.

X u d u ş. Şşş... Bəs neyləsin? Hər şeydə bir siyasət lazımdır, ya yox?

S a d ı q o v. Pul olsa da biz hökumətimizə can-başla qulluq eləyəcəyik, olmasa da...

A ğ a s ə l i m. Sən öləsən, kişinin siyasətçilikdə üstü yoxdur.

X u d u ş. Şşş...

S a d ı q o v. İnsanın gərək ürəyi geniş olsun! Biz pul üçün işləmirik!

X u d u ş. Məncə, Sadıqovun fikri siyasi nöqteyi-nəzərdən çox doğrudur.

A ğ a s ə l i m. Mən səhvimi boynuma alıram.

S a d ı q o v. Odur ha... İndi dostumsan! İçək Ağasəlimlə onun həyat yoldaşı Zabitənin sağlığına. (*İçirlər*) Hi-hi... Təklif var ki, Liliçka bizim üçün bir-iki ağız desin.

A ğ a s ə l i m (*Xuduşun qulağına*). Bu nə danışır, əyə? Mənim qeyrətim belə şeyləri götürməz.

X u d u ş. Şşş!.. Nə borcuna, anan deyil, bacın deyil!

Ş a h s u v a r o v. Lilya, xahiş edirik.

S a d ı q o v. Liliçka, burada hamı özümüzünküdür! (*Pauza*).

Ş a h s u v a r o v. Lilya!

Lətafət tərəddüd edir, sonra yavaş-yavaş oxumağa başlayır.

S a d ı q o v. Yanasan, dünya!

Xuduş "ah" çəkir. Lətafət oxuyur...
Birdən hönkürüb ağlayaraq, əlləri ilə üzünü tutur.

S a d ı q o v. Bıy... Nə oldu, Liliçka?!

Lətafət cavab verməyərək, qalxıb o biri otağa keçir.

D i l ş a d (*qəzəblə Sadıqova*). Get ona bir-iki damcı valeryan ver.

Sadıqov o biri otağa keçir. Xuduş, Ağasəlim və Zabitə qalxırlar.

Z a b i t ə. Biz də gedək. Daha gecdir.

X u d u ş. Sağ olun.

A ğ a s ə l i m. Sağ olun. (*Çıxırlar*)

Ş a h s u v a r o v. Bu gecə çox acıqlısınız, Dilşad xanım...

D i l ş a d. Sənin arxayınçılığın məni lap hirsləndirir, Ziyad, onu bil ki, Sadıqovdan sonra növbə sənindir!

Ş a h s u v a r o v (*gizli qorxu ilə*). Siz bunu haradan bilirsiniz?

D i l ş a d. İldırım Atayevin sizi görməyə gözü yoxdur.

Ş a h s u v a r o v. Olmasın! Əsassız, sübutsuz mənə nə edə bilər?

D i l ş a d. Yaxşı, tutaq ki, sənə bir şey eləyə bilmədilər, bəs Reyhan?! Nə qədər ki, Cahangir ortadadır, siz ondan gözünüzü çəkməlisiniz!

Ş a h s u v a r o v. Mən nə edə bilərəm?

D i l ş a d. Əgər, mən kişi olub belimə tapança bağlasaydım, bu sualı verməzdim.

Ş a h s u v a r o v. Məhəbbət olan yerdə tapança işə keçmir, Dilşad xanım! Reyhan Cahangiri sevir.

D i l ş a d. Hmm... İzzəti-nəfsi olan oğlan öz məğlubiyyətini bu qədər soyuqqanlılıqla etiraf etməz, Ziyad! Sizi inandırıram ki, Cahangirin başına bir iş gəlsə, ondan ilk üz döndərən Reyhan olacaq! Həyata ayıq gözlə baxın! Məhəbbət yaxşı günün töhfəsidir! Ax... nə üçün mən kişi doğulmamışam!

S a d ı q o v (*gəlir*). Bu cavanların da işindən heç baş açmaq olmur. (*Dilşad xanıma*) Hara hazırlaşırsınız?

D i l ş a d (*sərt*). Gedirəm!

S a d ı q o v. Qoyun sizi ötürüm.

Çıxırlar. Lətafət gəlir.

L ə t a f ə t. Ox, bu nə həyatdır mən keçirirəm...

Ş a h s u v a r o v. Lilya, bir qədəh də şampanski iç, əsəblərin düzəlsin. (*Qədəhi doldurub verir*)

L ə t a f ə t. Ax, Ziyad. Mən çox bədbəxtəm, heç kəs məni istəmir. Hamı mənə nifrətlə baxır. Bu gün Reyhanla Mehrican mənimlə elə danışırdılar ki, elə bil, məndən iyrənirdilər.

Ş a h s u v a r o v. Yəqin onlar sənin bu qiymətli daş-qaşlarına həsəd aparırlar.

L ə t a f ə t. Onların heç bir şeyə ehtiyacları yoxdur. Özləri də bir zaman məni sevirdilər. (*Ağlayır*)

Ş a h s u v a r o v. Lilya! Axı, sənin nəyin əskikdir ki, ağlayırsan?

L ə t a f ə t. Sən heç nə başa düşmürsən, Ziyad! Elə bil ki, mən insanlardan ayrılıb kənara atılmışam. Elə bil ki, heç kəsə lazım deyiləm. Atamın vəfatından sonra anam məni kənd təsərrüfatı texnikumuna qoymuşdu. Yaxşı da oxuyurdum. Anam da vəfat edəndən sonra xalam məni texnikumdan mamalıq məktəbinə dəyişdirtdi. Orada da iki kurs oxuyandan sonra çıxarıb verdi bu kişiyə!

Ş a h s u v a r o v. Lilya! Sən ki, ona öz xoşunla gəlmisən.

L ə t a f ə t. Xalam mənə o qədər dil tökdü ki... (*Pauza*) Ax... Qurtar məni bu evdən, Ziyad. (*Qədəhi alaraq*) Sən məni içkiyə yaman öyrətdin, Ziyad. Əvvəllər mən bunu dilimə də vurmazdım.

Ş a h s u v a r o v. Lilya! Sənin gözlərin şərabdan xumarlananda bilirsən nə qədər gözəl görünür? İç!

Lətafət şərabı yarıya qədər içir, sonra üz-gözünü büzüşdürərək qədəhi yerə qoyur.

L ə t a f ə t. Ax... İçirəm. Zəhləm gedir. Hamısı... Hamısı iyrəncdir. (*Qalxıb divana yıxılır. Şahsuvarov da gedib onun yanında oturur*)

Ş a h s u v a r o v. Lilya! Yatdı... (*Onu divana söykəyərək qalxır*) Əzab çəkir. Hamının ona pis baxmağından danışır. Doğrudur, Lilya... Sənə nifrət edirlər. Çünki sən axmaq və sadəlövhsən. İndi adamlar iyirmi il bundan əvvəlki deyillər. Ona görə də, son dərəcə incə və ehtiyatlı tərpənmək lazımdır. (*Pauza*) Sən bütün ümidini mənə bağlamısan. Yox, əzizim. Mən səadəti sənin qızıl saçlarında axtaran axmaqlardan deyiləm! Əgər, sən Atayevin qızı olsaydın, onda başqa məsələ idi. Mənə arxa lazımdır, Lilya! Atayev kimi güclü bir arxa! Mən təkəm. Tək olmaq isə dəhşətdir! Qəlbimdə hər dəqiqə hiss etdiyim qorxu və iztirablara ancaq Reyhanın məhəbbəti son qoya bilər! Lakin skamyadan dünən qalxan bir gədə onu mənim əlimdən alır. Məni mat qoyur! Utan, Şahsuvarov! Dilşad xanım arvadlığı ilə səndən qətiyyətlidir! (*Pauza*) Lakin vəziyyət son dərəcə təhlükəli və mürəkkəbdir. Mən hər dəqiqə ümumi atmosferi öyrənməliyəm. (*Həyəcan içində zəng edir*) Prokuroru ver. Salam, yoldaş Hüseynov. Tikinti təchizatı idarəsində aparılan yoxlamanın ilk nəticələri Sadıqovun məsuliyyətə cəlb olunmasına əsas verir. Siz necə düşünürsünüz? Mən istəyirəm onu həbs edəm. Necə? Hələ yoxlama qurtarsın? Aha... Yaxşı. Hər halda, mən onu ciddi nəzarət altına almışam. Sağ olun. (*Dəstəyi yerinə qoyur*) Danışığının tonu buz kimi soyuqdur!.. Ax... Öldürür bu şübhələr məni! Kim üzümə bir az ciddi baxırsa, kimin danışığında bir sərtlik duyuramsa, qorxu, müdhiş bir kabus kimi çökür üzərimə! (*Qısa, gərgin pauza*) Dilşad xanım haqlıdır. Gecikmək olmaz! Bu saat hər anın bir hökmü var! (*Geri çevrildiyi zaman balaca stolun üstündəki güldana toxunaraq, salıb sındırır. Lətafət diksinib oyanır*)

L ə t a f ə t. Deyəsən, mən yuxulamışam...

Ş a h s u v a r o v. Sən mələklər kimi yatmışdın, Lilya. Mən sənə tamaşa edərək, gələcək həyatımız barədə elə şirin xəyallara dalmışdım ki...

L ə t a f ə t. Mən də indicə yuxuda görürdüm ki, sənə bir dəstə gül verirəm. Özü də ağ gül. (*Yerə dağılmış büllur çiliklərini görərək*) Buna nə oldu?

Ş a h s u v a r o v. Mən toxundum.

L ə t a f ə t. Mən bu güldanı elə çox istəyirdim ki... Axı, onu mənə sən bağışlamışdın. (*Şahsuvarovun əlindən tutaraq*) Nə üçün bikef oldun?

Ş a h s u v a r o v. Sən yuxuda mənə ağ gül verməkdə, mənim də sənə bağışladığım güldan bu cür düşüb sınmaqda...

L ə t a f ə t. Elə danışma, Ziyad. Mən qorxuram...

Ş a h s u v a r o v (*əda ilə*). Nədən qorxursan? Nə olacaqsa, olacaq...

L ə t a f ə t (*vahimə ilə*). Axı, nə ola bilər?

Ş a h s u v a r o v. Mən özümdən qorxuram, Lilya.

L ə t a f ə t. Mənə əzab vermə, Ziyad! De görüm nə olub?

Ş a h s u v a r o v. Bilirsənmi, Lilya, əgər, Sadıqov həbs edilsə, bizim evlənməyimiz baş tutmayacaq!

L ə t a f ə t. Mən, Sadıqova nə qədər nifrət etsəm də, onun tutulmağını istəmirəm. Ancaq bizim evlənməyimiz nə üçün onun işi ilə əlaqədar olsun?

Ş a h s u v a r o v. Ona görə ki, mən inzibati orqanda işləyirəm.

L ə t a f ə t. Əgər, naçalniklikdən çıxaracaqlarsa, qoy çıxarsınlar. İkimiz də gedib ayrı bir iş görərik. Eh, Ziyad! Onda mən səni indikindən də çox istəyərəm. Gündə səkkiz saat işləyib gələrik evimizə. Mən gecələr oxuyub orta məktəbi qurtararam.

Ş a h s u v a r o v. Bunlar hamısı mümkündür. Ancaq iş təkcə vəzifədən çıxarılmaqla qurtarsaydı, nə vardı ki...

L ə t a f ə t. Ayrı nə ola bilər?

Ş a h s u v a r o v. Düşmənim çoxdur, Lilya. Bir balaca büdrədimmi, məndən əl çəkməzlər!

L ə t a f ə t. Bəs, onda nə edək?

Ş a h s u v a r o v. Çalışıb Sadıqovu qurtarmaq lazımdır.

Pauza.

L ə t a f ə t. Bəlkə mən gedib Atayevə yalvarıb-yaxarım?

Ş a h s u v a r o v. Atayev doğma oğlunun da günahından keçməz.

L ə t a f ə t. Elədir.

Ş a h s u v a r o v. Atayevdənsə Cahangirə müraciət etmək daha yaxşı olardı. Bu saat bütün işlər onun əlindədir. Özü də ki, sizinlə qohum olur.

L ə t a f ə t. Yox, yox, mən ondan utanıram.

Ş a h s u v a r o v. Bu ayrı məsələ. Mən səni ürəyin istəmədiyi işə məcbur edə bilmərəm.

L ə t a f ə t. Elə demə, Ziyad. Mən sənin bir sözünlə odun, alovun içinə girərəm.

Ş a h s u v a r o v. Sağ ol, Lilya.

L ə t a f ə t. Vaxta ki, sən məsləhət görürsən, mən gedib Cahangirdən xahiş edərəm. Özü də lap bu saat.

Ş a h s u v a r o v. İndi gecdir.

L ə t a f ə t. Onda sabah...

Ş a h s u v a r o v. Ancaq idarəyə getmək yaxşı deyil.

L ə t a f ə t. Evinə getmək pis düşməz ki? Subay oğlandır.

Ş a h s u v a r o v. Mən sənə özümdən artıq inanıram, Lilya. Cahangir həmişə axşamçağları evdə olur. Saat yeddidə getsən görə bilərsən. Ancaq Sadıqov bilməsin. Köhnə fikirli adamdır. Ürəyinə yüz şey gələ bilər.

L ə t a f ə t. Yaxşı.

Ş a h s u v a r o v. Mənim atam həmişə deyərdi ki, bir işi başlama, başladın, axıra çatdır. Madam ki, sən Cahangirə ağız açırsan, çalış sözün yerə düşməsin.

L ə t a f ə t. Görək. Mənə elə gəlir ki, o mənim xatirimi istəyir.

Ş a h s u v a r o v (*gülümsəyir*). Bu gün Atayevgildə bunu mən də hiss edirdim.

Sadıqov daxil olur.

S a d ı q o v. Liliçka. Sən bizi lap pərt elədin.

Ş a h s u v a r o v. Eybi yoxdur, əşi. Məclis lap əla keçdi, Lilya, rica edirəm, mənə bir stəkan çay verəsiniz.

Lətafət o biri otağa keçir.

Ş a h s u v a r o v. Sabah axşam düz yeddinin yarısında təzə parkda olarsan. Sənə çox mühüm bir şey xəbər verəcəyəm.

S a d ı q o v. Ola bilməz ki, indi deyəsən?

Ş a h s u v a r o v. Sabah axşam düz yeddinin yarısında!

S a d ı q o v. Baş üstə.

P ə r d ə

## BEŞİNCİ ŞƏKİL

Böyük park. Sağ tərəfdə Cahangirin yaşadığı bina görünür. Parkın ortasından yol keçir. Xuduş ilə Ağasəlim dalaşa-dalaşa gəlirlər.

X u d u ş. Qəribə adamsan... Dünən yüz dəfə başa saldım ki, müstəntiq səndən bir şey soruşanda, əgər, “yox” demək lazım olsa, mən yavaşca sol çiynimi qaldıracağam, “hə” demək lazım gəlsə, sağ...

A ğ a s ə l i m. Adə, çuşqanın biri çuşqa, sən solu qaldırdın də.

X u d u ş. Çünki “yox” demək lazım idi. Müstəntiq səni dilə tutub soruşur ki, əhaliyə yardım məqsədilə şəhər qırağındakı ev sahiblərinə list dəmir satmısınızmı? Mən o saat sol çiynimi dartıram. Amma sən deyirsən “bəli, satmışıq”.

A ğ a s ə l i m. Sən öləsən, Xuduş, çaşbaş salmışam.

X u d u ş. Odur də... Mən hələ qorxuram bu danışıqda heçə-puçanın hamısını açıb tökəsən ortalığa...

A ğ a s ə l i m. Adə, yeri, maymaq özünsən.

X u d u ş. Amanın bir günüdür, Ağasəlim, sərhesab ol. Özü də həmişə “bəli”, “xeyr”lə.

A ğ a s ə l i m. Niyə, nə olub bəyəm? O kimdir ki?

X u d u ş. A balam, necə kimdir? Müstəntiqdir. Acı danışarsan, tutar basar dama də...

A ğ a s ə l i m. Ölmüşdü Ağasəlim!

X u d u ş. Lənət sənə, şeytan! Yəni, bu, qoçaqlıq yeridir?

S a d ı q o v (*gəlir*). Nə olub yenə? Niyə boğuşursunuz?

X u d u ş. Deyirəm, qardaş, siyasətin olsun, müstəntiqlə qaba danışma, başlayıb...

S a d ı q o v. Doğrudur. İndi adamlardan mədəniyyət tələb olunur. Bax, yenə də qalstuk bağlamamısan.

A ğ a s ə l i m. Vallah, Sadıqov qardaş, qalstuk bağlayanda az qalır bağrım çatlasın.

S a d ı q o v. Öyrənmək lazımdır. Qalstukun olmasa, deyəcəklər mədəniyyətsizdir. Bu da sənin işinə təsir edəcək. Başa düşdün?

A ğ a s ə l i m. Bəli, onu başa düşməyə nə var ki!

S a d ı q o v. Mənim atam, babam şlyapa qoymuşdu? Ya elə bilirsiniz bu çalağan yuvasından çox xoşum gəlir? Zəmanənin tələbidir... (*Xuduşa*) Sən də çox əzilib-büzülmə! Özünü tox tut! İnsanın ən güclü müdafiə vasitəsi cəsarətdir! Bir işi tutma, tutdunmu, qorxma!

Qabağındakının gözünün içinə dik bax! Özünün haqlı olduğuna inan! Onsuz da, qorxaqlıq səni xilas etməyəcək.

A ğ a s ə l i m. A balam, niyə qorxursan axı? Şükür Allaha, anbarımızdan əskiyimiz çıxmayıb, bir şey olmayıb. Özümüz də Sadıqov qardaşdan iki dəfə təşəkkür almışıq.

S a d ı q o v. Hələlik o barədə danışmaq lazım deyil. Yeri gələndə mən deyərəm. Bilirsiniz, Xuduş demişkən, siyasət lazımdır. Biz gərək özümüz özümüzü yox, bir-birimizi tərifləyək. Bir-birimizin avtoritetini qaldıraq.

A ğ a s ə l i m. Məsələn, biz sizin avtoritetinizi necə qaldıraq, Sadıqov qardaş?

S a d ı q o v. Əslinə baxsanız, heç mənim buna ehtiyacım da yoxdur. Ancaq yenə də işimizin xatirinə deyərsiniz ki, Sadıqov yoldaş həmişə bizə öyüd-nəsihət verir ki, xalqa sədaqətlə qulluq eləyək. Düz olaq.

A ğ a s ə l i m. Niyə demirik? Lap üstünə beşini də qoyub deyərik.

S a d ı q o v. Çox da şişirtmək lazım deyil. Ağlınız özgəsinə getməsin. Bu müstəntiq tükü tükdən seçəndir.

X u d u ş (*pıçıltı ilə*). Şahsuvarova bir şey boyun olmusan?

S a d ı q o v. Nə boyun olacağam? Elə bizim qazandığımızın yarısı onun deyil?

A ğ a s ə l i m. Siz öləsiniz, zalım oğlu məni lap süngə çəkdi. Özünün də azla işi yoxdur.

S a d ı q o v. Bağırma! Verməsən, almazsan. İyirmi əngəlinin üstünü basdırıb.

A ğ a s ə l i m. Atası xeyrinə eləməyib ki! (*Hirslənir*) Sən öləsən, onu-munu bilmirəm. Bir köməyi dəyməsə, hamısını açıb deyəcəyəm. Çolaq oğlu Ağasəlimi hərif hesab eləmək olmaz!

S a d ı q o v. Adə, yaxşı, adə, onu bil ki, indiyə qədər onların sayəsində azad gəzirsən, yoxsa, çoxdan damdaydın.

X u d u ş. Düzdür, qardaş, düzdür. Adam gərək tanrısına təpik atmasın!

S a d ı q o v. Yaxşı, siz gedin, mənim burda mühüm bir adamla görüşüm var.

X u d u ş. İşin xeyrinədir?

S a d ı q o v. Hesabla gərək xeyrinə olsun. Görək...

Xuduş ilə Ağasəlim başqa səmtə, Sadıqov isə başqa səmtə gedərək, bağın dərinliklərində yox olurlar. Bir azdan Cahangirlə Reyhan gəlirlər.

R e y h a n. Bu da sənin evin...

C a h a n g i r. Gedək qonağım ol...

R e y h a n. Sağ ol. Burada yoldaşım var, onlara gedəcəyəm.

C a h a n g i r. Qoy onda səni ötürüm.

R e y h a n. Lazım deyil. Evləri yaxındadır.

C a h a n g i r. Elə isə, xudahafiz.

R e y h a n. Nə üçün məndən belə tez ayrılmaq istəyirsən?

C a h a n g i r (*onun əlindən tutaraq*). İncimə, Reyhan. Bu saat fikirlərim alt-üstdür.

R e y h a n. Hiss edirəm. Bayaqdan telefonda da çox bikef danışırdın.

C a h a n g i r. Sən zəng vuranda mən Sadıqovun adamlarını istintaq edirdim.

R e y h a n. Qurtardınmı?

C a h a n g i r. Hələ yox. (*Pauza*) İşin kökü çox dərinlərə gedir, Reyhan. Qorxuram bizim hər ikimiz üçün ağır olan əhvalat meydana çıxsın.

R e y h a n. Mən isə qorxmuram! Yara nə qədər tez üzə çıxsa, bir o qədər yaxşıdır! Sən hər bir şeyi aydınlaşdırmısanmı?

C a h a n g i r. Hələ tamamilə aydınlaşdıra bilməmişəm. Bəzi məsələləri təkrar-təkrar yoxlamaq istəyirəm.

R e y h a n. Mən də, hələlik, səndən heç bir şey soruşmuram, Cahangir. Ancaq xəstə kim olursa-olsun, yaxşı cərrahın əlində bıçaq titrəməməlidir! Sağ ol! Axşam sənə zəng edəcəyəm.

C a h a n g i r. Gözləyəcəyəm.

Reyhan gedir. Cahangir onun ardınca xeyli baxır. Sonra qayıdıb evə keçir. Müxtəlif tərəflərdən gələn İldırım Atayevlə Mehrican qabaqlaşırlar.

M e h r i c a n. Salam.

İ l d ı r ı m A t a y e v. Salam.

Pauza.
Hər ikisi həyəcan içindədir.

İ l d ı r ı m A t a y e v. Niyə siz dünən elə gözlənilmədən çıxıb getdiniz?

M e h r i c a n. Dayanmaq mənim üçün çətin idi.

İ l d ı r ı m A t a y e v. Mən bilmək istəyirəm, bütün bunlar doğrudanmı həqiqətdir?

M e h r i c a n (*cəsarətlə*). Mən sizin yolunuzu çoxdan gözləyirdim.

İ l d ı r ı m  A t a y e v. Necə? Məgər, siz məni əvvəllər tanıyırdınız?

M e h r i c a n. Xeyr. Tanımırdım. Ancaq bilirdim ki, bir gün siz gələcəksiniz. (*Qısa pauza*) Siz mənim xəyalımda yaşayırdınız.

İ l d ı r ı m  A t a y e v. Təşəkkür edirəm. Min dəfə təşəkkür edirəm! (*Qısa pauza*) Rica edirəm, öz qəlbinizi təkrar-təkrar yoxlayın. Unutmayın ki, mənim gəmim bir dəfə daşa toxunub.

M e h r i c a n. Mən bunu bilirəm.

İ l d ı r ı m  A t a y e v (*həyəcanla*). Elə isə deyin. Tamamilə bitərəf bir adam kimi deyin, mən sizin məhəbbətinizə layiqəm?

M e h r i c a n (*gərgin bir təbəssümlə*). Sevənlər bitərəf adamlar kimi danışa bilməzlər.

İ l d ı r ı m  A t a y e v. O... Siz mənim düşündüyümdən də ağıllısınız. (*Pauza*) Lakin yox! Mən, həyatımda cəmi iyirmi dörd bahar görmüş sizin kimi bir qızın otuz doqquz yaşlı, saçları ağarmış bir adamla həyat yoldaşı olmasını rəva görmürəm! Bu mümkün deyil! Sizin gəncliyiniz mənim üçün öz səadətimdən min dəfə qiymətlidir! (*Pauza*) Niyə susursunuz?

M e h r i c a n (*gülümsəyərək*). Mənim bir qəlbim var idi, onu da sizə açdım. Başqa nə deyə bilərəm ki? Sağ olun. (*Sürətlə uzaqlaşır*).

İ l d ı r ı m  A t a y e v (*tək*). Bu mümkündürmü? (*Fikirli halda gedir*)

Şahsuvarovla Sadıqov gəlirlər.

S a d ı q o v. Bu gecə səhərə qədər gözümə yuxu getməyib.

Ş a h s u v a r o v. Səbr elə, bu dəqiqə hər şeyi öz gözünlə görərsən!

S a d ı q o v. Qəribədir.

Ş a h s u v a r o v. Doğrudan da, çox qəribədir...

S a d ı q o v. Ürəyim lap darıxdı.

Ş a h s u v a r o v (saatına baxaraq). Bu ağacın dalına çəkil.

S a d ı q o v. İ... i... lap qəribənin qəribəsidir.

Lətafət tələsik addımlarla gəlib, Cahangirin evinin artırmasına çıxır.

S a d ı q o v. İ... i... bu Liliçka deyil?

Ş a h s u v a r o v. Məncə, özüdür.

S a d ı q o v. Hara gedir?

Ş a h s u v a r o v. Görmürsünüz?

S a d ı q o v. Axı, onun Cahangirin evində nə işi var?

Ş a h s u v a r o v. Əri sənsən!

S a d ı q o v. Əgər, mənəmsə, mən bilmirəm. İ... i... odur, zəngi basdı. Qapı açıldı. Liliçka girdi içəri... İ... i... qapı örtüldü. Yurdun kor qalsın, Məşədi Kərim, bu nə işdir? Mənim arvadımın bu vaxt subay oğlanın evində nə işi var?

Ş a h s u v a r o v. Dayan! Qışqır-bağır salma! Dünən mənim adamlarım xəbər gətirdilər ki, Lətafət hər axşam gəlir Cahangirin mənzilinə!

S a d ı q o v (*başına vurur*). Hər axşam?

Ş a h s u v a r o v. Mən əvvəl inanmadım. Elə ki, dünən gəlib indiki kimi öz gözlərimlə gördüm...

S a d ı q o v. Ax, namərd arvad! Mən səni brilyantlara qərq edirəm, sən də mənim başımı yerə soxursan?!

Ş a h s u v a r o v. Bura bax, bəlkə özün göndərmisən?

S a d ı q o v. Əşi, sən məni binamus-zad hesab edirsən?

Ş a h s u v a r o v. Dedim, bəlkə minnət-filan üçün...

S a d ı q o v. Sən öləsən, yox!

Ş a h s u v a r o v. Elə isə, daha şübhə yeri yoxdur.

S a d ı q o v. Kor-kor, gör-gör.

Ş a h s u v a r o v. Səni dolaşdırıb tutmaq istəməsi də elə bununla əlaqədardır...

S a d ı q o v. Düz deyirsən.

Ş a h s u v a r o v. İndi burada ağılla hərəkət etmək lazımdır. Bildinmi? Fərqi yoxdur, sən biabır olmusan! Çünki bu əhvalatı indi bütün şəhər danışır... Ona görə də, xışı dərindən götürmək lazımdır. Cahangiri ifşa etmək üçün tale özü sənin əlinə fürsət vermişdir!

S a d ı q o v. İndi mən nə edim?

Ş a h s u v a r o v. Bu dəqiqə get gir içəri, bir tufan qopar ki, göy üzü tutulsun!

S a d ı q o v. Sonra?

Ş a h s u v a r o v. Sonrası ilə sənin işin olmasın! Ancaq məni orada görəndə özünü elə aparırsan ki, guya, mənim bu əhvalatdan heç bir xəbərim yoxdur.

S a d ı q o v. Başa düşürəm.

Ş a h s u v a r o v. Di tərpən! Unutma ki, boran nə qədər tez gəlsə, canavarın işi o qədər asan olar.

S a d ı q o v. Ancaq sən gecikmə.

Ş a h s u v a r o v (*qəzəbli halda*). Vaxt keçir!

Sadıqov Cahangirin evinə tərəf gedir. Şahsuvarov harasa yüyürür.

P ə r d ə

## ALTINCI ŞƏKİL

Cahangirin evi. Yuxarı tərəfdə böyük kitab rəfi qoyulub. Ortada ağ örtüklü stol var. Divan, radioqəbuledici, telefon. Arxa pəncərədən əlvan rənglərə boyanmış qürub görünür... Lətafət və Cahangir. Lətafət dərin həyəcan içindədir.

C a h a n g i r. Demək, siz buraya Sadıqovun işi üçün gəlmisiniz?

L ə t a f ə t (*həyəcanla*). Bəli.

C a h a n g i r. Görünür, ərinizi çox istəyirsiniz.

Lətafət yerində səbrsiz hərəkətlər edir. Pauza.

C a h a n g i r. Niyə dinmirsiniz?

L ə t a f ə t. Məsələ istəməkdə deyil...

C a h a n g i r. Bəs nədədir? (*Pauza*) Əlbəttə, ərinizdir.

L ə t a f ə t (*hövsələdən çıxaraq*). Rica edirəm, bu sözü çox təkrar etməyəsiniz.

C a h a n g i r. Əgər, siz Sadıqovu bir ər kimi sevmirsinizsə, niyə onun minnətini edirsiniz? Yoxsa, bu qiymətli daş-qaşlarınızdan ayrılmaq istəmirsiniz?!

L ə t a f ə t (*ağlamsınmış halda*). Nə üçün siz mənə belə sözlər deyirsiniz? Mən sizdən kömək istəməyə gəlmişəm.

C a h a n g i r. Mən sizin xahişinizin mənasını bilməliyəm. Elə deyilmi? (*Pauza*) Ona görə də təkrar soruşuram. Əgər, siz ərinizi sevmirsinizsə, nə üçün onun işini öz taleyinizlə əlaqədar hesab edirsiniz? (*Pauza*) Bəlkə o özü sizi bura göndərib?

L ə t a f ə t. Mənim bura gəlməyimdən onun xəbəri yoxdur.

C a h a n g i r. Bəlkə siz onu doğru yola qaytarmaq, öz həyatınızı yenidən qurmaq istəyirsiniz? (*Pauza*) Bəlkə siz ona acıyırsınız?

L ə t a f ə t. Xahiş edirəm, soruşmayın. Əgər, qəlbinizdə mənə qarşı zərrə qədər də mərhəmət varsa, Sadıqovun qurtarmasına çalışın. (Ağır pauza)

C a h a n g i r. Deyirsiniz sizin bura gəlməyinizdən Sadıqovun xəbəri yoxdur?

L ə t a f ə t. And içirəm ki, xəbəri yoxdur!

C a h a n g i r (*sərt*). Elə isə, düzünü deyin, sizi bura kim göndərib?

L ə t a f ə t (*hərarətlə*). Heç kim, özüm gəlmişəm. (*Pauza*)

C a h a n g i r. Yadınızdadırmı, dünən xalanızgildə mən sizdən soruşdum ki, niyə həmişə bikef görünürsünüz. Mən bu sualı təsadüfi vermirdim. Mən hiss edirdim ki, siz nədənsə narazısınız. Ürəyinizi bir dost, bir yoldaş kimi mənə açın. Mən sizə, şəxsən sizə hər cür köməyə hazıram! Bəlkə bir çətinlik içindəsiniz? Bəlkə bir məsləhətə möhtacsınız? (*Pauza. Lətafət tərəddüd və iztirab içində susur*) Əgər, bu bir sirdirsə, ikimizin arasında qalacağına namusla söz verirəm!

L ə t a f ə t (*ağlayır*). Yox... bacarmıram... mümkün deyil...

C a h a n g i r. O zaman mən sizə nə deyə bilərəm...

L ə t a f ə t. Siz Sadıqova kömək etmək istəmirsiniz?

C a h a n g i r. Sadıqov cinayətkardır, Lətafət xanım!

L ə t a f ə t. Bəs, onda mən nə etməliyəm?

C a h a n g i r. Təəssüf ki, siz mənə ürək qızdırıb, gəlişinizin əsl səbəbini açıb söyləmədiniz. Bəlkə də, mən sizə nə etmək lazım olduğunu deyə bilərdim.

Qapının zəngi vurulmadan Sadıqov içəri daxil olur. Pauza.

S a d ı q o v (*Lətafətə*). Sən burada nə gəzirsən?

L ə t a f ə t. Onun sənə dəxli yoxdur!

S a d ı q o v (*qışqırır*). Necə dəxli yoxdur? Bəs, mən sənin ərin deyiləm?!

L ə t a f ə t. Ər!

S a d ı q o v. Yoxsa yalandır?! (*Cahangirə*) Sən cavab ver görüm, mənim cavan arvadımın sənin evində nə işi var?

C a h a n g i r. Qışqırmayın, mən kar deyiləm!

S a d ı q o v. Mən də sən deyən ərlərdən deyiləm! Cavab ver! Yoxsa, bu saat yerin altını üstünə çevirəcəyəm!

L ə t a f ə t. Bura mən özüm gəlmişəm, onun xəbəri yoxdur, bildinmi?

S a d ı q o v. Xeyr! Elə nömrələr işə keçməz! Cavab verin! Hər ikiniz cavab verin!

Şahsuvarov bir nəfər leytenantla daxil olur.

Ş a h s u v a r o v. Bu nə səs-küydür, canım? Leytenantla küçədən keçirdik, eşidib dedik, görəsən, nə olub?

S a d ı q o v. Nə olacaq?! Xalqın hüququnu, namusunu yaxşı qorumursunuz. Kişinin özünü dolaşdır, arvadını isə, çək gətir evinə?

Ş a h s u v a r o v (*əli ilə onun ağzını tutaraq*). Yavaş! Qışqırma! Küçədən keçənlər eşidərlər.

S a d ı q o v (*qışqırır*). Qoy eşitsinlər! Qoy görsünlər ki, namuslu şəxslərin başına nə oyun açırlar!

L ə t a f ə t. Ax... Bilsəydin ki, mən sənə nə qədər nifrət edirəm?!

S a d ı q o v. Hə? Belə?! Yaxşı, o necə olur ki, Sadıqovun daş-qaşları ilə bəzənirsən, amma özünə nifrət edirsən?! Hə?!

Lətafət boyunbağısını, saatını, üzüklərini qoparıb onun başına çırpır.

L ə t a f ə t. Al!

S a d ı q o v. İ... i... yavaş, yavaş! Nə qayırırsan? Dağıtma!

Lətafət sürətlə çıxır. Pauza. Sadıqov yerə tökülmüş daş-qaşları yığışdırır.

Ş a h s u v a r o v (*Sadıqova*). Sən də qəribə adamsan. Nə olar, adam adamın evinə gələr də.

S a d ı q o v. Nə münasibətlə? Mən ona demişdim?!

Ş a h s u v a r o v. Yaxşı, yaxşı, ayıbdır.

S a d ı q o v. Ayıb-zad qanmıram. Xahiş edirəm, bu saat oturub bizim bu davamız haqqında akt yazasınız.

Ş a h s u v a r o v. Burax, canım! Bu sizin üçün də, yoldaş Cahangir üçün də yaxşı olmaz!

C a h a n g i r (*Şahsuvarova*). Rica edirəm, siz mənim qayğıma qalmayasınız!

Ş a h s u v a r o v (*gülümsəyir*). Görünür, bu vəziyyətin sizin üçün nə demək olduğunu başa düşmürsünüz.

C a h a n g i r. Əksinə! Bu əhvalatın nə demək olduğunu mən sizdən daha aydın hiss edirəm.

S a d ı q o v. Yoldaş Şahsuvarov, onu bilin ki, siz aktı yazmasanız da, mən bu işi lap bu saat hər yerə... hər yerə xəbər verəcəyəm!

(*Qışqırır*) İşin üstünü basdırmağınız üçün sizin özünüzdən də şikayət edəcəyəm...

C a h a n g i r. Sadıqov! Lətafət buraya siz düşünən mənada gəlməmişdir. Əgər, buna inanmırsınızsa, gedin, nə bilirsiniz edin! İndi isə, rədd olmaq üçün sizə bir dəqiqə vaxt verirəm!

S a d ı q o v. Dayan... Dayan... Bəs, Liliçka bura nə üçün gəlmişdi?

C a h a n g i r (*qapını göstərərək*). Çıxın!

S a d ı q o v (*Şahsuvarovun üzünə baxır*). Bəs akt? (*Şahsuvarov çıxmasına him eləyir. Cahangirə*) Neynək, çıx deyirsən çıxaram. Ancaq onu bil ki, mən namus üçün hər bir şeyə hazıram. (*Çıxır*)

P ə r d ə

## YEDDİNCİ ŞƏKİL

Qapının zəngi çalınır. Dilşad o biri otaqdan gəlib qapını açır. Zabitə daxil olur.

Z a b i t ə. Salaməleyküm.

D i l ş a d. Salam. Nə olub, Zabitə?

Z a b i t ə. Nə olacaq, Ağasəlimi də, Xuduşu da tutdular.

D i l ş a d. Nə vaxt?

Z a b i t ə. Bir az bundan qabaq... Heç bilmirəm neyləyək? Yazıq uşağın barı bir təqsiri ola, adamı yandırmaz.

D i l ş a d. Uşaq kimdir?

Z a b i t ə. Bizim başıküllü Ağasəlimi deyirəm də. Qızılı ayağının altına töksən, gözünün ucu ilə baxmaz!.. Di gəl ki, bəxti yoxdur... (*Yavaş səslə*) Bacı canı, elə Şahsuvarov özü də Ağasəlimə qardaş kimiydi. Di gəl ki, indi üzü yaman dönüb... Elə bil, heç o Şahsuvarov deyil. Bu gün idarəsinin qabağında nə qədər dayandım, məni qəbul eləmədi.

D i l ş a d. Onda təqsir yoxdur, Zabitə, qorxur. Bu saat şəhərdə böyük komissiya işləyir...

Z a b i t ə. Güman yerimiz sizsiniz, Dilşad xanım, gərək bir təhər çəkəsiniz. Axı, siz neçə adamı bu cür çətinliklərdən qurtarmısınız...

Xosrov Atayev əsəbi halda daxil olaraq Zabitənin son sözlərini eşidir... Zabitə özünü yığışdırır.

Z a b i t ə. Salaməleyküm.

Atayev cavab verməyərək, şlyapasını çıxarıb asır.

D i l ş a d (*Zabitəyə işarə edərək*). Yaxşı, ay qız, sabahda-zadda gələrsən söhbət edərik...

Z a b i t ə. Neynək... Neynək... (*Çıxır*)

X o s r o v A t a y e v (*sərt*). Bu kimdir?

D i l ş a d. Belə nə üçün soruşursan? Adamdır, mənim yanıma gəlib.

X o s r o v A t a y e v. Mən onun sənə dediyi axırıncı sözləri eşitdim...

D i l ş a d. Nə olsun?

X o s r o v A t a y e v. Yadındadırmı, bir dəfə sən bir adam haqqında məndən xahiş etmişdin... O zaman mən də səndən təvəqqe eləmişdim ki, bir də elə işlərə qarışmayasan?!

D i l ş a d. Mən sənin üçün evdə oturub bozbaş bişirən arvadlardan deyiləm! Mən də sənin kimi bir vətəndaşam!

X o s r o v A t a y e v. Doğrudur, ancaq vətəndaşın borcu xalqı müdafiə eləməkdir, ona xəyanət edənləri yox! Sən nə haqla prokurora zəng edib oğruları, quldurları təmizə çıxarmağı ona təklif edirsən?

D i l ş a d. Mənim yeznəmin heç bir təqsiri yoxdur!.. Bu Cahangir kimi stolbazların özlərini gözə dürtmək üçün düzəltdikləri fitnədir!

X o s r o v A t a y e v. Sən bunu sübut edə bilərsənmi?

D i l ş a d. Bunu sübut etmək sənin borcundur. Mən sənin arvadınam! (*Pauza*.) İldırım ayağını qapıya qoyan kimi, mən bildim ki, evdə yenə bir tufan qopacaq...

X o s r o v A t a y e v (*dərin bir kədər içində*). İldırım haqlı imiş.

D i l ş a d (*odlanaraq*). Əlbəttə, haqlı olar! Çünki sənin qardaşındır. Mən isə yad qızıyam... Amma bu on ildə gecə-gündüz sənin qulluğunda duran, sənə yanan mən olmuşam, qardaşın yox! Sənin çətin günlərinə mən dözmüşəm... (*Ağlayır*) Mən səndən savayı bir kişiyə gözümün ucu ilə baxmamışam.

X o s r o v A t a y e v. Yaxşı, sakit ol...

D i l ş a d (*ağlayır*). Mən elə güman etmişəm ki, sən məni istəyirsən... Amma indi baxıb görürəm ki, bəd ayaqda yenə qardaşın yaxşı olur, mən pis! Haqqın var... yaşı qırxa çatan sonsuz bir arvad daha sənin nəyinə lazımdır...

X o s r o v  A t a y e v. Ağlama!

D i l ş a d (*ağlayır*). Mənim oğlum-qızım olsaydı, qohum-əqrəbam olsaydı, xətrim əziz olardı... Amma indi... yiyəsiz, kimsəsiz... (*Ürəyi xarab olur. Xosrov Atayev təlaş içində ona dərman içirdir. Nəhayət, Dilşad özünə gəlir*)

X o s r o v  A t a y e v (*onun əlindən tutaraq*). Dilşad!

D i l ş a d. Yaxşı... Bağışla...

Pauza.

Dilşad saçlarını düzəldir. Sadıqov həyəcanlı halda daxil olur. Xosrov Atayev onun gəlişindən narazı halda o biri otağa keçir...

D i l ş a d. Nə olub? Niyə belə tövşüyürsən?

S a d ı q o v. Liliçka belimi sındırdı... Məni dost-düşmən yanında xar elədi...

D i l ş a d. Necə? Necə?

S a d ı q o v. Yarım saat bundan qabaq bir nəfər şəxs məni aparıb düz müstəntiqin evinin qapısına. İçəri girib nə görmüşəm?! Liliçka ilə Cahangir əyləşiblər qabaq-qabağa. Deyirəm, balam, sən mənim arvadımsan, burada nə işin var? Deyir, onun sənə dəxli yoxdur. İndi başlayıb ki, daha səninlə yaşamıram. Şeylərini yığışdırır ki, çıxıb getsin. (*Kövrəlir*) Dərdimi götürüb sizin yanınıza qaçmışam.

D i l ş a d. A kişi, sən dəli olmusan, nədir, bu nə sözlərdir danışırsan?

S a d ı q o v. Yaxşı ki, Şahsuvarov özü də gəlib əhvalatın üstünə çıxdı. Yoxsa, elə deyərdim ki, dəli olmuşam. Ax, belə iş olar? Siz Allah, bircə gedin, Liliçkanı qoymayın çıxıb getsin...

D i l ş a d (*qəzəblə*). Qoy hara cəhənnəm olub gedir-getsin.

S a d ı q o v. Sevirəm. Əl çəkə bilmirəm... (*Gözünün yaşını silir*)

D i l ş a d. Yaxşı, yaxşı, yekə kişisən!

Şahsuvarov gəlir.

D i l ş a d. Bu nə məsələdir, Ziyad?!

Ş a h s u v a r o v. Heç soruşmayın, Dilşad xanım... Bütün şəhərdə biabır olmuşuq. (*Sadıqova*) Axı, mən sənə dedim ki, səs-küy qaldırıb aləmə bildirmə...

S a d ı q o v. Canım, axı, mən necə susaydım?

Ş a h s u v a r o v. Biabırçılıqdır.

D i l ş a d. Bəs, niyə Lilyadan soruşmadınız ki, bu subay oğlanın evində nə gəzirsən?

Ş a h s u v a r o v. Açıq danışdığım üçün üzr istəyirəm... Mən içəri girəndə onların ikisi də özlərini elə itirmişdilər ki, artıq bir kəlmə izahata ehtiyac yox idi.

D i l ş a d (*qəzəblə*). Ay ləçər!

Ş a h s u v a r o v. Əgər, məsələni dərindən götürsəniz, mən bu işdə Lilyanı təqsirləndirmirəm... Sadıqov da məni bağışlasın. Lilya əlli beş yaşlı kişiyə getmiş gənc, gözəl bir qadındır.

D i l ş a d. Bütün günah Cahangirdədir!

S a d ı q o v. Tamamilə haqlısınız. Doğrudan da... Əgər, sən – müstəntiq məni xalqa, dövlətə xəyanətdə təqsirləndirirsənsə, onda, icazə ver soruşum ki, mənim arvadımın sənin evində nə işi var?

Sadıqov "ah" çəkir.

D i l ş a d. Deməli, bir tərəfdən Xosrov Atayevin qızını almaq istəyir... O biri tərəfdən də...

Ş a h s u v a r o v. İnsan nə qədər avantürist olmalıdır ki, bu cür işlər tutsun...

D i l ş a d. Mən deyəndə Reyhan xanım az qalırdı hirsindən çatlaya. Qoy indi eşitsin, ləzzət aparsın. (*Şahsuvarova*) Siz müstəntiqin bu dözülməz hərəkəti barədə prokurora yazdınızmı?

Ş a h s u v a r o v. Mən onu biabır etmək istəmədim. Nə qədər olsa, camaat onu Atayevin qızının nişanlısı hesab edir.

D i l ş a d. Sən qəribə söz danışırsan, Ziyad! Deməli, Cahangiri müstəntiq qoyublar ki, xalqın cavan arvadını yoldan çıxarıb, evini dağıtsın, özünü də dolaşdırıb həbsə alsın?

Ş a h s u v a r o v. Ona görə də, gəlmişəm yoldaş Atayevlə danışım, görək nə etmək lazımdır.

D i l ş a d. Get danış! Qoy, hamıya nümunə göstərdiyi cavan oğlanın əslində kim olduğunu bilsin!

Şahsuvarov o biri otağa keçir.

S a d ı q o v. Siz Allah, bircə gedin Liliçkanı qoymayın çıxıb getsin. Mən sonra onu geri qaytara bilmərəm.

D i l ş a d. O məndən icazəsiz heç yerə gedə bilməz.

Reyhan daxil olur.

R e y h a n. O... Sadıqov... Siz burdaymışsınız...

S a d ı q o v. Necə məyər?

R e y h a n. Heç... dedilər siz bir az bundan qabaq bizim yeni parkda qəribə bir komediya oynayırmışsınız.

S a d ı q o v. Yıxılana gülməzlər, Reyhan xanım!..

R e y h a n. Nə üçün yıxılırsınız, sizin ki, əliniz böyüklərin ətəyindədir...

S a d ı q o v. Yoxsa, siz mənim gedib öz gözlərimlə gördüklərimə inanmırsınız?

R e y h a n. Siz hər kimə inanırsınız inanın, ancaq öz gözlərinizə yox...

S a d ı q o v. Qəribədir. Nə üçün axı?

R e y h a n. Çünki sizin gözləriniz qaradan başqa ayrı bir rəng seçmir!

D i l ş a d. Sənin seçdiyin oğlanı gördük...

R e y h a n. Əgər, Cahangir hamının xoşuna gələn bir oğlan olsaydı, daha mən niyə onu sevirdim ki!

D i l ş a d. Sən bu istehzalarına son qoyacaqsan, ya yox?

R e y h a n. Təəccüb edirəm... Nə üçün siz həqiqəti istehza kimi başa düşürsünüz?!

D i l ş a d. Sənin yerinə ayrı qız olsaydı, utandığından heç kimin üzünə baxa bilməzdi...

R e y h a n. Böyüklərdən nümunə götürmək borcumuzdur. Siz ki, hamının üzünə şax baxırsınız?!

D i l ş a d (*qışqırır*). Həddini keçmə!

R e y h a n. Siz nə danışırsınız, Dilşad xanım... Əgər, biz hədləri vurub keçməsəydik, bu qədər böyük işlər görə bilərdikmi?

D i l ş a d. Bu xarabadan baş götürüb getməkdən başqa ayrı çarə yoxdur...

Cahangir gəlir... Gərgin pauza... Dilşad əsəbi halda o biri otağa keçir,
Sadıqov da onu təqib edir.

C a h a n g i r. Deyəsən, mən bu dəfə çağırılmamış qonaq oldum... Sən bir saat bundan qabaq baş vermiş əhvalatı bilirsənmi?

R e y h a n. Bilirəm. Hamısını bilirəm... (*Onun əlindən tutaraq*) Mənim əzizim, gəl əyləş... Mən səni ilk dəfə gördüyüm o konsert axşamı birlikdə qulaq asdığımız “Yasəmənlər açılanda” sonatasını çalmaq istəyirəm...

Cahangiri çəkərək öz yanında oturdur, coşğun bir ruhla çalmağa başlayır...

R e y h a n. Niyə bikefsən? Yoxsa, hörümçəklərin toru səni təşvişə salmışdır?

C a h a n g i r. Hörümçəklər öz torlarının uclarını bəzən elə yerlərə bağlayırlar ki...

R e y h a n (*əl saxlayaraq*). Nə olub, Cahangir?

C a h a n g i r. Bu gün mənim həbsə aldığım adamlar sizin ailənizdən danışırdılar. Hətta, onlardan Ağasəlim adlı birisi çığır-bağır salıb iddia edir ki, Sadıqovun evində Dilşad xanıma neçə min qiyməti olan bir brilyant üzük vermişdir.

R e y h a n (*ayağa qalxaraq*). Demək, mənim çoxdan gözlədiyim fırtına artıq başlamışdır.

C a h a n g i r. Əgər, sən bir şey hiss edirdinsə, nə üçün atanı vaxtında xəbərdar etmirdin? Axı, mən əminəm ki, bu işlərin heç birindən onun xəbəri yoxdur.

R e y h a n. Mən atamı vaxtında xəbərdar etdim. Lakin o mənim sözlərimi ögey ana ilə övlad arasında olan bir narazılıq kimi başa düşərək əhəmiyyət vermədi. O zaman mən də bütün əhvalatı İldırım əmimə yazdım və xahiş elədim ki, şəxsən özü bura gəlsin.

C a h a n g i r. Aha, demək, sən yazmısan?!

R e y h a n. Mən atamın başı üzərində hərlənən qara buludları gördüm. Sevdiyin bir adamın uçuruma doğru getdiyini görüb, ona bir kömək edə bilməməkdən də ağır dərd varmı?

Pauza.

C a h a n g i r. Mən sənə təsəlli üçün söz tapa bilmirəm, Reyhan. İstintaq zamanı hər dəfə sizin familiyanızı protokola yazdıqca elə bilirdim ürəyimə tikan batır. Bizim ən xoşbəxt vaxtımızda birdən-birə belə hadisəyə rast gəlmək!

R e y h a n. Deyirlər mənim anam çox nəcib bir qadınmış.

C a h a n g i r. Eşitmişəm.

R e y h a n. Atam gərək onun xatirəsinə layiq qadınla evlənəydi...

C a h a n g i r. Doğrudur!

Mehrican əlində bir dəstə yasəmən gəlir.

M e h r i c a n. Nə üçün belə kədərlisiniz? Heç ilin bu vaxtında da bu cür qəmgin olmaq olarmı? Bağçaya girəndə təzə açılmış yasəmənlərin ətri insanı bihuş edir. Eşidirsinizmi, sarıköynək oxuyur.

R e y h a n. Sən qızdırmalı adamlara oxşayırsan, Mehrican. Xəstə deyilsən ki?

M e h r i c a n. Xəstə? (*Gülür*) Əksinə!.. Mən indi özümü hər zamankından gümrah hiss edirəm. Mənə elə gəlir ki, bu saat dağı dağ üstünə qoya bilərəm. Bilirsinizmi, kədər – məğlubiyyət əlamətidir. Mən isə, güclü insanları sevirəm! (*İldırım Atayev gəlir. Mehrican əlindəki yasəmənlərdən birini ona verir*) Buyurun, mən bunu sizin səkkiz il bundan qabaq əkmiş olduğunuz ağacdan qoparmışam.

İ l d ı r ı m  A t a y e v. Təşəkkür edirəm.

Qısa pauza.

C a h a n g i r. Dedilər ki, siz məni görmək istəyirmişsiniz.

İ l d ı r ı m  A t a y e v. Bəli. Yəqin ki, qızlar bizi bir-iki dəqiqəliyə bağışlayarlar.

M e h r i c a n. Buyurun.

İldırım Atayevlə Cahangir o biri otağa keçirlər.

Pauza.

R e y h a n. Sənə nə oldu, Mehrican? Gözlərin nə üçün dolub?

M e h r i c a n (*göz yaşları arasından gülümsəyərək*). Görürsən, özümü saxlaya bilmədim. Nə qədər olsa, qadın qadındır. Gedək bağçaya. Burada hava azdır.

R e y h a n. Gedək. (*Onlar qol-qola çıxırlar*)

Pauza.

İldırım Atayevlə Cahangir gəlirlər.

C a h a n g i r. Siz bağçaya enmək istəmirsiniz?

İ l d ı r ı m  A t a y e v. Yox, siz gedin. (*Zarafatla*) Bahar gəncliyindir.

C a h a n g i r. Guya ki, siz qocalmısınız. Yaxşı, hələlik.

İldırım Atayev pəncərəyə söykənərək, bağçaya tamaşa edir. Sonra dərin kədər içində o biri otağa keçir. Səhnə bir an boş qalır. Sonra Dilşad gəlib böyük şkafdan nə isə götürür və bu zaman Lətafət əlində çamadan daxil olur.

D i l ş a d. Bu nədir? Hara yığışırsan belə?

L ə t a f ə t. Evdən çıxmışam...

D i l ş a d. Niyə?

L ə t a f ə t. Onunla yaşamaq istəmirəm.

D i l ş a d. Hə?! (*Pauza*) De görüm Cahangirin evində sənin nə işin var idi? (*Pauza*) Niyə cavab vermirsən?

L ə t a f ə t. Sən məndən nə istəyirsən?

D i l ş a d. Canına dərd istəyirəm, gözünə də ağ. Bildinmi? Bu saat qayıt get evinə!

L ə t a f ə t. Getməyəcəyəm.

D i l ş a d. Sənə deyirəm bu dəqiqə qayıt!

L ə t a f ə t. Ölsəm də qayıtmaram!

D i l ş a d. Necə? Mənimlə söz güləşdirirsən? (*Bir neçə dəfə onu vurur*) Ləçər! Təqsir məndədir ki, sənin kimi iti adam eləyib ortaya çıxarmışam. Həyasız. (*O biri otağa keçir*)

Pauza. Şahsuvarov gəlir.

Ş a h s u v a r o v. Lilya! Sənə nə olub? Bu çamadan-zad nədir?

L ə t a f ə t. Mən Sadıqdan ayrılmışam, Ziyad.

Ş a h s u v a r o v (*halı dəyişir*). Necə? Ayrılmısan?

L ə t a f ə t. Həmişəlik ayrılmışam.

Ş a h s u v a r o v. Axı, mən sənə dedim bir-iki ay gözlə.

L ə t a f ə t. Gözləyə bilmədim. (*Pauza*)

Ş a h s u v a r o v. Nə etməli, vaxta ki, ayrılmısan, hələlik qal burada, görək sonra nə edərik.

L ə t a f ə t. Burada qalmağım mümkün deyil.

Ş a h s u v a r o v. Niyə?

L ə t a f ə t. Xalam qoymur. (*Pauza*)

Ş a h s u v a r o v. Bəs, onda nə etmək istəyirsən?

L ə t a f ə t. Mən bu sualın cavabını səndən gözləyirəm, Ziyad.

Ş a h s u v a r o v. Mən bu saat nə edə bilərəm?

L ə t a f ə t. Bakıda evin var. Göndər məni ora.

Ş a h s u v a r o v. Dəli olmusan, nədir? Sadıqov bütün şəhəri vurub bir-birinə. Müstəntiqin üstünə iş qaldırıb, sən də durub belə bir hən-gamə çıxarırsan?

L ə t a f ə t. Bəs, onda mən nə edim?

Ş a h s u v a r o v. Qayıt get evinə. O idiotu birtəhər dilə tut. Barış. Müvəqqəti. Başa düşürsənmi?

L ə t a f ə t. Mən ölsəm də bunu etmərəm, Ziyad!

Ş a h s u v a r o v. Onda özün bil. Mən sənin ağılsız hərəkətin ucundan özümü məhv edə bilmərəm.

L ə t a f ə t. Niyə belə sözlər danışırsan? Bilirsən ki, mən sənin ayağına kiçik bir daş dəyməsinə də razı olmaram.

Ş a h s u v a r o v. Ayağıma daş dəyməsinə razı olmursan, amma başımın batmasına razı olursan. Mən vəzifə adamıyam, anlayırsanmı?

L ə t a f ə t. Bəs, sən deyirdin məni sevirsən?

Ş a h s u v a r o v. Bilirsən, mənim giley-güzar etməyə vaxtım yoxdur. Ya bir neçə aylığa qal burada, ya da biz bir-birimizi heç tanımırıq. Aydındır?

L ə t a f ə t. Aydındır, Ziyad.

Şahsuvarov əsəbi halda qayıdıb o biri otağa girir. Lətafət onun ardınca uzun və key bir nəzər salır. Sonra yüyürərək qapıdan çıxır.

Pauza.

M e h r i c a n (*səsi gəlir*). Ora baxın, ora baxın! Özünü atmaq istəyir!

R e y h a n (*qışqırır*). Cahangir, özünü yetir!

Ş a h s u v a r o v. Bu nədir? (*Bayıra yüyürür*)

O biri evdən çıxan Xosrov Atayev, İldırım Atayev, daha sonra isə Dilşad və Sadıqov hövlnak bayıra yüyürürlər. İşıq sönüb yanır. Lətafəti yarıbayğın halda gətirirlər.

S a d ı q o v. Bədbəxtlik məni basıb. Qaraçuxam yatıb. (*Lətafət özünə gəlir*) Liliçka, bu nə işdir mənim başıma gətirirsən?

Ş a h s u v a r o v. Lətafət xanım, özünüzü necə hiss edirsiniz?

L ə t a f ə t (*ayağa qalxaraq*). "Lətafət xanım" nə üçün? Sən ki, həmişə mənə Lilya deyirsən?!

Ş a h s u v a r o v (*stəkanı su ilə doldurub ona uzadaraq*). İçin, əsəbləriniz sakit olsun.

L ə t a f ə t. Bu ki, şampanski deyil.

S a d ı q o v. Liliçka! Sən nə danışırsan?! Yoldaş Atayevgili görmürsən?

L ə t a f ə t. Görürəm və istəyirəm ki, Ziyad Şahsuvarovun indiyə qədər mənə göstərmiş olduğu iltifatı onlar da bilsinlər. Çünki mən Ziyad Şahsuvarovu birinci dəfə bu evdə görmüşəm! Onun mənə etdiyi elani-eşqə bu evdə qulaq asmışam!

Ş a h s u v a r o v. Bu, ağlını itirmişdir.

D i l ş a d (*Lətafətə*). Axmaq-axmaq danışma! Dur keç o biri otağa!

X o s r o v A t a y e v (*amiranə*). Ona toxunmayın! Mən sənə qulaq asıram, Lətafət.

L ə t a f ə t. Təşəkkür edirəm.

X o s r o v  A t a y e v. Bəs, sən Şahsuvarova nə cavab verdin?

L ə t a f ə t (*istehza ilə*). Sizin kimi hörmətli şəxslərlə oturub-duran, böyük bir şəhərdə naçalnik müavini olan bu cür yaraşıqlı oğlanın heyranedici sözlərinə hər gün Sadıq Sadıqovun mənfur üzünü görən bir qadın nə cavab verərdi?

S a d ı q o v. Əclaf qadın! Belə şeylər səni təmizə çıxara bilməz.

L ə t a f ə t. Kim deyir ki, mən təmizə çıxmaq istəyirəm? Özünüz gördünüz ki, əgər, bu gənc müstəntiq olmasaydı, indi cansız bir odun parçası ilə mənim fərqim yox idi. Onu da bilirsiniz ki, ölümdən qurtarmaq ikinci dəfə dünyaya gəlmək kimi bir şeydir. (*Qısa pauza*) Qəribədir... Bu, doğrudan da, belə imiş. Bir az qabaq Ziyad Şahsuvarovun dərdindən ölən mən, indi onun üzünə baxmaq istəmirəm.

Ş a h s u v a r o v. Lətafət!

L ə t a f ə t. Nədir? Yoxsa, davam gətirə bilmirsən? Sənin ki, belində tapança var. Nə üçün çəkib məni vurmursan? Vura bilməzsən. Çünki sən tülkü kimi qorxaqsan! Yer üzünün bütün alçaqlıqlarını toplasan sənin əməllərinin qarşısında bir heç olar. Mən öz namusumu, mənliyimi bir qurban kimi sənin ayaqlarının altına atdım. Sən isə, öz mənfur niyyətlərinə yetmək üçün onu körpü etmək istədin. Mən ölməyə layiq bir qadın idim. Lakin indi ölmədiyimə sevinirəm. Mən sizin hər ikinizə – sənə də, ölümə də nifrət edirəm. Ancaq yox. Mənim kinimi ifadə etmək üçün nifrət sözü kifayət deyil.

Kapitan iki milislə daxil olur.

K a p i t a n. Salam, belə vaxtsız gəlişim üçün üzr istəyirəm, yoldaş Atayev. (*Şahsuvarova*) Mən qanun adından sizi həbsə alıram. Silahınızı verin!

Ş a h s u v a r o v. Sizin məni həbs etməyə ixtiyarınız yoxdur.

K a p i t a n. Sizin həbs olunmağınız haqqında sərəncam verilmişdir. (*Orderi təqdim edir. Şahsuvarov təcili getmək istəyir. Kapitan onun qabağını kəsir*) Gecikmisiniz! (*İldırım Atayevə*) Yoldaş nazir müavini, müqəssir Ağasəlimlə Xuduş hər bir şeyi etiraf etmişlər. (Sadıqova) Rica edirəm şlyapanızı başınıza qoyasınız.

S a d ı q o v. Nə üçün axı?

K a p i t a n. Çünki biz sizi öz dostlarınızdan ayırmaq istəmirik.

S a d ı q o v. Bu, ədalətsizlikdir.

K a p i t a n. Bu, zamanın hökmüdür. Ailənizə bir sözünüz varsa, buyura bilərsiniz.

S a d ı q o v. Mənim heç bir kəsim yoxdur.

K a p i t a n. Elə isə gedək. (*Xosrov Atayevə*) Təkrar üzr istəyirəm, yoldaş Atayev. Biz bu cənabları başqa yerlərdə axtarırdıq, təəssüf ki, gəlib burada tapdıq. Hələlik.

P ə r d ə

## SƏKKİZİNCİ ŞƏKİL

Xosrov Atayevin evi. Dilşad əsəbi halda daxil olur.

D i l ş a d (*öz-özünə*). Bu iki-üç gündə hər şey alt-üst oldu. Fikirləşdikcə ayağımın altından yer qaçır. Dərdini deməyə bir adam da tapmırsan. (*Pauza, qapının zəngi çalınır*) Gəl.

Zabitə daxil olur. Dilşad onu görərkən amiranə görkəm alır.

D i l ş a d. Hə, bu vaxt xeyir ola?

Z a b i t ə. Sadıqovgildə aldığınız brilyant üzük üçün gəlmişəm.

D i l ş a d. Bəs, siz onu mənə bağışlamadınız?

Z a b i t ə. Biz dedik əl əli yuyar, əl də qayıdıb üzü. İndi ki, belə olmadı, malımızı qaytar özümüzə.

D i l ş a d (*qəzəblə*). Görünür, qulağınıza səs dəyib! Ərin dünyanı dağıdıb, hələ bir adam içinə də çıxırsan?

Z a b i t ə. Hə, bəs üzüyü alanda niyə belə demirdin?

D i l ş a d. Artıq-əskik danışma! Rədd ol burdan!

Z a b i t ə. Heç özünü dağıtma! Mənə Zabitə deyərlər! Bizim malımızı yemək olmaz.

D i l ş a d. Bu dəqiqə rədd olmasan, milis çağırdıb, səni də göndərəcəyəm ərinin yanına!

Z a b i t ə. Zəhmət çəkmə. Tay Şahsuvarov naçalnik deyil! Milis sözünə baxmaz! Tez ol, üzüyü ver! Yoxsa, evini başına uçurdaram!

Xosrov Atayev o biri otaqdan çıxır.

X o s r o v  A t a y e v. Niyə qışqırırsan, bacı, nə olub?

Z a b i t ə (*başını aşağı salaraq*). Heç bir şey. Öz malımızı istəyirik.

X o s r o v  A t a y e v. Siz kimsiniz, bacı?

Z a b i t ə. Ağasəlimin külfətiyəm.

X o s r o v  A t a y e v. Həbsə alınan Ağasəlimin?

Z a b i t ə. Bəli.

X o s r o v  A t a y e v. Yaxşı, bizdə sizin nə işiniz var?

Z a b i t ə. Necə yəni nə işiniz var? Mən Sadıqovun evində barmağımın beş min manatlıq üzüyünü çıxarıb arvadınıza vermişəm...

X o s r o v  A t a y e v. Nə üçün verirdiniz?

Z a b i t ə. Tay bunun nə üçünü yoxdur ki, verdik də. Özünüz bilmirsiniz?

Pauza. Dilşad iti addımlarla o biri otağa gedərək
üzüyü gətirib atır Zabitənin üstünə.

D i l ş a d. Götür, cəhənnəm ol, həyasız! Təqsir məndədir ki, sizin kimi alçaqlardan bəxşiş götürürəm.

Z a b i t ə (*qapıdan çıxa-çıxa*). Biz dedik ki, əl əli yuyar, əl də üzü. (*Çıxır. Pauza*)

X o s r o v  A t a y e v (*öz-özünə*). Əl əli yuyar, əl də üzü... Ağasəlimin xalq malı ilə alınmış üzüyü mənim evimdən çıxır. Şahsuvarov, Sadıqov kimi cinayətkarlar mənim evimdə həbsə alınırlar... Bu dəhşətdir! Necə oldu ki, onlar mənim qapımı tanıdılar?! (*Dilşada*) Səndən soruşuram. Necə oldu?!

D i l ş a d. Mən sənin əkdiklərini biçirdim... Əgər, Şahsuvarov, Sadıqov sənin qapını tanımağa layiq deyildilərsə, niyə hərəsini oturdurdun bir idarənin başında?

X o s r o v  A t a y e v (*sarsılaraq*). Doğrudur... Tamamilə doğrudur. Onların kim olduqlarını indiyə qədər tanımamaq mənim böyük, bağışlanılmaz günahımdır! (*Pauza*) Ancaq bəs sən? Bəs sən niyə öz ərinin bu səhvindən istifadə eləyib, onu xalq içində biabır edirdin?! Axı, sən həmişə and içib məni istədiyini söyləyirdin.

D i l ş a d. Mən sənin belə qorxaq olduğunu bilmirdim.

X o s r o v  A t a y e v. Necə? Mən qorxağam? (*Pauza*) Düz deyirsən. Ancaq yaddan çıxarma ki, xalqın ağır töhmətindən qorxmayanlar dünyanın ən vicdansız adamlarıdır. Vicdansızlıqla xəyanət isə əkiz yaranmışdır. Ona görə də, tutduğun əməllər səni qorxutmamışdır. Sən nə ailəni sevmisən, nə də xalqını...

D i l ş a d. Sən bir az nəzakətli danışsaydın pis olmazdı.

X o s r o v  A t a y e v. Nəzakət! Bundan sonra sən məndən hələ nəzakət də umursan?

D i l ş a d. Heç lazım da deyil! Səninlə yaşadığım bu on ildə mən nə gördüm ki, indi də onu itirməkdən qorxum?

X o s r o v  A t a y e v. Bəs, sən nə görmək istəyirdin?

D i l ş a d. Bilmirəm... Başqa ərlər öz arvadlarına belə suallar vermirlər...

X o s r o v  A t a y e v. Əgər, sən öz ərindən narazı idinsə, nə üçün indiyə qədər bunu açıb ona demirdin?

D i l ş a d. Bilirdim ki, bunun heç bir mənası yoxdur.

X o s r o v  A t a y e v. Axı, biz evlənəndə mən adicə bir mühəndis idim.

D i l ş a d. Ona görə də, mən o zamanlar susub heç bir söz demirdim... Sonra gördüm ki, sənin adi mühəndislikdən yüksək vəzifələrə qalxmağın bizim ailə həyatımızda heç bir dəyişikliyə səbəb olmadı.

X o s r o v  A t a y e v. Aha... Demək sən elə bilirdin ki, mən yüksək vəzifəyə keçəndən sonra biz də dayələr, qulluqçularla yaşayacağıq, qapımızda "Pobeda" maşınları dayanacaq. Eləmi? Ah, sən nə dəhşətli qadınsanmış!

D i l ş a d. Çox gec tanımısan!

X o s r o v  A t a y e v. Gec tanısam da bir daha sənin üzünü görməyəcəyəm! Bir daha sənə Xosrov Atayevin həyat yoldaşı deməyəcəklər. Rədd ol buradan!

D i l ş a d. Bilirsənmi nə edirsən?

X o s r o v  A t a y e v. Bu saat, bu dəqiqə rədd ol.

İldırım Atayev gəlir. Qısa pauza. Dilşad çıxır.

İ l d ı r ı m  A t a y e v. Nə olub?

X o s r o v  A t a y e v. Mən məhv olmuşam, qardaş! Mənim on illik ailə həyatım saxtaymış. Bizim familiyamız ləkələnmişdir! Qoy məni xalq divanına çəksinlər! (*Əlləri ilə başını tutaraq, stula yıxılır. Pauza*) Xalq bizi öz halal pulu ilə oxutdu. Yüksək vəzifə sahibləri etdi. Hökumət böyük bir şəhərin müqəddəratını mənə tapşırdı. Lakin mən? Mən nankor oldum! Nankor! Nə üçün dinmirsən, İldırım? Yoxsa, mən, doğrudan da, məhv olmuşam?! Yoxsa, daha mənimlə kəlmə kəsib danışmağa belə dəyməz?!

İ l d ı r ı m  A t a y e v. Hər şeyi sən özün dedin, Xosrov, daha mənə söz qalmadı.

X o s r o v  A t a y e v. Yox! Sən hökumətin bir nümayəndəsi kimi mənim haqqımda nə fikirdəsən?

İ l d ı r ı m  A t a y e v. Mən sənin işdən götürülməyini tələb etmişəm!

Ağır pauza.

X o s r o v  A t a y e v. Sağ ol, qardaşım! Xalqın böyük etimadını məlun bir qadının saxta məhəbbətinə qurban verən adamlar qardaş cəzasına layiqdirlər! Mən sənin sözlərinə vaxtında qulaq assaydım, belə olmazdı.

İ l d ı r ı m  A t a y e v. Mən indi yola düşüb gedirəm, Xosrov. Xalqın ədaləti böyükdür! Əgər, onlar sənə aman versələr, igid ol, qardaşım! İndisə gəl qucaqlaşaq! Bax, belə, uşaqlıqdakı kimi. Bu nədir, sənin gözlərin yaşarmışdır?

X o s r o v  A t a y e v. Get, İldırım, sənə yaxşı yol.

O biri otağa keçir. Pauza. Mehrican gəlir.

İ l d ı r ı m  A t a y e v. Nə yaxşı ki, gəldiniz. Yoxsa, sizinlə görüşməmiş getmək mənim üçün ağır dərd olardı... (*Qısa pauza*) Ümid edirəm ki, məni pisliklə xatırlamayacaqsınız.

M e h r i c a n. Heç bir zaman.

İ l d ı r ı m  A t a y e v. Salamat qalın. Xoşbəxt olun. Bilin ki, haradasa bir nəfər vardır və o hər dəfə sizin xoşbəxtliyinizi eşitdikcə sevinəcəkdir.

Cahangirlə Reyhan gəlirlər.

R e y h a n. Əmi, deyirlər gedirsiniz?

İ l d ı r ı m  A t a y e v. Bəli. Sən atandan muğayat ol. O, çox iztirab çəkir. Qoy ruhdan düşməsin. Səhv etmək bir günahdırsa, onu düzəldə bilməmək daha böyük dərddir! Atalar deyib:

İgid odur atdan düşə, atlana!
İgid gərək hər əzaba qatlana!

R e y h a n. Mənim atam həmişə mərd olmuşdur! O, bu ağır yaraya qatlanacaq, yarı yolda qalmayacaqdır! O zaman dostlar da, düşmənlər də görəcəklər ki, Atayevlər ailəsinin çırağı sönməmişdir!

P ə r d ə

*1954*

# SƏN HƏMİŞƏ MƏNİMLƏSƏN, YAXUD "BOY ÇİÇƏYİ"

İŞTİRAK EDİRLƏR

Həsənzadə – zavod direktoru
Xurşid – onun arvadı
Aydın – onun oğlu
Nargilə – cavan qız, orta məktəbi bitirib
Nəzakət – onun anası
Fərəc – Nəzakətin ikinci əri
Fərəcov – zavodda kadrlar şöbəsinin müdiri
Sarısaç qız – Nargilənin rəfiqəsi
Yaşlı kişi
Birinci oğlan
İkinci oğlan
İşçilər

Vağzal. Məlum olur ki, hər kəs öz adamını yola salır. Ön planda dayanmış Həsənzadə kiməsə baxıb gülümsəyir. Lakin o çox həyəcanlıdır. O, bütün xarici aləmdən təcrid olunaraq, yalnız gözlərini zillədiyi adamla məşğuldur. Qarşıdan gələn Nargilə onu görüb dayanır. Həsənzadə bunu hiss etmir.

Aydının səsi. Daha durma, ata, istidir.

Həsənzadə. Yatanda pəncərəni ört.

Aydının səsi. Arxayın ol.

Həsənzadə. Soyuq su içmə. Anginan təzə sağalıb.

Aydının səsi (*səbri tükənmiş halda*). Dedim ki, arxayın ol.

Nargilə sürətlə gözünü səs gələn tərəfdən çəkib, Həsənzadəyə baxır. Lakin Həsənzadə oğlunun sərt cavabından inciməmişdir.

Həsənzadə. Yolda konserv yemə.

Aydının səsi. Yaxşı, ata, get. (*Axırıncı zəng. Qatar tərpənir*) Salamat qal, ata. Çatan kimi teleqram vuracağam. Məndən arxayın ol.

Həsənzadə daha dinmir. O, çox mütəəssirdir. Əlini havada zəif-zəif tərpədərək oğlu ilə səssizcə vidalaşır. Qatarın səsi getdikcə uzaqlaşır. Həsənzadə dərindən nəfəs alaraq, başını aşağı salır və geri dönür. Bütün bu müddətdə gözləri Həsənzadədə olan Nargilə sanki bu saat ona, nə isə, həyəcanlı bir söz deyəcək. Lakin Həsənzadə onun varlığını hiss etməyərək, yanından keçib gedir. Qız onu eyni həyəcanlı, pərişan nəzərlərlə müşayiət edir... Səhnə hərlənir... Həsənzadə eyvana çıxıb papiros yandırır.

O, tez-tez papiros çəkir və budaqları eyvana əyilmiş söyüd ağacına baxır... Qarşıdakı binanın artırmasında isə, Nargilə dayanmışdır. Onun gözləri Həsənzadəyə zillənmişdir. Elə bil ki, qız onun baxışlarını tutub öz üzərində saxlamaq istəyir. Lakin Həsənzadə onu görmür... Həsənzadə öz dərdi ilə məşğuldur. Bu vaxt uzaqdan musiqi eşidilir... və ətrafın səssizliyi içində adama elə gəlir ki, bu musiqi naməlum zamanlardan indiyə qədər davam edib gəlir və bundan sonra da əbədi olaraq davam edəcəkdir... Səhnə tədriclə qaranlıqlaşır və qaranlıqlaşdıqca həmin musiqi də uzaqlaşır... Sonra mavi işıq içindən Xurşid çıxır.

X u r ş i d. Niyə bu qədər bikefsən? Aydın indi böyük oğlandır. Nə olacaq?..

H ə s ə n z a d ə. Bu iyirmi iki ildə birinci dəfədir ki, mən ondan belə uzun müddətə ayrılıram.

X u r ş i d. Hansı ata-ana həmişə öz övladı ilə bir yerdə olub?

H ə s ə n z a d ə. Elədir.

X u r ş i d. Bilirəm... təklik sənin üçün çətin olacaq.

H ə s ə n z a d ə. Nə etməli... Təki canı sağ olsun. (*Pauza. Musiqi davam edir*)

X u r ş i d. Gərək evlənəydin.

H ə s ə n z a d ə. O dəhşətli gecədə sən özün dedin ki, evlənmə.

X u r ş i d (*təqsirkar kimi*). Mən səhv etmişdim...

H ə s ə n z a d ə. Fərqi yoxdur... O zaman sən "Evlən!" desəydin də, mən bunu bacarmazdım...

X u r ş i d. Gərək evlənəydin... (*Qısa pauza. Musiqi davam edir*) Aydın səni çox incidirdi. Axı, o, elə körpəlikdən nadinc idi...

H ə s ə n z a d ə. O tez-tez xəstələnirdi.

X u r ş i d. Mən sənin bir gecə yuxusuz qalmağına dözmürdüm... Amma o səni aylarla yuxusuz qoyurdu...

H ə s ə n z a d ə. Başqa cür mümkün deyildi. Onu soyuqdan gözləmək lazım idi.

X u r ş i d. O, körpəlikdə də həmişə narahat yatırdı.

H ə s ə n z a d ə (*düşüncə içində*). Sonra da məktəb həyatı. (*Gülümsəyir*) Bir gün olmurdu ki, direktor zəng vurub ondan şikayət eləməsin... Nə isə... bunlar artıq keçmişdə qalıb. O bizim zəhmətimizi itirmədi.

X u r ş i d. "Bizim" yox, sənin! Mən vəfat edəndə onun iki yaşı var idi.

H ə s ə n z a d ə. Elədir. Ancaq mən sənin yerini verə bilmirdim. Tez-tez əsəbiləşirdim. Səhvlər edirdim. (*Qısa pauza. Musiqi davam edir*)

Sənin vəfatından üç-dörd ay sonra biz təzə binaya köçmüşdük. Bir gün o mənə, səni aşağıda, darvazanın yanında görmüş olduğunu söylədi. Deyir, “anama dedim ki, bax, burada oluruq, niyə gəlmirsən?”

X u r ş i d. Mən həmişə sənin güclü təbiətinlə fəxr edərdim. Niyə belə şeyləri yadında saxlamısan?

H ə s ə n z a d ə. Görünür, insan həmişə bir cür qalmır...

X u r ş i d. Evlən!

H ə s ə n z a d ə. Gecdir.

X u r ş i d. Qırx altı yaş hələ qocalıq demək deyil.

Qısa pauza.

H ə s ə n z a d ə. Sən mənim üçün həddindən artıq yaxşı olmusan...

X u r ş i d. Deyirlər, məhəbbət də canlı orqanizm kimi qocalır və nəhayət, ölür...

H ə s ə n z a d ə. Bəlkə də... Ancaq yəqin ki, bunun üçün iyirmi il azdır...

X u r ş i d. Evlənib özünə təzə həyat qurmağa sənin çoxdan haqqın var idi. Saçların ağaranda, iyirmi səkkiz yaşın hələ tamam deyildi...

H ə s ə n z a d ə. Bunun üçün mən kimsəyə minnət qoymuram. Çünki heç bir zaman ürəyimin ziddinə hərəkət eləməmişəm... Özümü heç bir səadətdən məhrum etmək fikrində olmamışam. Demək istəyirəm ki, mən, sadəcə olaraq, öz vəzifəmi yerinə yetirmişəm... Burada təəccüblü və ya fövqəladə nə var ki...

X u r ş i d. Elə demə... sən gənc idin... gözəl idin... Biz evlənəndən sonra da qızların telefon zəngləri kəsilmək bilmirdi...

H ə s ə n z a d ə. Bəlkə də, mənim yerimə bir başqası olsaydı, sənin vəfatından bir-iki il sonra evlənərdi... Sən deyən kimi, özünə təzə həyat qurardı... Bəlkə bu, Aydın üçün yaxşı olardı... Ancaq... Mən bunu bacarmadım. Hər dəfə bu barədə düşünəndə... Yox, bu mümkün deyildi və mən bu cür hərəkət etmədiyim üçün özümü məzəmmət eləmirəm!.. Mən çəkdiyim əziyyətlərdən, məhrumiyyətlərdən narazı deyiləm...

Qapının zəngi çalınır. Musiqi tamam susur. Xurşidin üzərinə düşən işıq sönür. Həsənzadə qapını açır. Nargilə, əlində bir yığın qəzet və jurnal daxil olur.

N a r g i l ə (*həyəcanını boğaraq*). Bunları qapıda poçtalyon verdi... Özü sancılanmışdı. Ona görə də, mən alıb gətirdim...

H ə s ə n z a d ə. Çox sağ olun. (*Qəzet və jurnalları ondan alıb, dəyirmi həsir stolun üstünə qoyur*) Siz bizim bu qonşudakı mühasibin qızı deyilsiniz?

N a r g i l ə. Xeyr... O mənim atalığımdır.

H ə s ə n z a d ə. Oxuyursunuz?

N a r g i l ə. Bu il onilliyi qurtardım. Ancaq ali məktəbə girə bilmədim.

H ə s ə n z a d ə. Nə üçün?

N a r g i l ə. Bir balım çatmadı... (*Birdən qızışıb özündən çıxaraq*) Dil müəllimi kifir bir qız idi, "dörd" əvəzinə götürüb "üç" verdi.

H ə s ə n z a d ə (*gülümsəyərək*). Məncə, müəllimə haqqında belə danışmaq yaxşı deyil.

N a r g i l ə (*tutularaq*). Bağışlayın...

H ə s ə n z a d ə. Eybi yoxdur, yaxşı hazırlaşıb gələn il girərsiniz.

N a r g i l ə. Yaman da girərəm...

H ə s ə n z a d ə. Hər halda, ruhdan düşmək lazım deyil. Bəs, indi nə edirsiniz?

N a r g i l ə. Heç nə.

H ə s ə n z a d ə. İşləmək istəmirsiniz?

N a r g i l ə. İş yoxdur. Anamla sizin zavodun kadrlar şöbəsinə getdik. Bir şey çıxmadı.

Qısa pauza.

H ə s ə n z a d ə. Naryadçı vəzifəsində işləyərsiniz?

N a r g i l ə. Siz deyəndən sonra niyə işləmirəm...

H ə s ə n z a d ə. Mənim deməyim başqa, sizin ürəyinizdən olmağı başqa.

N a r g i l ə. İşləyərəm.

H ə s ə n z a d ə (*zəng edir*). Allo, Fərəcov.

İşıq eyni zamanda telefon xəttinin o biri ucunda olan Fərəcovu işıqlandırır.

H ə s ə n z a d ə. Ora bir qız gələcək, adı... (*Nargiləyə*) Adınız nədir?

N a r g i l ə. Nargilə.

H ə s ə n z a d ə (*telefonla*). Adı Nargilə xanımdır. Onu srağagün orduya gedən oğlanın yerinə naryadçı təyin edərsiniz.

F ə r ə c o v (*narazılığını gizlədərək*). Ba-ba-baş üstə, yoldaş direktor.

Həsənzadə dəstəyi asır. Fərəcovun üzərinə düşən işıq sönür.

N a r g i l ə. Görürsünüz... Amma dünən bizə deyirdi oğlanın yerinə adam götürmüşük.

H ə s ə n z a d ə. Sabahdan gedərsiniz, əlli manat da maaşıdır...

N a r g i l ə (*qürurla*). Onun əhəmiyyəti yoxdur.

H ə s ə n z a d ə (*zarafatyana*). Yəni o qədər dövlətlisiniz?

N a r g i l ə. Altmış manat da atamın təqaüdünü alıram.

H ə s ə n z a d ə. Atanız vəfat eləyib?

N a r g i l ə. Bəli... Mən bir yaşında olanda... Müharibədə vurulub. Baş leytenant imiş. (*Həsənzadə papiros yandırır*) Oğlunuzu hara yola salırdınız?

H ə s ə n z a d ə. Başqırdıstana.

N a r g i l ə. Orda işləyəcək? (*Həsənzadə başı ilə təsdiq edir*) Həmişə?

H ə s ə n z a d ə. Kim bilir... Hələlik üçillik vaxta gedib.

N a r g i l ə. Gərək ki, mühəndisdir...

H ə s ə n z a d ə. Bəli. Neft institutunu qurtarıb.

N a r g i l ə. Darıxırsınız?

H ə s ə n z a d ə. Darıxdım nə olacaq...

Qısa pauza.

N a r g i l ə (*mütəəssir halda*). Bəlkə sizin üçün bir iş görmək lazımdır?

H ə s ə n z a d ə. Sağ olun. Lazım olan işləri özüm görməyə adət etmişəm.

N a r g i l ə. Bilirəm... oğlunuz kanikula gələndə hər səhər ondan əvvəl durub çay qoyurdunuz. Qəlyanaltı hazırlayırdınız...

H ə s ə n z a d ə. Elədir...

N a r g i l ə. Mən saatlarla o tək pəncərənin qabağında oturub, sizə tamaşa edirdim... Sizin isə, bundan xəbəriniz yox idi.

H ə s ə n z a d ə. Xəbərim var idi.

N a r g i l ə (*sevinclə*). Doğrudan?.. Amma elə bilirdim siz bir dəfə də olsun məni görməmisiniz...

H ə s ə n z a d ə. Nə üçün... Qonşu deyilik...

N a r g i l ə (*məyus halda*). Elədir... qonşuyuq... (*Qısa pauza*) Həmişə sizin oğlunuz gələndə mən sevinirdim.

H ə s ə n z a d ə (*zarafatyana*). Doğrudanmı?

N a r g i l ə (*Həsənzadənin ahəngindəki mənanı duyaraq*). Mən sizə görə sevinirdim!

H ə s ə n z a d ə. Mənə görə?

N a r g i l ə. Bəli. O gələndə sizin kefiniz yaxşı olurdu. Danışırdınız, gülürdünüz... O olmayanda isə, saatlarla bu həsir kresloda oturub elə hey papiros çəkirdiniz. Hey düşünürdünüz...

H ə s ə n z a d ə (*gülümsəyir*). Qocalara başqa daha nə qalır ki...

N a r g i l ə. Siz qocasınız?

H ə s ə n z a d ə. Əlbəttə.

N a r g i l ə (*acıqlanır*). Yoxsa, siz məni yüngülbeyin bir qız hesab edirsiniz?

H ə s ə n z a d ə. Qətiyyən!

N a r g i l ə. Onda nə üçün heylə deyirsiniz?

H ə s ə n z a d ə. Mənim özüm haqqımda elə deməyimin sizə nə dəxli ola bilər?

N a r g i l ə. Çox sağ olun. Mən sizdən belə kobud sözlər gözləməzdim.

H ə s ə n z a d ə. Bağışlayın.

N a r g i l ə. Yox, siz məndən üzr istəməyin... lap ürəyimi parça-parça eləsəniz də mən sizin üzr istəməyinizə razı olmaram.

H ə s ə n z a d ə. Təşəkkür edirəm. (*Qısa pauza*) Siz çox roman oxuyursunuz?

N a r g i l ə. Nə üçün soruşursunuz?

H ə s ə n z a d ə. Elə-belə...

N a r g i l ə. Xeyr, mən Robinzon Kruzodan başqa heç bir roman-zad oxumamışam. (*Təşəxxüslə*) Mən riyaziyyatçıyam. Fizika, riyaziyyata aid əlimə nə keçdi, buraxmaram.

H ə s ə n z a d ə. A... belə deyin.

N a r g i l ə. Nə qədər çalışdım, o kifir qızı başa sala bilmədim ki, riyaziyyatçı olmaq istəyirəm. Qrammatikadan üç alsam da, yola gedərəm.

H ə s ə n z a d ə. Bəs, axı, dedik müəllim haqqında belə hörmətsiz danışmaq yaxşı deyil...

N a r g i l ə. Bağışlayın... Yadımdan çıxdı. Söz verirəm. (*Pauza. Həsənzadə papiros çəkir, qız baxır*) Təbiətin qəribə sirləri var...

H ə s ə n z a d ə. Necə bəyəm?

N a r g i l ə. Oğlunuz sizə o qədər oxşayır ki...

H ə s ə n z a d ə. Hə... bir az oxşayır.

N a r g i l ə. Bir az yox, lap çox!.. Gözləri, yerişi, duruşu, hətta, papiros çəkməyi...

H ə s ə n z a d ə (*təəccüblə*). Məgər, o, papiros çəkir?

N a r g i l ə (*özünü itirərək*). Yox... Bəlkə... elə-belə məşğuliyyət eləyirmiş. Mən bircə dəfə görmüşdüm. Bir-iki ağız çəkəndən sonra üz-gözünü bürüşdürüb tulladı. Doğru deyirəm.

H ə s ə n z a d ə. Yəqin ki, doğru deyirsiniz...

N a r g i l ə (*ona diqqətlə baxaraq*). Yox! Yalan deyirəm! Papirosu axıra qədər çəkdi!

H ə s ə n z a d ə (*zarafatyana*). Üz-gözünü də bürüşdürmədi.

N a r g i l ə. Yox! (*Üsyankar*) Axı, çəkəndə nə olar... Maşallah, pəhləvan kimi oğlandır. Papiros ona neyləyəcək?! (*Yavaş və mütəəssir səslə*) Mən istəyirəm ki, siz heç bir şeyin fikrini eləməyəsiniz...

H ə s ə n z a d ə. Başa düşürəm... Sağ olun...

N a r g i l ə. Xoşbəxtlik gün kimi onun başı üzərində hərlənir.

H ə s ə n z a d ə (*birdən canlanaraq*). Siz eləmi güman edirsiniz?

N a r g i l ə. Əlbəttə. Ali təhsilli, ağıllı, gözəl... sağlam... Sizin kimi də atası!.. Xoşbəxtlik üçün daha ayrı nə lazımdır ki?!

H ə s ə n z a d ə (*dərindən nəfəs alaraq*). Yox... Həqiqi xoşbəxtlik üçün sizin dedikləriniz hələ çox azdır. Əsl məsələ bu sifətlərdən necə istifadə eləməkdə, insanlar üçün, özün üçün nə kimi xeyirli işlər görməkdədir.

N a r g i l ə (*pərişan halda*). İnsanlar üçün...

H ə s ə n z a d ə. Doğru deyilmi?

N a r g i l ə (*birdən*). Yox!

H ə s ə n z a d ə. Bəlkə siz hamıya kin bəsləyirsiniz?

N a r g i l ə. Sizdən və yazıqlardan başqa!

H ə s ə n z a d ə. Yazıq kimlərə deyirsiniz?

N a r g i l ə (*xəyal içində*). Surikə, anama...

H ə s ə n z a d ə. Surik kimdir?

N a r g i l ə. Yoldaşımdır... Onilliyi bir yerdə qurtarmışıq. Doğrudur, bir az yüngülbeyinliyi var... ancaq yazıqdır. Anam da yazıqdır,

çünki iradəsizdir, qorxaqdır. Rica edirəm, gəlin bu barədə danışmayaq... Mən sizin ürəyinizin qısılmasını istəmirəm.

H ə s ə n z a d ə. Eybi yoxdur. Mənim ürəyim o qədər də nərmənazik deyil.

N a r g i l ə (*riqqətlə*). Mən, oğlunuzdan ayrıldığınız bu ağır dəqiqələrinizdə sizə, nə isə, ürəkaçan bir şey danışmaq istərdim.

H ə s ə n z a d ə. Təşəkkür edirəm. Siz bir az öz həyatınız haqqında söhbət eləsəydiniz...

N a r g i l ə. Mənim həyatımın bir qiyməti olsaydı, onu sizə yüz dəfə danışardım.

H ə s ə n z a d ə. Kim deyir ki, sizin həyatınızın qiyməti yoxdur?

N a r g i l ə (*birdən əsəbiləşərək*). Kim! Anam! Atamın yerini tutan o köstəbək! Üzümə baxıb şit-şit gülümsəyən, məni tovlayıb yoldan çıxarmağa can atan fərsiz oğlanlar! Qrammatikadan "üç"ü verib mənim ali məktəbə girməyimə mane olan o qız! Hamı... hamı!..

Birdən kresloya yıxılaraq, hönkürüb əlləri ilə üzünü tutur.

H ə s ə n z a d ə. Sakit olun... ağlamaq nədir...

Pauza. Bayaqkı musiqi yenidən başlayır. Yenidən adama elə gəlir ki, bu musiqi min illərdir elə-belə davam edir...

N a r g i l ə (*birdən əlini üzündən çəkərək*). Doğrudanmı, siz mənim həyatım haqqında eşitmək istəyirdiniz?!

H ə s ə n z a d ə. Bəli. Danışın.

Nargilənin gözləri sanki yol çəkir... Həmin musiqi yenidən başlayır və musiqinin ahənginə uyğun olaraq, səhnə yavaş-yavaş qaranlıqlaşır.

N a r g i l ə. Anamın ikinci dəfə ərə getməyi yadıma gəlmir. Deyirlər onda mən kök, sağlam, güləyən bir uşaq imişəm. Lakin illər keçir, mən böyüdükcə, bu şənlik də silinib gedirdi. (*Musiqi susur. Səhnə tamam qaranlıqlaşır... və qaranlıqda Nargilənin bu sözləri eşidilir*) Mənim həyatımda fərəhsiz, sıxıntılı günlər başlanırdı...

Səhnə yenidən işıqlananda Nargilənin ata evində yemək otağı görünür, artıq yetkin bir qız olan Nargilə tez-tez mətbəxdən qab-qacaq gətirir. Lakin bu işin onun üçün son dərəcə xoşagəlməz bir hal olduğu hiss edilir. Nəzakət xanım yemək stolunun üstünü düzəldir. Nargilə qrafini gətirib qoyanda su süfrənin üstünə tökülür.

N ə z a k ə t. Niyə üsullu hərəkət eləmirsən... İndi bir də süfrəni dəyişim?

N a r g i l ə. Lazım deyil. Bir damcı tökülüb.

N ə z a k ə t. Sən onun xasiyyətini bilirsən. Şoraba da yadımızdan çıxıb. (*Tələsik mətbəxə gedir. Qız, anasının ardınca təngə gəlmiş adam kimi nəzər salır. Sonra dərindən nəfəs alaraq, yaxınlaşıb radionu açır. Otağa zərif bir musiqi dolur. Nəzakət həyəcanla daxil olub, şorabanı stolun üzərinə qoyaraq radionu bağlayır*) Nə qayırırsan?.. Bilmirsən o, ac olanda belə şeylərə dözmür?! (*Bayırdan ayaq səsləri eşidilir*) Gəlir...

Və yalvarıcı bir ifadə ilə qızına baxır. Nargilə onun nə demək istədiyini başa düşərək, səhnənin ikinci otağı əvəz edən hissəsinə keçir. Fərəc ağır addımlarla daxil olur. Nəzakət xanımın ona dikilən nəzərlərində bir vahimə vardır. Fərəc həsir şlyapasını çıxarıb Nəzakətə verir və mətbəxə yönəlir... Nəzakət də onun ardınca gedir. Sonra Fərəcin fınxıra-fınxıra, suyu üzünə şappıldada-şappıldada necə yuyunduğu eşidilir və bütün bu səslərin Nargiləyə olduqca xoşagəlməz bir təsir bağışladığı, onu əsəbiləşdirdiyi duyulur. Nəzakət yeməklə dolu boşqabı çox ehtiyatla gətirib stolun üstünə qoyur. Fərəc yaş əllərini havada tutaraq gəlir.

F ə r ə c. Məhraba! (*Nəzakət yüyürüb məhraba gətirir, Fərəc məhrabanı alıb qurulanaraq yenə də arvadına qaytarır. Sonra təntənə ilə irəliləyib yemək stolunun arxasına keçir. Nəzakət məhrabanı qoyub qayıdır, ayaq üstündə dayanıb ərinə tamaşa edir. Onun baxışlarında mütilik və qorxu hiss olunur*) İstiot!

N ə z a k ə t. Görürsən... Yenə də yaddan çıxıb...

Gedib gətirir. Pauza. Bütün bu müddətdə Nargilə o biri otaqda əvvəlcə kitab götürüb oxumaq istəyir, lakin oxuya bilmir. Sonra kitabı yerə qoyaraq, yarımçıq qalmış əl işini götürüb tikmək istəyir. Lakin tikə bilmir və onu da kənara atır. Hiss olunur ki, o biri otaqdan gələn çəngəl-bıçaq səsləri onu əsəbiləşdirir.

F ə r ə c. Kompot! (*Nəzakət bir stəkan kompot gətirir. Fərəc bir qurtum alıb arvadına baxır*) İstidir.

N ə z a k ə t (*təqsirkarcasına*). Bu gün işdən gec çıxdıq...

F ə r ə c (*Nargilə olan otağa işarə ilə*). Bəs, o neyləyirdi?

N ə z a k ə t. O da yoldaşıgilə getmişdi...

F ə r ə c. Demək bura mehmanxanadır...

Nargilə acığından barmağını dişləyir.

N ə z a k ə t (*kompotu götürür*). Qoyum soyuducuda bir az qalsın.

F ə r ə c. Çay!..

N ə z a k ə t. İki dəqiqəyə qaynayar.

F ə r ə c (*qəzəblə*). Qaynayar!.. (*Qalxıb əsəbi halda başdakı qapıya tərəf yönəlir və birdən geri dönür. Nargilə olan otağa işarə ilə*) Sən onunla danışdın?

N ə z a k ə t (*müqəssir kimi*). Hələ yox.

F ə r ə c. Danış! (*Baş tərəfdəki qapıdan çıxır. Nəzakət onun ardınca baxır, üzü yazıq, köməksiz bir ifadə alır. Nargilə o biri otaqdan gəlir*)

N a r g i l ə. Nə olub?

N ə z a k ə t (*tərəddüd içində*). Heç bir şey.

N a r g i l ə. Axı, o mənim haqqımda nə isə deyirdi. (*Qısa pauza*) Niyə susursan? Niyə dinmirsən?

N ə z a k ə t. Bir az yavaş...

N a r g i l ə. Yavaş danışmıram! Bura mənim atamın evidir.

N ə z a k ə t. Nargilə... qızım...

N a r g i l ə (*indi yavaş səslə*). Ah!.. Bircə başa düşsəydim ki, sən... vaxtilə gözəl-göyçək bir gəlin olan sən, onun nəyinə aşiq olmusan?

N ə z a k ə t. Mən indiyə qədər bu sirri heç kəsə açmamışam, amma indi böyük qızsan, sənə deyirəm, mən onu sevmirəm. Heç bir zaman da sevməmişəm!..

N a r g i l ə. Elə isə... Bəs, neçə ildir o, burada nə gəzir?

N ə z a k ə t. Atandan sonra mən bu damın altında tək qaldım... Sən isə körpəydin...

N a r g i l ə. Tək niyə olurdun? Sən ki, işləyirdin...

N ə z a k ə t. Gündüzlər işləyirdim... gecələr isə... dünya gözümdə qaralırdı. Elə bil ki, bu evdə hər şey... divarlar da, stullar da dil açıb mənə deyirdi: “O daha yoxdur... O daha heç bir zaman gəlməyəcək”.

Yenə də birinci səhnədəki musiqi eşidilir. Yenə də adama elə gəlir ki, bu musiqi dünya bina olunandan indiyə qədər davam edir.

Mən hər yerdə... Hər yerdə onun yoxluğunu hiss edirdim. Mənə elə gəlirdi ki, onunla birlikdə bütün həyat məni tərk edib getmişdir. Sən isə, dilbilməz bir körpə idin. Sən dünyadan xəbərsiz gözlərini mənə zilləyib gülümsədikcə, vahimə məni basırdı. Mənə elə gəlirdi ki, müharibə indicə səni də aparıb udacaqdır. Elə bil ki, soyuq əsgər süngüsünün ucu sənin dodaqlarına dirənmişdi. Sən isə, onu əmzik

bilib sorursan... Mən hər gecə dəhşətli yuxular görürdüm. Mən hər gecə sənin hansı uzaq, yiyəsiz səhradasa düşüb qalmış yaralı atanın çağırışını eşidirdim. (*Musiqi davam edir*) Təklik dəhşət idi. (*Ağlayır*) Mən yaşaya bilmirdim. Başa düş...

N a r g i l ə (*mülayim*). Yaxşı, sakit ol.

N ə z a k ə t (*daha yanıqlı şəkildə ağlayır*). Yoxsa... Mən sənin atanın xatirəsini bu dünyada heç bir səadətlə əvəz etməzdim.

Pauza. Musiqi davam edir. Musiqi susur. Səhnə qaranlıqlaşır. İşıqlananda Həsənzadə papiros çəkərək dinləyir. Nargilə həyəcanla söhbətinə davam edir.

N a r g i l ə (*aramla*). Mən anama inanırdım... Bir dəfə mən onun xəlvətcə atamın şəklinə baxıb ağladığını görmüşdüm. Mən onun halına yanırdım. Lakin onun zəifliyi, iradəsizliyi məni dəli edirdi.

H ə s ə n z a d ə. Bəs, sonra nə oldu?

N a r g i l ə. Sonra da belə oldu ki...

Səhnə yenidən qaranlıqlaşır. İşıqlananda axşamçağıdır. Fərəc arvadının qabağında dayanmışdır. Nargilə isə, o biri otaqda çarpayısının üstündə yarıuzanmış halda yuxulamışdır. Oxuduğu kitab sinəsi üzərinə düşüb qalmışdır. Onun üzündə həyəcanlı bir ifadə var.

F ə r ə c (*arvadına*). Nə oldu, danışdın?

N ə z a k ə t. Axı, bu evlər onun atasınınkıdır. Mən necə deyim ki, sən get ayrı yerdə ol?!

F ə r ə c. Xalası tək arvaddır. Getsin onun yanında qalsın.

N ə z a k ə t (*təqsirkarcasına*). Deyə bilmərəm... Ürəyim gəlmir...

F ə r ə c. Demək o sənin üçün doğmadır, amma, bu biriləri ögey?

N ə z a k ə t. Ögey nə üçün?

F ə r ə c. Bəs, niyə onların da qayğısına qalmırsan? Tək qız bir otağı tutub... Amma biz beş baş külfət iki balacasına sığınmışıq... Uşaqların dərs oxumağa da yerləri yoxdur. (*Hirslənir*) Bu isə, sənin vecinə deyil.

N ə z a k ə t. Qız heç vaxt uşaqların onun otağında dərs hazırlamalarına mane olmur... Əksinə... özü həmişə onlara kömək eləyir.

F ə r ə c. Bu nağılları qoy dursun. (*Birdən*) Mən onun burada olmasını istəmirəm, vəssalam, ya o, ya mən!

Fərəc otaqdan çıxır. Nəzakət onun ardınca uzun bir nəzər salır. Sonra Nargilə olan otağa girərək, gəlib onun yanında oturur. Gözü qızına zillənib qalmışdır. Yenə də

həmin musiqi səslənir. Yenə də zaman dayanır... Nargilə ayılır. Anasına baxaraq, sanki xəyalını uzaqlardan qaytarmağa çalışır.

N a r g i l ə (*dikəlir*). Elə qəribə yuxu görürdüm ki...

N ə z a k ə t. Nə yuxu idi?

N a r g i l ə. Görürəm mən yaşıl bir meşə ilə harasa tələsirəm. Birdən qarşıma saçları ağarmış qədd-qamətli bir zabit çıxır. İkimiz də dayanırıq. Sən də gəlib çıxırsan... Zabit kədərli gözləri ilə hey mənə baxıb susur... Mən özümü itirirəm. Sən mənə deyirsən: bunu tanımırsan? Sənin atandır da... Mən də ürəyimdə deyirəm: bir gör mənim atam necə yaraşıqlıdır...

N ə z a k ə t. O, müharibəyə gedəndə iyirmi üç yaşında saçları qapqara bir oğlan idi.

N a r g i l ə (*qalxıb güzgüdə özünə uzun bir nəzər salır. Gözləri güzgüdə olduğu halda oxuyur*).

Sən şahin kimi cəsur, mələk kimi gözəl idin.
Sən igidlər içində bir igid idin.
Səni uzaq bir səhrada sinəndən vurdular...
Dağlardan bir qartal uçub sənin yanına gəldi.
Başın üzərində hərlənən qarğalar
Onu görüb qaçdılar.
Düşməni məhv edib qayıdan yoldaşların səni
Bir palıd altında dəfn eləyib getdilər.
O vaxtdan həmin qartal hər axşam, səhər
Sənin qərib məzarın üzərində dövrə vuraraq
Göylərin dərinliklərində gözdən itir.

Fərəc gəlib o biri otağa keçir. Hiss olunur ki, qızın mahnısı onu daxilən özündən çıxarır. O, acığından stulları bir-birinə vurur.

F ə r ə c (*yemək otağında stula oturaraq qışqırır*). Borjom!.. (*Nəzakət diksinərək, qalxıb mətbəxdən ona bir şüşə borjom aparır*) Nə oldu, danışdın?

N ə z a k ə t. Yox.

F ə r ə c. Niyə?

N ə z a k ə t. Mən danışa bilmirəm!

Pauza. Fərəc sakit halda borjomu töküb içir. Sonra qalxıb, arvadının qabağında dayanır.

F ə r ə c. Ya mən, ya o! Bu gecə evə gəlməyəcəyəm. Soruşsalar, əmioğlugildəyəm. Səhər zəng edib qərarını mənə bildirərsən.

Həsir şlyapasını götürüb təntənəli şəkildə çıxır.
Nəzakət yerində donub qalmışdır.

N a r g i l ə (*gəlir*). Yenə niyə stulları bir-birinə çırpırdı?

N ə z a k ə t. Nargilə! Qızım! Sən köç xalanla ol. Tək arvaddır.

N a r g i l ə. Aha... demək belə...

N ə z a k ə t. Yenə də əvvəlki kimi gözüm üstündə olacaq.

N a r g i l ə. Yox, mən heç yerə getməyəcəm. Bura mənim atamın evidir. Zəhmət çəkib siz getsəniz, mən özümü çox yaxşı hiss edərəm.

N ə z a k ə t (*acıqlı halda*). Sən bir adamsan, amma biz beş nəfər!

N a r g i l ə (*onun sözünü təkrar edir*). Biz! Bəs, sən deyirdin onu istəmirsən?

N ə z a k ə t (*qışqırır*). Mənim uşaqlarım var!

N a r g i l ə. Uşaqlar.

N ə z a k ə t. Bu nə hərəkətdir?! Sən ananla danışırsan!..

N a r g i l ə. Yox! Mən Fərəcin arvadı ilə danışıram.

N ə z a k ə t (*mülayim tərzdə*). Axı, sən indi böyük qızsan... Hər şeyi başa düşürsən. Mən ki, sənə izah elədim.

N a r g i l ə. Mən səni ərə getməkdə təqsirləndirmirəm.

N ə z a k ə t. Yoxsa, mənim səni istəməyimə şübhə edirsən?

N a r g i l ə. Mən buna da şübhə etmirəm.

N ə z a k ə t. Bəs, onda sən məni nədə təqsirləndirirsən?

N a r g i l ə. Köləlikdə!

N ə z a k ə t. Mən kimin köləsiyəm?

N a r g i l ə (*qışqırır*). Bir köstəbəyin! İnsanlıqda haqqı olmayan bir rəzilin. Sən bu neçə ildə onun yanında mənimlə bir kəlmə danışmamısan! Qorxursan ki, köstəbək hirslənib səni atar.

N ə z a k ə t (*sarsılmış halda*). Sən ananın bədbəxtliyinə acımaq əvəzinə, gör ona nələr deyirsən!

N a r g i l ə. Mən bütün üzvləri sağlam olduğu halda, özlərini yalnız acımağa layiq bilənlərə...

N ə z a k ə t. Nifrət edirsən, eləmi?

N a r g i l ə. Bağışla, sən məni o qədər yandırıb-tökürsən ki...

N ə z a k ə t. Bəlkə də lənətə gəlmiş müharibə olmasaydı bizim aramızda bu sözlər olmazdı...

N a r g i l ə. Nə isə... Bu söhbətlər artıq gecdir. Demək sən də, ərin də mənim bu evdən çıxıb getməyimi istəyirsiniz.

N ə z a k ə t. Mən yox... başa düş...

N a r g i l ə. Başa düşürəm... Heç sən özün də təsəvvür eləyə bilməzsən ki, nə qədər aydın başa düşürəm.

N ə z a k ə t. O getdi. Əgər, sən burada qalsan, bir də qayıtmayacaq. Mənim isə, ondan üç uşağım var...

N a r g i l ə. Sən uşaqların adını az çək. Dünyada heç nədən xəbərləri olmayan körpələri bir ehtikar alətinə çevirmək yaxşı deyil. Bunu o eləyir, heç olmazsa, sən eləmə.

N ə z a k ə t. Mən sənin qarşında təqsirkaram.

N a r g i l ə. Xahiş edirəm, yalvarıram, belə sözləri qoy bir kənara. Get deyirsən, gedirəm. (*Çamadanını yığışdırır*)

N ə z a k ə t (göz yaşları içində). Allah bilir ki, mən səni nə qədər çox istəyirəm... Sən mənim ilkimsən. Sən onun yadigarısan...

N a r g i l ə (*qışqırır*). Sənə dedim ki, bu sözləri qoy bir kənara! Yoxsa, bax, getmərəm. O köstəbək bilir ki, hökumətə düşsə, bu otaqların heç olmasa, biri qanuni surətdə mənə çatır.

N ə z a k ə t (*qorxmuş halda*). Əlbəttə... (*Pauza. Birinci səhnədəki musiqi yenə də eşidilir. Yenə də adama elə gəlir ki, bu musiqi dünya bina olandan indiyə qədər davam edir. Nargilə atasının şəklini divardan alıb çamadanına qoyur. Sonra şifonerdən bir neçə kişi qalstukunu çıxarır, havada silkələyərək tozunu çırpır..*) Qoy onun qalstukunun biri mənə qalsın...

N a r g i l ə (*qalstukları çamadana qoyaraq*). Onun bu boyda evi sənə qalır, bir qalstuk nəyinə lazımdır ki...

N ə z a k ə t. Niyə sən mənə qarşı bu qədər amansızsan? (*Lakin Nargilə daha onu dinləmir. Çamadanını götürür, musiqi davam edir*) Mən hər gün sənin yanına gələcəyəm.

N a r g i l ə (*onu dinləməyərək divarları nəzərdən keçirir. Öz-özünə danışırmış kimi*). Gövhər nənəm deyərdi ki, mənim atam bu otaqda doğulub, sonralar da bura onun iş otağı olub...

N ə z a k ə t. Elədir...

Musiqi susur.

N a r g i l ə (*təhdidlə*). Əgər, siz buranı yataq otağı eləsəniz, mən hökumətin əli ilə bunu təkrar sizdən alacağam. İndi isə xudahafiz.

Çıxır. Nəzakət qızın ardınca uzun bir nəzər salır. İşıq tədricən tutqunlaşır. Nəzakət vahimə içərisində otağı nəzərdən keçirir. Elə bil ki, divar yerindən tərpənərək ona tərəf hərəkət edir. Yarıqaranlıq içində hər tərəfdən sıxlaşan divarlarla birlikdə Fərəc də irəliləyib Nəzakətin qarşısında dayanır. Nəzakət alacalanmış gözləri ilə ərinə baxaraq, dəhşət içində pıçıldayır.

N ə z a k ə t. Getdi!

Fərəcin Nəzakətə zillənmiş nəzərləri altında səhnə qaranlıqlaşır. İşıq yananda Nargilənin yeni mənzili görünür. Bu, balaca, dar, yarıqaranlıq bir otaqdır. Bir tərəfdə üzərinə ucuz, lakin çox təmiz adyal çəkilmiş dəmir çarpayı, köhnə divan qoyulmuşdur. Çarpayının yanındakı divara Nargilənin gənc atasının şəkli vurulmuşdur. Ortada təmiz, ağ örtüklü stol və iki köhnə stul vardır. Nargilə, əynində xalat, evini səliqəyə salır. Telefon zəng vurur. Nargilə irəliləyib dəstəyi götürür və bu zaman işıq yalnız onun, bir də telefon xəttinin o biri tərəfindəki avtomat köşkünün üzərinə düşür. Köşkdə ultramoda ilə geyinmiş sarısaç bir qız telefon dəstəyini qulağına tutmuşdur. Onun yanında yenə də ultramodada geyinmiş iki gənc oğlan dayanmışdır, oğlanlardan biri qızın əlindən tutmuşdur.

S a r ı s a ç  q ı z. Nana, səni təzə mənzildə təbrik edirik.

N a r g i l ə. Çox sağ olun. Ancaq mənim təzə mənzilim bu təbrikə dəyməz.

S a r ı s a ç  q ı z. Nə danışırsan, Nana. Sən indi azad quşsan... Heç kəs səndən soruşmayacaq, niyə tez getdin, niyə gec gəldin? Bu ki, dünyaya dəyər... Mən sənə həsəd aparıram.

N a r g i l ə (*gülümsəyir*). Doğrudanmı?

S a r ı s a ç  q ı z. Vicdan haqqı. (*İkinci oğlana baxaraq gülümsəyir*) Nana!

N a r g i l ə. Nədi?

S a r ı s a ç  q ı z. Tez geyin gəl. “Nərgiz” kafesinin yanında gözləyirik.

N a r g i l ə. Kiminlə?

S a r ı s a ç  q ı z. Gələrsən, görərsən. (*İkinci oğlana baxaraq gülümsəyir*) Sənin üçün sürpriz var. (*İkinci oğlan gülümsəyir*)

N a r g i l ə. Nə sürpriz?

S a r ı s a ç  q ı z. Dedim ki, gələrsən, görərsən.

N a r g i l ə. Sən kiminləsən?

S a r ı s a ç  q ı z. Mən Dodiklə.

N a r g i l ə. Hansı Dodiklə?

S a r ı s a ç  q ı z. Çapıq Davudu tanımırsan?

N a r g i l ə (*bərkdən gülərək*). Nə üçün oğlanın üzünə heylə söz deyirsən?

S a r ı s a ç  q ı z. Sən də... oğlanın... (*Davud onun əlini bərk sıxır, qız qışqırır*) Oy...

N a r g i l ə. Nə oldu?

S a r ı s a ç  q ı z. Sən ki, bunun vəhşiliyini bilirsən... (*Davud vəhşi bir görünüş alaraq, dişlərini bir-birinə sürtüb qıcırdadır*) Oy, Dod... bəsdir... (*Telefona*) Qurtar! Sürprizin bağrı çatladı.

İ k i n c i  o ğ l a n (*ağzını telefon dəstəyinə yapışdıraraq oxuyur*).

Zaman keçir... günlər quş kimi uçur.
Həyat bir stəkan sudur,
Tələs tez iç.
Yoxsa, bizim bu fərsiz planetimiz
Hər bir an bir ovuc kül ola bilər.
Həyat bir stəkan sudur,
Tələs tez iç...

S a r ı s a ç  q ı z (*oxuyur*).

Taleyindən narazı eybəcər bir qız
Bizi kəsdi, "üç" verdi,
Ali məktəbə girməyə qoymadı,
Biz həyatdan və eybəcər qızdan
İntiqam alacağıq.
Biz eşq badəsini sona qədər içib,
Dünyanın bütün zövq-səfasını dadacağıq...
Biz həyatdan və eybəcər qızdan
İntiqam alacağıq.

H ə r  ü ç ü (*oxuyur*).

Biz həyatdan və eybəcər qızdan
İntiqam alacağıq.

S a r ı s a ç  q ı z. Nana, tez ol, gözləyirik.

Köşk qaranlıqlaşır. İndi yalnız Nargilənin otağı görünür. O, yavaş-yavaş xalatını çıxarır, təzə paltarını geyir. Üzü ciddi və fikirlidir. Əvvəl dodaqlarına pomada, üzünə

pudra vurur. Sonra nə fikirləşirsə, əsəbi hərəkətlə hamısını silir. Yalnız saçlarını darayıb otaqdan çıxır. Səhnə qaranlıqlaşır, işıq yananda ikinci şəklin ardı davam edir. Həsənzadənin eyvanı, qapıdakı söyüd ağacının yuxarısı günəş şüaları ilə işıqlanmaqdadır. Həsənzadə ayaq üstə papiros çəkir. Nargilə onun qarşısında dayanaraq, bir əli ilə söyüd ağacının yarpaqlarını oynadır. O, həyəcanlıdır.

H ə s ə n z a d ə. Deməkk, siz rəfiqənizin çağırışına getmədiniz?

N a r g i l ə (*onun üzünə baxmadan*). Mən bura gəldim.

Pauza.

N a r g i l ə (*söyüdün budağını buraxır*). Nə üçün səbəbini soruşmursunuz?

H ə s ə n z a d ə (*gülümsəyir*). Məgər, sizlərdə adamdan qonaq gəlməyinin səbəbini soruşurlar?

N a r g i l ə. Mən qonaq gəlməmişəm. Mən sizi yaxından görmək, səsinizi eşitmək üçün gəlmişəm. Dünyadakı adamların hamısından çox mənim xoşuma siz gəlirsiniz!

H ə s ə n z a d ə. Təşəkkür edirəm. Ancaq siz dünyada hələ o qədər az adam görmüsünüz ki...

N a r g i l ə. Hər halda, görmüşəm. (*Birdən acıqlanır*) Mən hər şeyi, hətta, Surikin öz çuvakları ilə məni çağırdığını belə sizə danışdımsa, bu, heç də o demək deyil ki, mən axmaq və sadəlövh bir qızam.

H ə s ə n z a d ə. Əksinə... Mən sizi çox ağıllı qız hesab edirəm.

N a r g i l ə (*ona dərin və sınayıcı bir nəzər salaraq*). Mən sizdən ancaq səmimi söz gözləyirəm...

H ə s ə n z a d ə. Mən səmimi deyirəm.

N a r g i l ə. Uşaqlıqda bir dəfə rəhmətlik Gövhər nənəm də bu sözü mənə demişdi.

H ə s ə n z a d ə. Yəqin ki, yeri düşməyib. Yoxsa, bu sözü sizə çox adam deyərdi.

N a r g i l ə. Ancaq mən çox zaman bu sözün əksini eşitmişəm.

H ə s ə n z a d ə. Məsələn, kimdən?

N a r g i l ə. Məsələn, atalığımdan... O həmişə mənim yüngülbeyin, axmaq bir qız olduğumu söyləyirdi... Sonralar... Mən on altı-on yeddi yaşına çatanda isə, anamı inandırmağa çalışırdı ki, mənim evdə qız qalmağım təhlükəlidir. Mümkün qədər tez bir adam tapıb, məni başdan eləmək lazımdır.

Qısa pauza. Həsənzadə papiros yandırır.

H ə s ə n z a d ə. O, bu sözləri sizin yanınızda deyirdi?

N a r g i l ə. Bəzilərini mənim lap gözümün içinə deyirdi, bəzilərini isə, mən öz otağımdan eşidirdim.

H ə s ə n z a d ə. Bəs, ananız nə cavab verirdi?

N a r g i l ə. Mən sizə nağıl elədim ki, anam ondan necə qorxurdu.

H ə s ə n z a d ə (*qısa pauzadan sonra*). Həyatda belə şeylər çox olub... Siz ananızdan inciməyin.

N a r g i l ə. Əgər, onun əri adam olsaydı, mən anamdan inciməzdim. Üzünə baxırsan, qusmağın gəlir. (*Getdikcə qızışır*) Xəsis, xırdaçı, qeybətcil, qorxaq, alçaq... rəzil... hər nə desəniz, ondan!..

H ə s ə n z a d ə. Sakit... axı, siz söz verdiniz ki, daha əsəbiləşməyəcəksiniz.

N a r g i l ə. Bağışlayın... (*Ağlamsınır*) O məni o qədər yandırıb ki...

H ə s ə n z a d ə. Hər şey olub keçib. Siz indi ayrı yaşayırsınız.

N a r g i l ə. Ayrı yaşasam da, onun bərəlmiş qoyun gözlərini hər yerdə görürəm...

H ə s ə n z a d ə. İşləyərsiniz... Başınız qarışar... Hamısını unudarsınız.

N a r g i l ə. Məgər, mən anamgildə olanda işləmirdim? Məgər, o üç otağın döşəməsini, altı adamın bütün pal-paltarını mən yuyub təmizləmirdim?!.

H ə s ə n z a d ə. Mən sizin hər gün nə qədər paltar yuduğunuzu, nə qədər zibil atdığınızı görürdüm.

N a r g i l ə. Ah, heç olmasa, bunu bir nəfərdən eşitdim...

H ə s ə n z a d ə. Ancaq, bilirsinizmi, heylə işləmək başqa, cəmiyyət içində başqa... Zavodda siz təzə adamlar görəcəksiniz. Təzə sözlər eşidəcəksiniz...

N a r g i l ə. Mən sizdən başqa heç kəsi görmək də istəmirəm, eşitmək də!

H ə s ə n z a d ə. Nə üçün?

N a r g i l ə. Çünki heç kəsə inanmıram!

H ə s ə n z a d ə. Bəs, nəyə görə məhz mənə inanırsınız?

N a r g i l ə. Bilmirəm. (*Qısa pauza*) Ancaq bu belədir. Əgər, bu iki ildə hər gün mən o pəncərədən sizi görməsəydim, heç bilmirəm nə edərdim. Bayaq mən sizə yalan dedim... Poçtalyon kefsiz deyildi... Mən özüm küçədə dayanıb onu gözləyirdim. Gəlib çıxanda aldatdım ki, Həsənzadəgilə gedirəm, verin qəzetləri mən aparım...

H ə s ə n z a d ə. Nə olar ki?.. Tanış olmağıma çox şadam.

N a r g i l ə. Təşəkkür edirəm.

H ə s ə n z a d ə. Təşəkkür nə üçün...

N a r g i l ə. Sizin kimi bir adam, əgər, mənimlə tanış olduğuna da şaddırsa...

H ə s ə n z a d ə. Məgər, siz pissiniz?

N a r g i l ə. Bilmirəm... hər halda, tale mənim haqqımda bir az insafsızlıq eləyib...

H ə s ə n z a d ə. Səhv edirsiniz... Əgər, "tale" deyilən bir şey varsa, sizin ondan inciməyə haqqınız yoxdur. O, xoşbəxt olmaq üçün sizə hər şeyi vermişdir... Ağıl, gözəllik, sağlamlıq... daha nə istəyirsiniz... Bayaq siz özünüz bu sözləri mənim oğlum haqqında deyirdiniz.

N a r g i l ə. O başqa... mən başqa! O sizin oğlunuzdur.

H ə s ə n z a d ə. Bunun dəxli yoxdur... Oğul, qız, ömrü axıra qədər ata-ana ilə bir başa vurmur...

N a r g i l ə. Ah, siz nə yaxşısınız... Mən sizi elə belə də təsəvvür edirdim...

H ə s ə n z a d ə. Siz də yaxşısınız... Axı, biz nə üçün pis olmalıyıq? Pislikdə nə var ki...

N a r g i l ə. Elədir... (*Qısa pauza*) İcazə verin evinizi təmizləyim...

H ə s ə n z a d ə (*zarafatyana*). Mən sizə zəhmət vermək istəmirəm.

N a r g i l ə. Mən gözümü açandan bəri həmişə pis adam üçün zəhmət çəkmişəm. İndi isə... dünyada hamıdan çox istədiyim, hamıdan yaxşı sandığım bir adam üçün zəhmət çəkmək istəyirəm. Sizin məni məhrum etməyə haqqınız yoxdur.

H ə s ə n z a d ə (*zarafatyana*). Elə isə, mənim bu kitab şkafımı səliqəyə salın. Aydın töküb-dağıdıb. Mən də işə dəyim... Getmək istəsəniz, qapını bərk çəkin, özü bağlanacaq.

N a r g i l ə. Baş üstə. (*Həsənzadə evə girir. Nargilə şkafa yaxınlaşaraq, səliqəsiz halda üst-üstə qalaqlanmış kitablardan ilk əlinə keçənin əvvəl üstünü oxuyur, sonra açıb baxmaq istərkən kitabın arasından qurumuş bir çiçək düşür. Qız əyilib çiçəyi yerdən götürür, burnuna tutub qoxlayır, bu zaman Həsənzadə, əlində iri qovluq, içəridən çıxır*) Bu nə çiçəyidir?

H ə s ə n z a d ə. Ona “Boy çiçəyi” deyirlər. Yuxarı dağlarda bitir.

N a r g i l ə. Nə qəribə çiçəkdir... qupquru quruyub, amma elə gözəl ətri var ki, elə bil indicə dərilib.

H ə s ə n z a d ə (*dərindən nəfəs alaraq*). “Boy çiçəyi” elədir... Quruyub xəzan olsa da, ətri həmişəkitək qalır. Hələlik.

Gedir. Nargilə yenə çiçəyi kitabın arasına qoyur. Şeylərin tozunu alır. Çaydanı doldurub qazın üstünə qoyur.

N a r g i l ə (*oxuyur*).

Onun saçları gümüş kimi ağdır...
Onun gözlərində daima bir kədər vardır...
Mən onun nəcib əllərinə baxaraq soruşdum:
Əzizim, nə üçün həmişə pərişansan...
O gülümsəyib cavab verdi:
“Məgər, ürəkdə hər nə ki var...
Açıb deməkmi olar...”

Qapının zəngi çalınır. Nargilə qapını açır. Nəzakət daxil olur. Gərgin pauza.

N ə z a k ə t (*acıqlı*). Burada nə edirsən?

N a r g i l ə. Elə-belə gəlmişəm.

N ə z a k ə t. Qız uşağının subay kişinin evində nə işi var?

N a r g i l ə (*sakit halda*). O məni işə düzəldir.

N ə z a k ə t. Nə münasibətlə? O səni hardan tanıyır?

N a r g i l ə. Mən özüm onunla tanış olmuşam.

N ə z a k ə t. Qələt eləmisən. Onun sən boyda oğlu var.

N a r g i l ə (*sakit halda*). Səhv edirsən, onun oğlu məndən üç yaş böyükdür.

N ə z a k ə t (*qorxu içində*). Sən onunla çoxdan tanışsan?

N a r g i l ə. Yox... bir saat bundan qabaq.

N ə z a k ə t (*təkrar qəzəblənir*). Bu dəqiqə buradan çıx, cəhənnəm ol!

N a r g i l ə (*gülümsəyir*). Cəhənnəmdə çox olmuşam, indi də cənnətə köçmək istəyirəm.

N ə z a k ə t. Demək, sən öz doğma ananı ələ salırsan?

N a r g i l ə (*sakit halda*). Yox, ələ salmıram.

N ə z a k ə t (*mülayim tərzdə*). Heç fikirləşmirsən ki, camaat nə deyər? Yoxsa, səni Həsənzadə qulluqçu tutub?

N a r g i l ə. Qulluqçuluğun daşını daha atmışam. Onun evini yığıb-yığışdırmağımı mən özüm xahiş etdim.

N ə z a k ə t. Sənin dəli olduğunu deyirdilər, inanmırdım.

N a r g i l ə. Eh... inanmamağının nəticəsi nə oldu ki...

N ə z a k ə t. Əgər, sən bu saat burdan çıxıb getməsən, mən milis idarəsinə zəng edəcəyəm!

N a r g i l ə (*bərkdən gülür*). Mən on yeddi yaşından başlayaraq, düz doqquz il atamın təqaüdü ilə dolanıb, Fərəc Sərdarova qulluqçuluq elədim. Axırda da məni öz atamın evindən qovdu, bəs, niyə onda milisə zəng eləmədin?

N ə z a k ə t. Sənin kimi cavan qızın, təkcə, yad kişinin evinə getməyi əxlaqsızlıqdır.

N a r g i l ə. Bəs, əzab... işgəncə... ədalətsizlik necə?!

N ə z a k ə t (*kövrəlir*). Niyə heylə deyirsən... Məgər, səni döyüb-söyürdülər?!

N a r g i l ə. Elə zülm var ki, döymək onun yanında muştuluqdur. Bir cüt ağarmış göz buz kimi soyuq, iyrənc baxışları ilə məni gündə yüz dəfə təhqir edirdi. Mən, on üç-on dörd yaşında qız, onun kirli tuman-köynəyini yuyurdum. Uşaqlarına dayəlik edirdim... Səhərdən axşamacan ilan kimi qabıqdan çıxırdım. Bütün bunların müqabilində isə, qulağım nələr eşitmirdi! Eh... nahaq gəlmisən, ana...

N ə z a k ə t (*ağlayır*). Nar... qızım... ağlını başına yığ. Məni ikinci dəfə bədbəxt eləmə.

N a r g i l ə. Mən səni bağışlayıram, ana, sən də məni yaddan çıxar. Üç uşağın var... Onlar sənə bəsdir.

N ə z a k ə t. Nargilə, qızım!..

N a r g i l ə. Get, ana.

N ə z a k ə t. Söz ver ki, sənin ayağın bir də bu evə dəyməyəcək.

N a r g i l ə. O barədə fikirləşərəm.

N ə z a k ə t (*təhdidlə*). Söz ver!

N a r g i l ə. Dedim ki, fikirləşərəm.

N ə z a k ə t. Onu bil ki, ana üzünə ağ olanın qəbirdə də sümüyü od tutub yanar.

Nəzakət çıxır. Pauza. Həsənzadə gəlir.

H ə s ə n z a d ə. Siz hələ burdaymışsınız. Nə olub? Niyə belə qəmginsiniz?

N a r g i l ə. Görəsən, elə bir vaxt olacaqmı ki, köləlik deyilən şey Yer üzündən silinəcək? Yoxsa, bu, həyatın qanunlarından biridir?

H ə s ə n z a d ə (*zarafatyana*). Nə danışırsınız... Biz ki, köləliyi çoxdan ləğv etmişik...

N a r g i l ə. Mən ürək, xarakter köləliyini deyirəm. Lənətə gəlmiş qorxu hissini deyirəm.

H ə s ə n z a d ə (*ciddi*). Əlbəttə, min illərdən bəri insanların qanına, iliyinə işləmiş pisliklərin hamısını birdən çıxarıb atmaq mümkün deyil... Lakin...

N a r g i l ə (*həyəcanla onun sözünü kəsərək)*. Ah... Bircə bilsəydiniz ki, mən, birinin o birindən qorxmağına, ona yaltaqlanmasına nə qədər nifrət edirəm...

H ə s ə n z a d ə. Başa düşürəm... Lakin təkcə nifrət etməkdən nə çıxar... (*Kəskin şəkildə*) Adamları qorxaqlığa, yaltaqlığa öyrədən səbəbləri tapıb məhv etmək lazımdır! (*İlhamla*) Siz bizim zavodda kimsədən qorxmayan, kimsəyə yaltaqlanmayan, öz namuslu zəhmətləri ilə hər şeyə qalib gələn oğlanlar, qızlar görəcəksiniz və o zaman inanacaqsınız ki, qorxaqlıq heç də həyatın qanunlarından biri deyil!

N a r g i l ə. Çünki onların rəisi sizsiniz!..

H ə s ə n z a d ə. Bunun əhəmiyyəti yoxdur, ya mən, yaxud da...

N a r g i l ə (*onun sözünü kəsir*). Əhəmiyyəti çoxdur. Mən oradan, o pəncərədən sizə, sizin iri və gözəl əllərinizə tamaşa elədikcə özözümə deyirdim; görəsən, bu adam həyatında bir kəsdən, bir çətinlikdən qorxmuşdurmu? Sizin bu əlləriniz mənə əsl kişiliyin, cəsarətin, mərdliyin, iradənin, alicənablığın canlı bir timsalı kimi göründü.

Qısa pauza.

H ə s ə n z a d ə (*sözü dəyişir*). Buraları nə yaxşı yığışdırmısınız?

N a r g i l ə (*fərəhlə*). Xoşunuza gəlirmi?

H ə s ə n z a d ə. Əlbəttə... belə səliqə kimin xoşuna gəlməz...

N a r g i l ə. Divanın yerini dəyişdirdim. Etiraz eləmirsiniz ki?

H ə s ə n z a d ə. Əksinə... onun əsl yeri buraymış (*Zarafatyana*), uzan, söyüd budaqları arasından səmaya tamaşa elə.

N a r g i l ə. Aha! Xüsusən aydınlıq gecələrdə.

H ə s ə n z a d ə. Siz nə şairanə qız imişsiniz...

N a r g i l ə (*tutularaq*). Doğru deyirsiniz... yoxsa...

H ə s ə n z a d ə. Doğru deyirəm...

N a r g i l ə. Sağ olun, mən indiyəcən kimsədən özüm haqqında belə yaxşı söz eşitməmişəm.

H ə s ə n z a d ə (*zarafatyana*). Bəs kavalerinizdən necə?

N a r g i l ə. Kavalerim nə gəzir?!

H ə s ə n z a d ə. Necə nə gəzir? Belə gözəl qız...

N a r g i l ə. Biri var idi, dalından dəydim, getdi...

H ə s ə n z a d ə. Niyə?

N a r g i l ə. Sifəti qız üzünə oxşayırdı. Özü də elə şit gülümsəyirdi ki, elə bil, bu saat axıb töküləcək...

H ə s ə n z a d ə (*gülümsəyir*). Ağlı-zadı necəydi?

N a r g i l ə. Ağlı... (*Ovcunun içini üfürür*) Saman tozu! Özünü də müasir Don Juan hesab eləyirdi.

H ə s ə n z a d ə. Bəs, necə olmuşdu ki, siz əvvəllər onu xoşlamışdınız?

N a r g i l ə. Gördüm ki, bəzi qızların xoşuna gəlir, mən də maraqlandım. İndiki ağlım olsaydı, heç onun üzünə də tü... (*"Tüpürməzdim" demək istəyir, lakin sözünü dəyişir*) belə baxmazdım. Siz bura köçəndən qabaqkı əhvalatdır... Onda mənim on altı yaşım var idi.

H ə s ə n z a d ə. Bəs, rəfiqənizin sürprizi?

N a r g i l ə. Boşlayın. Mən sizə dedim ki, getmədim... Nə üçün bir də soruşursunuz? Yoxsa, mənə inanmırsınız?

H ə s ə n z a d ə. İnanıram. Tamamilə inanıram.

N a r g i l ə (*qürurla*). Mən sizə heç bir zaman yalan söyləmərəm. Ümumiyyətlə, mənim yalandan acığım gəlir. O da qorxaqlıq kimi bir şeydir. Elə deyilmi?

H ə s ə n z a d ə. Elədir.

N a r g i l ə. Mən sizin üçün çay dəmləmişəm.

H ə s ə n z a d ə. Nə danışırsınız!.. Siz hardan bildiniz ki, mənim ürəyim bu saat yaman çay istəyir?

N a r g i l ə (*sevinclə*). Gətirim?

H ə s ə n z a d ə. Gətirin.

Nargilə mətbəxdən bir stəkan çay, qənd, peçenye və başqa şeylər gətirir.

N a r g i l ə. Yaxşı dəm alıb?

H ə s ə n z a d ə. Əla. Bəs özünüzə niyə gətirmirsiniz?

N a r g i l ə (*tutularaq*). Özüm sizin yanınızda çay içəcəyəm?

H ə s ə n z a d ə. İçəndə nə olar? (*Nargilə tərəddüd içində susur*) Xahiş edirəm, özünüz üçün də gətirin.

Nargilə gedib özünə çay gətirir və stul çəkib Həsənzadə ilə qabaq-qabağa oturur. Gah gülümsəyir, gah ciddi görkəm alır. Özünü nə cür aparmağını bilmir. Həsənzadə bunu hiss edir.

N a r g i l ə. Siz atalığımla anamın mənim başıma açdıqları oyuna baxmayın, ümumiyyətlə, mənimki həyatda gətirir.

H ə s ə n z a d ə. Doğrudanmı?

N a r g i l ə. Doğrudan. (*Qısa pauza. Cəsarətlə*) Məsələn, bu eyvanda, bu söyüd ağacı altında sizinlə belə qabaq-qabağa oturmaq, sizə qulaq asmaq, sizin üçün bir iş görmək mənim ən böyük arzum idi. (*Göz qapaqlarını endirərək, yavaş səslə*) Bu iki ildə elə bir gecə olmayıb ki, mən sizdən qabaq yatım.

H ə s ə n z a d ə. Sizin kimi ağıllı bir qızdan belə sözlər eşitmək mənim üçün xoşdur. (*Qısa pauza*) Bilirsinizmi, biz insanlar qəribəyik. Nə qədər böyük iradə sahibi olursan ol, həyatın hansı əziz xatirələrlə bağlı olursa-olsun, yenə də kiminsə sənin haqqında düşünməsini, az da olsa, sənin taleyinlə maraqlanmasını istəyirsən.

N a r g i l ə. Bəs necə... İnsanlarla əhatə olunduğun halda, Robinzon Kruzo kimi yaşamaq olmaz ki...

H ə s ə n z a d ə (*papiros yandırır*). Doğrudur.

N a r g i l ə. Təklik dəhşətdir. Anamgildə olanda da mən həmişə özümü yalqız hiss edirdim...

H ə s ə n z a d ə. Başa düşürəm...

Telefon zəngi. Nargilə sıçrayıb dəstəyi götürür.

N a r g i l ə. Kimi istəyirsiniz? Həsənzadəni? Bu saat.

Həsənzadə qalxıb aparata yaxınlaşır. Nargilə dəstəyi elə bir sevinclə ona uzadır ki, elə bil, bu, qız üçün tam bir səadətdir.

H ə s ə n z a d ə (*telefona*). Yaxşı, qoyun boşaltsınlar, mən də yarım saata gəlirəm. (*Dəstəyi asır*)

N a r g i l ə. İşdəndir?

H ə s ə n z a d ə. Bəli. Təzə maşınlar gəlib, təhvil almaq lazımdır.

N a r g i l ə (*tərəddüdlə*). Onda... mən gedim...

H ə s ə n z a d ə. Demək, sabahdan işə başlayırsınız... Əlbəttə, sement zavodunda işləmək o qədər də asan deyil.

N a r g i l ə. Nə olsun çətindir... Siz ki, orda işləyirsiniz.

H ə s ə n z a d ə (*gülümsəyir*). Mən ayrı... bizim ciyərlərimiz sementin tozuna öyrəşib.

N a r g i l ə (*jaketini geyərək*). Hərdən bura gəlməyimə icazə verərsiniz?

H ə s ə n z a d ə. Əlbəttə...

N a r g i l ə. Hərdən yox, tez-tez! Hər gün!

H ə s ə n z a d ə. Gəlin.

N a r g i l ə. Mənim haqqımda pis düşünməyin ha!..

H ə s ə n z a d ə. Bəyəm, siz pis qızsınız?

N a r g i l ə (*qəti şəkildə*). Yox, pis qız deyiləm!

H ə s ə n z a d ə. Onda nə üçün mən sizin haqqınızda elə düşünməliyəm?

N a r g i l ə (*öz-özünə danışırmış kimi*). Doğrudan da... (*Qısa pauza*) Siz mənim indiyə qədər bir yad kişi ilə tək otaqda qalmadığıma inanırsınızmı?

H ə s ə n z a d ə. İnanıram. Bir də ki, qalanda nə olar?.. Kişilər adamyeyən deyillər ki?

N a r g i l ə. Yox... Bu, qeyri-səmimi söz oldu.

H ə s ə n z a d ə. Nə üçün?

N a r g i l ə (*acıqlı*). Çünki adamyeyənləri var!

H ə s ə n z a d ə. Biz həmişə yaxşını əsas götürməliyik... Pisin ömrü az olur.

N a r g i l ə. Əksinə, pislərin ömrü acı bağırsaq kimi hey uzanır... (*Qısa pauza*) Deyirlər mənim atam ağılda, yaraşıqda, qanacaqda iki oğlanın biriymiş. Amma müharibədən qayıtmadı. Fərəc isə qayıtdı. Özünün də hələ yüz il bundan sonra ölmək fikri yoxdur.

H ə s ə n z a d ə. Məsələ tez və ya gec ölməkdə deyil. Ömür, onsuz da, nisbi şeydir. Ancaq... Boy çiçəyini yadınıza salın. Özü neçə vaxtdır ki, xəzan olub gedib, amma ətri indi də bizi heyran edir... Yaxşı insanlar da belədir... Özləri məhv olsalar da, xatirələri həmişə bizim ləyaqətlə yaşamağımıza kömək edir. Bizim üçün təsəlli olur.

N a r g i l ə (*pıçıltı ilə*). Doğrudur... Əgər atamın əziz xatirəsi olmasaydı... (*Ağlayır*) Allaha şükür ki, mən hələ indiyə qədər onun adına layiq olmayan bir iş tutmamışam. Heç bir fırıldaqçı oğlanın hop-gopuna aldanmamışam. Buna birinci səbəb yad yerlərdə həlak olmuş cavan atamın adıdırsa, ikinci səbəb bilirsinizmi kimdir? (*Həsənzadə*

*sual ifadəsilə ona baxır*) Siz! (*Qısa pauza*) Mən oradan sizə tamaşa elədikcə, həyatımda tez-tez təsadüf elədiyim pisliklər mənə o qədər kiçik görünürdü ki, bir az qabaq onların məni incidə bildiklərinə təəccüb edirdim. Elə bil ki, mən onların hamısına – bütün o Fərəclərə, Dodiklərə ulduzların yanından baxırdım! Elə bil ki, mənim bu balaca sinəmə dünya sığmırdı. Mən zavodda, qəsəbədə sizin haqqınızda eyzən yaxşı sözlər eşidirdim. Və bunlar məni xoşbəxt edirdi. Mən sizin bizə qonşu olduğunuzu hamıya iftixarla söyləyirdim...

Telefon zəngi. Dəstəyi Həsənzadə götürür.

H ə s ə n z a d ə. Eşidirəm. Gəlirəm, gəlirəm. (*Dəstəyi yerinə qoyur*)

N a r g i l ə. Oy... mən sizi ləngitdim. Bağışlayın...

H ə s ə n z a d ə. Eybi yoxdur.

N a r g i l ə (*riqqətlə*). Sağ olun. Çox sağ olun...

H ə s ə n z a d ə. Siz də sağ olun.

N a r g i l ə. Hələlik.

H ə s ə n z a d ə. Hələlik.

Nargilə gedir. Həsənzadə onun ardınca uzun bir nəzər salır. Səhnə qaranlıqlaşır və bu qaranlıqda Nargilənin acıqlı səsi eşidilir.

N a r g i l ə n i n  s ə s i. Mən elə bilirdim Fərəc bizim evdədir...

İşıq Nargilə və onun qarşısında dayanmış Fərəcovun üzərinə düşür.

N a r g i l ə. Məni direktor Həsənzadə göndərib, başa düşürsünüz-mü?

F ə r ə c o v. Ba...ba... başa düşürəm... A... ancaq gecikmisiniz, siz dünən gəlməli idiniz... gö... gözlədim, gəlmədiniz.

N a r g i l ə (*onu yamsılayır*). D...de...dedim ki, xəstələnmişdim.

F ə r ə c o v. O öz işinizdir.

N a r g i l ə. Xəstələnmək öz işimdir?

F ə r ə c o v. Ə...əlbəttə. Sizi mən xəstələndirməmişəm ki?

N a r g i l ə. Siz xəstələndirmişsiniz! Mənim əsəblərimi siz Fərəclər çeynəyib əldən salmısınız. Mən sizlərlə vuruşmaqdan (*Boğazını göstərir*) bura gəlmişəm.

F ə r ə c o v. Mə...mə...mənim adım Fərəc deyil, Bədəldir.

N a r g i l ə. Xeyr! Sən Fərəcsən!..

Nargilə yaxındakı telefonun dəstəyini götürür. Fərəcov mane olmaq istəyir.

F ə r ə c o v. Telefona to...toxunmayın, gedin ayrı yerdən zəng eləyin.

N a r g i l ə. Əlinizi çəkin! Bura sizin eviniz deyil. Mən direktora zəng eləyirəm!

Fərəcov əlini çəkir. Nargilə zəng edir.

N a r g i l ə. Bağışlayın... narahat edirəm... Burda da bir Fərəc var... Məni işə götürmür, deyir yer tutulub...

Nargilə dəstəyi verir Fərəcova.

F ə r ə c o v. E...e...eşidirəm yoldaş di...rektor. Siz bunun dünən gələcəyini söyləmişdiniz... Ö...ö...özü də bi... birtəhər qızdır... Bi... bir az dəlisoydur.

N a r g i l ə (*özündən çıxır*). Dəli, gic, nenormalnı hamısı sizsiniz! (*Fərəcov dəstəyi dərhal onun ağzına tərəf tutur ki, sözlərini Həsənzadə eşitsin*) Siz Fərəclər adamyeyənsiniz!

F ə r ə c o v. Bacı, mənim adım Bədəldir.

N a r g i l ə. Xeyr, sizin hamınızın bir adınız var!

F ə r ə c o v (*telefonda*). Yo...yoldaş direktor, eşidirsiniz? Necə? Ə...əmrini verim? Ba...baş üstə...

Dəstəyi qulağından aralayır, lakin hələ asmır.

N a r g i l ə. Hə... Necədir? Siz Fərəclərlə hələ mənim işim çoxdur.

F ə r ə c o v (*özündən çıxaraq*). Lənət sənə şeytan...de... dedim ki, mənim adım Bədəldir.

N a r g i l ə. Keçməz! Fərəcsiniz!

Fərəcov əsəbi halda dəstəyi yerinə çırpır. İşıq sönür. İşıq yananda Həsənzadənin otağı görünür. Birinci şəkildəki musiqi davam edir. Həsənzadə, əlində papiros, pəncərə qarşısında dayanıb uzaqlara baxır. Sonra dərindən nəfəs alaraq geri çevrilir. Xurşid gəlir.

H ə s ə n z a d ə. Aydın gedəndən ancaq bir teleqram vurub ki, sağ-salamat gəlib çıxdım. İndi on səkkiz gündür ondan heç bir xəbər yoxdur.

X u r ş i d. Darıxma. Yəqin hələ yerini-yurdunu əməlli müəyyən eləməyib.

H ə s ə n z a d ə. Darıxmaya bilmirəm, adamın başına yüz cür fikir gəlir. (*Qısa pauza*) Bəlkə də bu ondandır ki, sən bizi çox tez tərk eləyib getdin. Sən sağ olsaydın, yəqin ki, mən ona bu qədər bağlanmazdım.

X u r ş i d. Sən öz borcunu yerinə yetirmisən... İndi Aydın sənin haqqında düşünməlidir.

H ə s ə n z a d ə. Yox... Mən heç kəsin mənim haqqımda narahat olmasını arzu etmirəm. Mən bunları elə-belə ürəyimdə düşünürəm. Kimsənin eşitməsini də istəmirəm.

X u r ş i d. Mən sənin bu tək vaxtında sağ olmağımı hər zamankından çox istərdim.

H ə s ə n z a d ə. Sən məni zəiflikdə təqsirləndirmə. Doğrudur, mən tək deyiləm. İşləyirəm, özü də pis işləmirəm. Zavodda məni istəyirlər. Xalq, hökumət mənim əməyimi qiymətləndirib. Lakin mən... bunların hamısını sənin, mənə ən yaxın bir adam olan sənin görüb eşitməyini istərdim...

X u r ş i d. Mən səni elə belə də tanımışdım.

Birinci şəkildəki musiqi davam edir. Həsənzadə yorğun halda divanda oturur.

H ə s ə n z a d ə. Bu gün zavoddakı şənlik məni yaman yorub. (*Gülümsəyir*) Axı, biz bu il keçən ilkindən xeyli artıq sement istehsal eləmişik...

X u r ş i d. Sənin zavoddakı hər qələbən mənim üçün bir bayrama çevrilərdi. Belə vaxtlarda sənin üzündə elə xoşbəxt, elə mehriban ifadə olurdu ki...

H ə s ə n z a d ə. O zamanlar mənim iki qanadım var idi... biri sən, biri də işim. (*Qısa pauza*) Lakin sonralar da mən ruhdan düşmədim. Mənə elə gəlirdi ki, sən mənim hər bir müvəffəqiyyətimi görüb sevinirsən... (*Yavaş-yavaş mürgüləyir. Musiqi davam edir*) Yadındadırmı... sən bəzən bu mahnını oxuyardın...

İşıq azalır və azaldıqca musiqi, cavan Xurşidin oxuduğu mahnıya çevrilir. Və sanki bu mahnı uzaqlardan, tamam başqa aləmdən gəlir. İşıq gücləndikcə biz Həsənzadəni divanda yatmış görürük. Onun üzündə xoşbəxt bir ifadə var. Xurşid yoxdur. Eyvanın qapısı açılır. Nargilə, əlində bükülü bir kağız daxil olur. Dayanıb uzun müddət Həsənzadəyə baxır, sonra böyük ehtiyatla ona yaxınlaşaraq, əyilib dodaqları ilə onun üzünə toxunmaq istəyir. Həsənzadə yuxuda tərpənir. Qız sıçrayıb kənarda dayanır... Həsənzadə hələ də yatır. Nargilə içəridən adyal gətirib üsulluca

onun üstünə salır. Sonra stolun üstündə çayı yarımçıq qalmış stəkanı aparıb mətbəxə qoyur. Süfrəni götürüb çırpır və yenidən salır. Sonra ehtiyatla gəlib divanda Həsənzadənin yanında oturur. Bayaqkı bükülü kağızı jaketinin cibindən çıxarıb baxır. Sonra səliqə ilə qatlayıb əlində saxlayır. Nəzərləri təkrar Həsənzadənin üzərində dayanır. O biri əli ilə onun saçlarına toxunur. Birinci şəkildəki musiqi davam edir. İşıq təkrar azalır. Sanki hava qaralır. Bayırda tez-tez şimşək çaxdığı görünür. Nəhayət, tamam qaranlıq olur və birdən gur işıq, qucağında bələkli bir uşaq içəri otaqdan çıxan Nargilənin üzərinə düşür. Həsənzadə qaranlıqdan çıxaraq, əyilib körpəyə baxır və gülümsəyərək barmağı ilə ona toxunmaq istəyir. Lakin Nargilə uşağı geri çəkir. Barmağı ilə Həsənzadəni hədələyir, yəni ki, "olmaz!" Sonra əlini üzünə qoyub, körpənin yatdığını başa salır və onu beşiyə qoyur... Sonra başını qaldırıb təkrar Həsənzadəyə baxır. Gözlərini yumaraq, üzünü onun üzünə yaxınlaşdırır. Şiddətli göy gurultusu eşidilir. İşıq qaralır, güclənəndə Nargilə sıçrayıb divandan qalxır. Həsənzadə diksinib gözlərini açır. Ayaq üstündə dayanmış Nargiləni görəndə əvvəl sanki heç nə başa düşmür... Sonra özünə gələrək, təkrar Nargiləyə baxıb gülümsəyir. Adyalı kənar edərək, qalxıb oturur.

H ə s ə n z a d ə. Bəzən adam elə xoşbəxt yuxular görür ki...

N a r g i l ə. Nə görürdünüz?

H ə s ə n z a d ə (*zarafatyana*). Yuxunu danışsan, kəsərdən düşər... Yaxşısı budur siz deyin görüm haradan gəlirsiniz?

N a r g i l ə (*məyus halda*). Nə üçün yuxunuzu danışmaq istəmirsiniz?

Həsənzadə papiros yandırır. Göy bir də şiddətlə gurlayır.
Külək söyüd yarpaqlarını tərpədərək uğuldayır.

H ə s ə n z a d ə. Bərk yağacaq. O əlinizdəki nədir?

N a r g i l ə (*daldığı mükəddər xəyaldan ayrılaraq, sevinclə*). Məktubdur. Oğlunuzdan gəlib. (*Zərfi ona verərək*) Poçtalyon məni yamanca tanıyıb... Bura gələndə... qapıda gördüm...

Lakin Həsənzadənin artıq onu dinləməyərək, məktubu açıb nəzərdən keçirdiyini görüb susur. Həsənzadə məktubu oxuyub qurtararaq, ehtiyatla qatlayıb zərfə qoyur.

N a r g i l ə. Nə yazır?

H ə s ə n z a d ə. Yaxşıdır. Neft mədənlərindən birində baş mühəndisdir.

N a r g i l ə. Ev tutub?

H ə s ə n z a d ə. Tutub.

N a r g i l ə. Yaxşı olar. Ağıllı oğlandır.

H ə s ə n z a d ə. Bu adyalı mənim üstümə siz salmısınız?

N a r g i l ə (*"hə" mənasında başını tərpədir*). Başqa kim salacaqdı ki?

H ə s ə n z a d ə. Dedim bəlkə Ayna xala salıb... O bu gün gəlib paltar yuyası idi. Niyə oturmursunuz? Gəlin əyləşin.

N a r g i l ə (*acıqlı*). Oturmuram.

H ə s ə n z a d ə. Nə üçün?

N a r g i l ə. Çünki siz məni istəmirsiniz...

H ə s ə n z a d ə (*səmimi təəccüblə*). Mən sizi istəmirəm?..

N a r g i l ə. O cür istəmək demirəm.

H ə s ə n z a d ə. Bəs, nə cür deyirsiniz?

N a r g i l ə (*acıqlı*). Mənim kimi!

H ə s ə n z a d ə (*zarafatyana*). Mən sizin kimi istəyə bilmərəm... Siz cavansınız...

N a r g i l ə. Siz qocasınız?

H ə s ə n z a d ə. Hər halda, sizdən iyirmi altı yaş böyüyəm.

N a r g i l ə (*acıqlı*). İyirmi altı yox, iyirmi beş! Mən srağagün on doqquzu bitirdim.

H ə s ə n z a d ə. Demək, biz bir gündə anadan olmuşuq... srağagün mən də qırx altıya adladım.

N a r g i l ə. Nə olsun? Qırx altı nədi ki... (*Birdən acıqlanaraq*) Heç bilmirəm bu nə yaş məsələsidir, salmısınız ortalığa.

H ə s ə n z a d ə (*gülümsəyir*). Yaş faktdır. Faktla hesablaşmamaq olmaz.

N a r g i l ə. Sevən adam yaşa baxmaz.

H ə s ə n z a d ə. Cavanlıqda adama elə gəlir... Mən də on səkkiz-on doqquz yaşlarında olduğum zaman özümdən iyirmi dörd yaş böyük bir qadına vurulmuşdum.

N a r g i l ə. Bəs, sonra nə oldu?

H ə s ə n z a d ə. Sonra... (*Qısa pauza*) Sonra Aydının anası ilə evləndim.

N a r g i l ə. Sevib evləndiniz?

H ə s ə n z a d ə. Bəli.

N a r g i l ə. Demək... əvvəlki qadına olan məhəbbətiniz əslində sabun köpüyü imiş...

H ə s ə n z a d ə. Bilmirəm... Bəlkə də...

N a r g i l ə. Bəs, o qadın necə oldu?

H ə s ə n z a d ə. Durur, indi yetmiş yaşlı bir qarıdır.

N a r g i l ə (*qısa pauzadan sonra birdən özündən çıxaraq*). Siz bununla nə demək istəyirsiniz?

H ə s ə n z a d ə. Heç nə... Söz-sözü gətirdi.

N a r g i l ə (*gəlib onun yanında oturaraq, mehriban tərzdə*). Siz məni istəməsəniz də, mən sizi həmişə... yetmiş yox, lap yüz yaşınız da olsa sevəcəyəm. Özü də mən sizdən tez qocalıb öləcəyəm. Özünüz görəcəksiniz... (*Qısa pauza*) Xahiş edirəm bir də bundan sonra mənimlə yaş barədə danışmayasınız... Yaxşımı?

H ə s ə n z a d ə. Yaxşı. Danışmaram. (*Papiros yandırır və bu zaman bayırda ürəyə yatan bir səslə oxunan "Qaragilə" mahnısı eşidilir. Nargilənin üzü soyuq bir ifadə alır. Həsənzadə dinləyir*)

Gəlmişəm otağına oyadam səni,
Qaragilə, oyadam səni.
Nə gözəl xəlq eləyib yaradan səni,
Qaragilə, yaradan səni.

H ə s ə n z a d ə. Bizim ekskavatorçu Rəşiddir.

N a r g i l ə (*soyuq tərzdə*). Tanıyıram.

H ə s ə n z a d ə. Haradan tanıyırsınız?

N a r g i l ə. Zavodda görmüşəm. Özündən müştəbehin biridir.

H ə s ə n z a d ə. Özündən müştəbeh? Yox, onda tanımırsınız.

N a r g i l ə. Tanıyıram. İki dəfə onun üçün naryad yazmışam. Bir az yaraşıqlıdır, bir az da səsi var deyən, elə bilir alçacıq dağları bu yaradıb.

Mahnı davam edir.

Qızıl gül əsdi,
Səbrimi kəsdi...

N a r g i l ə (*mahnının qurtarmasını gözləməyərək qalxır*). Bayaq dediniz ki, yuyulası şeyləriniz var.

H ə s ə n z a d ə. Siz zəhmət çəkməyin. Ayna xala gəlib aparar. Bir dəfə tünd bir türk kofesi hazırlarsınız, içərik.

N a r g i l ə (*sevinclə*). İstəyirsiniz lap bu saat hazırlayım.

H ə s ə n z a d ə. Yox, zavodda istehsalat müşavirəsi çağırmışam.

N a r g i l ə. Həmişə mən gələndə sizin ya işiniz olur, ya iclasınız. (*Gülür*) Məktəbdə "iclas var" deyən kimi "c"-nın yanına "r" qoyurdum.

H ə s ə n z a d ə. Neyləyirdiniz?

N a r g i l ə (*bərkdən gülərək*). Qaçırdım!.. (*Rəşidin oxuduğu mahnının ardı eşidilir. Nargilənin üzü dərhal soyuq və ciddi ifadə alır*) Deyəsən, bu ekskavatorçu bu gün bizə konsert vermək fikrindədir.

H ə s ə n z a d ə. Cavan oğlandır, kefi gəlir, oxuyur.

N a r g i l ə. Bah... bah... cavan oğlan...

H ə s ə n z a d ə. Bəs necə... gənclik – nəğmə deməkdir.

N a r g i l ə (*tutqun halda*). Bilmirəm! Belə obrazlı ifadələr barəsində fikirləşməmişəm. Hələlik. (*Getmək istəyir*)

H ə s ə n z a d ə. Dayanın. Nə üçün acıqlanırsınız?

N a r g i l ə (*sərt şəkildə*). Çünki siz mənim sözlərimi bir qəpiyin yerində qoymursunuz.

H ə s ə n z a d ə. Nə danışırsınız!.. Hansı sözlərinizi?

N a r g i l ə. Hansı sözlərinizi... Mən sizə dedim ki, bu cavanlıq-qocalıq məsələsini az ortaya salın! Siz də söz verdiniz...

H ə s ə n z a d ə. Bağışlayın, yadımdan çıxdı... Skleroz...

N a r g i l ə (*yanıb tökülərək*). Bax, görürsünüz?! Siz düzəlməzsiniz, vəssalam. Necə sklerozzusunuz ki, zavodda olan səkkiz yüz işçinin hamısını uşaqlarına qədər adbaad tanıyırsınız?!

H ə s ə n z a d ə. Nə bildiniz?

N a r g i l ə. Camaat danışır, mən də eşidirəm. Qulaqlarımı tutum?

H ə s ə n z a d ə. Yox, qulaqlarınızı nə üçün tutursunuz? Yaxşı sözü həmişə eşitmək lazımdır.

N a r g i l ə (*birdən qəhqəhə ilə gülərək*). Görürsünüz... Yaxşı olduğunuzu özünüz də təsdiq edirsiniz...

H ə s ə n z a d ə. Mən, ümumiyyətlə, deyirəm...

N a r g i l ə. Qurtardıq! Bir də bu mövzuya qayıdanı qurd yesin. Mən getdim.

Sürətli addımlarla qapıya tərəf yönəlir. Birdən geri dönərək Həsənzadəyə yaxınlaşır. Qarşısında dayanıb, ona baxır... Nəhayət, nəzərlərini endirərək Həsənzadənin əlini sol əli ilə bərk-bərk sıxıb tələsik çıxır. Həsənzadə qızın sıxmış olduğu əlini qeyri-iradi bir hərəkətlə qaldırıb baxır. Lakin onun fikrinin uzaqlarda olduğu görünür. Birinci şəkildəki musiqinin ardı davam edir. İşıq yavaş-yavaş zəifləyir, nəhayət sönür. Yananda Nargilənin otağı görünür. Qız öz mahnısını zümzümə eləyə-eləyə stolun üstündə xəmirdən yuxa açır, sonra doğrayıb nə isə hazırlayır. Onun üzündə xoş bir ifadə var. Telefon zəng vurur. Nargilə yüyürüb dəstəyi götürür. İndi işıq yalnız onun və telefon xəttinin o biri ucunda olan Sarısaç qızla tanış iki oğlanın üzərinə düşür.

S a r ı s a ç  q ı z. Salam, Nana. Harda itib-batmısan?

N a r g i l ə. Harada olacağam, zavodda... evdə... indi mən iş adamıyam.

S a r ı s a ç  q ı z. Bah... bah... iş adamı.

N a r g i l ə (*zarafatyana*). Bəs necə?

S a r ı s a ç  q ı z. Nana, doğrudurmu ki, deyirlər sən sement zavodunun direktoru Həsənzadə ilə gəzirsən?

N a r g i l ə. Gəzmirəm, mən onu istəyirəm... sevirəm, aydındırmı?

S a r ı s a ç  q ı z (*işvə ilə*). Başa düşürəm, Nana, gümüşü saçlar... hələ təravətini itirməmiş çöhrə!... Maşın... vəzifə... pul... bir sözlə: xalis Amerika zövqü! (*Səsini alçaldaraq*) Naverno, on bolşoy razvratnik...

N a r g i l ə (*ciddi şəkildə*). Mən onun haqqında sənin belə danışığına icazə vermirəm.

S a r ı s a ç  q ı z (*eyni işvəkarlıqla*). Yox a... deyəsən, gerçəkləmisən. Bəlkə sən ona ərə getmək istəyirsən?

N a r g i l ə. Əlimdə işim yarımçıq qalıb, xahiş edirəm sonra zəng edəsən...

Oğlanlar, Sarısaç qıza mətləbə keçməyi him edirlər.

S a r ı s a ç  q ı z. Nana, bu gün dənizçilər evində tans var.

N a r g i l ə. Tans?

S a r ı s a ç  q ı z. Ahaaa... (*Qısa pauza*) Gəlirsən?

N a r g i l ə. Yox, gələ bilməyəcəyəm.

S a r ı s a ç  q ı z (*ikinci oğlana baxaraq işvə ilə*). O hələ də gözləyir ha...

N a r g i l ə. Kim?

S a r ı s a ç  q ı z. O gün demədim?..

N a r g i l ə. Gələ bilməyəcəyəm...

S a r ı s a ç  q ı z. Ah, sən nə qədər staromodnı olmusan, Nana! Yaxşı... hələlik...

Nargilə ilə görüşmək istəyən oğlan ağzını telefon dəstəyinə tutaraq.

İ k i n c i  o ğ l a n. Əlvida, Nana!

Çapıq Davud isə dişlərini bir-birinə sürtərək vəhşi görünüşlə ağzını uzadıb Sarısaç qızın qulağını dişləyir. Qız qışqıraraq dəstəyi asır. Onların üzərinə düşən işıq sönür. Nargilə dəstəyi yerinə qoyaraq, işinin üstünə qayıdır. Nəzakət xanım, əlində ağ salfetə bükülmüş qab gəlir.

N ə z a k ə t (*qabı stolun üstünə qoyaraq*). Salam, qızım.

N a r g i l ə. Salam, ana.

N ə z a k ə t. Sənin üçün kotlet gətirmişəm.

N a r g i l ə. Fərəc ezamiyyətə gedib? (*Nəzakət nəzərlərini ondan qaçıraraq, başının hərəkəti ilə təsdiq edir*) Nə zəhmət çəkirdin...

N ə z a k ə t. Nə üçün belə sözlər danışırsan? Məndən qisas alırsan?

N a r g i l ə. Mən heç bir zaman səndən qisas almaq fikrində olmamışam, ana. Əgər, belə bir qüvvəm olsaydı...

N ə z a k ə t. Hələ əvvəlcə öz həyatın haqqında düşün, qalsın dünyanı düzəltməyin. Fərəcin rəisi, oğlu üçün sənə elçi gəlmək istəyirmiş. Həsənzadə ilə olan əhvalatı eşidəndən sonra gəlməyib.

N a r g i l ə. Bunu sənə Fərəc dedi?..

N ə z a k ə t. Tutaq ki, o deyib, nə olsun?

N a r g i l ə. Heç... Elə-belə soruşuram...

N ə z a k ə t. Fərəc and içib, rəisi inandırıb ki, heylə şey yoxdur.

N a r g i l ə. Nə üçün Fərəc məndən ötəri yalan danışırdı?

N ə z a k ə t (*mülayim tərzdə*). İnsan cavanlıqda səhv eləyə bilər, ancaq bu dərəcədə yox. Mən bura səninlə söz güləşdirməyə gəlməmişəm... Ağlını başına yığ, cavanlığının, gözəlliyinin qədrini bil. Ola bilsin ki, Fərəcin rəisi bu günlərdə bizə gəlsin... Oğlunu da tanıyırsan, pis oğlan deyil. Ali təhsilli, əlində yaxşı işi...

N a r g i l ə. Əgər, o yaxşı oğlan idisə, bəs, niyə cavan arvadını iki uşağı ilə qovub salırdı küçəyə?

N ə z a k ə t. Qovmaq nə üçün... istəməyib, boşayıb... Bu, tək onun başında görünməyib ki... Ailə sirrinə əl aparmaq çətindir.

N a r g i l ə. Surik onun dabbaqda gönünə bələddir.

N ə z a k ə t. Sən məni o vəziyyətə gətirəcəksən ki, gedib özümü atacağam poyezdin-zadın altına.

N a r g i l ə (*səmimi təəccüblə*). Məndən ötəri?

N ə z a k ə t. Sən mənim qızımsan... Səni mən doğmuşam.

N a r g i l ə (*kədərlə*). Eh, ay ana... Mən doğulmaya da bilərdim. Gərək ki, uşaq olub-olmaması çox zaman insanların iradəsindən asılı olmur. Yaxşısı budur, Fərəcə deyəsən ki, mən onun rəisinin oğluna getməyəcəyəm!

N ə z a k ə t (*əsəbi halda qalxaraq*). Getmə... Əgər, bu qəsəbədə bir oğlan sənin üzünə baxsa, mən adımı dəyişərəm.

N a r g i l ə (*bərkdən gülür*). Bir gör sən məni nə ilə qorxutmaq istəyirsən...

N ə z a k ə t. Yaxşı... Axırını görərik...

Çıxır. Nargilə işinə davam edir. Səhnə yavaş-yavaş qaranlıqlaşır. İşıqlananda Nargiləni Həsənzadənin eyvanında görürük. O, yemək stolunun üzərinə ağ süfrə çəkir. Qrafini su ilə doldurur. Balaca vazaya çiçək qoyur. Bu zaman qapı zəngi vurulur. Qız yüyürüb açır. Həsənzadə daxil olur. O, çox yorğundur. Lakin bunu büruzə vermək istəmir.

H ə s ə n z a d ə (*yemək stoluna nəzər salaraq*). Bu nə dəsgahdır...

N a r g i l ə. Mən sizin üçün türk kofesi hazırlamışam. (*Yüyürüb gətirir*)

H ə s ə n z a d ə (*ürəkdən*). Yaxşı qızsınız.

N a r g i l ə. Nə barədə?

H ə s ə n z a d ə. Hər barədə: ağılda, gözəllikdə, hazırcavablıqda...

N a r g i l ə (*ona iti bir nəzər salaraq, həyəcanla*). Yalvarıram, oğlunuzun əziz canına and verirəm: siz bu sözləri ürəyisınıq bir qız olan mənim xətrim xoş olmaq üçün deyirsiniz, yoxsa, doğrudan da, belə düşünürsünüz?

H ə s ə n z a d ə (*ciddi*). Mən həmişə düşündüyümü deyirəm... Bir də, sizin kimi həyatın isti-soyuğunu görmüş mərd bir qızın baş sığallanmasına nə ehtiyacı var?..

N a r g i l ə (*çox mütəəssir*). Sağ olun, çox sağ olun!

Rəşidin mahnısı eşidilir:

Gəlmişəm otağına oyadam səni,
Qaragilə, oyadam səni.
Nə gözəl xəlq eləyib yaradan səni,
Qaragilə, yaradan səni.

Nargilə diksinərək bayıra sarı əsəbi bir nəzər salır. Onun bu ani hərəkəti Həsənzadənin diqqətindən qaçmır. Qısa pauza. Mahnı davam edir...

H ə s ə n z a d ə (*qızın üzünə baxmaqdan çəkinərək*). Bu gün Rəşidin bayramıdır.

N a r g i l ə (*dalğın*). Qəzetlərdə şəkli çıxdığına görə?

H ə s ə n z a d ə. Yalnız buna görə deyil... Dünən ona, güllə atmaqda respublika çempionu adı veriblər.

N a r g i l ə. Bah... bah... (*Mahnı davam edir*) Siz bu mahnını oxumağı ona qadağan eləyin!

H ə s ə n z a d ə. Niyə?

N a r g i l ə. Çünki o bunu oxumaqla mənə sataşır...

H ə s ə n z a d ə. Nə bilirsiniz?

N a r g i l ə (*acıqlı halda*). Yüz dəfə ona demişəm ki, mənim adım Nargilədir... Yenə də başlayır. Qaragilə, Qaragilə...

H ə s ə n z a d ə. Nə olar ki, qoyun Qaragilə desin.

N a r g i l ə. İstəmirəm.

Mahnı davam edir.

Qızıl gül əsdi,
Səbrimi kəsdi...
Sil gözün yaşın, Qaragilə,
Ağlama, bəsdi...

H ə s ə n z a d ə (*öz-özü ilə danışırmış kimi*). Yaxşı oğlandır.

N a r g i l ə. Məncə, sərrast güllə atmaq və ya bir gündə dörd günün işini görmək hələ tamam yaxşı adam olmaq deyildir...

H ə s ə n z a d ə (*ciddi şəkildə*). Doğrudur. Lakin Rəşidin yaxşılığı eyni zamanda onun insanlara münasibətindədir. Bizim ümumi işimizə, dövlətə sədaqətindədir. (*Zarafatyana*) Bunun üzərinə onun gözəl nəğmələrini, igidliyini də gəldikdə...

N a r g i l ə. Bah... bah, saxlayın, yoxsa, özümdən gedərəm.

H ə s ə n z a d ə (*xəyal içində*). Bəlkə də mən, onda öz keçmiş gəncliyimi gördüyüm üçün bu qədər xoşuma gəlir.

N a r g i l ə (*gərgin istehza ilə*). Yoxsa, siz də onun kimi oxuyardınız?

H ə s ə n z a d ə (*gülümsəyir*). Siz sataşırsınız, amma mən, doğrudan da, oxuyardım...

N a r g i l ə (*eyni istehza ilə*). Bəs, indi niyə heç oxumursunuz?

H ə s ə n z a d ə (*dərindən nəfəs alaraq*). Yadırğamışam. Mənim nəğməmin susduğu vaxtdan xeyli zaman keçibdir.

N a r g i l ə (*əsəbi halda*). Belə sentimental sözlər sizə yaraşmır.

H ə s ə n z a d ə. Doğrudur. Ancaq, görünür, həmişə susmaq da mümkün deyil. Siz o gün doğru deyirdiniz: insanların içində Robinzon Kruzo kimi yaşamaq olmaz.

Rəşid oxuyur:

Boynuma salmısan zülfündən zəncir,
Qaragilə, zülfündən zəncir.

N a r g i l ə (*təkrar əsəbiləşərək*). Xahiş edirəm, bir də onu mənim yanımda tərifləməyəsiniz...

H ə s ə n z a d ə. Söz düşdü, dedim... Bir də, tərifləyəndə nə olar?

N a r g i l ə. İstəmirəm. Sizin üçün yenə kofe tökümmü?

H ə s ə n z a d ə. Bəsdir. (*Qəsdən)* Təşəkkür edirəm. (*Pauza. Nargilənin üzü düşkün və pərişan bir ifadə alır*) Nə üçün birdən-birə bikeflədiniz?

N a r g i l ə. Çünki siz məni sevmirsiniz! (*Həyəcanla*) Qətiyyən sevmirsiniz! Mən həmişə bu barədə söhbət salanda siz araya söz qatırsınız... Elə bilirsiniz ki, mən bunu başa düşmürəm. (*Pauza. Həsənzadə papiros yandırır*) Əlbəttə, istəmək, sevmək sifarişlə qəbul olunan bir şey deyil. Mən ancaq öz bəxtimdən küsməliyəm.

H ə s ə n z a d ə. Bayaq siz məni təqsirləndirdiniz... Amma indi özünüz bəxtinizdən şikayətlənirsiniz.

N a r g i l ə. Çünki mən haqlıyam. (*Qızğınlıqla*) Nə təfavütü var ki, əvvəllər mənim günümü Fərəc qara eləmişdi, indi siz eləyirsiniz?.. Nə şəkildə? Bunun əhəmiyyəti yoxdur... Heç olmazsa, Fərəcin əsarətindən bir gün xilas olacağıma ümidim var idi... (*Qısa pauza. Həsənzadə papiros çəkir*) Papirosu az çəkin, zəhərlənərsiniz! (*Pauza*) Sizi başa düşmək mümkün deyil... Bəzən elə bil ki, siz də məni sevirsiniz... Ancaq söhbət ciddi hal alanda...

H ə s ə n z a d ə. Siz ağıllı qızsınız... Səbəbini...

N a r g i l ə. Xahiş edirəm, bu köhnə havaları qoyun dursun. Mən əvvəl də sizə demişəm, indi də deyirəm: yaş məsələsinin buna dəxli yoxdur. Həqiqi sevgi belə boş şeyə baxmaz. (*Birdən həyəcanlanaraq*) Nə üçün siz özünüzü fədakar olmağa layiq bilirsiniz, başqalarını yox?

H ə s ə n z a d ə. Həyatda hər şey kimi fədakarlığın da öz yeri var... (*Qısa pauza*) Sevgi də canlı bir orqanizm kimi qocalır... və bir gün ölür...

N a r g i l ə. Yəni, demək istəyirsiniz ki, mən gələcəkdə sizi sevməyə də bilərəm? Qorxmayın, belə şeylər ömründə olmaz.

H ə s ə n z a d ə (*gülümsəyərək*). Mən özüm üçün qorxmuram...

N a r g i l ə. Mənim üçün isə heç qorxmayın... Sizin həsrətinizi o qədər çəkmişəm ki... (*Onun əlindən tutaraq*) Mənim əzizim! Mənim qəhrəmanım!..

H ə s ə n z a d ə (*əlini nəzakətlə çəkərək*). Gəlin əyləşin. Sizdən bir şey soruşmaq istəyirəm.

N a r g i l ə (*çox şən və gülməli bir əda ilə stulu çəkib onun qabağında oturur*). Hə... soruşun!..

H ə s ə n z a d ə. Adamların söz-hərəkətindən, tənəsindən qorxmursunuz?

N a r g i l ə (*eyni şən və gülməli bir əda ilə*). Yox, qorxmuram!

H ə s ə n z a d ə. Nə üçün?

N a r g i l ə. Heç "nə üçün"ün yeridir?! Yaxşı adamlar yaxşı hissləri söz-hərəkət eləməzlər. Pisləri isə qoy cəhənnəm olsunlar!

H ə s ə n z a d ə (*bərkdən gülərək*). Bəzən elə ağıllı söz deyirsiniz ki...

N a r g i l ə (*bərk inciyərək*). Bəzən?! Demək... Bəzən dəlidən doğru xəbər, heyləmi?

H ə s ə n z a d ə. Bəzən yox, həmişə!

N a r g i l ə (*onu dinləyərək öz-özü ilə danışırmış kimi*). Bəlkə Fərəc haqlı imiş?.. Bəlkə, doğrudan da, mən dəliyəm?

H ə s ə n z a d ə (*həyəcanla*). Mən zarafat eləyirdim...

N a r g i l ə (*eyni fikri dağınıqlıqla*). Sizin zarafatınız havayı olmaz.

H ə s ə n z a d ə (*böyük bir nədamət hissi ilə*). Nə üçün olmur? Bəzən ən ağıllı adamlar belə, ən axmaq sözlər danışa bilərlər... (*Nargilə gözləri onda olduğu halda "yox" mənasında ağır-ağır başını bulayır və Həsənzadəyə elə baxır ki, elə bil, onun ağarmış saçlarını, gözünün ətrafındakı qırışları yalnız indi görür. Elə bil ki, Həsənzadə onun nəzərləri altında saniyə-saniyə qocalır*) Min dəfə üzr istəyirəm. Mən, sadəcə olaraq, ehtiyatsızlıq elədim.

N a r g i l ə (*kədərlə gülümsəyərək*). Ehtiyatsızlıq...

H ə s ə n z a d ə (*özünü büsbütün itirərək*). İnanın ki, siz mənim nəzərimdə həmişə ağıllı... həssas bir qızsınız.

Rəşid oxuyur.

Mən sənin əsirinəm, bir məni dindir,
Qaragilə, bir məni dindir...

N a r g i l ə (*qulaqlarını tutaraq qışqırır*). Çıxın onu susdurun! (*Və bərkdən hönkürərək divana yıxılır. Həsənzadə özünü itirmiş halda ona su verir. Qız suyu alıb ürək yanğısı ilə içir. Sonra dikəlib eyni həyəcan-*

*la bayıra qulaq asır və nəğmənin susması ilə yavaş-yavaş sakit olur. Nəhayət, gözünün yaşını silərək, ayağa qalxıb paltarını düzəldir*) Bağışlayın... Sizin qanınızı qaraltdım, hələlik...

H ə s ə n z a d ə (*həyəcanla*). Dayanın, nə tələsirsiniz?.. Gedirsiniz?..

N a r g i l ə. Özümü çox yorğun hiss edirəm. Gedim bir az dincəlim. Sağ olun. (*Çıxır*)

İşıq, gah dayanıb həyəcanla baxan Həsənzadənin, gah da sürətlə səhnəni dolanıb evinə tələsən Nargilənin üzərinə düşür və bütün bu müddətdə Rəşidin oxuduğu mahnı yenidən eşidilir. Adama elə gəlir ki, bu mahnı qızı hər yerdə addım-addım təqib edir. Qız gözdən itib, mahnı uzaqlaşdıqca, işıq da azalır və nəhayət, sönür. Yananda isə, biz Həsənzadəni eyni həyəcanlı vəziyyətdə dayanıb pəncərədən baxan görürük. Bu zaman dalbadal şimşək çaxır. Göy guruldayır. Və birdən bu göy gurultusu telefon zəngi ilə əvəz olunur. Həsənzadə hövlnak gedib dəstəyi götürür. Sanki o, bu telefon zəngindən, nə isə, xoş bir şey gözləyirdi. Lakin işıq telefon xəttinin o biri ucunda əsəbi görünüşlə dəstəyi qulağına tutmuş Nəzakət xanımı və onun yanında dayanmış Fərəci işıqlandırır.

H ə s ə n z a d ə. Eşidirəm.

N ə z a k ə t. Özünüzü yığışdırın!

H ə s ə n z a d ə. Necə?

N ə z a k ə t. Mən sizdən xahiş etmirəm, mən sizə əmr edirəm: özünüzü yığışdırın!

H ə s ə n z a d ə. Danışan kimdir?

N ə z a k ə t. Danışan Nargilənin anasıdır.

H ə s ə n z a d ə. Ah, anası...

N ə z a k ə t. Sizin ondan böyük oğlunuz var. Mən sizi biabır edərəm.

H ə s ə n z a d ə. Nə üçün xanım, mən neyləmişəm?

N ə z a k ə t. Neylədiyinizi yaxşı bilirsiniz! (*Fərəc başı ilə təsdiq edir*) O uşaqdır, ağlı kəsmir, sizə nə düşüb? Nə üçün öz mövqeyinizdən, vəzifənizdən istifadə eləyib cavan qızı yoldan çıxarırsınız? (*Fərəc başı ilə təsdiq edir*) Utanın! Əgər vicdanınız yoxdursa, qorxun. Mən şikayət edərəm! Sizi küçənin ortasında daşa basaram!

H ə s ə n z a d ə. Sizin belə danışmağınız mənasızdır. O çox ağıllı qızdır. Mən də heç bir zaman onun haqqında pis fikirdə olmamışam.

N ə z a k ə t. O sizə uyduğu üçün bütün elçiləri geri qaytarır.

H ə s ə n z a d ə. Ürəyi istəyən adam olanda geri qaytarmayacaq.

N ə z a k ə t. Nə üçün siz onu evə dəvət edirsiniz? (*Qısa pauza*) Görürsünüzmü, cavab verə bilmirsiniz!

H ə s ə n z a d ə (*sakit*). Siz bu barədə qızın özü ilə söhbət eləmisiniz?

N ə z a k ə t. Siz onu elə yoldan çıxarmamısınız ki, mənə bir söz danışa...

H ə s ə n z a d ə. Əgər, siz yaxşı ana olsaydınız, o, sizdən heç bir şey gizlətməzdi...

N ə z a k ə t. Mənim yaxşı-pis ana olmağımın sizə dəxli yoxdur.

Fərəc başı ilə təsdiq edir.

H ə s ə n z a d ə. Yox, dəxli var. Çünki mən onun taleyi ilə maraqlanıram.

N ə z a k ə t. Axı, siz kimsiniz, onun taleyi ilə maraqlanırsınız?

H ə s ə n z a d ə (*özünü saxlaya bilməyərək*). Bəs, siz kimsiniz?

N ə z a k ə t. Mən onun anasıyam! Eşidirsinizmi! Anası!

H ə s ə n z a d ə. Yalnız ona görəmi ki, onu siz doğmusunuz? Əgər, belə düşünürsünüzsə, səhv edirsiniz... Uşağı doğmaq hələ işin lap başlanğıcıdır. Əsl məsələ onu böyütmək, insan arasına, həyata çıxarmaqdır. Siz isə, onu, həyatının köməyə, insan ünsiyyətinə möhtac olduğu ən vacib dövründə, ərinizlə dilbir olub, atasının evindən bayıra salmısınız!

N ə z a k ə t. Bunu sizə o özü deyib?

H ə s ə n z a d ə. Kimin deməsinin əhəmiyyəti yoxdur... Əgər, Nargilənin atası birdən dirilib gəlsəydi, siz ona nə cavab verərdiniz? Onun üzünə necə baxardınız? Əlbəttə, siz cavan idiniz... Bütün ömrünüz boyu dul oturmayacaqdınız... Heç kəs, hətta, onun özü də bunu sizdən tələb eləyə bilməzdi. Ancaq ərə getmək analıq hüququnu, analıq məsuliyyətini tapdalamaq, atasız, köməksiz bir qız uşağını illərlə dindirməmək, axırda da əsəblərini korlayıb qapılara salmaq demək deyildi? Əgər, əriniz yanınızdadırsa, qoyun özü də eşitsin. Siz də, o da ədalət qarşısında cavabdehsiniz!.. (*Əsəbi halda*) Bir az açıq desəm, cinayətkarsınız... Öz uşağını öldürmək istəyənlərlə sizin heç bir fərqiniz yoxdur. Bəziləri bunu birdən-birə edirlərsə, siz tədricən eləmisiniz! Aydındırmı? Siz, onda özünə inam hissini məhv eləmisiniz!

Nəzakət telefon dəstəyini yerinə çırparaq, hönkürüb ağlayır, bərkdən yana-yana ağlayır. Fərəc arvadına qəzəbli bir nəzər salır və o biri otağa keçir. Nəzakət xanımın üzərinə düşən işıq sönür, Həsənzadənin üstünə düşən işıq güclənir. Bayırda şiddətli göy gurultusu eşidilir. Şiravan yağış tökür. Tez-tez şimşək çaxaraq gah Həsənzadəni, gah da öz balaca evinin pəncərəsinin qabağında dayanmış Nargiləni işıqlandırır. Və birdən sanki qız nədən isə vahiməyə gəlir. Pəncərə qabağından çəkilərək öz otağına qorxmuş, ürkək bir nəzər salır. Sonra cəld irəliləyib radionu açır, otağa gurultulu bir musiqi dolur, qız cihazı eyni sürətlə də bağlayaraq, bir an sükut içində dayanıb qulaq asır. Tufan eyni şiddətlə davam edir. Qız telefon aparatına yaxınlaşaraq dəstəyi götürüb nömrəni yığır. Həmin anda işıq hələ də bayıra tamaşa eləyən Həsənzadəni işıqlandırır. Həyəcanlı telefon zəngi. Həsənzadə çevrilib dəstəyi götürür.

H ə s ə n z a d ə. Eşidirəm. (*Qız dəstəyi qulağına tutmuş halda susur. Lakin onun üzündəki vahimə getdikcə mülayim bir ifadəyə çevrilir*) Eşidirəm. (*Qız susur*)

Həsənzadə eyni səbrlə telefon dəstəyini asır və onun üzərinə düşən işıq sönür. Nargilə, istər-istəməz, dəstəyi yerinə qoyur və onun çöhrəsi birdən-birə ümidsiz, pərişan bir ifadə alır. Göy bir də guruldayır, lakin Nargilə daha qorxmur... Artıq dünya dağılsa da, dağılmasa da, onun üçün birdir. O, ağır-ağır irəliləyib divanda oturur. Pauza. Bayırda tufan eyni şiddətlə davam edir. Telefon zəngi. Nargilə diksinərək qalxıb dəstəyi götürür. İşıq eyni zamanda telefon xəttinin o biri ucunda dəstəyi əlində tutmuş sarısaç qızı və onun olduğu otağı işıqlandırır. Patefonda son dəbli bir oyun havası çalınır. Sarısaç qızın bizə tanış oğlan dostlarının hərəsi bir qızla, iki başqa oğlan isə bir-biri ilə rəqs edir. Stolun üzərində şərab şüşələri və başqa şeylər görünür. Sarısaç qız telefon dəstəyini elə tutmuşdur ki, Nargilə musiqini eşitsin. Nargilə qulaq asır.

S a r ı s a ç  q ı z. Nana, hello...
N a r g i l ə. Salam.
S a r ı s a ç  q ı z. Eşidirsən?
N a r g i l ə. Eşidirəm.
S a r ı s a ç  q ı z. Sənin sevdiyin tansdır.
N a r g i l ə. Bilirəm.
S a r ı s a ç  q ı z. Çapıq Dodikgildə yığışmışıq.
N a r g i l ə. Nuş olsun.
S a r ı s a ç  q ı z. Sən də gəl!
N a r g i l ə. Mən də?
S a r ı s a ç  q ı z. Ahaaaa...
N a r g i l ə (*zəif müqavimətlə*). Yox...
S a r ı s a ç  q ı z. Vallah, sənin dərdin az qalıb məni dəli eləsin...
N a r g i l ə. Mənim nə dərdim var?..

S a r ı s a ç  q ı z. Hələ bir soruşursan da. (*Mütəəssir halda*) Nanacan! Nə üçün belə edirsən? Nə üçün qızıl vaxtını o cür keçirirsən? Biz nə qədər cavan olacağıq?.. (*Gözləri yaşarmış*) Vicdansız! Bilirsən sənə nə qədər ürəyim yanır?! İndi də ha istədim zəng eləməyim, bacarmadım... Sənsiz heç nə canıma yatmır... Başa düş...

N a r g i l ə (*eyni zəif səslə*). Sağ ol, Surik.

S a r ı s a ç  q ı z. "Sağ ol"u qoy bir kənara, özün dur gəl bura.

N a r g i l ə (*tərəddüdlə*). Bayırdan xəbərin var?

S a r ı s a ç  q ı z. Mənim bu saat heç nədən xəbərim yoxdur, olmasını da istəmirəm... Sənə dedim, dur gəl! (*Qısa pauza*) Nə oldu?..

N a r g i l ə (*yavaş səslə*). Yaxşı...

S a r ı s a ç  q ı z. Gəlirsən?

N a r g i l ə (*qəti şəkildə*). Gəlirəm.

S a r ı s a ç  q ı z. Öpürəm səni, Nanacan! (*Dəstəyi asır, sevinclə yoldaşlarına xəbər verir*) Nana gəlir!

O ğ l a n l a r (*bir yerdə*). Gəlir?!

Onların üzərinə düşən işıq sönür, indi yalnız Nargilə görünür. O dəstəyi yerinə qoyur və geyinməyə başlayır. Üzünə pudra, dodaqlarına pomada sürtür. Redikülünü götürüb otaqdan çıxmaq istərkən, telefon təkrar zəng çalır. Qız qayıdıb dəstəyi götürür. Telefon xəttinin o biri ucunda Həsənzadə görünür.

H ə s ə n z a d ə. Nargilə...

N a r g i l ə (*həyəcanını boğmağa çalışaraq*). Buyurun.

H ə s ə n z a d ə. Təksiniz?

N a r g i l ə. Bəli. (*Acıqlı halda*) Başqa kim olacaqdı ki?

H ə s ə n z a d ə (*olduqca mehriban*). Dedim, bəlkə yoldaşlarınız-dan-zaddan...

N a r g i l ə (*nəfəsini dərərək*). Heç kəs yoxdur.

H ə s ə n z a d ə. Qorxmursunuz?

N a r g i l ə. Nədən?

H ə s ə n z a d ə. Axı, deyirdiniz ki, uşaqlıqda həmişə göy gurultusundan qorxarmışsınız.

N a r g i l ə. İndi ki, uşaq deyiləm.

H ə s ə n z a d ə. Elədir... (*Pauza. Bayırda tufan davam edir*) Deyəsən, hələ də acığınız soyumayıb?

N a r g i l ə. Soyumayanda nə olar ki?..

H ə s ə n z a d ə. Mən sizdən təkrar üzr istəyirəm. (*Pauza*) Nə üçün dinmirsiniz?

N a r g i l ə. Siz məni incitməmək üçün üzr istəyirsiniz?

H ə s ə n z a d ə. Yox. Mən kobud bir səhv elədiyim üçün üzr istəyirəm.

N a r g i l ə. Yaxşı... Daha bu barədə danışmayaq.

H ə s ə n z a d ə. Deməli, bağışlayırsınız.

N a r g i l ə (*mülayim tərzdə*). Siz də təksiniz?

H ə s ə n z a d ə (*zarafatyana*). Mən elə anadangəlmə təkəm.

N a r g i l ə (*mehribancasına*). Darıxmırsınız?

H ə s ə n z a d ə. İnsan hər şeyə öyrəşir.

N a r g i l ə (*mütəəssir halda*). Yenə də sentiment...

H ə s ə n z a d ə. "Sentiment" nə üçün... Demək istəyirəm ki, darıxmamağa öyrəşmişəm.

N a r g i l ə (*daha da mütəəssir*). Bilirəm... Sizin belə sözləriniz mənə çox pis təsir edir... Mən sizin özünüzü tək hiss etmənizə dözə bilmirəm.

H ə s ə n z a d ə. Təşəkkür edirəm.

N a r g i l ə. Oh... (*Qışqırır*) Mən sizdən təşəkkür istəmirəm, başa düşürsünüzmü, istəmirəm!..

H ə s ə n z a d ə (*zarafatyana*). Yavaşın, qulağım batdı...

N a r g i l ə. Qoyun batsın...

H ə s ə n z a d ə (*eyni zarafatla*). Nə üçün? Axı, onda sizin səsinizi eşitməzdim...

N a r g i l ə. Yoxsa ki, eşitmək istəyirdiniz...

H ə s ə n z a d ə. Mən sizin səsinizi həmişə... dünya durduqca eşitmək istərdim...

N a r g i l ə. Bəsdirin... Bəsdirin... Mən belə ümumi... mücərrəd sözlər eşitmək istəmirəm. (*Təmkinlə*) İyirminci əsr qəti hərəkət tələb edir... Bildinizmi?! (*Pauza. Sanki Həsənzadə qəflətən Çin səddi qarşısında qalır. Onun üzü birdən-birə sarsılmış, düşkün bir ifadə alır. Bəlkə o, ömründə ilk dəfə həyatının nə qədər kədərli olduğunu, ta uzaq üfüqlərinə qədər görür..*) Nə oldu? Nə üçün susdunuz?

H ə s ə n z a d ə (*dərindən nəfəs alaraq*). Heç... Mən sizə qulaq asıram...

N a r g i l ə. Mən sözümü dedim, eşitmədiniz?

H ə s ə n z a d ə. Eşitdim...

Qısa pauza.

N a r g i l ə. Yaxşı... Sağ olun...

Dəstəyi asır. Həsənzadə dəstəyi gözünün qabağına tutaraq ona uzun və ümidsiz bir nəzər salır və yerinə qoyur... Onun üzərinə düşən işıq sönür. Nargilə telefon aparatından aralanaraq otağın ortasında dayanır. Bayaqdan bəri əlində tutmuş olduğu redikülü qeyri-şüuri bir hərəkətlə qaldırıb baxır. Nəyi isə xatırlayır və ani əsəbi hərəkətlə onu kənara tullayır, sonra eyni qəzəblə plaşını, jaketini çıxarıb tullayaraq divana yıxılıb, əllərilə üzünü tutur. İşıq sönür. Digər işıq yananda Həsənzadə kağızları bir-bir oxuyub dərkənar yazır... Uzaqdan Rəşidin oxuduğu "Qaragilə" mahnısı eşidilir. Həsənzadə bir an əl saxlayaraq mahnıya qulaq asır. Sonra yenə işinə davam edir. Birdən mahnı kəsilir.

Pauza. Fərəcov tələsik gəlir.

F ə r ə c o v. Yo... yoldaş direktor... O... qız...

H ə s ə n z a d ə (*başını kəskin hərəkətlə qaldırır*). Hansı qız?

F ə r ə c o v. O günü işə götürdüyümüz... Nargilə...

H ə s ə n z a d ə. Hə, neyləyib?...

F ə r ə c o v. İ...İ... indicə az qalmışdı Rəşidi öldürsün!..

H ə s ə n z a d ə. Nə üçün?

F ə r ə c o v. De... De... deyir niyə oxuyursan... Rəşid də bi... bi... bilirsiniz, zarafatcıl oğlandı... De... deyir sizin kimi qə...qəşəng qız da mahnıya daralarmı? Qız bayağıdı çilingərin bıçağını... götürüb düz oğlanın üzünə atasan!.. Ba... başını qaçırmasaydı... bi... bi... birtəhər olacaqdı...

H ə s ə n z a d ə (*sakit*). Sonra?

F ə r ə c o v. Sonra da qız... yaman pərt oldu... Az qaldı ağlasın...

H ə s ə n z a d ə. Bəs, Rəşid nə dedi?

F ə r ə c o v. Nə desin... Əvvəl bir xeyli durub baxdı... So... Sonra "bağışlayın, Nargilə xanım, – dedi. – Vaxta ki, mənim mahnım sizi bu dərəcədə əsəbiləşdirir, bir də ömrümdə oxumaram..." Çox... çox xatalı qızdı...

Pauza. Həsənzadə papiros çıxarıb yandırır.

H ə s ə n z a d ə. Yaxşı, siz gedin... (*Fərəcov çıxır. Həsənzadə qalxıb kabinetdə var-gəl edir. Telefon zəngi. Həsənzadə dəstəyi götürür*) Eşidirəm...

Telefon xəttinin o biri başında Nəzakət xanım görünür.

N ə z a k ə t. Yəqin ki, danışanın kim olduğunu tanıdınız.

H ə s ə n z a d ə. Tanıdım.

N ə z a k ə t. Siz bizim söhbətimizi Nargiləyə demisiniz?

H ə s ə n z a d ə. Xeyr, deməmişəm. Necə məgər?

N ə z a k ə t. Xahiş edirəm deməyəsiniz... Son günlər o tez-tez əsəbiləşir... Qorxuram...

H ə s ə n z a d ə. Qorxmayın, heç nə olmaz.

N ə z a k ə t. Mən sizin işinizə mane olmuram ki?

H ə s ə n z a d ə. Xeyr. Mane olmursunuz.

N ə z a k ə t. Srağagün sizinlə kobud danışdım...

H ə s ə n z a d ə. Eybi yoxdur.

N ə z a k ə t. O gündən bəri mən sizə kin bəsləyə bilmirəm. Sizin səsinizdə elə bir doğruluq, elə bir ürək yanğısı hiss edirdim ki...

H ə s ə n z a d ə (*səbrsiz halda*). Bu sözlər artıqdır...

N ə z a k ə t. Siz məni məzəmmət eləməkdə haqlısınız. Mən qəddar və qorxaq olmuşam. (*Qısa pauza*) Ancaq... Doğrudanmı, mən ona qarşı analıq haqqımı itirmişəm?

H ə s ə n z a d ə (*sərt şəkildə*). Bilmirəm... Bəlkə də itirməmisiniz...

N ə z a k ə t. Onun ürəyi mənə qarşı buz kimi soyuqdur... O mənim onu yaddan çıxarmağımı tələb edir!.. Ancaq and içirəm ki, mən onu həmişə o üç uşağımın üçündən də çox istəmişəm.

H ə s ə n z a d ə. Mən buna inanıram. Gəlin biz bir də bu barədə danışmayaq. "İstəmək" çox sürtülmüş sözdür.

N ə z a k ə t (*göz yaşları içində*). Bu dünyada mənim ən böyük arzum onun xoşbəxtliyi olmuşdur. Mən heç bir zaman ona gözünün üstündə qaşın var deməmişəm.

H ə s ə n z a d ə (*əsəbi halda onun sözünü kəsir*). İş də orasındadır ki, siz ona heç nə demirdiniz... Onun isə insanla danışmağa ehtiyacı var idi... Başa düşürsünüzmü, insanla?! Siz ana idiniz... Siz ona çox şey deyə bilərdiniz... (*Qısa pauza. Bu sözlərlə sanki Həsənzadənin üzərindən ağır bir yük götürülür. Yavaş səslə*) O hələ insan həyatının isti-soyuğunu görməmişdi... Xudpəsənd deyildi. Qanadları hələ bərkiməmişdi. O özünə qarşı başqalarından qayğı, fədakarlıq görmək istəyirdi... (*Qısa pauza*) Lakin siz ərinizin yanında onunla danışmağa belə, qorxurdunuz...

N ə z a k ə t. Mən zəif bir qadın idim. Mən azad deyildim.

H ə s ə n z a d ə. Nə üçün? Sizi zirzəmiyə salıb ağzınızı bağlamamışdılar ki?..

N ə z a k ə t. Mən həmişə qorxu içindəydim.

Bu zaman Fərəc arxadan daxil olur. Nəzakətin son sözlərini eşidib ayaq saxlayır. Nəzakət onu görmür.

İndinin bu saatında da mən bütün ciddi-cəhdimə baxmayaraq, özümü onun əsarəti altında hiss edirəm.

H ə s ə n z a d ə. Nə üçün? Bəyəm o sizi döyüb-incidirdi?

N ə z a k ə t. Yox...

H ə s ə n z a d ə. Bəlkə... Açıq danışdığım üçün üzr istəyirəm, bəlkə siz onu çox sevirsiniz?

N ə z a k ə t (*qəti*). Yox. Mən, sadəcə, olaraq qorxurdum. Mənə elə gəlirdi ki, əgər, bu adam məni tərk edərsə, əlim yerdən, göydən üzülər!

H ə s ə n z a d ə (*əsəbi*). Çünki siz əsl həyatdan kənarda idiniz. Ölkə, xalq ağır günlər keçirdiyi halda, siz yalnız özünüzlə məşğul idiniz! Yalnız öz canınız üçün titrəyirdiniz! Əgər, iş daha bərkə düşsəydi, bəlkə siz körpə qızınızı da atıb qaçardınız!

N ə z a k ə t (*qəzəblə*). Siz nə haqla bu cür sözlər deyirsiniz?

H ə s ə n z a d ə. Nə üçün hirslənirsiniz? Siz ki, doğrudan da, onu atdınız!

Fərəc öskürür. Nəzakət diksinərək geri çevrilib onu görür. Qeyri-iradi bir hərəkətlə dəstəyi arxasında gizlədir.

F ə r ə c. Söhbət kimlə və nə haqqındadır? (*Nəzakət iri-iri açılmış gözləri ilə ona baxıb durur. Fərəc eyni əda ilə təkrar edir*) Söhbət kimlə və nə haqqındadır?

N ə z a k ə t. Söhbət... Mənim qızım haqqındadır...

F ə r ə c. Trubkanı qoy yerinə!

N ə z a k ə t (*birdən təsəvvürəgəlməz bir qəzəblə*). Qoymuram!.. Bəsdir eybəcər kabus kimi məni gecə-gündüz təqib elədiyin! O mənim qızımdır! Onu mən doğmuşam! O mənim dünyada əvvəlinci və axırıncı dəfə sevdiyim bir adamın yadigarıdır!

F ə r ə c. Necə?

N ə z a k ə t. Mən sənə nifrət edirəm!

F ə r ə c. Nifrət edirsən?

N ə z a k ə t. Mən heç bir zaman səni istəməmişəm!..

F ə r ə c. Trubkanı qoy yerinə!

N ə z a k ə t (*dəstəyi ağzına daha da yaxın tutaraq*). Qoymuram! Neçə illərdi sən məni analıq hüququndan məhrum eləmisən! (*Göz

*yaşları içində*) Sən məni məcbur eləmisən öz qızımı onun doğma atasının evindən çıxarıb bayıra salım... Sən!..

Bu zaman Nargilə, Həsənzadənin kabinetinə daxil olur. Həsənzadə dərhal dəstəyi yerinə qoyur. Nəzakət xanımla Fərəcin üzərinə düşən işıq sönür.

N a r g i l ə. Deyin mənim haqq-hesabımı versinlər, daha zavodda işləmək istəmirəm.

H ə s ə n z a d ə. Nə üçün? Rəşid ki, sizə söz verib bir də o mahnını oxumasın...

N a r g i l ə. Mən onunla bir yerdə işləyə bilməyəcəyəm.

H ə s ə n z a d ə. Axı, nə üçün?

N a r g i l ə (*həyəcanla*). Çünki mən sizdən başqa heç kəsi sevmək istəmirəm!..

H ə s ə n z a d ə (*gülümsəyir, zarafatyana*). Heç kəsi sevmək istəmirsiniz, yoxsa, sevmirsiniz?

N a r g i l ə (*Həsənzadəyə uzun və diqqətli bir nəzər salır*). Mən sizdən başqa heç kəsi sevmirəm və sevmək də istəmirəm. İndi aydındırmı?

H ə s ə n z a d ə (*üzü ciddi və kədərli ifadə alır. Güclə eşidilən yavaş səslə*). Aydındır!..

Bu zaman üç nəfər cavan işçi daxil olur.

B i r i n c i i ş ç i (*Nargiləyə*). Doğrusu, biz sizdən heylə hərəkət gözləmirdik.

İ k i n c i i ş ç i. Bəs, adam da Rəşid kimi oğlana bıçaq atar?

Ü ç ü n c ü i ş ç i. Bəlkə siz onu yaxşı tanımırsınız?.. Bütün zavod onun başına and içir...

B i r i n c i i ş ç i. Bu neçə ilin ərzində birinci dəfədir ki, bizim kollektivdə belə hadisə baş verir.

N a r g i l ə (*əsəbi halda*). Axı, sizə nə dəxli var?

İ k i n c i i ş ç i. Necə yəni sizə nə dəxli var?

H ə s ə n z a d ə. Nargilə xanım təzə gəldiyi zavod həyatı ilə yaxşı tanış deyil... (*İşçiləri göstərərək*). Bunlar Rəşidin yoldaşlarıdır. Bir briqadada işləyirlər. Ona görə də maraqlanırlar...

B i r i n c i i ş ç i. Bəlkə, o sizi təhqir eləyib?

N a r g i l ə (*acıqlı halda*). Yox!

B i r i n c i i ş ç i. Bəlkə onun mahnısı nəyi isə sizin yadınıza salıb?

N a r g i l ə (*özündən çıxaraq*). Siz burada mənə məhkəmə qurmağa gəlmisiniz, nədir?

B i r i n c i  i ş ç i. Məhkəmə də qurmaq olar. Siz onu öldürə bilərdiniz!..

H ə s ə n z a d ə (*stuldan qalxaraq*). Yaxşı, uşaqlar, ümid edirik ki, o hadisə bir də təkrar olmayacaq. İndi isə, gəlin bununla qurtaraq. Mən özüm Rəşidlə danışaram. (*Zarafatyana*) Hələ desəniz üzr də istərəm.

N a r g i l ə (*həyəcanla*). Necə? Üzr istərsiniz? Heç vaxt!

H ə s ə n z a d ə (*eyni zarafatyana ifadə ilə*). Madam ki, sizi işə mən götürmüşəm, demək, hərəkətlərinizə mən də cavabdehəm. Elə deyilmi?

Qısa, gərgin pauza.

N a r g i l ə (*yavaş səslə*). Mən özüm üzr istərəm...

B i r i n c i  i ş ç i. Vaxta ki, öz günahınızı hiss etməyə başlayırsınız, üzr istəmək lazım deyil...

İ k i n c i  i ş ç i (*Nargiləyə*). Siz gələcəkdə görəcəksiniz ki, Rəşid də, onun dostları da necə oğlanlardır...

Ü ç ü n c ü  i ş ç i (*zarafatyana*). Onda siz Rəşidə bıçaq yox, gül atarsınız.

İşçilər çıxmaq istəyərkən birinci işçi ayaq saxlayır və Nargiləyə sarı dönür.

B i r i n c i  i ş ç i. Ancaq onu bilin ki, Rəşid ömründə heç bir kəsi sizin qədər istəməyib!

Nargilə kəskin hərəkətlə başını döndərib, oğlana, nə isə, acıqlı bir şey demək istəyir, lakin cavan işçilər çıxırlar. Gərgin pauza.

N a r g i l ə (*yavaş və təqsirkar ifadə ilə*). Bağışlayın. (*Çevrilib tələsik çıxır*)

H ə s ə n z a d ə (*qızın ardınca uzun bir nəzər salaraq*). Nə üçün həmişə o gedəndən sonra mən özümü bu qədər yalqız, bu qədər qəmgin hiss edirəm? Elə bil ki, o bir də qayıtmayacaq... (*Qısa pauza*) Əgər, bütün bunlar belədirsə, nə üçün mən qəti qərara gələ bilmirəm? Yoxsa, qarşımda açılan bu yeni bahar səhərinin qeyri-adi gözəlliyi məni qorxudur? Yoxsa, mən böyük insan məhəbbətinin qüdrətinə inanmağı yadırğamışam? Bəlkə mən işıqdan qorxub qaranlığa çəkilirəm?

İşıq yavaş-yavaş azalır və nəhayət, sönür. İşıq yananda Nargilənin otağı görünür. Nargilə nə isə tikir və radioda oxunan mahnıya qulaq asır. Qapının zəngi çalınır.

N a r g i l ə (işindən ayrılmayaraq). Gəl.

Sarısaç qız daxil olur.

S a r ı s a ç  q ı z. Salam, Nana... (*Onu öpür*) Vicdansız... Görürsənmi, ürəyim durmadı, yenə də mən səni axtarıb tapdım. (*Ətrafa göz gəzdirərək*) Nə qəşəng mənzilin var!

N a r g i l ə. Xoş gəlmisən, əyləş...

S a r ı s a ç  q ı z. Bu nədi, yoxsa, özünə cehiz düzəldirsən?

N a r g i l ə (*gülümsəyərək*). Aha...

S a r ı s a ç  q ı z. Nana, sən doğrudan Həsənzadəyə gedirsən?

N a r g i l ə. Sən bu sualı bir dəfə də mənə vermisən. Bəli, mən onu istəyirəm!

S a r ı s a ç  q ı z. Görünür ki, sizin aranızda mənim bilmədiyim, başa düşmədiyim nə isə var...

N a r g i l ə. Ola bilər...

S a r ı s a ç  q ı z. Yaşlı da olsa, çox yaraşıqlıdır. Yerişi, duruşu... sifəti...

N a r g i l ə. Məsələ yalnız yaraşıqda deyil...

S a r ı s a ç  q ı z. Yaraşıqda deyil, yaşda deyil, pulda, varda deyil, bəs nədədir?

N a r g i l ə. Bilmirəm.

S a r ı s a ç  q ı z (*mənalı bir təbəssümlə*). Çox yaxşı bilirsən. Dünən zavoddan çıxıb evinə gedirdi... Kişi məni nə cür cəlb etmişdisə, Dodik bayağıdı özündən çıxdı. (*Bərkdən gülərək*) Sən qısqanmırsan ki?

N a r g i l ə. Əksinə... Mən istəyirəm ki, bütün qızlar, qadınlar onu görəndə yerlərində quruyub qalsınlar... Çünki o buna layiqdir.

S a r ı s a ç  q ı z. Doğru sözündür?

N a r g i l ə. Mən indiyə qədər onsuz necə yaşadığıma təəccüb edirəm. Çünki o mənim üçün havadır, sudur, bütün bir həyatdır. (*Sarısaç qızın üzü birdən-birə qüssəli bir ifadə alır*) Səninlə Dodikin əhvalatı nə yerdədir?

S a r ı s a ç  q ı z. Eh...

N a r g i l ə. Necə "eh?"...

S a r ı s a ç  q ı z (*yavaş səslə*). Mən ondan büsbütün təngə gəlmişəm... Hər gün eyni anekdotlar, eyni şit zarafatlar...

N a r g i l ə. Bəs, evlənmirsiniz?

S a r ı s a ç  q ı z. Əvvəllər o, gündə qulağımı dəng elədi ki, “evlənək”, indi isə susur. Mənə nə düşüb, yoxsa ki, ondan ötrü gözüm uçurdu... (*Pauza. Nargilə tikir. Sarısaç qız pəncərədən bayıra baxır*) Nana...

N a r g i l ə. Eşidirəm.

S a r ı s a ç  q ı z. Həsənzadəyə de, zavodda mənim üçün də bir iş düzəltsin.

N a r g i l ə. Doğru sözündür?

S a r ı s a ç  q ı z (*başı ilə təsdiq edir*). Düzəldər?

N a r g i l ə (*həyəcanla*). Əlbəttə. Ancaq... bilirsənmi, ordakılar çox ciddi adamlardır...

S a r ı s a ç  q ı z (*gülümsəyərək*). Qorxma... Özün bilirsən ki, istəyəndə mən də ciddi olmağı bacarıram.

N a r g i l ə (*zarafatyana*). Gərək işə gecikməyəsən...

S a r ı s a ç  q ı z. Bilirəm... Onsuz da hər gün saat on ikiyəcən yatmaqdan bezaram.

N a r g i l ə (*tikişi bir kənara qoyaraq, aludəliklə*). Həsənzadə mütləq düzəldər. Bir yerdə işləyərik... Elə maraqlıdır ki, adam heç bilmir gün necə gəlib-keçir.

Qısa pauza.

S a r ı s a ç  q ı z. Nar, mən çox bədbəxtəm.

N a r g i l ə. Nə üçün? Sənə nə olub ki?

S a r ı s a ç  q ı z. Bilmirəm, gecələr gəzmək... tans... şərab... Elə bil ki, yaşamaqda heç bir fərəh, heç bir məna yoxdur... Ata-ana işdə... Ev bomboş... qalıram avara, bilmirəm neyləyim. Bir donu neçə dəfə söküb təzə modaya salarsan?! (*Ağlamsınır*) Çapıq Dodiklə nə qədər öpüşmək olar?.. Birdən az qalıram onun da baş-gözünü vuram əzəm, özümü də atam dənizə.

N a r g i l ə. Bir az yavaş...

S a r ı s a ç  q ı z. Sən zarafata salma, Nar... (*Pauza*) Ah... Məktəb nə gözəl idi. Nar... Heç olmasa, sabah nə iş görəcəyini, nə edəcəyini bilirdin... Qarşında onilliyi qurtarmaq kimi bir məqsəd var idi... İndisə...

N a r g i l ə. Məktəb ona görə gözəl idi ki, bizi bir-birimizə hələ pozulmamış, təhrif olunmamış duyğular bağlayırdı... Evdə günümüz nə qədər qara olsa da, məktəbdə hər şeyi unudurduq...

S a r ı s a ç  q ı z. Bizi kəsib ali məktəbə girməyə qoymayan o qızın qanını içərdim.

N a r g i l ə. Bir gün gələcəkdi ali məktəbi də qurtaracaqdıq, məsələ onda deyil.

S a r ı s a ç  q ı z. Bəs nədədir?

N a r g i l ə. Həsənzadə deyir ki, bizim quruluşumuzda insan cəmiyyətdən, onun mübarizəsindən kənarda qalarsa, heç bir zaman xoşbəxt ola bilməz.

S a r ı s a ç  q ı z (*qulaqlarını tutur*). Oh, yenə də təbliğat...

N a r g i l ə. Yox, mən indi hiss edirəm ki, bu, doğrudan da, belədir... Axı, hamı, bütün xalq böyük bir məqsədə doğru irəliləməkdə ikən sən bu axından necə kənarda qala bilərsən?

S a r ı s a ç  q ı z (*dalğın*). Mən heç nə istəmirəm. Heç nəyi sevə bilmirəm, Nar... Atom əsri hara, sevgi hara... Əgər, bir düyməni basmaqla yüz milyonlarla insanı bir anda külə döndərə bilərlərsə, onda nə sevgi?

N a r g i l ə. Boşla bu bədbin fikirləri. Səni inandırıram ki, hər şey yaxşı olacaq. Bir yerdə işləyərik, məktəbdəki kimi yenə də hər gün görüşərik... Zavodun yaxşı klubu da var... Hər gecə film göstərirlər. Lap qiyabi instituta da girərik. Həsənzadə kömək eləyər. (*Qürurla*) İndi biz daha əvvəlki kimi köməksiz deyilik!

S a r ı s a ç  q ı z. Heç kəsə ürəyim qızmır, Nar... Mənə elə gəlir ki, adamlardan milyon verst uzağa düşmüşəm. Atam işdən sonra bütün günü aşnasının yanında olur. Anamı da qısqanclıq əldən salıb, gündə qanqaralığı, gündə dava, eh...

N a r g i l ə. Darıxma, biz onlar kimi yaşamarıq... Biz özümüz üçün tamam yeni bir həyat quraraq. İstəyirsən Həsənzadəyə deyək, zavodda Dodik üçün də bir iş düzəltsin.

S a r ı s a ç  q ı z. Qoy cəhənnəm olsun. Bəyəm, o, işləyəndir?

N a r g i l ə. Nə vaxtacan atasının əlinə baxacaq?

S a r ı s a ç  q ı z. Narahat olma. O, darmayedliyə öyrənib. (*Qalxır*) Mən getdim, Nar...

N a r g i l ə. Nə tələsirsən?

S a r ı s a ç  q ı z. Partnixaya gedəcəyəm.

N a r g i l ə. Təzə paltar tikdirirsən?

S a r ı s a ç  q ı z. Sən də, təzə paltar üçün pul hardadır... Qırmızı donumu sökdürüb ayrı formada tikdirirəm... Demək mənim məsələmi çuvakınla danışarsan...

N a r g i l ə. Surik!

S a r ı s a ç  q ı z. Bağışla... Zəhrimar dilim öyrənib... (*Güzgüdə özünü səliqəyə salaraq*) Nar, üçüncü dəfədir ki, qiyamət bir oğlanla qabaq-qabağa çıxıram. Üzünə baxıram, az qalır yerişini itirsin. Məni gülmək tutur, o isə qulaqlarının dibinə qədər qızarır. Görünür, çox üzüsulu uşaqdır... (*Qəhqəhə ilə gülür. Nəzakət gəlir. Sarısaç qıza soyuq bir nəzər salır. Sarısaç qızın gülüşü arvadın bu soyuq nəzərləri altında donur*)

S a r ı s a ç  q ı z. Yaxşı, Nar. Mən getdim. Sağ olun.

N a r g i l ə. Xoş gəldin. (*Sarısaç qız çıxır*) Sən nə üçün onunla salamlaşmadın?

N ə z a k ə t. Sən bunlarla əlaqəni kəs, o günü də dedim... (*Gərgin pauza*) Özün də qayıt evinə.

N a r g i l ə. Mən bir də Fərəcin yanına qayıdım?

N ə z a k ə t. Dedim ki, öz evinə!

N a r g i l ə. Belə söhbətlər daha nəyə lazımdır? Hər şey olub-keçib.

N ə z a k ə t. Mən onun stol-kürsüsünü sənin otağından çıxarmışam.

N a r g i l ə. Soruşmaq ayıb olmasın, bu gün hardan doğub?

N ə z a k ə t. Sən mənə cəhənnəm əzabı verirsən! Heç yerdə qərar tuta bilmirəm... Mən Fərəcə də, özümə də nifrət edirəm. Mən bunu ona demişəm... Daha neyləməliyəm?!. (*Göz yaşları içində*) On iki ildən artıq idi ki, mən sənin atanı yuxuda görmürdüm. Amma indi hər gecə görürəm. Mənimlə bir kəlmə danışmır. Siz məndən nə istəyirsiniz? Bir canım var, əgər, onu verməklə bu əzabdan qurtara bilərəmsə, alın, vallah sizə minnətdar olaram. Heç olmasa, qəbirdə rahat yataram. Mən pisəm... ancaq mən, heç bir şeyi bilə-bilə, öz iradəmlə eləməmişəm. Heç olmazsa, sən bunu başa düş.

N a r g i l ə (*yaxınlaşıb əlini onun başına çəkir*). Sakit ol, ana!

N ə z a k ə t. Qızım! (*Ona qısılır*)

N a r g i l ə (*mütəəssir halda*). Sakit ol, ana!

N ə z a k ə t. Mən sənin məhəbbətini qaytarandan sonra ayrı cür yaşamaq istəyirəm...

N a r g i l ə (*mehribancasına*). Belə ürəyinaziklik nəyə lazımdır...

N ə z a k ə t. Yox, qayıtmalısan... Mən sənin nəfəsini atanın evində, öz yanımda hiss etməyincə rahat ola bilməyəcəyəm.

N a r g i l ə (*zarafatyana*). Elə fərz elə ki, ərə getmişəm.

N ə z a k ə t. Ərə getmək başqa, mən səni bir ana kimi bütün qayda-qanun ilə köçürmək istəyirəm. Mən bunun üçün illər uzunu Fərəcdən gizlin, öz maaşımdan qəpik-qəpik kəsib pul yığmışam. Mən səni ləyaqətlə ərə verəcəyəm.

N a r g i l ə (*zarafatmı və ya həqiqətmi olduğu bilinməyən bir sevinclə*). Demək, mənim cehizim də olacaq. (*Anasını öpür*)

N ə z a k ə t (*təəccüblü bir ruhi sakitliklə*). Bu neçə ilin ərzində birinci dəfədir ki, sən ananı öpürsən... Mən də sənə analıq xeyir-duası verirəm, qızım... Səni görüm dünyalarca xoşbəxt olasan.

N a r g i l ə (*ürəyinin dərinliklərindən qopub gələn bir istək və ehtiramla*). Amin! (*Pauza. Nargilə anasına qısılır və indi işıq yalnız onların üzünə düşür. Sanki hər ikisinin gözü nəhayətsiz uzaqlara... eyni məchul nöqtəyə zillənmişdir. Hər ikisinin çöhrəsində eyni sakit ifadə vardır*) Yadındadırmı, mən dörd-beş yaşlarımda olduğum zaman qıçımı it tutmuşdu. Fərəc kurorta getmişdi...

N ə z a k ə t (*pıçıltı ilə*). Yadımdadır.

N a r g i l ə. Yaram simlədiyi üçün sən neçə gecə yuxusuz qalmışdın. Mən isə hey sənə nağıl dedirdirdim. Yorulub əldən düşmüşdün. Bir gün də mahnı oxumağını tələb elədim... Sən oxudun... Birdən susdun... Baxdım ki, yuxuya getmisən... (*Pauza. Anasına daha da qısılaraq*) O mahnının yadında qalan yerlərini mənim üçün oxu.

Qısa pauza. Birinci şəkildəki musiqi davam edir. Ananın xəyalı uzaqlara uçur. Yenə də zaman dayanmışdır.

N ə z a k ə t. Yox, o mahnını yadıma sala bilmirəm.

N a r g i l ə (*ürəkdən*). Fikir eləmə, ana... Hər şey yaxşı olacaq...

N ə z a k ə t. Mən ömrümə on ömür calayıb sənin xoşbəxtliyin üçün dişimlə-dırnağımla çalışacağam.

N a r g i l ə. Sağ ol ana. (*Onu öpür*) Neçə illərdir ki, mən sənin nəfəsini belə yaxından hiss etməmişdim.

N ə z a k ə t (*qalxır*). Bu gün yığışıb gələrsən. Sabah gedərik dərziyə.

N a r g i l ə. Nə var ki?

N ə z a k ə t. Sənin üçün də, özüm üçün də kostyumluq almışam.

N a r g i l ə (*ürəkdən, lap uşaq kimi sevinir*). Nə danışırsan?.. Yaxşı materialdır?

N ə z a k ə t. Gərək xoşuna gəlsin... Məncə, çox yaxşıdır...

N a r g i l ə (*eyni uşaq sevinci ilə*). Axır ki, mənim də əynim bir təzə kostyum üzü görər...

N ə z a k ə t. Anan sənin üçün hələ ayrı şey də alıb.

N a r g i l ə. Nə?

N ə z a k ə t. Gələrsən, görərsən...

N a r g i l ə. Bəlkə... (*Məzəli bir əda ilə ayağına işarə edir*) Dünən univermağa gələn tuflilərdəndir? (*Nəzakət başı ilə təsdiq edir*) Sağ ol, ana. Bir gün mən də heylə bahalı tufli ayağıma geyəcəyimi heç ağlıma da gətirməzdim. Ancaq... ana, bir məsələ var...

N ə z a k ə t. Yenə nə məsələdir?

N a r g i l ə. Axı, mən o kişinin üzünü bir də görmək istəmirəm.

N ə z a k ə t. Sən onun üzünü görməyəcəksən. Mən aralıq qapını bağlamışam.

N a r g i l ə. Qoy elə mən burda qalım.

N ə z a k ə t. Təzədən başlayırsan?

N a r g i l ə. Yaxşı...

N ə z a k ə t. Hələlik...

N a r g i l ə. Hələlik, ana!

Nəzakət çıxır. Nargilə onun ardınca uzun bir nəzər salır. İşıq tədricən azalır, nəhayət, Nargilənin həyəcanlı, xoşbəxt nəzərləri altında sönür. Həsənzadənin eyvanı. Ətrafda bir tör-töküntülük nəzərə çarpır. Həsənzadə şeylərini çamadanlara yığır. Telefon zəngi. Həsənzadə dəstəyi götürür. İşıq eyni zamanda telefon xəttinin o biri ucunda dəstəyi qulağına tutmuş Nəzakətin üzərinə düşür.

H ə s ə n z a d ə. Eşidirəm.

N ə z a k ə t. Sizi bir də narahat elədiyim üçün üzr istəyirəm.

H ə s ə n z a d ə. Eybi yoxdur, buyurun...

N ə z a k ə t (*həyəcanını güclə boğaraq*). Bilirsinizmi, biz barışdıq...

H ə s ə n z a d ə. Təbrik edirəm... Mən bunu gözləyirdim...

N ə z a k ə t. İcazə verin sizə dünyalar qədər təşəkkür edim.

H ə s ə n z a d ə. Mənə?

N ə z a k ə t. Əlbəttə... Sizin təsiriniz olmasaydı, biz ana-bala arasındakı əhvalat kim bilir haralara gedib çıxardı... Bəlkə də heç ölənəcən barışmazdıq. (*Qısa pauza*) Ancaq sizdən böyük bir xahişim var.

H ə s ə n z a d ə. Buyurun...

N ə z a k ə t (*həyəcan içində*). Deməyə cəsarət eləmirəm.
H ə s ə n z a d ə. Ürəyinizə nə gəlirsə, deyin.
N ə z a k ə t. Elədiyiniz yaxşılığı axıra qədər aparın.
H ə s ə n z a d ə. Başa düşmürəm.
N ə z a k ə t. Siz nə qədər yaxşı insan olsanız da, mən onun sizə ərə getməsinə razı deyiləm.
H ə s ə n z a d ə. Mən bunu bilirəm.
N ə z a k ə t. Siz Allah inciməyin...
H ə s ə n z a d ə. İncimirəm...
N ə z a k ə t. Özünüz deyin, insafdırmı ki, o cür gənc qız...
H ə s ə n z a d ə (*səbrsiz onun sözünü kəsir*). Aydındır.
N ə z a k ə t. Rica edirəm, məni səhv başa düşməyin... Biz çalışmalıyıq ki, övladlarımızın xoşbəxtliyi bütöv olsun. Elə deyilmi?
H ə s ə n z a d ə. Elədir... Əlbəttə, elədir...
N ə z a k ə t. Biz xoşbəxt olmadıq, heç olmasa, onlar olsunlar... Yalvarıram, bir vasitə ilə onu özünüzdən uzaqlaşdırın. Elə edin ki, bir də sizin barənizdə düşünməsin... Siz alicənab adamsınız... Siz bunu bacararsınız...
H ə s ə n z a d ə. Mən o barədə fikirləşərəm. Ancaq siz öz səhvinizi işdə düzəldin... Nargilə sizin bilib-tanıdığınızdan çox-çox yüksək bir qızdır. (*Pauza. Dərin böhran içində*) Siz onun xoşbəxt olmasına çalışın!.. Bunun üçün, əgər, bir çətinliyə rast gəlsəniz, mənə müraciət eləməyi unutmayın!.. (*Qısa pauza*) Mənim ünvanımı zavoddan soruşsanız, deyərlər...
N ə z a k ə t. Necə bəyəm, siz bir yerə gedirsiniz?
H ə s ə n z a d ə. Bəli, gedirəm.
N ə z a k ə t. Neçə vaxta?
H ə s ə n z a d ə. Həmişəlik.
N ə z a k ə t. Nə danışırsınız...
H ə s ə n z a d ə (*artıq danışmaq onun üçün çətindir*). Başqa sözünüz yoxdur ki?
N ə z a k ə t (*mütəəssir halda*). Gedin, işiniz həmişə avand olsun. Siz dəyərli insansınız.

Həsənzadə dəstəyi asır və dərhal papiros yandırır. O, heç bir zaman indiki qədər həyəcanlı görünməmişdir. Birinci şəkildəki musiqi yenidən qalxır. Pauza. Həsənzadə papiros çəkdikcə onun həyəcanı sonu görünməyən bir kədərə çevrilir. Yaşlı bir kişi,

Fərəcov və keçən dəfə Həsənzadənin kabinetində gördüyümüz üç cavan oğlan daxil olurlar.

Y a ş l ı k i ş i. Salam.

H ə s ə n z a d ə. Əleykəssalam, buyurun, əyləşin...

Gələnlər otururlar.

Y a ş l ı k i ş i. Bu nə əhvalatdır, əşi, deyirlər gedirsən?

H ə s ə n z a d ə (*zarafatyana*). Elə deyirlər.

Y a ş l ı k i ş i. İyirmi ildir bir yerdə işləyirik, üzümüz-gözümüz öyrəşib...

F ə r ə c o v. Ba...a... balaca bir sexi böyüdüb o cür zavod eləmisiniz... İ... i... indi ən ya... ya... yaxşı vaxtında qoyub gedirsiniz.

B i r i n c i i ş ç i. Harada işləyəcəksiniz?

H ə s ə n z a d ə. Gəncə tərəfdə təzə zavod tikmək lazımdır.

Y a ş l ı k i ş i. Deyir, özün ərizə vermisən?

H ə s ə n z a d ə (*qəsdən kişinin sözünün üstündən keçərək*). Eh, ay Muradxan dayı, sənlə mənə bu dünyada tikməkdən başqa ayrı nə qalıb ki?..

Y a ş l ı k i ş i. Tikmək yaxşı şeydir. Ancaq sən niyə özünü mənimlə bir tutursan?.. Mən yetmişi vurub keçmişəm. Amma sən.

B i r i n c i i ş ç i. Rəşid bayaq kəndlərindən zəng eləmişdi. Sizin getməyinizi biləndə yaman pərt oldu...

H ə s ə n z a d ə. Məzuniyyətini nə cür keçirir?

B i r i n c i i ş ç i. Deyir darıxıram... Sabahda, birigündə qayıdacaq...

İ k i n c i i ş ç i (*mənalı təbəssümlə*). Darıxmağının səbəbi var.

H ə s ə n z a d ə (*gülümsəyir*). Nədi eylə?

B i r i n c i i ş ç i. Bilmirsiniz?

H ə s ə n z a d ə (*qəsdən*). Yox, bilmirəm, nə olub bəyəm?

İ k i n c i i ş ç i. Naryadçı qız gələndən bəri nə gecəsi gecədi, nə gündüzü gündüz...

Ü ç ü n c ü i ş ç i. Lap Məcnun olub.

H ə s ə n z a d ə. Nargiləni deyirsiniz?

B i r i n c i i ş ç i. Ancaq qızın onunla ulduzu barışmır ki, barışmır... Rəşidi görəndə, elə bil, cini qalxır. İllah da ki, oxuyanda.

İ k i n c i i ş ç i (*mənalı təbəssümlə*). Bunlar Rəşidin xeyrinədir.

B i r i n c i i ş ç i. Xeyrinədir?

İ k i n c i  i ş ç i (*filosofanə bir görkəm alaraq*). Bəs necə...

Ü ç ü n c ü  i ş ç i (*hərarətlə*). Sən də ağ eləmə! Nəyi xeyrinədir, az qalmışdı kişini vurub öldürsün...

İ k i n c i  i ş ç i. Siz hələ uşaqsınız. Mən belə romanları çox oxumuşam.

Ü ç ü n c ü  i ş ç i. Qız nervinnidi, vəssalam...

İ k i n c i  i ş ç i. Xeyr a... nervin bura dəxli yoxdur. (*Bilici ədası ilə*) Psixoloji!

Pauza. Həsənzadə ikinci işçiyə baxır. Sonra gözlərini ondan çəkərək papiros yandırır. O öz dərin kədərinə qalib gəlməyə çalışır.

B i r i n c i  i ş ç i. Biz gərək onu həmkarlar ittifaqına götürək.

İ k i n c i  i ş ç i. Götürməyinə götürək, ancaq həmkarlar ittifaqının məhəbbətə nə dəxli var?

B i r i n c i  i ş ç i (*ötkəm*). Çox dəxli var!.. Əgər, o, bir təşkilatın üzvü olsa, kollektivə daha tez isinişər. Adamlara dəvə nalbəndə baxan kimi baxmaz.

Ü ç ü n c ü  i ş ç i. Təzə gələn vaxt söz demək olmurdu. İndi xeyli dəyişib.

Y a ş l ı  k i ş i. Qızın ağlı olsa, çəm-xəm eləməz. Bu mahalda Rəşid kimi oğlan yoxdur.

İ k i n c i  i ş ç i. Əlbəttə.

F ə r ə c o v. Rəşidi vu... vu... vurar, öldürər... Də... dəli şeydir.

H ə s ə n z a d ə (*sərt*). Bura bax, Fərəcov, əgər, bir də sənin o qız barəsində bu cür sözlər danışdığın qulağıma çatsa, birinci növbədə, mənə cavab verməli olacaqsan... Elə bilmə ki, mən ayrı planetə köçürəm. Həmişə zavodla əlaqə saxlayacağam.

Y a ş l ı  k i ş i. Əlbəttə... zavod sənin balandır.

H ə s ə n z a d ə. Əgər, mənim xatirimi istəyirsinizsə, o qızdan muğayat olun. Ağıllı qızdır. Çalışın xoşbəxt olsun. (*Qısa pauza. Papiros çəkir*) O, başqa şəraitdə böyümüşdür.

Y a ş l ı  k i ş i. Sən bizə pis adam tapşırmazsan. O qızı gözümüz üstə saxlayacağıq.

İ k i n c i  i ş ç i. Lap arxayın olun.

H ə s ə n z a d ə (qısa pauza. Həsənzadə ağır düşüncədən başını qaldıraraq). Bilirsiniz ki, Rəşidi mən də çox istəyirəm.

B i r i n c i  i ş ç i. Siz onu politexnik institutunacan aparıb çıxarmısınız.

H ə s ə n z a d ə. Əgər, Nargilə ilə ulduzları barışsa, mən də şad olaram.

B i r i n c i  i ş ç i. Yəni demək istəyirsiniz ki...

Ü ç ü n c ü  i ş ç i. Hə... də...

H ə s ə n z a d ə (*birinci oğlana xitabən*). Mənə də elə gəlir ki, bu mümkündür və sizdən xahiş edirəm o barədə mənim də rəyimi Rəşidə bildirəsiniz.

B i r i n c i  i ş ç i. Baş üstə.

Qısa pauza.

H ə s ə n z a d ə. Mən taleyə inanıram. Mənə elə gəlir ki, bizim xoşbəxtliyimiz əksər hallarda bir-birimizdən asılıdır.

Y a ş l ı  k i ş i. Elədir, qardaş, elədir. Əgər, hamı sənin kimi düşünsəydi, dünya cənnət olardı. (*Qısa pauza*) Yaxşı adamlar həmişə yaxşı işlər yadigar qoyub gedirlər. (*Əvvəl o, sonra da o birilər qalxırlar*) Sənin bizim boynumuzda haqqın çoxdur. Get, işin həmişə avand olsun...

H ə s ə n z a d ə. Sağ olun...

Y a ş l ı  k i ş i. Sənə yaxşı yol...

Həsənzadə hamı ilə əl tutuşur. Adamlar çıxırlar. Həsənzadə bir neçə saniyə hərəkətsiz dayanır. Onun görünüşü çox kədərlidir. Birinci şəkildəki musiqi yenidən başlayır. Həsənzadə şeylərini yığışdırmaqda davam edir. Otağın işığı azalır və yarıqaranlıqdan Xurşid çıxır. İşıq onun və Həsənzadənin üzərinə düşür.

X u r ş i d. Nə üçün evlənmədin? Axı, o səni sevir.

H ə s ə n z a d ə. Doğrudur... Lakin bu, qeyri-adi bir məhəbbətdir. (*Qısa pauza*) Təbiət sevənlər arasında qəribə tənasüb yaradır; bu tənasüb pozulduqda isə, ikisindən birində məhəbbət daha tez qocalır. Daha tez məhv olur ki, bu da çox kədərli bir haldır...

X u r ş i d. Sən cavanlıqda məhəbbət barəsində bu cür sakit, bu cür soyuq mühakimə yürütməzdin...

H ə s ə n z a d ə. O zaman bu duyğular hamısı torpaqdan təzə-təzə baş qaldıran körpə otlar üzərinə düzülmüş bahar şehləri idi. Yay günəşi onları çoxdan qurudub! Qışda düşən şeh isə donub buz olur...

X u r ş i d. Sən gedirsən, bəs, o yazıq qızın halı necə olacaq? Məgər, bu, sənin tərəfindən xudpəsəndlik deyil?

H ə s ə n z a d ə. Yox! Mənim getməyim ədalətin hökmüdür. (*Qısa pauza*) Dünyada ata-ana nəvazişi görməyən o gənc qız mənə göy-dəndüşmə bir məxluq, bir Allah kimi baxır. (*Zarafatyana*) İndi, əgər, bu "Allah" öz qüdrətindən sui-istifadə eləyib onun səadətini oğurlasa, bəs, insafı harda qaldı?

X u r ş i d. Axı, o öz xoşbəxtliyini səndə görür...

H ə s ə n z a d ə. Doğrudur... Lakin bu duyğunun ömrü o qədər qısadır ki... (*Pauza*) Yox, sonrakı peşmançılıqdan indiki əzab min dəfə yaxşıdır! (*Qısa pauza*) Bir vətəndaş olaraq mənim üçün əsas məsələ onun həyatı, insanları düzgün dərk etməsidir!

X u r ş i d. Sən bu məsələni artıq həll etmiş olduğunu güman edirsən?

H ə s ə n z a d ə. Mən bunun üçün əlimdən nə gələ bilirdisə, hamısını elədim. Ardını isə... həyat özü davam etdirəcək! Mən onu yaxşı insanlar arasında qoyub gedirəm!

Maşın siqnalı. Qapı zəngi. Şofer daxil olur. Xurşid çəkilir.

Ş o f e r. Hazırsınız?

H ə s ə n z a d ə. Bəli, hazıram.

Şofer iki çamadanı götürüb çıxır. Həsənzadə pencəyini geyərək, boş otağa nəzər salır. İşıq tədricən sönür. İşıq yananda isə, Nargilənin otağı görünür. Nargilə eyni həvəslə tikir. Qapının zəngi çalınır. Qız yüyürüb qapını açır. Həsənzadə otağa daxil olur. Nargilə bir an donub qalır.

N a r g i l ə. Gözlərimə inana bilmirəm. Siz də mənim otağıma gələrmişsiniz. (*Özünü Həsənzadənin üstünə ataraq, hər iki əli ilə ondan yapışıb, üzünü sinəsinə yapışdırır*) Ay Allah... Mən nə qədər xoşbəxtəm!.. Mənim əzizim, həyatım... (*Sevincdən gah gülür... gah gözləri yaşarır*) Bu gün mənim nə xoşbəxt günümdür!.. Sizdən bir az qabaq da anam gəlmişdi.

H ə s ə n z a d ə (*birdən canlanaraq*). Doğrudanmı?

N a r g i l ə. Bəs necə!.. Uzun işdir... Elə indicə sizə zəng edəcəkdim. Anam təkidlə mənim geri qayıtmağımı istəyir. Hətta, Fərəcin stul-mustulunu da mənim otağımdan çıxarıb, aralıq qapını bağlayıb.

H ə s ə n z a d ə. Bəs, sən nə cavab verdin?

N a r g i l ə. Mən sizinlə məsləhətləşmək istədim... Qayıdım, yox...

H ə s ə n z a d ə. Əlbəttə, qayıtmaq lazımdır...

N a r g i l ə. Fərəcin acığına mən də qayıtmaq istəyirəm.

H ə s ə n z a d ə. Fərəcin acığına nə üçün? Ananın xatirinə qayıtmaq lazımdır. Madam ki, peşman olub...

N a r g i l ə. Eh... bilirsiniz necə peşman olub... Deyir, mən səni öz ata evindən gəlin köçürmək istəyirəm, yaman dəyişilib.

H ə s ə n z a d ə. Belə də gözləmək olardı... Ana anadır.

N a r g i l ə. Görünür, elədir. (*Qısa pauza. Həsənzadəyə həyəcanla baxaraq*) Mən sizi bu kiçik, yoxsul otağıma heç yaraşdıra bilmirəm. Elə bil ki, Aydan gəlmisiniz. Gəlin əyləşin... Mənim Aydan gələn əzizim. (*Hər ikisi oturur*) Mən evimizə qayıdandan sonra da tez-tez gələrsiniz... Eləmi?

H ə s ə n z a d ə. Vaxt olar gələrəm.

N a r g i l ə. Vaxt olar nədir... hər gün gələcəksiniz. (*Bir sirr açırmış kimi yavaşcadan*) Anam daha sizin kölgənizi qılınclamır...

H ə s ə n z a d ə (*mükəddər bir təbəssümlə*). Doğrudanmı?

N a r g i l ə. Bir kəlmə də pis söz demir.

H ə s ə n z a d ə. Mən buna çox şadam.

N a r g i l ə. Mən bilirdim ki, anam, əvvəl-axır, başa düşəcək... (*Onun əlindən yapışaraq*) Axı, sizə necə pis demək olar? Eh... bu gün... Surik də gəlmişdi...

H ə s ə n z a d ə. Nə deyirdi?

N a r g i l ə. İşləmək istəyir. Zavodda onun üçün bir iş tapılar?

H ə s ə n z a d ə. Tapılar.

N a r g i l ə. Onda düzəldin. Vallah, pis qız deyil.

Həsənzadə bloknot və qələm çıxarıb nə isə yazaraq kağızı çıxarıb Nargiləyə verir.

H ə s ə n z a d ə. Verərsiniz Fərəcova, düzəldər...

N a r g i l ə. Məktub nə üçün? Sabah özünüz çağırıb tapşırarsınız...

H ə s ə n z a d ə (*özünü toplayaraq*). Özüm gedirəm.

N a r g i l ə (*birdən tutularaq*). Hara? (*Yalnız indi Həsənzadənin yol paltarında olmasının fərqinə vararaq*) Olmaya Aydını görməyə gedirsiniz? (*Həsənzadə "yox" mənasında başını bulayır*)

H ə s ə n z a d ə. Təzə iş yerinə.

N a r g i l ə. Başa düşmürəm, necə "təzə iş yerinə"?

H ə s ə n z a d ə. Gəncə tərəfdə böyük sement zavodu tikilməlidir, məni ora dəyişiblər...

N a r g i l ə (*qeyri-ixtiyari*). Bəs mən?!

H ə s ə n z a d ə (*onun əlindən tutaraq*). Siz burada qalırsınız...

N a r g i l ə (*dəhşət içində əlini Həsənzadənin əlindən qopararaq qışqırır*). Yox... yox... İstəmirəm! Qalmaq istəmirəm! Mən... Sizsiz yaşaya bilmirəm. (*Birdən böhran içində gülərək*) Yoxsa? Siz məni sınamaq istəyirsiniz?

H ə s ə n z a d ə. Sizin sınanmağa ehtiyacınız yoxdur.

N a r g i l ə (*öz-özünə danışırmış kimi*). Demək, gedirsiniz...

Qısa və gərgin pauza.

H ə s ə n z a d ə (*onun əlindən tutaraq*). Qulaq asın, görün mən nə deyirəm.

N a r g i l ə (*əlini onun əlindən qopararaq*). Lazım deyil!.. Heç nə deməyin!.. Heç nə... (*Gözlərindən sakit-sakit yaş axır*) Siz getməli idiniz... Siz həddindən artıq yaxşı adamsınız. Siz qala bilməzdiniz...

H ə s ə n z a d ə. Elə deməyin...

N a r g i l ə. Yox, narahat olmayın. (*Göz yaşları sakit-sakit axır*) Siz getsəniz də, hər şeyi özünüzlə aparmırsınız... Siz mənim həyatımda çox şey qoyub gedirsiniz.

H ə s ə n z a d ə. Rica edirəm həyəcanlanmayın.

Göz yaşları daha da şiddətli tökülür.

N a r g i l ə. Dedim ki, narahat olmayın... Madam ki, siz belə edirsiniz, demək, belə də lazımdır. Qoy mənim göz yaşlarım sizin səfərinizi kədərli eləməsin. Siz onsuz da bu dünyada az dərd çəkməmisiniz. (*Göz yaşları içində gülümsəyir*) Mən Səməndər quşu kimi sizin odunuza yanmaq istəyirdim. Siz bunu istəmədiniz. Çünki siz həddindən artıq yaxşı adam idiniz... (*Bayırda maşın siqnalı. Həsənzadə qalxır*) Yox, bircə dəqiqə də dayanın... Əgər, bu dünyada insaf, ədalət varsa, qoy sizin bircə oğlunuz yer üzünün ən xoşbəxt adamı olsun. Sizin qəlbiniz bir də qəm görməsin. Siz həmişə... gecə də, gündüz də mənim yanımda olacaqsınız. Mənimlə olacaqsınız. (*Şiddətli göz yaşları içində gülümsəyir*) Axı, mən sizsiz necə yaşaya bilərəm?

H ə s ə n z a d ə (*həyəcanla*). Nargilə...

N a r g i l ə. Yox, susun. Siz öz sözünüzü demisiniz. Mənim isə sizə sözüm çox idi... Sizin vaxtınız yoxdur... Lakin siz harda olursunuz-olun, mən hər gün bu sözləri sizə deyəcəyəm.

H ə s ə n z a d ə. Rica edirəm həyəcanlanmayın.

N a r g i l ə (*göz yaşları içində gülümsəyir*). Kim deyir ki, mən həyəcanlanıram?! Əksinə... Mən heç bir zaman özümü bu qədər sakit hiss etməmişəm! Mənim məhəbbətim əbədiyyətə qovuşmuşdur! Mən onun sabitliyini, gözəlliyini, əbədiliyini heç bir zaman bu qədər aydın hiss etməmişdim... (*Onun qollarından yapışaraq*) İndi isə gedin, qatara gecikirsiniz...

Həsənzadə çıxır. Birinci şəkildəki musiqi yenidən başlayır.
İşıq tədriclə azalır və sönür...

P ə r d ə

*1963*

# MƏHV OLMUŞ GÜNDƏLİKLƏR

İ Ş T İ R A K  E D İ R L Ə R

G ö v h ə r – həkim, 42 yaşında
F ə r i d ə – onun qızı, 22 yaşında
Q ə n i m ə t – gənc mühəndis, 22 yaşında
S a v a l a n – rəssam, 22 yaşında
A n j e l – 22 yaşında
Ə d a l ə t – 38 yaşında
S k e l e t ə b ə n z ə r  k i ş i
T i p

## BİRİNCİ PƏRDƏ

Gövhərin evi. Sadə, təmiz bir otaq. Fərəh və sevinc ifadə eləyən bir musiqi. Fəridə bu musiqinin ahənginə uyğun bir xoşbəxtlik içində gəlib zəng eləyir. İşıq, eyni zamanda, telefon xəttinin o biri ucunda, stol arxasında oturmuş Ədalətin üzərinə düşür.

Ə d a l ə t (*dəstəyi götürərək*). Eşidirəm.

F ə r i d ə (*zarafatyana, səsini dəyişir*). Bağışlayın, yoldaş rəisi olar?

Ə d a l ə t (*səsi tanıyır, lakin zarafatla*). Kimdir soruşan?

F ə r i d ə. Bir qəşəng qız!

Ə d a l ə t. Qəşəng qızın rəislə nə işi var?

F ə r i d ə. İşi olmasaydı, zəng eləməzdi.

Ə d a l ə t. Buyurun, Fəridə xanım!.. Rəis sizi dinləyir.

F ə r i d ə (*qəhqəhə ilə gülərək*). Yaman şeysən, nə qədər səsimi dəyişdim, yenə də tanıdın.

Ə d a l ə t (*gülümsəyərək*). Görürsən ki... Nə əcəb zəng eləmisən?

F ə r i d ə. Çox sağ ol! Eləməyim?

Ə d a l ə t. Bayaq eləmişdin, ona görə deyirəm.

F ə r i d ə. Nə olsun, bayaq eləmişdim, indi də eləyirəm. (*Nazlanaraq*) Sənsiz darıxıram.

Ə d a l ə t. Tənəffüsdə gələcəyəm.

F ə r i d ə. Doğrudan?

Ə d a l ə t. Doğrudan.

F ə r i d ə. Urra! İşin çoxdur?

Ə d a l ə t. Çoxdur.

F ə r i d ə. Gəlim kömək eləyim?

Ə d a l ə t (*eyni zarafatla*). Gəl.

F ə r i d ə. Bax, gələrəm ha...

Ə d a l ə t. Gözləyirəm.

F ə r i d ə (*bərkdən gülür, sonra nə üçünsə pıçıltı ilə*). Öpürəm səni.

Ə d a l ə t. Mən də...

F ə r i d ə. Çox-çox?

Ə d a l ə t. Çox-çox.

F ə r i d ə. İşlə! (*Dəstəyi asır*)

Ədalətin üzərinə düşən işıq sönür. Fəridə gündəliyini çıxarıb eyni həyəcanla yazmağa başlayır və yazdıqca biz onun daxili səsini eşidirik.

F ə r i d ə n i n  d a x i l i  s ə s i. Mən xoşbəxtəm... Bir ay bundan əvvəl politexniki bitirdim. İndisə istədiyim oğlana ərə gedirəm. Sabah yox, birisi gün bizim toyumuzdur. Nişanlım gözəldir, yüksək vəzifə sahibidir. Nəcib oğlandır. Ah... mən bu xoşbəxtliyi gözləyirdim. Mən anamın yarımçıq qalmış səadətini tamamlamaq istəyirdim... O, ömrünün iyirmi cavan, əziz ilini mənə həsr edib... Mən sənə rast gəldiyim üçün öz taleyimə təşəkkür edirəm, Ədalət! Sən mənim himayədarım, dostum, yoldaşım, sevgilim olacaqsan! Biz səninlə gələcək illəri ürəklə, cəsarətlə qarşılayacağıq.

Gövhər gəlir.

F ə r i d ə. Ana, deyəsən, yaman yorulmusan?

G ö v h ə r. Yaman. Bu gün düz on beş evə getmişəm.

F ə r i d ə. Sənin də sahən o qədər böyükdür ki...

G ö v h ə r. Böyüklüyünün eybi yoxdur... Təki xəstəlik olmasın. (*Kağıza bükülü parçanı çıxarıb Fəridəyə verir*) Sənin üçün neylon pərdəlik almışam.

F ə r i d ə. Neçə pəncərə üçündür?

G ö v h ə r. Səkkiz.

F ə r i d ə. Dayan görüm çatır? (*Gözlərini yumaraq xəyalən sayır*) İki... üç... beş... altı... iki də kabinet. Hamısına çatır. Sən heç Ədalətin evinə getməmisən, pəncərələrin sayını hardan bilirsən?

G ö v h ə r. Küçədən saymışam.

F ə r i d ə (*parçaya baxır*). Oy, nə gözəl rəngi var.

G ö v h ə r. “Hədiyyələr salonu”nda qəşəng bir süfrə vardı, beş manatım çatmadı...

F ə r i d ə. Eybi yoxdur, ana. Ədalətin hər şeyi var.

G ö v h ə r. Bilirəm... (*Yorğun təbəssümlə*) Ancaq heç bir ana qızını cehizsiz yola salmaq istəməz.

F ə r i d ə (*ona diqqətlə baxaraq*). Ana, nə üçün mənim Ədalətə getməyim səni sevindirmir?

G ö v h ə r (*onun üzünə baxmadan*). Nədən bilirsən sevindirmir?

F ə r i d ə. Hiss edirəm... O, sənin ürəyindən deyil.

Ağır pauza.

G ö v h ə r (*dərindən nəfəs alaraq*). Sən ali təhsilli, mədəni, ağıllı bir qızsan... Madam ki, onu bu qədər sevirsən, mənim ürəyimdən olub-olmamasının nə əhəmiyyəti var...

F ə r i d ə (*inciyir*). Çox sağ ol, ana! Sən məni bu qədər nankor bir qız hesab edirsən? Sən ömrünün əziz vaxtlarını mənə sərf etdiyin halda...

G ö v h ə r (*onun sözünü kəsir*). Sən bilirsən ki, mən bu barədə söz-söhbəti sevmirəm.

F ə r i d ə. Bağışla.

G ö v h ə r. Mən Ədaləti tələbə vaxtlarında bir az tanıyırdım. Onun xalası mənimlə bir ambulatoriyada işləyirdi. Sonra xalası başqa yerə dəyişildi... Ədalətdən uzun zaman xəbərim olmadı. Mən, bu Ədalətin həmin tələbə olduğunu keçən il bildim.

F ə r i d ə. O zaman tələbə sənə necə təsir bağışlayırdı?

G ö v h ə r. Yaxşı... Mehriban, nəzakətli, təvazökar bir oğlan idi.

F ə r i d ə. Bəs indi?

Qısa pauza.

G ö v h ə r. İndisi barədə bir söz deyə bilmərəm.

F ə r i d ə. Nə üçün?

G ö v h ə r. Çünki indi adamlar yüksək vəzifəyə qalxanda, onlarla bizim – adi adamların arasında bəzən bir sədd yaranır. Onların nə elədiklərindən, nə ilə məşğul olduqlarından xəbərimiz olmur. Biz onların yalnız adlarını eşidirik.

F ə r i d ə (*hərarətlə*). Bu onların nöqsanıdır!

G ö v h ə r. Yəqin ki...

F ə r i d ə (*qızğınlıqla*). Ancaq... ana, inan ki, Ədaləti tələbə vaxtında necə görmüsənsə, indi də elədir. Hələ, bəlkə də, daha yaxşıdır. (*Şirin xəyala dalaraq*) Eh, bilirsən necə təmiz oğlandır?.. Srağagün axşam gəzməyə gedəndə, qucağında uşağı olan cavan bir qaraçı arvadı bizə yaxınlaşıb sədəqə istədi. Ədalət çıxarıb ona bir onluq verdi. Eh, hələ bu nədir ki, sən onu yaxından tanısan, valeh olarsan. (*Qısa pauza*) Nə üçün dinmirsən, ana?

G ö v h ə r. Mən sənə inanıram, Fəridə, başqa nə deyə bilərəm ki...

F ə r i d ə (*eyni həyəcanla*). Mən istəyirəm ki, onun necə insan olduğunu sən də mənim kimi hiss eləyəsən.

G ö v h ə r (*dərindən nəfəs alaraq*). Mən arxayınam ki, ürəyin səni aldatmır.

F ə r i d ə. Oh, nə danışırsan, ana! Onun səndən yaman xoşu gəlir. Deyir, Gövhər xanım alicənab qadındır.

G ö v h ə r. Təşəkkürlər.

F ə r i d ə (*eyni həyəcanla*). Deyir, biz evlənəndən sonra gərək Gövhər xanımı qoymayaq işləsin.

G ö v h ə r (*təəccüblə*). Nə üçün?

F ə r i d ə. Çünki, deyir, sahə həkimi olmaq ağır peşədir. İndiyə qədər işlədiyi bəsdir. Qoy bundan sonra da istirahət eləsin.

G ö v h ə r (*maraqla*). Bəs, sən nə cavab verdin?

F ə r i d ə. Onun fikrini təsdiq elədim. Doğrudan da, nə qədər işləyəcəksən? Küçələrdə nə qədər ayaq döyəcəksən? Bəzən o qədər yorulursan ki, gecə ayaqlarının ağrısından yata bilmirsən.

G ö v h ə r. Düzdür, ancaq, ayaqlarım ağrıyanda da, mən özümdə bir xoşhallıq hiss edirəm. Vicdan rahatlığı hər şeydən gözəldir, qızım! Mənim müalicə eləyib sağaltdığım körpələr indi institutlarda oxuyurlar. Məktəblərdə dərs deyirlər. Dağlarda mühəndislik edirlər. Elə ailələr vardır ki, mən iyirmi ildir gedib-gəlirəm... (*Gülümsəyir*) Bir zaman özlərini müalicə elədiyim körpələrin indi uşaqlarına baxıram. Bütün bunlardan ayrılmaq... Həmişəlik ayrılmaq...

F ə r i d ə. Sənin cəmi qırx yaşın var. Özün də, maşallah, elə qalmısan, otuzdan artıq vermək olmaz.

G ö v h ə r (*gülümsəyir*). Nə demək istəyirsən?

F ə r i d ə. Onu demək istəyirəm ki... Sən indi də ərə gedə bilərsən.

G ö v h ə r (*ciddi*). Ərə getmək istəsəydim, indiyəcən gedərdim. Nə mane olurdu?

F ə r i d ə. Mane olan şeylər var idi...

G ö v h ə r. Məsələn?

F ə r i d ə. Atamın xatirəsi... Məni istədiyin kimi böyütmək arzusu.

G ö v h ə r (*dərindən nəfəs alaraq*). Atanın xatirəsi mənim üçün çox əzizdir. Lakin öz istəkli ərindən sonra ərə getməyə hər bir qadının haqqı vardır. Hətta, mən deyərdim ki, bu, onun insanlıq borcudur. Əgər, mən sənin atandan sonra bir başqasını onun qədər istəsəydim, tərəddüd etmədən ərə gedərdim. Bu, səni bu cür böyüdüb boya-başa çatdırmağıma mane ola bilməzdi!

F ə r i d ə. Mən buna əminəm!

G ö v h ə r. Mən sənin atandan sonra heç kəsi istəyə bilmədim. Nə üçün? Bilmirəm. (*Qısa pauza*) Madam ki, istəyə bilmədim, demək, ərə də gedə bilməzdim. Çünki, mənim fikrimcə, istəksiz-məhəbbətsiz həyat gec-tez aparıb ikiüzlülüyə, saxtakarlığa, yalana çıxaracaqdır ki, dünyada bundan pis iş yoxdur. (*Kəskin*) Bu, cəhənnəmdir!

F ə r i d ə. Başa düşmürəm, ana.

G ö v h ə r. Ailədə "sən özün üçün, mən də özüm üçün" prinsipi dözülməz bir haldır. (*Həyəcanla*) O evdə ki, səmimiyyət yoxdur, orada həyat da yoxdur. Orada ata-ananın öz balalarına münasibəti də saxta-dır. Heç bilirsənmi bu nə deməkdir?

F ə r i d ə. Hiss edirəm.

G ö v h ə r (*qızğınlıqla*). İnsanda qətiyyət olmalıdır. Heç kəs bizi sürünməyə məcbur etmir. (*Telefon zəngi. Fəridə dəstəyi götürür*)

F ə r i d ə. Eşidirəm. Bu saat. (*Dəstəyi anasına uzadaraq*) Səni istəyirlər!

G ö v h ə r (*telefonla*). Bəli... Mən yazdığım dərmanları vermi-siniz? Axşamçağı, saat 6-da gələrəm. İndi? (*Qısa pauza*) Yaxşı... (*Dəstəyi yerinə qoyur*) Mən getdim.

F ə r i d ə. Heç olmasa, bir az dincələydin. İşdən indi çıxmısan.

G ö v h ə r. Anadır. Ürəyi dözmür. Xahiş edir ki, indi gəlim.

F ə r i d ə. Naharımız hazırdır.

G ö v h ə r. Yarım saata gəlirəm. (*Çıxır*)

Fəridə bir neçə saniyə onun ardınca baxır. Sonra birdən sevinc, fərəh qarışıq bir həyəcanla oturub yazır.

F ə r i d ə n i n  d a x i l i  s ə s i. Anam haqlıdır. Lakin bizim gələcək ailəmizdə hər şey gözəl olacaq. Hər şey aydın və səmimi olacaq.

Çünki biz son nəfəsimizə qədər bir-birimizi sevəcəyik. Bir-birimizə sadiq olacağıq. Anam haqlıdır. Sədaqət, səmimiyyət olmayan yerdə həyat da yoxdur. Məgər, dünyanın bütün ağıllı adamları bu nəticəyə gəlməyiblərmi?

Birdən lap yaxınlıqda mahnı eşidilir.

Q ə n i m ə t və S a v a l a n (*oxuyurlar*).

Pəncərədən daş gəlir,
Ay bəri bax, bəri bax.
Xumar gözdən yaş gəlir,
Ay bəri bax, bəri bax.

Səni mənə versələr,
Ay bəri bax, bəri bax.
Hər görənə xoş gələr,
Ay bəri bax, bəri bax.

Fəridə qalxıb pəncərəni açır. Qənimətlə Savalan bayırda görünürlər.

F ə r i d ə (*zarafatla*). Buyuracaqlar içəri.
Q ə n i m ə t. Kim var?
F ə r i d ə. Birinci dəfədir gəlirsiniz?
S a v a l a n. Demək istəyirik ki, təzə nişanlın sizdədir, ya yox?
F ə r i d ə. Çox sağ olun. Məgər, mənim köhnə nişanlım da var idi?
Q ə n i m ə t. Əlbəttə!
F ə r i d ə (*eyni zarafatla*). Kim idi o xoşbəxt qəhrəman?

Qənimət əlini döşünə qoyur. Fəridə qəhqəhə ilə gülür. Qənimətlə Savalan gəlirlər. İkisi də təxminən Fəridə ilə yaşıddır. İkisi də yaraşıqlı və üzügülər oğlandır. İkisi də son dəblə geyinmişdir. Hərəsinin qoltuğunda bir şey var.

S a v a l a n. Nə cür oxuyuruq?
F ə r i d ə. İndi sizin mahnınızı eşidəndə ürəyim birtəhər oldu.
Q ə n i m ə t. Nə cür, yəni, birtəhər?
F ə r i d ə. Elə bil, tələbəlik həyatımızdan yüz il imiş ki, ayrı düşmüşəm.
S a v a l a n. Yəni, daxil olduğun təzə aləm səni bizdən bu qədər uzaqlaşdırıb?
Q ə n i m ə t (*dərdli-dərdli*). Dünyanın işi belədir, dostum Savalan.
S a v a l a n (*eyni zarafatla*). Qəm çəkmə, dostum Qənimət.

Q ə n i m ə t (*eyni zarafatla*). Elə isə, hədiyyəni aç.

F ə r i d ə. Nə hədiyyə?

S a v a l a n. Bəs birigün toyunuz deyil?

Q ə n i m ə t. Biz orda iştirak eləyə bilməyəcəyik, ona görə, səni bu gün təbrik etmək istədik.

F ə r i d ə. Nə üçün iştirak etmirsiniz?

S a v a l a n. Atalar deyib, çağırılan yerə ar eləmə, çağırılmayan yeri dar eləmə.

F ə r i d ə. Mən özüm sizi dəvət edirəm!

Q ə n i m ə t. Təşəkkür.

S a v a l a n. Gecdir. Nişanlın bizi tanımır. Özü də böyük vəzifədə.

F ə r i d ə. Nə olsun...

Q ə n i m ə t. Dostum Savalan, hədiyyəni aç! (*Savalan açır*) Bu, Savalan dağının şəklidir. Dostum Savalan bunun üstündə düz altı ay işləyib.

F ə r i d ə (*həqiqətən heyran olaraq*). Ah, nə gözəldir.

Q ə n i m ə t. Məğrurdur, əzəmətlidir.

F ə r i d ə. Nə qədər dərin hisslə çəkilmişdir.

Q ə n i m ə t. Çünki rəssam ürəyini o dağlarda qoyub gəlib.

F ə r i d ə (*mütəəssir bir mehribanlıqla Savalana*). Təşəkkür edirəm. Mən bunu öz otağımdan asıb, hər gün tamaşa eləyəcəyəm.

S a v a l a n (*qızın sözündən mütəəssir olur*). Bunu düşünmək bizim üçün böyük təsəllidir.

Q ə n i m ə t (*kağıza bükülü bir şey çıxarıb verir*). Bu da Qənimətin hədiyyəsidir.

F ə r i d ə. Oy!.. Nə qəşəng köynəkdir!

Q ə n i m ə t. Təmiz dəvə yunundandır. Bacım toxuyub...

F ə r i d ə. Nə zəhmət çəkirdi?..

Q ə n i m ə t. Yaxşı, yaxşı. Özün həmişə dəvə yunundan köynək arzulayırdın.

F ə r i d ə. Bacına yazarsan ki, Fəridə deyir, çox sağ olsun! Bəs bu?

Q ə n i m ə t. Bu da, bir-birimizə rast gəldiyimiz vaxtdan ta bu günə qədər mənim yazdığım gündəliklərdir.

F ə r i d ə. Bunu mənə nə üçün verirsən? Gerisini yazmayacaqsan!

Q ə n i m ə t. Yox!

F ə r i d ə. Nə üçün?

Q ə n i m ə t. Çünki bu səhər o günlərə nöqtə qoyuldu. Ancaq səndən bir xahişim var: bu zərfi ilk uşağın olandan sonra açarsan?

F ə r i d ə. Niyə?

Q ə n i m ə t. Mən belə istəyirəm. Söz verirsən?

F ə r i d ə. Söz verirəm... Ancaq bu nə deməkdir?

Q ə n i m ə t. Bu o deməkdir ki, mənim ürəyimi də sən özünlə aparırsan.

F ə r i d ə (*gözləri yaşarır*). Mən ölüm, belə zarafatları burax, Qənimət.

S a v a l a n (*Qənimətə*). Sən də! Niyə qızın ürəyini kövrəltdin?

Q ə n i m ə t (*eyni zarafatla*). Eybi yoxdur. Bu göz yaşları sonra mirvari olub Fəridənin gəlinlik tacına düzüləcək!..

F ə r i d ə. Qənimət! Sən gələcəkdə öz vəziyyətini düzəldib evlənmək istəyəndə heç bir qız sənə "yox" deməyəcək. Qızlar səni mənsiz görəndə arı kimi üstünə elə töküləcəklər ki, heç bilməyəcəksən Fəridə harada qaldı.

Q ə n i m ə t (*zarafatyana pafosla*). Biz əsəblərimizi dəmir kimi möhkəmləndirmək üçün şüşə qırıntıları üzərində ayaqyalın gəzirik.

S a v a l a n. Əlimizi bıçaq kəsəndə yerinə duz basırıq!

Q ə n i m ə t. Məhəbbət ürəyimizi parçalayanda yeməyə güc veririk.

S a v a l a n. Çünki bizə enerji lazımdır. Qüvvət lazımdır!

Q ə n i m ə t. Yollar çətin, mənzil isə uzaqdır. (*Oxuyur. Savalan da ona qoşulur*)

Mənzil uzaq, yollar çətin, ömür qısadır,
Mərdlik bizə babalardan yadigardır...
Cavan qartal qanad çalır dağ başında...
İgid qorxmaz uçurumdan, fırtınadan, borandan.
Sevgilisi dözməz çətin yollara,
Lakin oğlan ona deməz vəfasız...
Çünki sevgilimiz ürəyimizin bir parçasıdır;
Lakin vətən əcdadımızın yadigarıdır.
Bizə ömür vətən üçün lazımdır,
Bizə ömür gələcək üçün lazımdır...

F ə r i d ə. Sizə qulaq asıram, ürəyimdə bir qəriblik, bir qüssə hiss edirəm. Elə bil ki, mən də Savalan kimi doğulduğum dağlardan ayrı düşmüşəm... Belə anlarda mən yanımda, lap qulağımın dibində qüvvətli bir insan nəfəsi duymaq istəyirəm.

Q ə n i m ə t. Əgər, sənin indi getdiyin oğlan belə qüvvətli bir insandırsa, mən sizin evlənməyinizi təbrik eləyə bilərəm.

F ə r i d ə. Sən istehza eləyirsən?

Q ə n i m ə t (*sərt*). Yox!

F ə r i d ə (onun əlindən tutaraq). Mənim əzizim...

Q ə n i m ə t (*zarafatyana*). Xahiş edirəm mənə toxunmayasan...

F ə r i d ə. Nə üçün?

Q ə n i m ə t. Bəlkə ərin qısqancdır...

S a v a l a n. Düz deyir də, bəlkə ərin qısqancdır.

F ə r i d ə. Çox sağ ol, bu "ər" nə sözdür?

Q ə n i m ə t. Yaxşı, həyat yoldaşın.

F ə r i d ə. Oy, bu "həyat yoldaşı" sözündən də lap acığım gəlir.

Q ə n i m ə t. Bəs, onda nə deyək?

F ə r i d ə. Bilmirəm. Savalan, sən də məni məzəmmət eləyirsən?

S a v a l a n. Yox, mən sənin Qənimətdən ayrılmağını alqışlayıram.

Q ə n i m ə t. Hətta, alqışlayırsan?

S a v a l a n. Bəli!

F ə r i d ə. Nə üçün?

S a v a l a n. Çünki Qənimətə sənin kimi rəfiqə lazım deyil.

F ə r i d ə (*təəccüblə*). Nəyə görə?

S a v a l a n. Ona görə ki, sən də hər gün gördüyümüz bahalı şubalardan geymək istəyən adi qızlardan birisən.

F ə r i d ə (*bərk sarsılaraq*). Tutalım ki, elədir, kim yaxşı yaşamaq istəmir?

S a v a l a n. Hamı yaxşı yaşamaq istəyir, bu, hər bir insanın arzusudur.

F ə r i d ə. Bəs, onda nə demək istəyirsən?

S a v a l a n (*zarafatla*). Onu demək istəyirəm ki, əgər, bütün qızlar sənin kimi düşünsəydi, biz arvadsız qalardıq. Qənimətə elə qız lazımdır ki, onunla birlikdə hər cəfaya dözməyi bacarsın.

F ə r i d ə. Əgər, mən... o oğlanı, Ədaləti sevirəmsə...

S a v a l a n. Sən eyni sözləri Qənimət haqqında da deyirdin.

F ə r i d ə. Lakin o sevgi bizim həyatda ilk görüşümüz idi. İndi mənə elə gəlir ki, Qəniməti həmişə səmimi bir dost, bir qardaş kimi istəmişəm.

S a v a l a n (*yarızarafatla*). Əlbəttə, indi sənə elə gələr...

F ə r i d ə (*həyəcanla*). Biz üçümüz də bir yaşdayıq, Savalan! Üçümüzün də ağzından süd iyi gəlir. Bizi, yenicə atıldığımız bu həyat-

da nə gözlədiyindən xəbərimiz yoxdur! Mən uşaq vaxtı, demək olar ki, yalqız böyümüşəm. Anam gecə-gündüz öz xəstələri ilə məşğul olardı... Onların həyatından mənə dəhşətli şeylər danışardı. Mən daima özümdə, nə isə, anlaşılmaz bir qorxu hiss eləyərdim. Ona görə də, meylimi gəncliyimizin ilk günlərində rast gəldiyim Qənimətə saldım.

S a v a l a n. Çünki Qənimət qızıl kimi bir oğlan idi.

F ə r i d ə. Doğrudur. Lakin illər keçdikcə, hiss eləməyə başladım ki, o da mənim kimi yalqızdır, köməksizdir.

S a v a l a n (*gülümsəyir*). Demək, ona görə də, indi sən məhz "mühüm cənaba" ərə gedirsən...

F ə r i d ə (*inciyir*). Xahiş edirəm, onun haqqında belə danışmayasan.

S a v a l a n (*eyni təbəssümlə*). Bağışla...

F ə r i d ə. O, həyatda ayağını yerə möhkəm dirəmiş güclü və eyni zamanda, çox yaxşı bir adamdır. O, sizə də lazım olan adamdır.

S a v a l a n. Yox, o barədə bizi məzur qılacaqsan.

F ə r i d ə. Mən səni başa düşürəm, Savalan. Əgər, o, bizim həmişə nifrət elədiyimiz nadan bir karyerist olsaydı, mən elə söz deməzdim.

S a v a l a n. Biz sənin ərini tanımırıq. Özümüz də zəhmətkeş babayıq. Zənn edirəm ki, bizim arxamızda dayanacaq adama ehtiyacımız olmayacaq.

F ə r i d ə (*dərindən nəfəs alaraq, dalğın halda*). Heyf ki, mən öz hisslərimi sizə izah eləyə bilmirəm.

S a v a l a n. Eybi yoxdur. Həyat özü izah eləyər. (*Bərk mütaliəyə dalmış Qənimətə yaxınlaşaraq əlini onun oxuduğu qəzetə çırpır*) Daha bəsdir, dur.

Q ə n i m ə t (*qəzeti stolun üstünə ataraq qalxır*). Zəhmətə! İstehsalata!

S a v a l a n. Sən istehsalata, bəs, mən hara?

Q ə n i m ə t. Sən də öz daxili aləminə. Xəyallarının qanad çaldığı dünyalara.

S a v a l a n. Tənqidçi Qorxmazov mənim daxili aləmimə, özü demişkən, elə bir əmudi zərbə endirib ki, daş üstündə daş qalmayıb. Xəyallarımı da şil-küt eləyib, yıxıb bir tərəfə. Özümə də məsləhət verib ki, əgər, həqiqi rəssam olmaq istəyirəmsə, gedim fermada çoban Rəşidin bir qoyundan iki quzu almağının, bənna Mədədin evləri vax-

tından tez hörüb qurtarmağının sirlərini öyrənib əsərlərimdə əks etdirim.

Q ə n i m ə t. Bax, belə... Afərin Qorxmazov. (*Fəridəyə zarafatla*) Mənim vəfasız Fəridəm nə üçün belə dalğındır?

F ə r i d ə (*incik*). Mən ölüm bəsdir, Qənimət.

Anjel daxil olur. Bu, Fəridə yaşında boylu-buxunlu gözəl bir qızdır. Üzünün ifadəsi onu görüb-götürmüş, gənc kübar qadınlara bənzədir. Son dəblə və çox səliqəli geyinmişdir. Hərəkətləri sərbəst və ağayanadır.

F ə r i d ə (*onu qucaqlayır*) Sən də buralara gəlib çıxarmışsan... (*Savalana*) Tanış olun, mənim uşaqlıq rəfiqəm Anjel xanım. Orta məktəbin səkkizinci sinfinə qədər bir yerdə oxumuşuq.

S a v a l a n (*Anjellə əl tutuşaraq*). Savalan!

Q ə n i m ə t (*Anjellə əl tutuşaraq*). Qənimət!

A n j e l (*Qənimətin əlini buraxmayaraq, zarafatla Fəridəyə*). Yoxsa, bu, Rembrandtın əsərində qartalın oğurlayıb apardığı Qənimətdir?

Q ə n i m ə t. Özüdür ki, var.

A n j e l. Bəs, niyə, qayıtdınız?

Q ə n i m ə t (*eyni zarafatla*). Qartal məni dilə tutmuşdu ki, cənnətə aparır... Baxdım gördüm yalandır, hər tərəf cəhənnəm kimi zəbanə çəkən göysüz-göyərtisiz bir səhradır. Ona görə də, fürsət tapıb əkildim.

A n j e l. Afərin! Qaçıb qurtarmaq da igidlikdəndir. (*Fəridəyə*) Sən nə qədər gözəlləşmisən, nə qədər qəşəng, gümrah görünürsən, Fira...

F ə r i d ə. Mənə Fira demə, Anjel. (*Zarafatyana*) Dostlarımın onda acığı tutur.

A n j e l (*oğlanlara yuxarıdan-aşağı saymazyana bir nəzər salaraq*). Doğrudanmı?.. Eşitdim sabah yox, birigün sənin toyundur? (*Fəridə başı ilə təsdiq edir*) Jenix bu cənabların hansıdır?

F ə r i d ə. Heç biri. (*Yavaş səslə*) Bəlkə indi bura gəldi, görərsən. Sən xaricdən nə zaman qayıtmısan?

A n j e l. Dörd aydır.

F ə r i d ə. Gör neçə aydır səndən məktub almıram. Xaricdə çox qaldın?

A n j e l. İki il yarım.

S a v a l a n. Anjel xanım xaricə nə üçün getmişdi?

A n j e l. Atalığım səfarətxanada işləyirdi.

S a v a l a n (*qəribə bir sevinclə*). Doğrudan? Atalığınızın famili nədir?

A n j e l. Rabinoviç.

S a v a l a n. Bıyy...

A n j e l. Nə var?

S a v a l a n. Heç... Bəs, siz azərbaycanlı deyilsiniz?

A n j e l (*gülümsəyir*). Bu çox staramodnı sual oldu. Doğrusu, mən özüm də bilmirəm hansı millətdənəm.

S a v a l a n. Yenə də...

A n j e l (*zarafatla*). Ox... gözəl oğlanları həmişə belə üzlü gördüm. Mənim atam azərbaycanlı, anam isə polyakdır, atamın vəfatından sonra anam yəhudiyə ərə gedib...

S a v a l a n. Deməli, bir növ, internasional...

A n j e l. Aha... Tapdınız... Fəridə, sən heç demədin quşu qanadından tutan bu oğlanlar kimdirlər, nəçidirlər?

F ə r i d ə (*barmağı ilə göstərərək*). Qənimət institut yoldaşımdır.

A n j e l (*mənalı təbəssümlə*). Hə... Sən gərək ki, bunun haqqında mənə yazmışdın.

F ə r i d ə. Savalan da Qənimətin yaxın yoldaşıdır... Mənim də dostumdur. Eyni zamanda, çox istedadlı bir rəssamdır.

A n j e l (*birdən canlanaraq şıltaq bir qız ədası ilə*). Savalan! Mən azərbaycanlılar arasında belə bir ada rast gəlməmişəm.

S a v a l a n. Savalan Cənubi Azərbaycanda hər yerdən görünən uca bir dağdır. Mən də o dağın ətəklərində dünyaya gəldiyim üçün qoca nənəm adımı Savalan qoyub.

A n j e l. Başa düşdüm. Deməli, siz, İran demokratlarındansınız. (*Gözlənilməyən bir mehribanlıq və səmimiyyətlə*) Mən Fransa qəzetlərinin birində sizin haqqınızda oxumuşam. Azərbaycana gəlmiş bir jurnalist sizi tərifləyib yazmışdı ki...

S a v a l a n. Xahiş edirəm ki, bunu bir də heç yerdə danışmayasınız.

A n j e l (*təəccüblə*). Nə üçün?

S a v a l a n. Çünki həmin jurnalistin hansı sinifdən olduğu mənə məlum deyil.

A n j e l. Bunun nə dəxli var?

S a v a l a n. Necə nə dəxli var? Birdən oldu burjua jurnalisti... Ondan sonra gəl Qorxmazova cavab ver. (*Qənimətlə Fəridə bərkdən gülürlər*)

A n j e l. Qorxmazov kimdir?

S a v a l a n. Şünas... sənətşünas... Hay-küy salacaq ki, bunun əsərlərinin burjua jurnalistinə xoş gəlməsi təsadüfi deyil...

A n j e l. Siz də elə idiotun sözünə əhəmiyyət verirsiniz?

S a v a l a n. Əhəmiyyət verənlər tapılır.

A n j e l. Mən elə bilirdim ki, siz cəsarətli oğlansınız.

S a v a l a n. Siz yanılmamısınız, mən, doğrudan da, cəsarətli oğlanam. Ancaq neyləyəsən ki, Qorxmazov dünyada heç bir həqarəti vecinə alan deyil. Bu üzünə şillə çəksən, o biri üzünü çevirəcək.

A n j e l. O... belə adamlardan, doğrudan da, çəkinmək lazımdır. Yaxşı, bəs, siz həqiqi ürək sözlərinizi öz rəsmlərinizdə necə ifadə edirsiniz?

S a v a l a n. Birtəhər basırığa salıb, şünasın gözündən yayındırırıq. (*Gülüşürlər*) Qorxmazovun beyninin girinti-çıxıntıları siz deyən qədər də incə deyil.

A n j e l. Siz mənim xoşuma gəlməyə başlayırsınız...

S a v a l a n. Mən buna çox şadam.

A n j e l. İstehza edirsiniz?

S a v a l a n. Sizin kimi qadının xoşuna gəlmək xoşbəxtlikdir.

A n j e l. Siz mənim rəsmimi çəkərsiniz?

S a v a l a n. O barədə fikirləşərik.

A n j e l. Ah, fikirləşərsiniz...

Maşın səsi eşidilir.

F ə r i d ə (*sevinc içində*). Ədalətdir!

A n j e l. Kim? (*Pəncərəyə yaxınlaşır*)

F ə r i d ə (*Anjelin qulağına*). Təzəbəy.

Maşın qapısı açılıb-örtülür. Anjel pəncərədən diqqətlə baxır. Üzü birdən-birə tutqun bir ifadə alır. Pəncərədən çəkilərək Savalana.

A n j e l. Bir siqaret verin.

Savalan siqaret qutusunu çıxarıb onun qabağına tutur. Anjel bir siqaret götürüb yandırır. Savalan siqaret qutusunu onun yanındakı stolun üstünə qoyur.

Q ə n i m ə t (*Fəridəyə*). Biz gedək...

F ə r i d ə. Siz heç yerə getməyəcəksiniz! Aydındır?! Mən sizi Ədalətlə tanış edəcəyəm.

S a v a l a n (*zarafatla Qənimətə*). Eybi yoxdur. Dayan görək bu necə Ədalətdir.

Ədalət daxil olur. Bu, otuz səkkiz yaşında, gözəl geyinmiş, yaraşıqlı bir adamdır. Hərəkətlərində nəzakətli və çox mülayimdir, üsulludur. Sanki addımını belə düşünmədən atmır.

F ə r i d ə (*onun əlindən yapışaraq*). Ədalət... Sən nə yaxşı vaxtda gəldin. Mənim dostlarımla tanış ol.

Ədalət, Anjeli gördükdə, bir an yerində donur, sonra dərhal özünü ələ alaraq gülümsəyir.

Ə d a l ə t. Məmnuniyyətlə. (*Oğlanlarla tanış olur. Anjelə yaxınlaşdıqda yenə də bir an çaşır və nə edəcəyini bilmir. Lakin Anjel onu bu çətin vəziyyətdən qurtarır*)

A n j e l (*əlini uzadaraq*). Anjel!

Ə d a l ə t (*oğlanlara*). Biz, demək olar ki, qiyabi tanışıq. Fəridə sizin haqqınızda mənə danışıb. (*Savalana*) Siz gərək ki, rəssamsınız.

S a v a l a n. Bəli, gərək ki...

Ə d a l ə t (*gülümsəyir*). Bağışlayın. Başımız işə o qədər qarışır ki, öz sənətkarlarımızı da tanıya bilmirik.

Q ə n i m ə t. Siz, onsuz da, Savalanı tanıya bilməzdiniz.

Ə d a l ə t. Nə üçün?

Q ə n i m ə t. Çünki o danqratla qaldırılmamışdır.

Ə d a l ə t (*gülümsəyir*). Başa düşürəm.

Qənimətin ifadəsindəki sərtlik Fəridəyə də, Ədalətə də təsir edir. Lakin Ədalət özünü o yerə qoymur. Anjel papiros çəkir. Pauza.

Ə d a l ə t (*Qənimətə*). Sizi hara təyin elədilər?

Q ə n i m ə t. Dəniz mədənlərinə.

Ə d a l ə t. Əgər, yerinizdən narazı olsanız, mən kömək edə bilərəm...

F ə r i d ə (*ruhla*). Qənimətə mən də demişəm.

Q ə n i m ə t (*hövsələsiz*). Təşəkkür edirəm. Mən yerimdən çox razıyam. (*Fəridəyə*) İcazənizlə biz gedək.

Ə d a l ə t. Nə üçün belə tez? Mən, məmnuniyyətlə, sizinlə söhbət etmək istərdim.

Q ə n i m ə t. İltifatınız artıq olsun.

Ə d a l ə t. Deyim şoferə sizi aparsın.

S a v a l a n. Təşəkkür edirik. Ayaqla gedərik. Ayaqla getmək yaxşıdır. Pis öyrənərik.

Q ə n i m ə t. Hələlik.

S a v a l a n. Hələlik, Anjel xanım, ümid edirəm ki, təsadüf bizi bir də görüşdürər.

F ə r i d ə (*incimiş halda*). Gedək sizi ötürüm.

Q ə n i m ə t. Zəhmət çəkmə.

F ə r i d ə (*sərt*). Yaxşı... yaxşı...

Artırmaya çıxırlar. Ədalət, Anjelə yaxınlaşaraq, nə isə demək istəyir, lakin Anjel özünü o yerə qoymayaraq, Savalanın siqaret qutusunu götürüb artırmaya yüyürür.

A n j e l (*Savalana*). Siqaretiniz yadınızdan çıxıb. (*Qutunu ona uzadır*)

S a v a l a n. Yadımdan çıxmayıb. Sizin üçün qoymuşam. Mən indi alaram.

A n j e l. Sağ olun. Siz telefonunuzu mənə vermək istəmirsiniz?

S a v a l a n. Məmnuniyyətlə verərdim. Ancaq təəssüf ki, telefonum yoxdur.

A n j e l. Necə, sizin kimi məşhur rəssamın telefonu yoxdur?

S a v a l a n. Eh, Anjel xanım, məşhur olsaydım, Ədalət yoldaş məni tanıyardı.

A n j e l (*Ədalətin qarasına, acıqla*). Onsuz da keçinmək olar. Sizi bütün aləm tanıyır.

S a v a l a n (*eyni zarafatla*). Yox, Anjel xanım, əgər, yaxşı mənzil, emalatxana, telefon istəyirəmsə, gərək məni Ədalət tanısın. Aləm tanımasa da olar.

F ə r i d ə (*çox incik*). Siz nə üçün Ədaləti belə sancırsınız? Gördünüzmü, o sizə qarşı özünü necə sadə aparırdı.

S a v a l a n (*eyni zarafat və istehza ilə*). Bunun üçün bizim dərin minnətdarlığımızı ona çatdırarsan.

F ə r i d ə (*əsəbiləşərək*). Onun buna ehtiyacı yoxdur.

S a v a l a n. Doğrudan da.

Q ə n i m ə t. Sən nə üçün onun bura gələcəyini bizə demirdin?

F ə r i d ə. Mən istəyirdim ki, o, sənin necə adam olduğunu görüb, hiss eləsin. Amma sən ona buynuz göstərdin.

Q ə n i m ə t. Narahat olma, Fəridə...

F ə r i d ə (*olduqca incik və məyus bir halda*). Daha bu sözdən sonra sənə nə deyim?

S a v a l a n. Gedin içəri. Təzəbəy təkdir. Adye, Anjel xanım!

A n j e l. Adye!

Qənimətlə Savalan gedirlər. Fəridə onların ardınca uzun bir nəzər salır. Sonra Anjellə içəri keçirlər. Ədalət ayaq üstə dayanıb qəzetə baxır. Hiss olunur ki, həyəcanlıdır.

F ə r i d ə (*hələ də fikirli*). Siz söhbət eləyin, mən də kofe dəmləyim.

Mətbəxə gedir. Ədalət və Anjel. Ağır pauza.

Ə d a l ə t. Sən nə vaxt gəlmisən?

A n j e l. Dünən. (*Qısa pauza*) Nə üçün sən mənimlə tanış olduğunu gizlətdin?

Ə d a l ə t (*ona yaxınlaşır*). Anjel, gəl elə bilək ki, biz, doğrudan da, yeni tanış oluruq.

A n j e l (*ona uzun bir nəzər salaraq*). Onsuz da, bizim münasibətimizdən sənin həyatında heç nə qalmamışdır.

Ə d a l ə t. Mən evlənirəm, Anjel!

A n j e l. Bilirəm. (*Qısa pauza. Anjel siqaret çəkir*)

Ə d a l ə t. Eşitdim ki, sən də altmış dörd yaşlı bir professorla yaşayırsan.

A n j e l. Yaşayırdım!

Ə d a l ə t. Bəs nə oldu?

A n j e l. Öldü.

Ə d a l ə t. Deməк, bu qara paltar ona görədir?

A n j e l. Xeyr. Ona görə deyil. Bu, mənə yaraşdığı üçün geymişəm. (*Kinli-kinli*) Professordan sonra mən ondan qırx yaş kiçik bir oğlanla yaşamışam.

Ə d a l ə t (*acığını büruzə verməməyə çalışaraq*). Aydındır.

A n j e l. Yox, bu hələ hamısı deyil.

Ə d a l ə t (*daha qəzəbini saxlaya bilməyərək*). Kifayətdir! Mən sənin həyatın haqqında haqq-hesab soruşmuram.

A n j e l (*bərkdən gülərək*). Yoxsa yandırır?

Ə d a l ə t. Sənin gündə bir kişiylə olmağın nə üçün məni yandırmalıdır?

A n j e l (*ayağa qalxaraq, ona yaxınlaşır. Dərin kin və istehza ilə*). Çünki mən sənin oğlunun anasıyam.

Ə d a l ə t (*qorxmuş halda*). Bir az yavaş danış, Anjel!

A n j e l (*qəhqəhə ilə gülərək*). Qorxursan nişanlın eşitsin? Demək, sən ondan gizləmisən?!

Ə d a l ə t (*yalvarışla*). Anjel... rica edirəm...

A n j e l. Sən? Rica? Dünyanın nə qəribə işləri olurmuş. Yox, Fəridə hər şeyi bilməlidir. Sonra nə nəticə çıxarır-çıxartsın, bu, onun öz işidir.

Ə d a l ə t. Yəqin sən, zarafat eləyirsən, Anjel?

A n j e l. Qətiyyən! (*Qüssə ilə*) Fəridə mənim günahsız vaxtlarımın yoldaşıdır. Mən onun da özüm kimi aldanmasına razı ola bilmərəm.

Ə d a l ə t. Sən onun həyatını tar-mar eləyə bilərsən. O, məni sevir.

A n j e l. Mən indi təsəvvür eləyə bilmirəm ki, səni necə sevmək olar?

Ə d a l ə t (*izzəti-nəfsi yaralanır. Lakin gülümsəyərək, mümkün qədər yumşaq cavab verir*). Anjel, insafın olsun, Moskvadan mənə gündə on dəfə zəng eləyən sən deyildinmi?

A n j e l (*birdən ürəyindən vurulmuş quş kimi boynu bükülür. Dərin bir kədər və nədamət içində)*. Mən idim...

Fəridə dolu məcməyi ilə gəlir.

F ə r i d ə (*bu tutqun səhnədən sonra gənc çöhrəsi indi daha sevincli və daha işıqlı görünür*). Mən hələ mağazaya qaçıb, təzə tort da almışam. (*Qəhvə dolu fincanları və tortu stolun üstünə qoyur*) Anjel, darıxmadın ki?

A n j e l. Heç belə çuvaklarla da darıxarlarmı?

F ə r i d ə (*qəhqəhə ilə gülərək*). Düz sözə nə demək olar? Rica edirəm, yaxın əyləşin.

A n j e l (*süfrəyə baxaraq*). Bəs konyak?

F ə r i d ə. Doğrudan?

A n j e l. Əlbəttə.

F ə r i d ə. Bizdə içən olmadığı üçün evdə saxlamırıq. Bu saat gedim alım.

Ə d a l ə t (*Fəridəyə*). Dayan, şofer gedər. (*Pəncərəyə yaxınlaşmaq istəyir*)

A n j e l (*Ədalətə*). Lazım deyil, daha içəsi olmadım.

F ə r i d ə. Nə üçün?

A n j e l. Sən içmədiyin üçün həvəsim qaçdı.

F ə r i d ə. Nə olsun? Ədalətlə içərsiniz.

A n j e l. Başqasının adamı ilə içməyə marağım yoxdur. Öz çuvakım olsaydı, ayrı məsələ. (*Fəridə bərkdən gülür. Anjel qəhvəsini içərək qalxır*) Mən getdim.

F ə r i d ə. Anjel, hara tələsirsən? Biz heç bir doyunca danışmadıq da...

A n j e l. Eybi yoxdur, ay var, gün var...

F ə r i d ə. Demək, sən hələ buradasan? (*Anjel başı ilə təsdiq edir*) Yəqin ki, toyda olacaqsan.

A n j e l. Mütləq. Sizin kimi xoşbəxt çiftin toyunda iştirak etmək özü də bir səadətdir. (*Fəridəni öpür, Ədalətə*) Zənn edirəm ki, sizi öpməmək də olar. Hələlik. (*Çıxır*)

F ə r i d ə. Uşaqlıqdan belə ürəyiaçıqdır. Zarafatla həmişə ona deyərdim ki, "qorxuram bu ürəyiaçıqlığının ucundan bir gün tora düşəsən". Doğrudan da düşdü. Biz instituta girən il eşitdim ki, bir oğlana vurulub. O da yazıq qızı bədbəxt eləyəndən sonra yoxa çıxıb. Bu, çox dəhşətli bir vicdansızlıqdır, elə deyilmi?

Ə d a l ə t. Kim bilir, əhvalat necə olmuşdur? Yəqin ki, oğlan qızı məcbur eləməyib.

F ə r i d ə (*dərindən nəfəs alaraq*). Yəqin ki... Ancaq nə deyirsən, de, mən oğlanı təqsirkar hesab eləyirəm. Qız ona inanıb. Etibar eləyib.

Ə d a l ə t. Əksərən qız üçün belə təmizəçıxarma hallarını adamlar özləri uydururlar. Bəlkə qız özü o dəqiqələrdə heç bir etibar-filan haqqında düşünmürmüş...

F ə r i d ə. Demək istəyirsən ki, qız özü də eyni dərəcədə təqsirkardır?

Ə d a l ə t. Bəlkə də, artıq.

F ə r i d ə (*başını onun sinəsinə söykəyərək*). Kaş dünyada heç bir yalan, heç bir saxtakarlıq olmayaydı... Romanlarda oxuyursan, dəhşətə gəlirsən. (*Nişanlısına daha bərk qısılaraq*) Bizim bir-birimizin qarşısında həmişə alnımız açıq olacaq... Mən indiyə qədər neyləmişəmsə, hamısını sənə danışmışam, zənn edirəm ki, sənin də həyatında məndən gizlin heç nə yoxdur...

Ə d a l ə t (*yavaş səslə*). Elədir.

F ə r i d ə (*onun çətinliklə cavab verdiyini hiss edərək, gülümsəyir*). Sən nə qədər də olsa, kişisən... (*Zarafatyana*) Bəlkə də, bəzi şeylər olub, eybi yoxdur... Günahından keçmək olar.

Ə d a l ə t (*onu bərk-bərk öpür*). Sən nə qədər yaxşı qızsan, Fəridə!

F ə r i d ə. Bəs sən?! (*Öpür*) O günü bir kitabda oxuyurdum ki, indiki gənclər vəfa, sədaqət, əbədi məhəbbət kimi sözlərə dəbdən düşmüş bir şey tək baxırlar. Yalandır. Sən mənim üçün əbədi sevgisən, sədaqətsən, vəfasan. Biz bir-birimizi ölənəcən istəyəcəyik. Elə deyilmi?

Ə d a l ə t. Elədir.

İşıq sönür. Yananda vağzal. Gövhər və yol paltarında olan Fəridə. Ədalət tələsik onlara yaxınlaşır.

Ə d a l ə t (*Fəridəyə*). Hər şey öz qaydasındadır... Danışdım, kupedə ancaq ikimiz olacağıq. Gövhər xanım, salamat qalın...

G ö v h ə r. Gedin, yaxşı istirahət edin. Toy səyahəti insanın həyatında bir dəfə olur.

F ə r i d ə. Hara çatsaq, sənə teleqram, məktub göndərəcəyik.

G ö v h ə r (*mütəəssir*). Mən gələcəkdə sənin alnına kölgə salacaq heç bir hərəkətə yol verməmişəm. Heç bir yaman iş tutmamışam, qızım. Mən həmişə, hər dəqiqə sənin xoşbəxt olmağını arzu eləmişəm. Qoy həyat sənə yar olsun. (*Fəridəni öpür. İşıq azalır. Qatar yola düşür. Gövhər pıçıltı ilə*) Ananın əvəzindən də xoşbəxt ol, qızım!

Gövhər ağır addımlarla yerindən tərpənir. Sonra həyəcanla yüyürüb gələn Qəniməti görürük. O gecikmişdir. Qatar artıq uzaqlaşmaqdadır.

Q ə n i m ə t. Bizim aramızda hər şey bitdi-getdi, Fəridə... Kim bilir, bir də bir-birimizə rast gələcəyikmi... Əlvida, mənim gözəl arzularımın, gözəl xəyallarımın yoldaşı. Sən dünyalara dəyən bir qız idin... Mən bütün əzabların, bütün iztirabların, bütün çəkişmələrin fövqündə dayanmış həqiqi insan hisslərinin nə demək olduğunu səninlə duydum. Sən, əyninə geyməyə bir yönlü kostyum tapmayan kimsəsiz tələbənin ürəyini şahların tacından yüksəyə qaldırdın. Öz insanlıq ləyaqətimi mənə hiss etdirdin. Buna görə də, mən bütün ömrüm boyu sənə minnətdar olacağam. Hər gün, hər saat səni xatırlayacağam. Sağ ol, Fəridəcan. Qoy bu izdivac sənə yeni xoşbəxtlik gətirsin!

İ ş ı q s ö n ü r

## İKİNCİ PƏRDƏ

Müasir ruhda və çox zəngin bir qonaq otağı.
Fəridə oturub gündəlik yazır.

F ə r i d ə n i n  d a x i l i  s ə s i. Artıq neçə vaxtdır ki, mən gəlinəm. Sevincim yerə-göyə sığmır. Xoşbəxtlik necə gözəlmiş! Əvvəllər mən həqiqi səadətin nə demək olduğunu bilmirəmmiş. (*Anjel gəlir*) Anjel! (*Qucaqlaşırlar*) Nə yaxşı gəldin, Anjel!

A n j e l. Ərə getmək sənə düşüb. O qədər qəşəngləşmisən ki...

F ə r i d ə. Ədalət də elə deyir.

Anjel divardakı xalının qarşısında ayaq saxlayaraq tamaşa edir.

A n j e l. Mən eyni ilə buna bənzər bir xalını da Parisdə, bir diplomatın evində görmüşəm.

F ə r i d ə. Bunu toyumuzda Ədalətin işçilərindən biri bizə bağışlayıb.

A n j e l. Görünür, yaxşı dostdur. Bu xalının, azı, dörd min qiyməti var.

F ə r i d ə (*təəccüblə*). Təzə pulla?

A n j e l (*gülümsəyir*). Əlbəttə, nə üçün təəccüb eləyirsən?

F ə r i d ə. Bu qədər də qiymətli hədiyyə olar?

A n j e l (*eyni təbəssümlə*). İndi ki, olub.

F ə r i d ə. Görünür, çox varlı adamdır. (*Barmağındakı üzüyü göstərir*) Bunu da Ədalətin Kamil adlı başqa bir dostu gətirib. Ədalət deyir ki, xalis brilyantdır.

A n j e l (*üzüyü nəzərdən keçirərək*). Kamili tanıyıram, dələduzun, lotunun biridir. (*Fəridə inciyir*) Nə üçün inciyirsən?

F ə r i d ə. Çünki Ədalətin elə dostu olmaz!

A n j e l (*eyni təbəssümlə*). Bəlkə o, mənim tanıdığım Kamil deyil.

F ə r i d ə. Əlbəttə, o deyil. (*Kefi kökəlir*) Gözəl üzükdür, eləmi?

A n j e l (*eyni təbəssümlə*). Gözəldir. Bunun bir tayı Moskvada yeddi minə idi.

F ə r i d ə. Təzə pulla?

A n j e l. Bəli, təzə pulla...

Qısa pauza. Fəridə hələ də heyrətlə ona baxır.

F ə r i d ə (*öz-özü ilə danışırmış kimi*). Anjel, anam qırx-əlli manatlıq toy hədiyyəsi alanda elə bilirdim ki, bizdən bahalı hədiyyə aparan yoxdur... Görünür, onlar çox böyük maaş alırlar.

A n j e l. Güman etmirəm, hər halda, sənin anandan çox almırlar.

F ə r i d ə. Nə danışırsan? (*Qısa pauza*) Mənim anam iyirmi ildir işləyir, amma indiyə qədər artırıb mənə bir pianino ala bilmədi. Ona görə də, həmişə vicdan əzabı çəkirdi.

A n j e l (*bərkdən gülərək*). Eybi yoxdur... İndi kiçik, zərif bir pianino sənin buduarında... gözəl bir royal da qonaq otağında... nə qədər istəyirsən çal, keçən günlərin heyfini çıx.

F ə r i d ə (*bir anlaşılmazlıq içində*). Bəs nə üçün gülürsən?

A n j e l. Heç, elə-belə. Sən ki, mənim hərdən axmaq hərəkətlər elədiyimi bilirsən.

F ə r i d ə (*bir şeydən qorxurmuş kimi, onun əlindən tutaraq, ani bir həyəcanla*). Mən xoşbəxtəm, Anjel, elə deyil?

A n j e l (*tutqun və ciddi bir ifadə ilə*). Madam ki, sən özünü xoşbəxt hiss edirsən, demək, elədir.

F ə r i d ə (*təəccüblə*). Məgər, sən özün də mənim nə qədər xoşbəxt olduğumu hiss eləmirsən?

A n j e l (*zarafatyana*). Biz insanlarda telepatiya hələ o qədər güclü inkişaf etməmişdir. Delfinlər bir-birini bizdən tez başa düşürlər.

F ə r i d ə (*dərindən nəfəs alaraq*). Eh, Anjel, sən əvvəllər belə deyildin.

A n j e l. İndi nə cürəm ki?

F ə r i d ə. Görünür, ilk məhəbbətin uğursuzluğu səndə hər şeyə qarşı bir soyuqluq, bir inamsızlıq yaratmışdır.

A n j e l. Elə isə, qoy Allah səni elə bir uğursuzluqdan saxlasın. Qaldı ki, mən... Mən bütün əzabların, təhqirlərin, iztirabların kökü olan məhəbbətə nifrət edirəm!

F ə r i d ə (*onu qucaqlayaraq*). Anjel! Doğrudanmı, sənin üçün bir müqəddəs hiss qalmamışdır?

A n j e l. Tüpürüm müqəddəs adlanan bütün hisslərə!..

F ə r i d ə. Bəsdir, Anjel!

A n j e l. Elə bilmə ki, mən istədiyim adama aldandığım üçün bu fikrə gəlmişəm. Yox! Əgər, mənə biri xəyanət etmişdirsə, mən beşinə xəyanət etmişəm... Əgər, məni biri aldatmışdırsa, mən üçünü aldatmışam.

F ə r i d ə (*geri çəkilərək, vahimə içində*). Sən məni özündən ürküdürsən, Anjel...

A n j e l (*bərkdən gülərək*). Yazıq Fəridə... Sən məndən ürksən, gərək yaşamayasan!

F ə r i d ə. Nə üçün?

A n j e l. Çünki mən əsl həyatın özüyəm!

F ə r i d ə (*qışqırır*). Yalandır, dediklərin əsl həyata böhtandır!..

A n j e l. Əgər, mən sübut eləsəm?

F ə r i d ə. Nə ilə?

A n j e l. Faktlarla! Görüb-tanıdığın canlı insanlarla...

F ə r i d ə (*qorxmuş halda*). Mənim görüb-tanıdığım insanlarla?

A n j e l. Bəli!

F ə r i d ə (*qorxmuş halda*). Sən nə dəhşətli olmusan, Anjel!

A n j e l (*bərkdən gülərək onun əlindən tutur*). Zarafat eləyirəm. Qoy sənin xəyalında yaratdığın səadət sarayı uçub dağılmasın.

F ə r i d ə. Nə üçün "xəyalımda yaratdığım?" Məgər...

A n j e l. Axı, sən həyata yenicə qədəm qoyursan. (*Zarafatyana*) Mənim kimi yüz yırtıq-deşiyə girib-çıxmamısan. (*Öz-özü ilə danışırmış kimi*) Hər şey axır... Hər şey dəyişir... Bəlkə bu, doğrudan da, belədir? Bəlkə mən səhv edirəm?

F ə r i d ə (*sevinclə*). Mən əminəm ki, sən səhv edirsən.

A n j e l (*sözü dəyişir*). Sənin dostların heç bura gəlməyəcəklər?

F ə r i d ə. Hansı dostlarım?

A n j e l. Qənimət, Savalan.

F ə r i d ə. Qənimət gəlməz. İşləyir.

A n j e l. Bəs rəssam?

F ə r i d ə. O gərək gəlsin. Mənim şəklimi çəkməyə söz verib.

A n j e l. Ondan xoşum gəlir.

F ə r i d ə. Yaxşı oğlandır.

A n j e l. Nə barədə?

F ə r i d ə. Ağıllıdır... Təmiz oğlandır.

A n j e l. Eh... Mənə onun nə ağlı lazımdır, nə də məktəb uşağı kimi təmizliyi. Denən gözəl oğlandır, öküz kimi sağlamdır...

F ə r i d ə. Mən ölüm, boşla belə zarafatları, Anjel... Sonra, doğrudan da, aramız dəyər.

A n j e l. Aramız dəyər, ərini əlindən alaram!

F ə r i d ə (*gülümsəyir*). Ay aldın ha!

A n j e l. Nə üçün sən ala bilərsən, mən yox?

F ə r i d ə. Mən kimin ərini əlindən almışam?

A n j e l. Mənim!

F ə r i d ə (*bilmir gülümsəsin, ya təəccüb eləsin*). Anjel...

A n j e l (*bərkdən gülə-gülə onu qucaqlayır*). Dedim ki, mənə fikir verm... Olub-qalan ağlımı da Fransada qoyub gəlmişəm...

F ə r i d ə (*zarafatla*). Yalan demə. Sən tülküdən çox bilirsən.

Qapı zəngi. Fəridə yüyürüb açır. Savalan gəlir. Onun əlində şəkil çəkməyə aid şeylər vardır.

S a v a l a n. Xanımlara salam!

A n j e l. Adını tut, qulağını bur.

S a v a l a n. Kimin qulağını burursunuz?

A n j e l. Sizin qulağınız çox qəşəng olduğu üçün əlim gicişir.

F ə r i d ə (*gülür*). Anjel indi sənin haqqında danışırdı.

S a v a l a n. Mən buna çox şadam. Ancaq Anjel xanım mənim haqqımda nə danışa bilər? Biz cəmi bir dəfə görüşmüşük.

A n j e l. Bir dəfə də kifayətdir. Kosmos sürəti!..

F ə r i d ə. Anjel xanım dedi ki, sən onun xoşuna gəlirsən.

S a v a l a n. Bu ki, xoşbəxtlikdir.

A n j e l. Kimin üçün?

S a v a l a n. Kim ki, sizi istəsə... (*O biri otaqda telefon zəngi. Fəridə yüyürür*)

A n j e l. Siz məni istərdiniz?

S a v a l a n. Yox.

A n j e l. Bəlkə... İstədiniz?

S a v a l a n. Ağlım kəsmir...

A n j e l. Mən gözəl deyiləm?

S a v a l a n. Yox!

A n j e l. Zarafat edirsiniz?

S a v a l a n. Yox.

A n j e l (*qətiyyən inciməyərək, maraqla*). Parisdə gözəl bir qız rolunda çəkilmək üçün mənə yüz minlər təklif edirdilər.

S a v a l a n. İnanmıram, şəkildə gözəl görünə bilərsiniz.

A n j e l. Amma əslində gözəl deyiləm?

S a v a l a n. Dedim ki, yox.

A n j e l. Bəs, siz gözəl kimə deyərdiniz?

S a v a l a n (*eyni komik şənlik və ilhamla*). Mən gözəl ona deyərdim ki, Savalan dağının harda olduğunu dərhal bilsin. Onun adını tutanda üzü günəş kimi parlasın!

A n j e l. Deyəsən, sizin bir vintiniz çatmır...

S a v a l a n. Xeyr... Sizi inandırıram ki, mənim bütün vintlərim yerindədir!

A n j e l. Bəs, onda, Savalan dağını tanıyıb-tanımamağın gözəlliyə nə dəxli var?

S a v a l a n (*eyni şairanə komik pafosla*). Ox... heç bilirsiniz necə dəxli var... Qoca rus qadını "Matuşka Volqa" deyəndə üzündə hərarətli sevinc cilvələnən kimi, Savalan deyəndə də, elə bilirdim mənim qoca nənəm Kamırxan qarının bükülmüş beli düzəlir, qırışmış alnında bir şəfəq yanır...

A n j e l. "Matuşka Volqa" Rusiyadan axır.

S a v a l a n. Bunun dəxli yoxdur.

A n j e l. Deməli, əgər, mən Savalanı tanısaydım, gözəl olardım?

S a v a l a n. Yox! Savalanı məsləksiz, vicdansız bir avantürist də tanıya bilər. Yalnız tanımaq azdır. Onu sevmək, onun əzəməti ilə fərəhlənmək, Promotey kimi zəncirə vurulmuş dağın bir gün azad olacağı ümidi ilə yaşamaq, yaratmaq!.. Məncə, hər bir azərbaycanlı üçün bundan yüksək hiss yoxdur! Kim bu hisslə yaşayırsa, o, mənim üçün əzizdir, gözəldir.

A n j e l. Sənin Savalana bağlılığın, mərhum Don Kixotun Dulsineyaya olan eşqinə bənzəyir. Ancaq Don Kixotun, heç olmazsa, arıq bir yabısı ilə paslı bir qılıncı var idi.

S a v a l a n. Eybi yoxdur... Təki arzular ölməsin!

Fəridə gəlir.

F ə r i d ə. Bağışlayın. (*Nazlanaraq*) Ədalət zəng vuranda buraxmaq istəmir ki... (*Anjelə*) Mənim bir neçə yaxşı parçam var. Deyir, Moskvadan dərzi gətirdək...

S a v a l a n (*heyrətlə*). Moskvadan dərzi gətirdəsiniz?

F ə r i d ə. Hə, razı olmadım, dedim ki, yox, lazım deyil.

A n j e l. Nə üçün qoymursan gətirtsin?

F ə r i d ə. Eh... sən... də... ayıbdır...

A n j e l. Kimdən ayıbdır?

F ə r i d ə. Camaatdan. Adama nə deyərlər... (*Gülümsəyir*) Həmişə on beş-iyirmi manata paltar tikdirən mən, indi Moskvadan dərzi gətirdim?!

A n j e l. Onda sənin Ədalət kimi ərin yox idi.

S a v a l a n (*hələ də təəccüblə*). Demək belə...

A n j e l (*qəhqəhə ilə Savalana*). Mənim patriot qəhrəmanım... Elə bilirsən ki, hamı sənin kimi lütdür! Bizdə elə kişilər var ki, onların xanımları hər gün süd vannası qəbul edirlər ki, ipək kimi yumşaq olsunlar.

S a v a l a n (*birdən canlanaraq, gülümsəyir*). Onlara kişi demirlər, Anjel, Musiq deyirlər!

A n j e l. "Musiq" nədir?

S a v a l a n (*bərkdən gülərək*). Mən Musa adlı yüz qırx kilo ağırlığında hörmətli bir şəxs tanıyırdım. Arvadı ona həmişə Musa əvəzinə Musiq deyərdi... (*Arvadı təqlid edir*) "Musiq", sən uzan istirahət elə, biz Valeriklə kinoya gedirik. (*Musiqi təqlid edir*) "Duşka, bəlkə mən də gedim?" (*Arvadı təqlid edir*) "Mu... Musiq... Sən işləyib yorulmusan. Nahardan sonra sənə istirahət lazımdır... Davleniyan var..." (*Anjel bərkdən gülür*).

F ə r i d ə. Valerik kim idi?

S a v a l a n. Musiqin təsərrüfat işləri üzrə müavini. Qız sifətli şiş bir gədəydi...

A n j e l (*gülümsəyərək, qəsdən*). "Gədə", yoxsa "oğlan"?

S a v a l a n. Gədə!

F ə r i d ə (*fikirli*). Bəlkə kinoya düz ürəklə gedirmişlər.

S a v a l a n. Dedim ki, gədə idi. (*Dərindən nəfəs alaraq, ciddi*) Duşkanı mən ərə getməmişdən də tanıyırdım. Durna adlı ucaboylu, təvazökar, yaraşıqlı, incə bir qız idi... Musiqə gedəndən sonra əvvəllər çox qəmgin görünürdü... Bir gün küçədə rast gələndə heç bir söz demədən əlindəki tək zanbağı mənə bağışlayıb keçdi... Hiss etdim ki, gözləri yaşardı.

A n j e l (*həqiqi kədərlə*). Yazıq Duşka... (*Siqaret yandırır*)

F ə r i d ə. Ürəyim sıxıldı.

S a v a l a n. Nə üçün... Hamlet demişkən, biz ki, Aydan arıyıq...

F ə r i d ə. Nə isə, mənə pis təsir elədi.

S a v a l a n (*şən*). Yaxşı... yaxşı... (*Gətirdiyi şeylərə işarə ilə*) İcazə verirsən rəssam başlasın?

F ə r i d ə. Bu dəfə qalsın, Savalan. Həvəsim qaçdı.

S a v a l a n. Onda mən getdim.

F ə r i d ə. Ayrı gün gələrsən, yaxşımı? (*Savalan başı ilə təsdiq edir*)

A n j e l (*Savalana*). Mənə zəng eləyin.

S a v a l a n. Nə üçün?

A n j e l (*gülümsəyir. Lakin bu təbəssümdə əvvəlki sarkazm yoxdur*). Elə-belə.

F ə r i d ə. Bu nədir, Savalan, sən lap kobudlaşmısan. Heç qıza da elə sual verərlərmi?.. (*Gülümsəyərək xüsusi əda ilə*) Özü də Anjel kimi qıza.

S a v a l a n. Doğrudan da... Bağışlayın, Anjel xanım. Mən, məmnuniyyətlə, sizə zəng edərəm.

A n j e l. Mən incimirəm. Zənginizi gözləyəcəyəm.

S a v a l a n. Baş üstə, hələlik. (*Çıxır*)

F ə r i d ə. Anjel...

A n j e l (*siqareti yandıraraq*). Nə var?

F ə r i d ə. Doğrudan bu oğlan sənin xoşuna gəlir?

A n j e l. Doğrudan.

F ə r i d ə. Anjel! O, sən düşündüyün oğlanlardan deyil.

A n j e l (*tamamilə sakit*). Nə bilirsən?

F ə r i d ə. Neçə ildi yoldaşıq...

A n j e l (*eyni sakitliklə*). Aranızda bir şey olub?

F ə r i d ə (*bərk inciyir*). Sən məni dəhşətə salırsan, Anjel! Bu lap pozğunluqdur.

Anjel bərkdən gülür, lakin bu gülüş birdən dərin qüssəyə çevrilir.
Pauza.

A n j e l (*siqaretini külqabıya basaraq*). Yox, Fəridə, məni maraqlandıran onun xarici görünüşü deyil. Şmotkalar üçün özlərini öldürən duzsuz oğlanların söhbətini eşidəndə ürəyim bulanır. Sənin rəssamında indiyə qədər başqalarında görüb hiss eləmədiyim nə isə var. Və bu "nə isə" məndə qəribə hisslər doğurur. Elə bil ki, mənim indiyə qədər keçirdiyim günlər bir yuxuymuş. Elə bil ki, mənim həyatım indi geriyə, on altı-on yeddi yaşlarıma qayıdır, mən özümdə anlaşılmaz bir həvəs, bir yüngüllük hiss edirəm. Onun qızı var?

F ə r i d ə (*pərt olur*). Elə pis soruşursan ki, adam bilmir nə cavab versin... Necə yəni "qızı var?"

A n j e l. Yaxşı, sevgilisi, nişanlısı olsun.

F ə r i d ə. Yoxdur.

A n j e l. Nə əcəb?

F ə r i d ə (*məhəbbətlə*). Ax, Anjel, sənin elə bir ərin olsaydı... Bilirsən mən nə qədər sevinərdim.

A n j e l. Elə oğlan məni istəməz.

F ə r i d ə. Nə bilmək olar, bəlkə istədi?

A n j e l (*gülümsəyir*). Bəlkə...

F ə r i d ə. Belə gözəl, mədəni qız... Sənə nə olub?..

A n j e l. Heylə oğlanlar birinci növbədə...

F ə r i d ə. Başa düşürəm... Nə olsun... Bütün olub-keçmişləri etiraf edərsən.

A n j e l (*birdən darıxmış kimi*). Nə isə... Fəridə... kofe!

F ə r i d ə (*mənalı təbəssümlə*). Bu saat! (*Çıxır*)

Anjel qalxıb divarda Savalanın Fəridəyə toy hədiyyəsi gətirdiyi "Savalan" tablosuna uzun bir nəzər salır. Ədalət daxil olur. Qısa pauza.

Ə d a l ə t. Bəs Fəridə hardadır?

A n j e l. Mətbəxdə.

Ə d a l ə t (*yaxınlaşaraq, pıçıltı ilə*). Heç bilmirəm ki, sənə necə təşəkkür edim, Anjel.

A n j e l. Nəyə görə sən mənə təşəkkür etməlisən?

Ə d a l ə t (*pıçıltı ilə*). Bizim keçmişimiz haqqında Fəridəyə bir kəlmə söz demədiyinə görə. Mən bunu qiymətləndirirəm, Anjel.

A n j e l. Elə bilirsən, mən sənə görə susuram?! Mənim əlimdə əlac olsaydı, sənin boynunu elə vurardım ki, qanın yerə dammazdı!

Ə d a l ə t. Anjel!

A n j e l. Heyf ki, ortada Fəridə vardır.

Ə d a l ə t (*eyni yalvarışla*). Anjel!

A n j e l. Mən onun xəyallarını, arzularını alt-üst eləmək istəmədim. Çox gecdir. Lakin, əgər, sən ona da xəyanət eləsən, mənim intiqamım dəhşətli olacaq.

Ə d a l ə t. Mən onu sevirəm, Anjel.

A n j e l. Sən bu sözləri mənə də deyirdin.

Ə d a l ə t. Nə olar. Mən buna təəssüf etmirəm.

A n j e l. Mən bura sənin ikiüzlü sözlərini eşitmək üçün gəlməmişəm. Mənim səndən tələbim vardır!

Ə d a l ə t. Nə tələb?

A n j e l. Mənim oğlumun atasının sən olduğunu rəsmiləşdirmək lazımdır.

Ə d a l ə t. Necə yəni rəsmiləşdirmək?!

A n j e l. Yəni, ona rəsmi surətdə sənin familiyanı vermək! Uşaq bu gün-sabah böyüyüb məndən atasının kim olduğunu soruşacaq, aydındırmı?

Pauza.

Ə d a l ə t. Anjel, icazə ver, o barədə bir əsaslı düşünüb-daşınaq.

A n j e l. Nə düşünəcəksən?

Ə d a l ə t (*əsəbi, səbrsiz*). İndi yox... Rica edirəm, sonra... Fəridə bu dəqiqə gələ bilər...

A n j e l. Yaxşı. Sonra mən sənə zəng edərəm.

Fəridə gəlir.

F ə r i d ə. Oy, Ədalət, sən nə vaxt gəldin? Anjel, niyə durdun? Bu saat kofe hazır olar.

A n j e l. Səhərdən oturmuşam, bəs deyil?

F ə r i d ə. Sən Allah, getmə!

A n j e l (*zarafatyana*). Təzə ər-arvadı tək qoymaq lazımdır.

F ə r i d ə. Anjel, yaxşı şeylər bişirmişik.

A n j e l. Yox, Fəridəcan, işim var. (*Açıq zarafatla*) Gözəl rəssam mənə zəng eləyəcək, hələlik. (*Çıxır*)

Ə d a l ə t. Bu hansı gözəl rəssam haqqında danışır?

F ə r i d ə. Savalan haqqında.

Ə d a l ə t (*gülümsəyir*). Hə, sizin dostunuz...

F ə r i d ə. "Siz" deyəndə kimləri nəzərdə tutursan?

Ə d a l ə t. Səni, Qəniməti...

F ə r i d ə. Savalan mənim rəsmimi çəkmək istəyir. Deyir, bu, mənim ən kamil işim olacaq.

Ə d a l ə t (*gülümsəyir*). Nə üçün məhz sənin rəsmini?

F ə r i d ə (*şən təbəssümlə*). Yəqin ona görə ki, bir-birimizi lap uşaqlıqdan tanıyırıq... sevirik.

Ə d a l ə t. Sevirsiniz?

F ə r i d ə (*zarafatyana*). Yoxsa, qısqanırsan? Oy, xoşuma gəlir sənin qısqanclığın... Mən ölüm qısqanırsan?

Ə d a l ə t. Yox, qısqanclıq acizlərin işidir.

F ə r i d ə (*bir an xəyala dalaraq*). Doğrudan da elədir.

Ə d a l ə t. Ancaq camaatı heç bir zaman yaddan çıxarmaq lazım deyil!

F ə r i d ə. Camaatı? Hansı camaatı?

Ə d a l ə t. Ətrafımızda yaşayan camaatı.

F ə r i d ə. Onları nə barədə yaddan çıxarmamalıyıq?

Ə d a l ə t. Hər barədə. (*Qısa pauza*) Adamlar hardan bilirlər ki, sən o rəssamı bir qardaş kimi istəyirsən... Görəcəklər ki, çox vaxt mən evdə olmayanda gəlir. Saatlarla burada olur... Bir sən, bir də o. Deməк, burada nə isə var.

F ə r i d ə. Məsələn, nə?

Ə d a l ə t (*gizli əsəbiliklə*). "Məsələn, nə"sini onlar özləri düzəldəcəklər.

F ə r i d ə (*hərarətlə*). Axı, biz üçümüz də bilirik ki, arada başqa, heç bir şey yoxdur və ola da bilməz.

Ə d a l ə t. Biz bilirik, onlar yox!

F ə r i d ə (*sanki indiyə qədər ona məlum olmayan başqa bir aləmə daxil olur*). Demək, onda biz... mən heç bir oğlan yoldaşımla görüşməməliyəm?

Ə d a l ə t (*könülsüz*). Nə üçün... Olar... Lakin, əlbəttə... Ancaq rəsmi yerlərdə... Yalnız mən olduğum zaman.

F ə r i d ə (*hələ də təəccüb içində, lakin gülümsəyərək*). Deməli, ərli qadın olmağın belə işləri də varmış.

Ə d a l ə t (*zarafatla*). Bəli... Bəs sən nə bilmisən...

F ə r i d ə. Yaxşı... Daha neyləyək, Savalana deyərəm ancaq sən evdə olanda gəlsin.

Ə d a l ə t. Tez-tez yox.

F ə r i d ə. Necə? Bəs, portretimi çəkməsin?

Ə d a l ə t (*onun üzünə baxmadan*). Çəkməsə yaxşıdır.

F ə r i d ə. Elə də şey olar?.. O, neçə vaxtdır buna hazırlaşır... Bu fikirlə yaşayır... O, bu portreti Moskvada açılacaq böyük sərgiyə göndərəcək. İndi necə ola bilər ki, onu birdən-birə bunların hamısından məhrum eləyəsən?

Ə d a l ə t (*gizli əsəbiliklə*). Qoy başqa bir qadın tapsın. Onun üçün nə təfavütü var...

F ə r i d ə (*ərinin sözü onun qadınlıq, insanlıq qüruruna toxunur. Bir qədər incimiş*). Təfavütü var! Axı, rəssam da şairdir, ilhamla yaradır.

Ə d a l ə t (*sarkazmla gülümsəyərək*). Deməli, o öz şah əsərini yaratmaq üçün mən bədbəxtin arvadından ilham almalıdır?

F ə r i d ə (*ona diqqətlə baxaraq*). Məgər, o, mənimlə bir insan, gənc bir qadın kimi maraqlana bilməz?

Ə d a l ə t (*sərt*). Yox! Qoy o, başqa gənc qadınla (*"gənc qadın" sözünü xüsusi vurğu ilə deyir*) maraqlansın!

F ə r i d ə. Əgər, bu işdə qeyri-əxlaqi bir şey varsa, o zaman "başqa" gənc qadının namusu sənin üçün əhəmiyyətli deyil?

Ə d a l ə t. Qoy başqa qadının da dərdini öz əri çəksin. (*Onun əlindən tutaraq, mülayim*) Mən sənin ürəyitəmiz olduğunu bilirəm. Lakin adamları başa salmaq çətindir; hələ bütün şüurlar o dərəcəyə qədər inkişaf etməmişdir.

F ə r i d ə. İnkişaf eləyən şüurlar daha çoxdur. Nə üçün biz geridə qalmış, qəlbi qara adamların ardınca sürünməliyik?

Ə d a l ə t (*əsəbiləşir, lakin bunu büruzə verməməyə çalışır. Gərgin təbəssümlə*). Görəsən, biz bu rəssamın üstündə çox mübahisə edəcəyik?!

F ə r i d ə (*dərindən nəfəs alaraq. Son dərəcə ruhsuz*). Yaxşı... madam ki, sənin ürəyindən deyil, Savalana deyərəm gəlməsin.

Ə d a l ə t (*yavaş səslə. Onun üzünə baxmadan*). Mən səni məcbur etmirəm, Fəridə.

F ə r i d ə. Məni məcbur etmək də olmaz! Ancaq mən bu söhbətdən sonra rəssamın üzünə çıxa bilmərəm.

Ə d a l ə t. İnciyirsən?

F ə r i d ə. İncimirəm. (*Qapı zəngi. Gedib qapını açır. Qapıda skelet kimi arıq, uzun bir kişi dayanmışdır. Fəridə qorxub bir addım geri çəkilir*) Kimi istəyirsiniz? (*Skeletəbənzər kişi susur*) Kimi istəyirsiniz? (*Skeletəbənzər kişi susur. O, qorxaraq qayıdıb evə qaçır*)

Ə d a l ə t. Kim idi?

F ə r i d ə. Qapıda əcaib bir adam durub. Soruşuram, dinmir. (*Ədalət tez qapıya gedir. Əsəbi hərəkətlə cibindən bir dəstə pul çıxararaq, tələsik sayıb ona verir. Skeletəbənzər kişi pulu alıb gedir. Ədalət bir an dayanır, dərindən nəfəs alır. Sonra evə qayıdır*) Çox dəhşətli görünüşü var. Xəstədir?

Ə d a l ə t. Yox.

F ə r i d ə. Nə istəyirdi?

Ə d a l ə t (*gizli əsəbiliklə*). Pul. Stol hazır deyil?

F ə r i d ə. Hazırdır.

Ə d a l ə t. Gedək. Mən acından ölürəm...

İşıq azalır. Güclənəndə Fəridə oturub gündəlik yazır.

F ə r i d ə n i n d a x i l i s ə s i. Doğrudanmı, bizim təmiz hisslərimiz insanlar arasında öz əleyhimizə çevrilə bilər?! Doğrudanmı, Savalan kimi bir oğlanın mənə olan o səmimi duyğuları adamlara şübhəli görünə bilər?

Bu zaman küçədə ayaq səsləri eşidilir. Fəridə başını qaldırıb, açıq pəncərədən baxır.

F ə r i d ə. Qənimət!

Q ə n i m ə t (*pəncərədən görünür*). Salam, Fəridə. Necəsən?

F ə r i d ə. Mən yaxşı... Bir de görüm, sən necəsən?

Q ə n i m ə t (*gülümsəyir*). Mən də yaxşı.

F ə r i d ə. Kvartira ala bildin?

Q ə n i m ə t. Söz veriblər. Gələn kvartalda bəlkə aldım.

F ə r i d ə. Neft daşlarında sənin üçün çətin keçmir ki?

Q ə n i m ə t. Yox.

F ə r i d ə. Sən həmişə çətinliklər, qəhrəmanlıqlar, bir sözlə, romantika haqqında düşünərdin.

Q ə n i m ə t (*gülümsəyir*). Unutmamısan!..

F ə r i d ə. Heç o günləri unutmaq olarmı?

Q ə n i m ə t. Neft daşlarında işləmək mənə maddi cəhətdən də xeyirdir. Maaşım burda alacağımdan əlli faiz artıqdır. (*Zarafatyana*) Özümə təzə kostyum, təzə tufli almışam. Gələn ay da lap son dəbdə bir plaş alacağam. Kasıb daha sən görən deyil. (*Gülüşürlər*) Biz kürkümüzü sudan çıxaracağıq. De görüm, sən necəsən? Həyatından çoxmu razısan?

F ə r i d ə. Çox.

Q ə n i m ə t. Evinizdən gələn pianino səslərindən hiss edirəm. Axı, mən bu küçədən tez-tez keçirəm.

F ə r i d ə. Sən ki, bu tərəfdə olmursan?

Q ə n i m ə t. Sən ki, olursan.

F ə r i d ə (*birdən tutularaq*). Məncə, sən gərək daha belə zarafatları eləməyəsən, Qənimət.

Q ə n i m ə t. Kim deyir ki, mən zarafat eləyirəm?

F ə r i d ə. Sən məni hələ də unutmamısan?

Q ə n i m ə t. Bu evdəki Fəridəni unutmuşam. Gövhər xanımın evindəki Fəridəni isə unutmamışam. Heç bir zaman da unutmayacağam. Bunun isə, nə sənə dəxli var, nə də sənin hörmətli ərinə. (*Gülümsəyir*) Xudahafiz! (*Gedir*)

F ə r i d ə (*onun ardınca*). Tez-tez zəng elə, Qənimət!

Q ə n i m ə t i n s ə s i. Baxarıq.

Fəridənin üzü birdən-birə kədərli bir ifadə alır. Bir an sükut içində dayanır. Sonra oturub gündəliyini yazmağa davam edir.

F ə r i d ə n i n d a x i l i s ə s i. "Toyumuzdan sonra bu gün birinci dəfə Qəniməti gördüm. Yenə əvvəlki kim şən... Yenə əvvəlki kimi zarafatcıl... Neçə ay işləyəndən sonra bir dəst kostyum ala bildiyinə necə sevinirdi... Halbuki Ədalətin on dəst kostyumu var... Bunu düşünəndə ürəyimə bir qüssə çökür. Burada, nə isə, bir ədalətsizlik yoxdurmu? Axı, yüksək vəzifədə olmaq başqa bir aləmə daxil olmaq demək deyil". (*Bayırda maşın siqnalı. Fəridə qalxıb pəncərədən şoferə*) Ədalət yatıb. (*Ədalət gülümsəyərək, o biri otaqdan daxil olur*)

Ə d a l ə t. Ədalət oyaqdır.

F ə r i d ə. Şoferdir, çay gətirim?

Ə d a l ə t. Bir stəkan pis olmaz.

F ə r i d ə. Bu saat... (*Gündəliyini yığışdırıb yeşiyə qoyur*)

Ə d a l ə t (*zarafatyana*). Sən öz gündəliyini nə vaxta qədər məndən gizlədəcəksən?

F ə r i d ə (*zarafatla*). Qocalıb belimiz bükülənə qədər.

Ə d a l ə t. O... bu çox uzun oldu. Bu günün qəhrəmanı kimdir?

F ə r i d ə. Sən, mən, Qənimət.

Ə d a l ə t. Qənimət?

F ə r i d ə. Bəli, o, indicə burdan (*pəncərə tərəfi göstərir*) keçirdi. Biz onunla bir qədər söhbət də elədik.

Ə d a l ə t (*alınır, lakin üzə vurmur*). Nə barədə?

F ə r i d ə (*eyni zarafatla*). Onu gələcəkdə oxuyarsan. Ancaq məni bir məsələ çox maraqlandırır.

Ə d a l ə t (*eyni zarafatla*). Nə məsələdir o?

F ə r i d ə. Qənimətlə, Savalanla bizim həyatımız arasında nə üçün bu qədər böyük fərq olmalıdır?

Ə d a l ə t. Başa düşmürəm, nə fərq?

F ə r i d ə. Nə üçün, məsələn, Qənimət kimi ali təhsilli, ağıllı, diribaş bir oğlan, neçə ay işləyəndən sonra özünə zorla bir dəst kostyum ala bilsin. Amma biz...

Ə d a l ə t (*onun sözünü kəsərək*). Başa düşdüm. Səbəbini desəm, məni təvazökar olmamaqda təqsirləndirməzsən ki?

F ə r i d ə. Yox, mən belə sirləri bilmək istəyirəm.

Ə d a l ə t (*sərt qürurla*). Ona görə ki, mənim əlimin altında üç min Qənimət kimi adam işləyir və onların fəaliyyətinə, birinci növbədə, mən cavabdehəm. Onları mən idarə edirəm.

F ə r i d ə. Lakin, bununla bərabər, gərək ki, sizin maaşlarınızın arasında o qədər də böyük fərq yoxdur. Qənimət deyir ki, onlar Neft daşlarında əlli faiz artıq maaş alırlar...

Ə d a l ə t (*zarafatyana*). O... səndən qorxmaq lazımdır. (*Onu öpür*) Qənimətin Neft daşlarında zəhməti çox olduğu üçün maaşı da çoxdur. Mənim də burada zəhmətim çox olduğu üçün yaşayış imtiyazlarım da çoxdur. (*Çırtma ilə onun burnuna vuraraq*) İndi anladın? (*Təkrar öpür*) Demaqoqiyaya başın qarışdı, çayı yaddan çıxardın...

F ə r i d ə. Oy, bu saat...

Mətbəxə yüyürür. Ədalətin üzü soyuq və məyus bir ifadə alır. Qısa pauza. Fəridə çay, pirojna-filan gətirir. Ədalətin üzünün əvvəlki şən və gümrah ifadəsi yenə də qayıdır.

Ə d a l ə t (*çayını içə-içə*). Bu gecə "Karmen"ə getmək istəyirsən?

F ə r i d ə. Gedək!

Ə d a l ə t. Hazırlaş, mən iclasdan çıxan kimi maşını göndərərəm. (*Fəridənin barmağındakı bahalı üzüyə işarə ilə*) Bunu çıxar qoy evdə.

F ə r i d ə (*təəccüblə*). Nə üçün?

Ə d a l ə t. Biz özümüzü mümkün qədər sadə aparsaq yaxşıdır, elə deyilmi?

F ə r i d ə. Axı, bunu bizə toy hədiyyəsi gətiriblər.

Ə d a l ə t (*dalğın*). Kim nə bilir ki, hədiyyə gətiriblər.

F ə r i d ə. Başqa... nə düşünə bilərlər ki?

Ə d a l ə t. Hər nə desən... nə çox qəlbiqara adamlar. (*Fəridə dərin bir anlaşılmazlıq içindədir. Telefon zəngi. Ədalət dəstəyi götürür*) Eşidirəm... Salam! Doğrudan? Nə deyib? Aha... sonra?.. Yaxşı...

Axşam operada görüşərik... Gerisini orda danışarıq... Hələlik... (*Dəstəyi asır*)

F ə r i d ə. Kim idi?

Ə d a l ə t (*gülümsəyir*). Kamil.

F ə r i d ə. Nə deyirdi?

Ə d a l ə t (*zarafatyana*). Heç...

F ə r i d ə (*inciyir*). Çox sağ ol.

Ə d a l ə t. Yaxşı... yaxşı... Deyir, çox mühüm bir yığıncaqda bizim fəaliyyətimizə yüksək qiymət veriblər.

F ə r i d ə. Kim?

Ə d a l ə t. Bizim şefimiz. Məni yaman tərifləyib.

F ə r i d ə. Nəyə görə tərifləyib?

Ə d a l ə t (*ona təəccüblə baxaraq*). Sən elə soyuq soruşursan ki.

F ə r i d ə (*sualını təkrar edir*). Nəyə görə tərifləyib?

Ə d a l ə t (*bir qədər sərt*). Yaxşı işlədiyimizə görə. Planı vaxtından əvvəl yerinə yetirdiyimizə görə.

F ə r i d ə. Təbrik edirəm!

Ə d a l ə t (*birdən daha da canlanaraq*). Ayın on beşində qızının ad günüdür.

F ə r i d ə. Kimin qızının?

Ə d a l ə t (*zarafatyana, bərkdən*). Şefin! Gərək yaxşı bir hədiyyə tədarük eləyək.

F ə r i d ə. Nə çox evimizdə yaxşı şey.

Ə d a l ə t (*gülümsəyir*). Yox. Elə olmaz. Gərək, qızın adına alınsın. Buranın yuvelirtorqunda da fərli bir şey yoxdur. Gərək, Moskvadan alınsın.

F ə r i d ə. Necə, ondan ötəri Moskvaya gedəcəksən?

Ə d a l ə t. Onsuz da birigün uçuram Moskvaya... İdarənin işi var...

F ə r i d ə. Bəs, heç mənə deməmişdin?

Ə d a l ə t. Baş o qədər qarışır ki... (*Saatına baxır*) Yaxşı. Məni gözləyirlər. Sən axşama hazırlaş. (*Gedir*)

Fəridə daxili bir gərginliklə ora-bura vurnuxur, sanki bu geniş otaqlarda özünə yer tapa bilmir. Birdən əlini qaldırıb barmağındakı bahalı üzüyə baxır. Sonra üzüyü çıxarıb servantın yeşiyinə atır. İndi onun üzündə soyuq, ciddi bir ifadə var. Qapı zəngi. Gedib açır. Gövhər gəlir...

F ə r i d ə. Salam, ana. Neçə vaxtdır səni bura gətirə bilmirik.

G ö v h ə r. Vaxt tapa bilmirəm. İndi də bir dəqiqəliyə gəlmişəm. Yay isti keçir. Uşaqları qarın xəstəliklərindən-zaddan qorumaq lazımdır.

F ə r i d ə. Biz də hazırlaşırıq Kislovodskiyə... (*Qısa pauza*)

G ö v h ə r. Yaxşı olar. Ancaq məni bir şey yaman narahat edir.

F ə r i d ə. Nədir o, ana?

G ö v h ə r. Sən işləmək istəmirsən?

F ə r i d ə (*tutulur*). Doğrusu, mən istəyirdim. Ancaq Ədalət razı olmadı. Deyir, sənin işləməyinə bizim ehtiyacımız yoxdur.

G ö v h ə r. "Bizim", yəni, kimlərin?

F ə r i d ə. Yəni, öz ailəmizin.

G ö v h ə r. Bəs, onda, sən nə üçün on altı il oxuyub mühəndis olurdun? (*Qısa pauza. Mehriban ifadə ilə*) Bəlkə də Ədalət səni çox istədiyindən elə deyir. Ancaq sən onu razı salmalısan. O hiss etməlidir ki, yaxşı bir mühəndis olanda həyatın daha da fərəhli keçər. Biz başqa zamanda yaşayırıq. İndi bu bərli-bəzəkli otaqlarda işsiz-gücsüz oturub xanımlıq etməklə xoşbəxt olmaq mümkün deyil. Bu sizi bir-birinizdən də təngə gətirər! Mən anayam! Mən istəyirəm ki, sən öz ailəni, ərini sevməklə yanaşı, həm də müstəqil, ləyaqətli bir insan olasan! (*Gülümsəyir*) Yadındadırmı, uşaqlıqda sənə vəznəli-çuxalı oğlan paltarı geyindirərdim...

F ə r i d ə. Yadımdadır... (*Gülümsəyir*) Sən mənə gəlinciklərlə bərabər, tapança da alardın...

G ö v h ə r. Mənim oğlum yox idi. Mən arzu edirdim ki, sən gələcəkdə həqiqi kişilər kimi cəsarətli, mərd olasan. (*Qalxır*)

F ə r i d ə. Otur, ana.

G ö v h ə r. Yox, hələ bir neçə evə də dəyməliyəm. Ümid edirəm ki, ananı başa düşərsən. Hələlik.

Gedir. Fəridə anasının ardınca uzun bir nəzər salır. Baxışları anlaşılmaz və qəmgin bir ifadə alır. Sonra o, nəzərlərini çəkərək, divardakı qiymətli xalıya baxır, sonra qəribə bir maraqla hər tərəfi nəzərdən keçirir. Sanki bunların hamısını indicə görür. Sonra oturub gündəliyini yazır.

F ə r i d ə n i n d a x i l i s ə s i. Anam hiss etdirməməyə çalışsa da, mənim bu zəngin, bu qayğısız həyatımın onu sevindirmədiyini duyuram... O, özünün dediyi kimi, nə isə, gizli bir narahatlıq içindədir.

Qapı zəngi. Fəridə açır. Qəribə bir tip kağıza bükülü bir şeyi ona verir. Fəridə açıb baxır, qalın tüklü xəzi görəndə qorxub yerə salır.

T i p (*qəribə bir təəccüblə*). Niyə qorxdunuz, xanım? (*Əyilib xəzi yerdən götürür*) Bu nadir tapılan bir dəridir.

F ə r i d ə (*yalnız indi özünə gələrək*). Kim göndərib?

T i p. Yoldaş Sərkarov.

F ə r i d ə (*fikri dağınıq*). Yoldaş Sərkarov kimdir?

T i p. Hi-hi... tanımırsınız?

F ə r i d ə (*sərt*). Yox.

T i p. Yoldaş Sərkarov Qaplan Qəhrəmanoviç, mextorqun direktorudur da...

F ə r i d ə. Bəs, siz niyə hırıldayırsınız?

T i p. Hi-hi... Mən hırıldamıram, xanım, gülürəm.

F ə r i d ə. Nə üçün?

T i p. Dedim, bəs, zarafat edirsiniz, çünki sizin kimi böyük xanımlardan Sərkarovu tanımayan yoxdur. (*Xəzi sığallayaraq*) Bu çox qiymətli şeydir, əldə, azı, min beş yüz qiyməti var.

F ə r i d ə. Necə yəni "əldə"?

T i p. Hi-hi... yəni bazarda. Çasnı satışda.

F ə r i d ə. Yaxşı. Bəs, pulu?

T i p. Nə pul?

F ə r i d ə (*sərt*). Bura bax, deyəsən, axı, siz təlxəklik eləyirsiniz? Necə nə pul? Bunu bizə müftə verirlər?

T i p. Mən kiçik adamam, xanım... Onu yoldaş Sərkarov bilər.

F ə r i d ə (*qəribə bir həyəcanla*). Aparın! Tez!

T i p (*təəccüb içində*). Nə danışırsınız, xanım? Bəs, mən yoldaş Sərkarova nə deyim?

F ə r i d ə (*hücumla*). Aparın!

T i p (*qorxmuş halda götürülür*). Qəribədir... Qəribədir...

İşıq sönür, yananda Qənimətin otağı görünür. Anjel, Qənimət və Savalan tez-tez o biri qapıdan girib-çıxaraq stolun üzərinə cürbəcür yemək şeyləri-filan düzürlər.

S a v a l a n. Bəh... Bəh... Nə gözəl stoldur! Sağ ol, Anjel xanım! Anjel, bu tortu da özün hazırlamısan?

A n j e l (*acıqla*). Yox, konditer tutmuşam.

Q ə n i m ə t. Sən də... əlbəttə, özü hazırlayıb.

S a v a l a n. Bağışla, Anjel.

A n j e l. Bağışlamıram. Kim məni qiymətləndirmirsə, o, mənim düşmənimdir.

S a v a l a n. Allaha şükür ki, biz səni qiymətləndiririk. Sən bizim ən əziz qonağımızsan.

A n j e l (*inciyir*). Düzəltdin.

Q ə n i m ə t. Anjel nə üçün qonaq olur?

Bütün bu müddətdə Anjel süfrə ilə məşğuldur.

A n j e l. Yaxşı, biz buraya Anjelin kim olduğunu müzakirə eləməyə yığışmamışıq. Anjel sizin yağlı tériflərinizi çox eşidib.

Q ə n i m ə t. Bizim?

A n j e l. Siz oğlanların, nə təfavütü var...

S a v a l a n. Vallah, mənim sözümdə heç bir yağ-zad yoxdur.

A n j e l. Yaxşı, bitdi. (*Birdən şənlənərək*) Stol hazırdır, ağalar.

Q ə n i m ə t (*stola nəzər salaraq*). Deyəsən, içkimiz lap azdır. Mən qaçım bir şüşə şampan alım.

S a v a l a n. Qoy mən gedim. Sən bu gecə bəysən... (*Qapıya yönəlir*)

Q ə n i m ə t. Dayan! Mən müasir bəyəm. Ona görə də özüm gedəcəyəm. (*Yüyürərək çıxır*)

S a v a l a n. Anjel...

A n j e l. Yenə də məndən danışacaqsan?

S a v a l a n. Əgər, sənin barəndə danışmaq mənim üçün xoşdursa?

A n j e l. Müəyyən vaxta qədər.

S a v a l a n. Səhv edirsən. (*Qısa pauza*)

A n j e l (*papiros yandıraraq*). Fəridə mənim barəmdə sizə nə danışıb?

S a v a l a n. Heç bir şey. Nə üçün soruşursan ki?

A n j e l. Elə-belə.

Birdən Savalanın gözü qızın sumkasındakı kitaba sataşır.

S a v a l a n. O nə kitabdır?

A n j e l. Səttarxan haqqındadır.

S a v a l a n. Doğrudan?

A n j e l. Nə üçün təəccüb edirsən ki?

S a v a l a n. Axı, sən...

A n j e l (*onun cümləsini tamamlayır*). Savalan dağının harda olduğunu bilmirdin. İndi necə olub ki, Səttarxanla maraqlanırsan? (*Zarafatla*) Hər şey axır... Hər şey dəyişir.

S a v a l a n. Zarafatı burax, mən ciddi soruşuram... Yoxsa, elə-belə bekarçılıqdan oxuyursan?

A n j e l. Yox, Cənubi Azərbaycanın taleyi ilə maraqlandığım üçün oxuyuram.

S a v a l a n (*təhdidlə*). Anjel!

A n j e l. Nə var?

S a v a l a n. İstehza edirsən?

A n j e l. Axmaq! (*Hücumla*) Mən sənin düşündüyün qədər də düşüb itmiş adam deyiləm. Mən bilirəm ki, öz xalqına gülmək alçaqlıqdır.

S a v a l a n (*günahkar kimi, həyəcanla*). Axı, sən dünənə qədər o xalqı tanımırdın.

A n j e l. Tanımırdım, çünki onun haqqında mənə heç nə deyən olmamışdı.

S a v a l a n (*əsəbi bir həyəcanla*). Doğrudur! (*Öz-özünə danışırmış kimi*) Demək, bizi ondan məhrum etmək olmaz. Biz son mənzilin harada olduğunu bilirik və bir gün o mənzilə çatacağımıza inanırıq... Əgər, ata-baba ənənələrindən ayrı düşən Anjel bu gün Səttarxanı bir qəhrəman kimi sevib qiymətləndirirsə, demək, yaşasın ideya! Yaşasın bizim idealımız! Anjel, icazə ver, səni öpüm.

A n j e l (*əlini qabağa uzadaraq*). Sakit. Bəlkə sən elə bilirsən ki, mən Səttarxan haqqında sənə xoş gəlmək üçün oxuyuram?

S a v a l a n (*eyni hərarətlə*). Əlbəttə, yox! Mən hiss edirəm ki, sən təbiətən yaxşı qızsan. Necə deyərlər, naturalsan, dürəklərdən deyilsən!

A n j e l. Dürək nədir?

S a v a l a n. Lətifəsi səndən uzaq olsun, dürək... nə isə, xarici təsirlərə uyub əslini itirən, nə ondan, nə bundan olan xırda adamlara biz öz aramızda “dürək” deyirik...

A n j e l (*bərkdən gülərək*). Əcəb sərrast söz tapmısınız.

S a v a l a n (həqiqi heyranlıqla). Sən nə gözəl gülürsən, Anjel.

A n j e l (*mehribanlıqla*). Yaxşı... Sarı simə keçmə.

S a v a l a n (*zarafatyana*). Demək, sən tarın sarı simini unutmamısan!

A n j e l (*dərindən nəfəs alaraq, divanın üstündəki tara işarə ilə*). Bunu sən çalırsan, yoxsa Qənimət?

S a v a l a n. Mən.

A n j e l. Götür bir az çal, qulaq asaq.

S a v a l a n. Məclis qızışanda...

Anjel tarı götürüb bir-iki mizrab vuraraq dinləyir... Sonra yavaş-yavaş "Segah" çalıb asta, dərdli bir səslə oxuyur. Savalan dərin heyrət içində qulaq asır. Lakin Anjel sanki onu görmür. Anjel öz kədərinə dalaraq, bu dünyadan ayrılmışdır.

A n j e l (*oxuyur*). Yad eylədikcə vəslini, ey mahi tələtim,
Ağlar gözümdə qanə dönür eşq həsrətim...

S a v a l a n. (*özünü saxlaya bilməyərək qışqırır*). Anjel!

Anjel tarı yerə qoyur. Savalan qarşısıalınmaz bir həyəcanla onu öpür.

A n j e l (*onu özündən kənar edərək*). Lazım deyil, Savalan.

S a v a l a n (*eyni həyəcanla*). Anjel! Mən səni yalnız indi tanımağa başlayıram!

A n j e l (*kədərli təbəssümlə*). Gecikmisən.

S a v a l a n. Yox, gecikməmişəm. Mən həmişə hiss edirdim ki, sən göründüyün kimi deyilsən.

A n j e l (*eyni kədərli təbəssümlə*). Göründüyün kimi deyilsən!

Birdən qəti hərəkətlə qalxıb güzgünün qarşısında gözlərini silərək canlı və gümrah bir görünüşlə saçlarını düzəldir. Savalan yaxınlaşıb güzgüdə ona baxır, nə isə demək istəyir. Qənimət daxil olur.

Q ə n i m ə t. Bu da şampan! (*Savalana*) Niyə tərpənmirsən?

S a v a l a n (*Anjelə baxmaqda davam edərək*). Hipnoz olmuşam!

A n j e l (*onun qoluna girərək*). Mənim gözəl rəssamım, gəl əyləşək. Bizim bir-birimizi olduğu kimi tanımağımız mümkün deyil.

S a v a l a n. Mən səninlə bərabər öz ürəyimi kəşf etmişəm. Bayaq o sarı simi sən dilləndirdin. Mən qulaq asdım, indi də mən dilləndirim, sən qulaq as! (*Qənimətə*) İndi mənə aydın oldu ki, nə üçün bu qızı görməyəndə darıxıram. Niyə saatlarca bunun haqqında düşünürəm.

A n j e l (*eyni zarafatla)*. Demək, bizim sarı simlərimiz tamam başqa-başqa əhvalatlar hekayə edirmişlər.

S a v a l a n (*sanki birdən-birə taqətdən düşərək*). Qənimət bəy! Bizimki sevgidə gətirmədi! (*Coşğunluqla*) Ancaq biz and içmişik ki, heç bir dərdə təslim olmayaq. Vuraq, dostlar!

Şampan butulkasını götürür, bu dəmdə qapının zəngi vurulur. Qənimət qapını açır. Fəridə otağa daxil olur. Hamı bir an heyrət içində dayanıb ona baxır.

F ə r i d ə (*gülümsəyir*). Gözləmirdiniz, eləmi?

Q ə n i m ə t. Fəridə! Mənim ürəyimə dammışdı ki, sən gələcəksən. Sübut? Baxa bilərsən! (*Qənimət bu sözlərlə yemək stoluna işarə edir. Süfrəyə dörd dəst qab-qacaq, dörd qədəh qoyulmuşdur*)

S a v a l a n. Heç bayaqdan mənim ağlıma gəlməyib ki, niyə Qənimət stolun üstünə dörd adamlıq qab-qaşıq qoyub...

A n j e l. Mənim ağlıma gəlirdi. Ancaq fikirləşirdim ki, yəqin, başqa bir qız da gələcək. (*Fəridəyə*) Nə əcəb həyat yoldaşın (*son sözləri xüsusi vurğu ilə deyir*) səni tək buraxıb?

F ə r i d ə (*zarafatyana, lakin səmimi*). Əvvəla, həyat yoldaşım Moskvaya uçdu. İkincisi də, nə üçün tək buraxmasın? (*Eyni zarafatla*) Biz bir-birimizə inanırıq.

A n j e l. Allah eləsin!

F ə r i d ə. Anjel! Yoxsa, sən buna şübhə edirsən?

A n j e l. Sənə? Sənə yox. Sənin kimi mələyə kim şübhə eləyə bilər?

F ə r i d ə. Bəs, Ədalətə?

A n j e l (*gizli kin qarışıq bir zarafatla*). "Ədalət" sözünün mənası çox dərin olduğu üçün o barədə heç nə deyə bilməyəcəyəm.

F ə r i d ə (*zarafatla və səmimiyyətlə*). Eybi yoxdur, vaxt gələr, deyərsən.

A n j e l (*qətiyyətlə*). Yəqin ki...

S a v a l a n (*qızlara*). İnsafınız olsun, səbəbkar burada darıxır.

F ə r i d ə. A... doğrudan da... Qənimət! (*Onun əlindən tutaraq*) Mənim əzizim, bizim hamımızın əzizi! Səni təbrik edirəm! Bunu da qalstukuna taxarsan. (*Onun üzündən öpərək, əlindəki balaca şeyi verir*)

Q ə n i m ə t. Bu ki, sənin...

F ə r i d ə (*sözünü kəsərək*). Hə... O mənim qız vaxtı gəzdirdiyim üzüyün qaşıdır.

Q ə n i m ə t (*həyəcanla*). Sən o üzüyünü yaman çox istəyirdin.

F ə r i d ə (*gülümsəyərək başı ilə təsdiq edir)*. Ona görə də, qoy onun qaşı sənin sinəndə yadigar qalsın.

Q ə n i m ə t (*həyəcanla*). Elə şey olmaz.

S a v a l a n (*amiranə)*. Olar! (*Sancağı alıb Qənimətin qalstukuna taxır*) Aydındır?!

Q ə n i m ə t (*dərindən nəfəs alaraq*). Aydındır.

S a v a l a n. Elə isə başladıq. (*Şampan şüşəsini partladaraq qədəhləri doldurur. Qənimətə*) Sağ ol, qardaşım! Qoy bu yaqut həmişə sinəndə parlasın. Ömrün uzun olsun!

F ə r i d ə. Sağ ol, Qənimət! (*Qədəhini vurur*)

A n j e l. Sağ ol, Qənimət. Bugünkü bayram üçün gərək mən səni öpüm.

İçirlər. Savalan patefonu qurur. Müasir bir rəqs havası otağı bürüyür. Dördü də bir-birinin təklifini gözləmədən ayağa qalxıb oynayırlar.

Q ə n i m ə t. Uşaqlar! Bu il bir az tez, bir az gec, dördümüzün də iyirmi iki yaşı tamam olur. Planetimizdə olan bütün yaşıdlarımızın sağlığına! (*İçirlər*)

A n j e l (*birdən-birə fikrə gedən Savalanı zarafatyana sancır*). İyirminci əsrdə şairanə xəyallara dalmaq çox gülməli görünür.

S a v a l a n. Nahaq yerə, nə qədər dünya var, gözəllik var, şairanəlik də olacaq. Adam fikirləşir ki, Fəridənin bura gəlişi...

A n j e l. Leonardo da Vinçi fırçasına layiqdir. Cakonda!

S a v a l a n. Fəridə, sənin bu gecə bizi yaddan çıxarmayaraq bura gəlməyin ürəyimi o qədər kövrəldib ki, ağlamaq istəyirəm.

F ə r i d ə (*zarafatyana*). Sizin kimi oğlanları kim unudar?

S a v a l a n (*ciddi kədərlə*). Yox, Fəridə, bizim kimi oğlanları unudanlar, bizdən heç xəbəri də olmayanlar çoxdur. (*Birdən coşğunluqla*) Amma vaxt gələr, bizi tanımağa, bizimlə hesablaşmağa məcbur olarlar! O zaman Amerikadakı hindular da bilərlər ki, Anjel kimdir.

A n j e l (*sərt*). Nə üçün təkcə Anjel?

S a v a l a n (*son dərəcə mehriban*). Ona görə ki, sən çox nəcib bir qızsan. (*Qənimətə*) Sənə nə olub? Qəm dəryasına qərq olmusan?

Q ə n i m ə t. Qətiyyən! Mən fikirləşirəm...

S a v a l a n. Nə fikirləşirsən?

Q ə n i m ə t. Fikirləşirəm ki, Fəridə yaxşı eləyib Ədalətə ərə gedib.

A n j e l. Necə?

Q ə n i m ə t. Evlənmək, ailə qurmaq üçün bizə ev-eşik lazım idi. Toy eləmək üçün pul lazım idi. Gəlinin geyinib adam içinə çıxması üçün yay-qış paltarı lazım idi... Qoluna qızıl saat, barmağına brilyant üzük lazım idi...

F ə r i d ə. Qızılsız-filansız da keçinmək olardı.

Q ə n i m ə t. Bütün bunları düzəltmək üçün Qənimət beş il işləyib pul yığmalı, Bakı Sovetində ev növbəsinə durmalı idi.

F ə r i d ə. Sən zarafat elə. Ancaq təəssüf ki, bunlar hamısı bir həqiqətdir. Ailə həyatı qurmaq üçün bizim imkanımız yox idi.

Q ə n i m ə t. Düzdür, yox idi... Aylıq təqaüdümü 30 yerə böləndə günümə bir manat iyirmi qəpik düşürdü. Həmişə kinoya, teatra biletimizi sən alırdın. Suya, dondurmaya sən qonaq eləyirdin.

F ə r i d ə. Yaxşı, məni kövrəltmə...

Q ə n i m ə t. Sən haqlısan, Fəridə. Ömür dayanıb bizi gözləmir. Mən səndən incimirəm.

A n j e l. Xahiş edirəm, bu nitqləriniz üçün başqa dinləyicilər tapasınız... Rəqs! Rəqs!

Anjel, Qənimət, Savalan coşğun rəqs edirlər. Fəridə də onlara qoşulur. Lakin oynaya bilmir. Çünki qəlbində, nə isə, bir ağırlıq var. Yoldaşlarının başı oyuna qarışanda Fəridə hiss olunmadan gedir. Bir azdan yoldaşları onun getdiyini bilirlər. Üçü də pərişan halda dayanır. Qısa pauza. Maşın qapısının açılıb-örtüldüyü eşidilir. Savalan pəncərəyə yaxınlaşır. Maşın səslənib uzaqlaşır.

S a v a l a n. Getdi... Maşınla getdi... Gözəl maşındır... (*Qısa pauza*)

Qənimət bakalını doldurub birnəfəsə içir.ıı

S a v a l a n (*Qənimətə*). Nə olub? Deyəsən, eşqin təzədən geri qayıtdı?

Q ə n i m ə t (*sərt*). Zarafatı burax!

S a v a l a n. Bağışla. (*Qısa pauza*)

Q ə n i m ə t (*son dərəcə mütəəssir*). Sizdən nə gizlədim, uşaqlar. O maşının səslənib getməsi ilə ürəyimdə elə bir dərin boşluq açıldı ki, elə bil, hamı çıxıb ayrı bir dünyaya getdi. Biz isə, bu Yer planetində yalqız qaldıq. (*Qısa pauza*) Mənə elə gəlir ki, onun ürəyində bizə, nə isə, bir sözü var idi.

Pauza.

A n j e l (*oxuyur*).

Mən ona deyirdim
Ömrümün baharı.
O pozdu ilqarı, ilqarı.
Aldatdı ruhumu
O şirin nəfəsi,
O şirin busəsi, busəsi.
Qar kimi yağaram, yağaram,
Yel kimi əsərəm, əsərəm,
Ardınca gəzərəm, gəzərəm, gəzərəm.
Eşqimin xətrinə, xətrinə hər
Möhnətə dözərəm, dözərəm,

Möhnətə dözərəm, dözərəm, dözərəm.
Od salıb qəlbimə,
O, getdi, gəlmədi.
Dərdimi bilmədi, bilmədi.
Ay keçir, gün keçir,
Sinəmdə bu həsrət,
Bir də ki, məhəbbət, məhəbbət...
Qar kimi yağaram, yağaram,
Yel kimi əsərəm, əsərəm,
Ardınca gəzərəm, gəzərəm, gəzərəm.
Eşqimin xətrinə, xətrinə hər
Möhnətə dözərəm, dözərəm,
Möhnətə dözərəm, dözərəm, dözərəm.

İşıq azalır. İşıq güclənəndə Fəridənin otağı. Savalan siqaret yandırır.

F ə r i d ə (*mütəəssir*). İncimə, Savalan. Bu portret mənim də arzum idi. Lakin... (*Səsini yavaşıdaraq*) Bu mümkün deyil.

S a v a l a n (*həyəcanla*). Axı, nə üçün? Bəlkə axşam Qənimətin ad günündə bizdən incimisən?

F ə r i d ə. Qətiyyən. Mən sizdən necə inciyə bilərəm.

S a v a l a n. Bəs, onda nə olub? Nə üçün istəmirsən?

F ə r i d ə (*bir növ taqətsiz*). Lazım deyil, Savalan.

S a v a l a n. Bəlkə mənim talantıma inanmırsan?

F ə r i d ə. Sənin talantına hamı, bütün adamlar inanırlar. Özün bilirsən ki, mən sənin talantındakı dərinliyə heyranam. Sən ucuz şöhrət üçün işləmirsən, həqiqi sənət yaradırsan. Lakin, bununla belə, mənim portretimi çəkməyin lazım deyil.

S a v a l a n (*dərindən nəfəsini alaraq*). Səbəbini deməsən, getməyəcəyəm. (*Birdən həyəcanla*) Biz üç yoldaşın heç zaman bir-birimizdən gizli sirrimiz olmamışdır. İndi nə üçün sən bu qədər qapalı olmusan? (*Ağır pauza*) Nə üçün dinmirsən?

F ə r i d ə (*güclə eşidiləcək səslə*). Ədalət razı deyil.

S a v a l a n (*bərkdən gülərək*). Demək, qısqanır...

F ə r i d ə (*birdən canlanaraq*). Yox, qısqanmır.

S a v a l a n. Bəs, nə üçün razı deyil?

F ə r i d ə. Deyir, xalqdan ayıbdır. Söz-zad çıxararlar.

S a v a l a n (*Hamletsayağı*). Yerlər! Göylər! Yoxsa, cəhənnəmin özünüdəmi çağırım... Sənin hörmətli ərin xalqdan iki əsr geridə qalmışdır. Xalq həmişə mərdliyi namərdlikdən ayırmağı, ağı qaradan seçməyi bacarır. Rica edirəm, bunu ona deyəsən. İndisə, əlvida! (*Siqaretini külqabıya basır*) Mən getdim.

F ə r i d ə (*məyus bir əlacsızlıqla*). Əlvida nə üçün?

S a v a l a n (*şeylərini götürərək*). Çünki biz bir daha görüşməyəcəyik.

Sanki Fəridənin bütün ruhu bir anda uçub gedir.

F ə r i d ə (*eyni halsızlıqla*). Niyə?

S a v a l a n. Ona görə ki, sən bizə tamam yad olmusan. Sən bizim tanıdığımız, sevdiyimiz Fəridə deyilsən. (*Ani pauza. Mehriban bir ifadə ilə*) Mənim sözlərimdən incimə, Fəridə.

F ə r i d ə (*güclə eşidilən səslə. Onun üzünə baxmadan*). İncimirəm..

S a v a l a n (*eyni mehribanlıqla, mütəəssir*). Sağ ol, Fəridə. (*Zarafatla*) İşdir, dünyadır, əgər, bir şey üçün sənə lazım olsaq, saçlarından iki tük qoparıb, bir-birinə toxunduraraq, bizi səsləyərsən. O saat yanında hazır olarıq.

Çıxır. Fəridə bir neçə saniyə donmuş kimi dayanır. Həyəcanla pəncərəyə yaxınlaşır. Sonra, bir təsəlli kimi, gündəliyini çıxarıb yazmağa başlayır.

F ə r i d ə n i n d a x i l i s ə s i. Mən öz ərimin xahişini yerinə yetirərək, Savalanın mənim portretimi çəkməsindən imtina etdim. O, həmişəlik çıxıb getdi. Mənə elə gəldi ki, onunla birlikdə bütün səmimi dostlarım, gəncliyimin əziz günləri də məni əbədi olaraq tərk eləyib getdi. Özümü soyuq, məyus bir yalqızlıq içində hiss edirəm. Mən özümə yer tapa bilmirəm.

Bayırda maşın səsi, Fəridə gündəliyi götürüb yeşiyə qoyur. Ədalət gəlir. Onun əlində balaca sumka və plaş vardır. Fəridə onun üstünə atılır. Uzun illərin həsrəti kimi ərini qucaqlayıb öpür...

Ə d a l ə t. Nə yaman qəribsəmisən.

F ə r i d ə. Səfərin necə keçdi?

Ə d a l ə t. Əla! (*Sumkasına işarə ilə*) Sənin üçün qiymətli hədiyyə almışam. Mavi brilyant! (*Külqabında siqaretin kötüyünə işarə ilə zarafatyana*). Bu lap macəra romanına bənzəyir... Kim gəlmişdi?

F ə r i d ə. Savalan.

Ə d a l ə t. Rəssam?

F ə r i d ə (*qəribə bir dalğınlıqla*). Məncə, biz ikimiz də ancaq rəssam Savalanı tanıyırıq.

Ə d a l ə t (*ani bir diqqətlə*). Elədir. (*Gülümsəyərək*) Nə oldu, portretin çəkilişinə başladınız?

F ə r i d ə (*eyni dalğınlıqla gülümsəyir*). Sən ki, razı deyildin, necə başlaya bilərdik...

Ə d a l ə t (*Fəridə üçün imtina etməyin çox ağır olduğunu hiss edir. Lakin üzə vurmur*). Təşəkkür edirəm.

F ə r i d ə (*birdən qeyri-adi bir qətiyyətlə*). Mən işləmək istəyirəm, Ədalət!

Ə d a l ə t. Necə yəni işləmək?

F ə r i d ə. Öz ixtisasım üzrə. Sənin gəlməyini gözləyirdim. Sabah gedəcəyəm nazirliyə.

Ə d a l ə t (*zarafatla*). Yoxsa, pulsuzlamısan?..

F ə r i d ə (*cavab onun xoşuna gəlmir*) Məgər, məsələ yalnız puldan ibarətdir?

Ə d a l ə t. Darıxırsan?

F ə r i d ə (*sərt*). Yox!

Ə d a l ə t (*onun əlindən tutaraq zarafatyana*). O... mənim ceyranım əsəbiləşib ki.

F ə r i d ə. Bəsdir... Sənə demişəm ki, mənə ceyran demə.

Ə d a l ə t. Dilim öyrənib. Axı, ceyran heyvanların ən qəşəngi, ən məsumudur.

F ə r i d ə. Nə olsun? Mən ki heyvan deyiləm. (*Ədalət bərkdən gülür*)

Ə d a l ə t. Yaxşı, axı, sən nəyə görə mütləq işləmək istəyirsən?

F ə r i d ə (*hərarətlə*). Ona görə ki, mən on altı il oxumuşam. Ona görə ki, anam, yoldaşlarım mənə bir cür baxırlar. Mən keçən gecə Qənimətin ad gününə getmişdim.

Ə d a l ə t (*bərk alınır, lakin üzə vurmur*). Qənimətin?

F ə r i d ə. Bəli, mən orada özümü o qədər pis, o qədər yabançı hiss edirdim ki... Özüm özümə lazımsız bir əşya kimi görünürdüm.

Ə d a l ə t (*təəccüblə*). Məgər, mənim varlığım sənin üçün bu qədər əhəmiyyətsizdir?

F ə r i d ə. Ancaq bir adam üçün yaşamaq çətindir.

Ə d a l ə t (*zarafatla*). Elə bilirdim ki, mən sənin üçün tamam bir aləməm...

F ə r i d ə. Sən mənim üçün bir aləm olmaqla bərabər, eyni zamanda, içində yaşadığımız cəmiyyətin bir üzvüsən. (*Gülümsəyir*) Axı, mən fizikəm. Bütün molekullar bir-biriləri ilə bağlı hərəkət elədikləri kimi, biz insanlar da bir-birimizə bağlıyıq. (*Qısa pauza*)

Ə d a l ə t. Nə üçün sən mənə deməmiş o məclisə gedirdin?

F ə r i d ə. Sən burda yox idin.

Ə d a l ə t. Yox idim – demək, getmək lazım deyildi. Mən bilirəm ki, sənin ürəyində ona qarşı heç bir şey yoxdur və ola da bilməz. Mən özümü hər yetənlə müqayisə etmək fikrində də deyiləm... Lakin...

F ə r i d ə (*alınaraq*). Yox, Ədalət, Qənimət "hər yetən" deyil. O da, Savalan da çox dəyərli oğlanlardır. Əgər, sən onları tanıyıb qiymətləndirmirsənsə...

Ə d a l ə t (*soyuq*). Mən görürəm ki, bizim söhbətimiz çox arzu-olunmayan yerə gedib çıxa bilər. Ona görə də, burda nöqtə qoyaq. (*Zarafatyana*) Arzu eləyək ki, sən öz ərindən xəbərsiz heç bir məclisə getməyəsən.

F ə r i d ə. Olsun. Ancaq mən işə gedəcəyəm!!

Ə d a l ə t (*sərt və qəti*). Yox, Fəridə, sən işə getməyəcəksən. Çünki bu saat bizim buna ehtiyacımız yoxdur; qaldı yoldaşlarının sənə bir cür baxması, məncə, bu da səbəb ola bilməz. Çünki sən, birinci növbədə, mənim bu işə necə baxmağımla hesablaşmalısan. Ümumiyyətlə, mən sənin əvvəlki student yoldaşlarınla oturub-durmağının tərəfdarı deyiləm.

F ə r i d ə. Nə üçün?

Ə d a l ə t (*sərt*). Çünki onlar bizim səviyyəmizdə adamlar deyillər.

F ə r i d ə. Dedim ki, onlar çox ləyaqətli adamlardır!

Ə d a l ə t (*səbrsiz*). Başa düş, Fəridə, sənin belə hərəkətlərin mənim hörmətimi korlaya bilər.

F ə r i d ə. Başa düşmürəm. (*Öz-özü ilə danışır kimi*) Mən tamam bir anlaşılmazlıq içindəyəm.

Ə d a l ə t. Qəribədir... (*Siqaret yandırır*)

F ə r i d ə (*sanki özü öz fikirlərinə cavab verir*). Yox... Mən mütləq işə getməliyəm. Mən özümü pis hiss edirəm. Mən adamların arasında olmaq istəyirəm.

Ə d a l ə t (*əsəbini gizlətməyə çalışır*). Məgər, biz adamlar arasında deyilik? Məgər, sən hər gecə qonaqlıqlara, konsertlərə getmirsən? Məgər, bizə tanışlar, dostlar gəlmirlər?

F ə r i d ə. Mən heç bir zaman sənin dostlarının, tanışlarının məclisində özümü sərbəst hiss eləyə bilmirəm.

Ə d a l ə t. Axı, nə üçün?

F ə r i d ə. Bilmirəm... Mənə elə gəlir ki, onlar heç bir zaman öz ürək sözlərini demirlər... Heç bir zaman əslində düşündükləri kimi danışmırlar... Mən onları tanıya bilmirəm... Elə bil ki, maska taxırlar. Mən onlardan qorxuram.

Ə d a l ə t (*özünü saxlaya bilməyərək*). Bəsdir, Fəridə! Sən bununla məni də təhqir eləyirsən.

F ə r i d ə. Qətiyyən. Mən yalnız hiss etdiklərimi deyirəm. Doğrusunu bilmək istəyirsənsə, mən özüm də onların yanında dönüb ayrı cür oluram. Süni, qeyri-səmimi...

Ə d a l ə t. Axı, belə olmağa səni nə məcbur edir?

F ə r i d ə. Yəqin ki, ümumi vəziyyət. Ümumi mühit, maskarada girən gərək maska taxsın! Mən yalandan gülürəm, yalandan şənlik edirəm.

Ə d a l ə t. Məgər, mənim dostlarımın məclisində həqiqi səmimiyyət yoxdur?

F ə r i d ə (*ürəkdolusu*). Yoxdur! (*Qısa pauza*) Ah, Ədalət, sən bircə bilsəydin ki, o qızıl dişli yaltaqların süni gülüşləri, süni tərifləri məndə nə qədər dərin nifrət doğurur... Mənə elə gəlir ki, onlar daldada baş kəsirlər.

Ə d a l ə t. Demək, həqiqi səmimiyyət ancaq qara camaatdadır...

F ə r i d ə (*təəccüblə*). Qara camaat? Məgər, indi belə termin var?

Ə d a l ə t (*əsəbi*). Mən adi adamları nəzərdə tuturam.

F ə r i d ə. Mənim üçünsə adi və qeyri-adi adam yoxdur. Həqiqi, mərdanə insanlar var.

Ə d a l ə t. O da ancaq sənin dostlarındır!

F ə r i d ə. Sən nahaq istehza eləyirsən. Onlar nə üçün yaşadıqlarını bilirlər.

Ə d a l ə t. Bəlkə, sən məni də qeyri-səmimi, mənasız bir adam hesab edirsən?

F ə r i d ə (*sanki bunun, həqiqətən də, belə olduğundan qorxaraq, ani bir vahimə içində ərinə diqqətlə baxır, sonra bu şübhələrini özün-*

*dən rədd edirmiş kimi həyəcanla*). Yox... yox, əgər, elə olsaydı, mən səni sevməzdim. Sənin arvadın olmazdım. Sən elə deyilsən. Onlar hamısı sənə yaltaqlanan rəzillərdir. Nə üçün sən onların başını-gözünü əzib qovmursan! Qoy cəhənnəm olsun onların hədiyyələri də, özləri də! (*Bu zaman kimsə bərkdən gülür və nə üçünsə Fəridənin gözünə skelet kişinin dəhşətli üzü görünür. Qız qorxaraq bir addım geri çəkilir. Kişinin xəyalı yox olur. Fəridə eyni vahimə içində öz-özü ilə danışırmış kimi pıçıldayır*) Bəlkə iş üçün lap bu saat getmək lazımdır?! Bəlkə Qənimətə zəng eləyim? O, gedib danışsın?

Ə d a l ə t (*qətiyyətlə*). Sən heç bir yerə getməyəcəksən, Fəridə!

F ə r i d ə. Necə, mən işə girməyəcəyəm?

Ə d a l ə t. Yox! (*Qışqırır*) Burax bu Qənimətləri! Hələ məlum deyil, sənin dostların yaxşı adamlardır, yoxsa mənimkilər.

F ə r i d ə (*dərin anlaşılmazlıq içində*). Doğrudanmı, sən onların alçaqlığını görmürsən, Ədalət? Doğrudanmı, hər ay gəlib səndən pul alan skeletin dəhşətini hiss eləmirsən?

Ə d a l ə t. Rica edirəm, mənim işlərimə qarışmayasan! (*Fəridə təəccüblə ona baxır. Telefon zəngi. Ədalət əsəbi hərəkətlə dəstəyi götürür. İşıq eyni zamanda telefon xəttinin o biri ucunda olan Anjelin üzərinə düşür*) Eşidirəm.

A n j e l. Mən səni gözləyirəm.

Ə d a l ə t. Sonra!

A n j e l. Mən səni bu gün, bu saat gözləyirəm! Eşidirsənmi?!

Ə d a l ə t (*çarəsiz*). Yaxşı... (*Dəstəyi asır. Anjelin üzərinə düşən işıq sönür*)

F ə r i d ə. Nə olub?

Ə d a l ə t. Heç nə. Moskvadan adam gəlib... Mənimlə görüşmək istəyir.

F ə r i d ə. Bəs, niyə bir cür oldun?

Ə d a l ə t (*əsəbi*). Bu görüşlər adamı yorur, təngə gətirir. (*Çıxır*)

Fəridə həyəcan içindədir. O özünə yer tapa bilmir. Qapı zəngi. Fəridə gedib açır. Həmin skelet kimi arıq, əcaib kişi qapıda dayanmışdır.

F ə r i d ə (*ani bir vahimə içində*). Nə istəyirsiniz? (*Kişi susur*) Nə istəyirsiniz? (*Skeletəbənzər kişi eyni sükut içində baxır*) Kişi, lalsan?

S k e l e t ə b ə n z ə r k i ş i (*gözlənilməyən bir gümrahlıqla*). Bəli.

F ə r i d ə. Necə lalsan ki, danışırsan?

S k e l e t ə b ə n z ə r  k i ş i. Mən danışan lalam, xanım.

F ə r i d ə (*qorxu və maraq içində*). O nə deməkdir?

S k e l e t ə b ə n z ə r  k i ş i. Onun nə demək olduğunu Yer üzündə bir mən bilirəm, bir də sizin əriniz.

F ə r i d ə. Mən necə? Bilə bilərəm?

S k e l e t ə b ə n z ə r  k i ş i. Onu ərinizdən soruşun.

Pauza. Fəridə indi qorxmur. Nəyi isə aydınlaşdırmağa çalışır. Fəridə qayıdıb o biri otaqdan çıxan Ədalətlə qarşılaşır.

Ə d a l ə t. Kim idi?

F ə r i d ə (*key kimi*). Kişi.

Ə d a l ə t. Hansı kişi?

F ə r i d ə. Lal... Skeletəbənzər kişi. (*Vahimə içində*) Qəribədir, danışa bildiyi halda, deyir, lalam. (*Ədalət cəld gedib kişiyə pul verir. Skeletəbənzər kişi gedir. Ədalət nə isə düşünür. Sonra iti addımlarla gedir*) Bu nədir?.. Yoxsa, mən dəli oluram... (*Ətrafı təəccüblə gözdən keçirir*) Elə bil ki, birdən-birə hər şeyə qarşı məndə qəribə bir soyuqluq, bir yadlıq əmələ gəlib... hətta, hətta... Ədalətin özünə qarşı da.

İşıq sönür. Yananda Anjelin evi. Anjel və Savalan.

A n j e l. Mən heç kəsi sən düşündüyün mənada sevə bilmirəm, Savalan.

S a v a l a n (*həyəcanla*). Axı nə üçün?

A n j e l. Çünki məni aldadıblar. Mənim ilk sevgimi ayaqlar altına salıb tapdalayıblar. Mən məhəbbətə olan inamımı itirmişəm.

S a v a l a n. Əgər, aldadıblarsa, bunda sənin təqsirin yoxdur.

A n j e l. Yox, mənim təqsirim var. Biz qızlar həmişə bütün günahı kişilərin boynuna qoymağa adət etmişik. Biz hissiyyata daha tez qapılırıq, daha tez zəiflik göstəririk, daha tez inanırıq, halbuki bizim öz mənliyimizi, namusumuzu hərraca qoymağa ixtiyarımız yoxdur. Çünki dünyaya gələn yeni insanın taleyi, gələcəyi üçün, birinci növbədə, biz analar cavabdehik!

S a v a l a n. Nə üçün "birinci növbədə" siz?

A n j e l. Bilmirəm... Yəqin, ondan ötəri ki, biz uşağa sizdən daha çox yaxınıq, biz daha çox əziyyət çəkirik.

S a v a l a n (*onun əlindən tutaraq*). Anjel! Mən səni sevirəm! Madam ki, sən öz təqsirini bu qədər dərindən hiss etmisən, demək, biz onun üzərindən qırmızı bir xətt çəkə bilərik.

A n j e l (*əli oğlanın əlində başını bulayır*). Yox, Savalan. Sən həyata indi-indi qədəm qoyan, böyük ideallarla yaşayan gül kimi təmiz bir oğlansan. Sənin və yoldaşlarının mənəvi acizliyə, ikiüzlülüyə, idealsızlığa qarşı hücum mövqeyi tutmağınız mənim xoşuma gəlir. Mən sənin özünə də, istedadına da heyranam, ona görə də, sənə gəlmərəm!

S a v a l a n (*öz-özü ilə danışırmış kimi*). Qəribə məntiqdir. (*Birdən coşğun həyəcanla*) Biz tamamilə yeni bir həyata başlayırıq! Sənin gözəl duyğuların, gözəl arzuların yenidən qayıdar...

A n j e l. Bəlkə də... Lakin indi mənim özümdən başqa daha vacib qayğılarım var.

S a v a l a n. Nədir onlar? Bilmək olmaz? (*Anjel "yox" mənasında başını bulayır.*.) Eh... Anjel... Mənə elə gəlir ki, sən yenə də səhv edirsən.

A n j e l (*qətiyyətlə*). Yox! Mən daha səhv etməyəcəyəm. (*Yaxınlaşıb onun üzündən öpərək*) İndisə get, Savalan. (*Saatına baxır*) Bu saat bura başqa bir adam gələcək. Mənim onunla mühüm söhbətim var.

S a v a l a n (*məyus*). Biz bir daha görüşməyəcəyik?

A n j e l. Nə üçün görüşmürük... (*Mehriban təbəssümlə*) Biz həmişəlik dost, sirdaş olacağıq. (*Ruhla*) Qənimətə salam de.

S a v a l a n (*çox pərişan*). Anjel.

A n j e l (*eyni mehriban təbəssümlə onun əlindən tutur*). Mənim əzizim... Tezliklə hər şey keçib gedəcəkdir... Sən gənc, gözəl bir qızla evlənəcəksən... və bir gün küçədə qoca Anjelə rast gəlib bir zaman ona aşiq olduğuna ürəyində güləcəksən.

S a v a l a n (*üsyanla*). Heç vaxt! Necə olacaq ki, sən qocalacaqsan, biz cavan qalacayıq?

A n j e l. "Biz!" (*Gülür*) Demək evlənəcəksən? (*Dərindən nəfəs alaraq*) Sağ ol, mənim rəssamım! Mən sənin yaradıcılığını həmişə ürək döyüntüsü ilə izləyəcəyəm!

S a v a l a n (*məyus*). Hələlik, Anjel!..

A n j e l. Hələlik, Savalan!.. (*Savalan çıxır. Anjel onun ardınca uzun bir nəzər salaraq öz-özünə)* Mən özümdən, öz səadətimdən imtina etmirəm, Savalan! Lakin mən bundan sonra oğlum üçün yaşayacağam! Mən onun sənin kimi namuslu, mərd bir oğlan olmasına çalışacağam. (*Kinli bir qətiyyətlə*) Və mən buna müvəffəq olacağam! (*Qapı zəngi. Anjel açır. Ədalət gəlir*)

Ə d a l ə t. İndi buradan gedən o rəssam idi?

A n j e l. Bəli, necə məgər?

Ə d a l ə t. Heç... elə-belə.

A n j e l. Niyə soruşmursan ki, nə üçün gəlmişdi?

Ə d a l ə t. Nə üçün soruşmalıyam? Sənin kimi cavan qadının evinə niyə gələrlər?

A n j e l. Yaxşı. Sən uşağa nə vaxt öz familiyanı verəcəksən?

Ə d a l ə t. Bu mümkün deyil, Anjel.

A n j e l. Nə üçün?

Ə d a l ə t. Çünki sən bununla mənim ailə həyatımı pozacaqsan. Əgər, Fəridə bu əhvalatı bilsə...

A n j e l (*sakit*). Mən indiyə qədər bu barədə ona bir söz deməmişəm. Hətta, o, mənim uşağım olduğunu da bilmir. Mən bundan sonra da susacağam.

Ə d a l ə t. Uşağı mənim familiyama yazdırandan sonra gizləmək olmaz.

A n j e l (*səbrlə*). Mən bir daha Fəridənin gözünə görünmərəm!

Ə d a l ə t. Məsələ yalnız gözünə görünməməkdə deyil.

A n j e l (*ona diqqətlə baxaraq*). Mən, indiyə qədər səndən aliment tələb eləmədiyim kimi, bundan sonra da eləməyəcəyəm!

Ə d a l ə t (*yalvarışla*). Anjel! Qoy o sənin familiyanda qalsın.

A n j e l (*səbrlə*). Gələcəkdə o məndən soruşmaz ki, atam kimdir?

Ə d a l ə t. Gələcək hələ uzaqdadır... O barədə sonra düşünərik.

A n j e l. Bəs, indi soruşanlara nə cavab verim?

Ə d a l ə t. Bir söz tapıb demək olar...

A n j e l. Bircə sənin adın olmasın, eləmi?

Ə d a l ə t. Anjel! Özün hər şeyi başa düşürsən... Ailə... vəzifə, axı, hamı məni təmiz bir adam kimi tanıyır.

A n j e l. Daha yaxşı. Görərlər ki, sən, namuslu bir adam kimi öz vicdani borcunu yerinə yetirirsən.

Ə d a l ə t. Sən uşağı da götür, yenə də qayıt Moskvaya, mən hər ay sənə istədiyin qədər pul göndərərəm.

A n j e l (*istehza ilə*). Sənin maaşın ancaq öz ailənə çatar. Mənə istədiyim qədər pulu hardan göndərəcəksən?

Ə d a l ə t. Onun sənə dəxli yoxdur.

A n j e l. Yox, dəxli var! Sən deyirsən ki, təmiz adamsan... Bizdə təmiz adam, ancaq maaş cədvəlinə qol çəkib aldığı pulla yaşayır.

Ə d a l ə t. Mənim necə adam olduğumu bilirlər. Amma mən sənin uşağının atası olduğumu bilmirəm. Mən buna inanmıram!

A n j e l. Nə üçün?

Ə d a l ə t. Çünki səni məndən başqaları da tanıyırdı.

A n j e l. Axı, sən bilirsən ki, biz tanış olanda mən bakirə qız idim. Mənim on səkkiz yaşım hələ tamam olmamışdı.

Ə d a l ə t. Mən heç nə bilmirəm və sən də mənə heç nə sübut eləyə bilməzsən!

A n j e l. Sən əsəbiləşdiyin üçün bu cür danışırsan... yoxsa, elə belə də düşünürsən?

Ə d a l ə t. İndi ki, sən yaxşı sözü eşitmirsən, mənim mövqeyimi nəzərə almırsan, o zaman mənim də ixtiyarım var istədiyim kimi düşünüm...

A n j e l. Amma, əslində, uşağın atası olduğunu inkar eləmirsən?

Ə d a l ə t. Lazım gələrsə, inkar eləyə bilərəm və hamı da mənə inanar.

A n j e l. Burda səninlə məndən başqa ayrı adam yoxdur. Xahiş edirəm, bir sualıma düzgün cavab verəsən.

Ə d a l ə t. Buyur.

A n j e l. Sən keçən dəfə Moskvada gördün ki, o sənə nə qədər oxşayır. Necə qəşəng uşaqdır!..

Ə d a l ə t. Sonra?

A n j e l. İndi sən, özündə ona qarşı, az da olsa, atalıq duyğusu hiss eləmirsən?

Ə d a l ə t (*tərəddüdsüz*). Yox.

A n j e l. Heç?

Ə d a l ə t. Heç!

A n j e l. Bu üç ildə o bir dəfə də olsun sənin yadına düşməyib?

Ə d a l ə t. Yox.

A n j e l (*alma ilə dolu vazanın yanındakı şiş bıçağı götürərək). Mən and içmişəm ki, əgər, sən uşağı öz familiyana yazdırmağa razı olmasan, bu bıçağı sancam düz ürəyinin başına, lakin bu etirafından sonra sənin ölüb-ölməməyin nə mənə lazımdır, nə də oğluma. (Bıçağı yerə tullayaraq*) Gedə bilərsən.

Ə d a l ə t. Bəlkə... bir kömək-zad...

A n j e l. Gedə bilərsən!

Ə d a l ə t. Bəlkə... bir az pul...

A n j e l (*qışqırır*). Rədd ol! (*Ədalət çıxır. Bayırda maşın səslənib, uzaqlaşır. Anjel siqaret yandırıb bir-iki qullab vurur. Sonra o biri otağa keçir. Səhnə bir neçə saniyə boş qalır. Qapı zəngi. Anjel səhnədən keçərək qapını açır. Fəridə daxil olur. O, gərgin əhvali-ruhiyyədədir. Anjel bayaqkı əhvalatdan sonra özünü ələ almağa çalışaraq*) Nə olub?

F ə r i d ə. Heç nə...

A n j e l. Yenə də...

F ə r i d ə. Mən səninlə söhbətə gəlmişəm, Anjel.

A n j e l. Nə barədə?

F ə r i d ə. Özüm barədə.

A n j e l (*gülümsəyərək*). Sənin kimi xoşbəxt xanımın özü barədə söhbəti maraqlıdır.

F ə r i d ə. Yox, Anjel. Mənim xoşbəxtliyimdə nə isə çatışmır.

A n j e l (*siqaretindən dərin bir qullab alaraq, ciddi*). Səncə, çatışmayan nədir?

F ə r i d ə. Bilmirəm. (*Qısa pauza*) Anjel, sən məndən təcrübəlisən. Çox yerlər gəzmisən... Çox adamlar görmüsən... Ona görə də, mən səninlə məsləhətləşmək istəyirəm.

A n j e l. Mən səni dinləyirəm, Fəridə... (*Qısa pauza*)

F ə r i d ə (*çətinliklə*). Sən bilirsən ki, mən ərimi çox sevirəm.

A n j e l. Hiss edirəm.

F ə r i d ə. Ancaq onda bəzi xasiyyətlər meydana çıxır ki, bu, məni yaman narahat edir.

A n j e l. Məsələn?

F ə r i d ə. Məsələn, Savalan mənim portretimi çəkmək istəyirdi, o razı olmadı.

A n j e l. Sən də güzəştə getdin.

F ə r i d ə. Bəli... Sonra mənim Qəniməti təbrik eləməyə getməyim onu çox acıqlandırdı... O, mənə onlarla görüşməyi qəti qadağan etdi... Mən bütün yoldaşlarımdan, bütün mənə tanış həyatdan ayrılmışam. Mən özümü qızıl qəfəsə salınmış quş kimi hiss edirəm. Sonra ən pisi də budur ki, o mənim işə girməyimə razılıq vermir. Deyir, sənin işləməyinə bizim ehtiyacımız yoxdur.

A n j e l (*gülümsəyir*). Doğru deyir də... Hər gün o qədər qiymətli hədiyyələr gələn bir ailənin...

F ə r i d ə (*hərarətlə*). Axı, nəyə görə bizə o qədər qiymətli hədiyyələr gəlməlidir? O hədiyyələri gətirənlərin özləri o qədər pulu hardan alırlar?

A n j e l (*qəsdən*). Onun sənə dəxli yoxdur. Sənin borcun yaxşı geyinmək, yaxşı yeyib-içmək və öz sevimli ərini razı salmaq, əyləndirməkdir.

F ə r i d ə (*heyrətlə*). Anjel!

A n j e l. Nə var?! Sən ki, onu sevirsən?

F ə r i d ə. Nə olsun! Məgər, sevmək bütün həyatdan ayrı düşmək, kölə olmaq deməkdir?

A n j e l (*öz-özü ilə danışırmış kimi*). Bizim faciəmiz ondadır ki, öz səhvimizi sonradan başa düşürük.

F ə r i d ə (*həyəcanla*). Anjel, mən səndən məsləhət, təsəlli almağa gəlmişəm.

A n j e l. Mənim verəcəyim məsləhət qorxuram sənin üçün ağır olsun, Fəridə.

F ə r i d ə. Nə üçün?

A n j e l. Çünki sənin ərin çox mahir bir fırıldaqçıdır.

F ə r i d ə (*qışqırır*). Sən nə ixtiyarla onun haqqında belə sözlər danışırsan?

A n j e l (*eyni soyuqqanlılıqla*). Əlbəttə, ixtiyarım olmasaydı, danışmazdım.

F ə r i d ə. Yalandır! O, namuslu adamdır!

A n j e l. Ş...ş... Sakit! Siqaret istəyirsən?

F ə r i d ə. İstəmirəm. (*Anjel onun qolundan tutaraq o biri otağa çəkir*)

A n j e l i n s ə s i. Necə oğlandır?

F ə r i d ə n i n s ə s i (*acıqlı*). Çox qəşəngdir... Kimin uşağıdır.

A n j e l i n s ə s i. Mənim.

F ə r i d ə n i n s ə s i. Bəs, niyə indiyə qədər deməmisən?

A n j e l i n s ə s i. Onun səbəbini sonra bilərsən... Gözlərinə, alnına, ağzına diqqətlə bax! (*Qısa pauza*) Kimə oxşayır!

F ə r i d ə n i n s ə s i (*həyəcan, qorxu içində*). Yox... Ola bilməz!

A n j e l (*amiranə qışqırır*). Kimə oxşayır?!

Fəridə əlləri ilə üzünü tutmuş olduğu halda dəhşətlə səhnəyə daxil olur.
Anjel də onu təqib edir.

F ə r i d ə. Ola bilməz! (*Qısa pauza. Anjel siqaret yandırır. Fəridə birdən ona sarı dönərək, tamam taqətdən düşmüş halda*) Bəs, sən nə üçün bunu məndən gizlədirdin, Anjel?

A n j e l. Çünki sən ərini sevirdin... Sən göyün yeddinci qatındaydın. Əgər, o, bir az bundan əvvəl, burada, mənim qarşımda öz günahını etiraf eləyib uşağı familiyasına yazdırmağa razılıq versəydi, mən yenə də sənə heç nə deməzdim. Lakin o, öz doğma oğlundan da imtina etdi. Sən isə, məndən onun haqqında məsləhət almağa gəlmisən.

Fəridə sanki birdən canlanaraq, möhkəm addımlarla otaqdan çıxır,
Anjel siqaret yandırır. Sonra telefona yaxınlaşaraq zəng edir.

A n j e l (*telefona*). Alo, rica edirəm qonşuluğunuzdan Savalanı çağırasınız. (*Qısa pauza*) Alo! Savalan! Mən Fəridənin anasının telefonunu bilmirəm. Tez ona zəng elə, qoy getsin Fəridəgilə... heç nə olmayıb... Fəridə bərk əsəbiləşib. Sonra deyərəm. Yaxşı olar ki, sən də gedəsən. Gecikməyin.

Dəstəyi asaraq özü də yüyürür. İşıq bir an sönüb yenə də yanır. Fəridə öz evinə daxil olaraq, gündəliklərini yandırır. Gövhər, Ədalət, sonra isə Qənimətlə Savalan gəlir. Ədalət o biri otağa keçmək istəyərkən skelet kişi ilə qarşılaşıb dayanır. Fəridə çamadanını götürərək Gövhərlə ağır-ağır gedir. Qənimətlə Savalan dayanıb baxır. Anjel həyəcanla yüyürərək daxil olur. Fəridəgilin ardınca baxır. Sonra qabağa gələrək zala müraciət edir.

A n j e l. Siz elə güman etməyin ki, mən Ədalətdən intiqam almaq üçün belə etdim... Yox! Mən bayaq dedim ki, o, mənim üçün də, oğlum üçün də bir heçdir. Lakin mən Fəridə kimi yaxşı bir qızın bu heçə qurban getməsinə dözə bilmədim. (*Sonra pərdə Anjelin sözsüz mahnısı altında ağır-ağır enir*)

P ə r d ə

*1969*

# XURŞUDBANU NATƏVAN

## İ Ş T İ R A K  E D İ R L Ə R

X u r ş i d b a n u  N a t ə v a n
C a n i ş i n
K n y a z  X a s a y
S e y i d  H ü s e y n
H i d a y ə t  x a n
M i r z ə  R u h u l l a h
N ə v v a b
M a m a y ı
T e r  V a h a n
Z a h i r  b ə y
Q o c a  k n y a z
D a ş d ə m i r
B ə y i m
K o r  k a m a n ç a ç ı
T ə h m i n ə
Ş a h m a r
M ö h n ə t
F ə r ə c  b ə y
Q a l a  r ə i s i
M i x a y l o v
Ş a h z a d ə
M ə l i k ü l d ö v l ə
M u r a d a l ı

## BİRİNCİ PƏRDƏ

### BİRİNCİ ŞƏKİL

Qafqaz canişininin malikanəsi. Pərdə açılanda geniş otaqda Xurşidbanu ilə Mirzə Ruhullah sükut içində dayanıb zala baxırlar. Knyaz Xasay iti addımlarla gəlib Xurşidbanunun qarşısında dayanır.

K n y a z  X a s a y. Canişin cənabları indi buyurub sizi dinləyə-cəklər, Banu bəyim.

X u r ş i d b a n u. Təşəkkür edirəm, knyaz.

K n y a z  X a s a y. Qulluğunuzda həmişə hazıram, Banu bəyim.

X u r ş i d b a n u. Bu mənim üçün böyük iltifatdır, knyaz.

K n y a z X a s a y. Mən sizin haqqınızda lap əfsanəyə bənzər gözəl söhbətlər eşitmişəm.

X u r ş i d b a n u. Sən mənim haqqımda zəhərli sözlər də eşidə bilərsən, knyaz.

K n y a z X a s a y. Ola bilməz! Bütün Azərbaycan sizinlə fəxr etməlidir.

X u r ş i d b a n u. Bu sözləri səndən eşitmək mənim üçün xoşdur, knyaz. Qarabağa qonaq gəlsən, bizi şad etmiş olarsan...

K n y a z X a s a y. Böyük məmnuniyyətlə gələrəm, Banu bəyim.

Ortayaşlı, yaraşıqlı bir adam olan canişin otağa daxil olur.

C a n i ş i n. Xoş gəlmisiniz, madmazel. Sizi gördüyümə çox şadam. Rica edirəm, əyləşin. (*Xurşidbanu ilə canişin əyləşirlər*) Sizin nəslinizə dərin hörmətim olduğuna əmin ola bilərsiniz, madmazel. Qaladakı çinovniklərimizdən razısınızmı? Onlar sizə lazımi qədər hörmət edirlərmi?

X u r ş i d b a n u. Onlarla elə yaxın münasibətim olmasa da, güman edirəm ki, mənə hörmət eləməyə bilməzlər, knyaz həzrətləri.

C a n i ş i n (*Banunun ötkəm cavabına bir qədər təəccüb eləsə də, özünü o yerə qoymur*). Əlbəttə, İbrahim xanın nəvəsinə, general Mehdiqulu xanın qızına hörmət hər kəsin borcudur. Eşitdiyimə görə, siz həm də gözəl şairəsiniz. Sizin haqqınızda kapitan Mirzə Fətəli Axundov mənə danışmışdır. Mən azərbaycanlıların igidliyinə heyranam. Elə bil ki, Allah özü də onların qəhrəmanlığını gözəl Qarabağ atları ilə mükafatlandırıb. Ancaq təəssüf ki, belə cəsur xalqın yarısı sizdən ayrı düşüb.

X u r ş i d b a n u. Bu, bizim faciəmizdir, knyaz həzrətləri. İki böyük dövlətin, qədim bir tarixi olan Azərbaycan xalqını iki yerə parçalayıb, qardaşı qardaşdan ayırmaları ədalətli iş deyildir.

C a n i ş i n. Tarixin hadisələri bəzən elə cərəyan edir ki, ağıllı hökmdarlar belə, amansız hərəkətlərə məcbur olurlar. (*Söhbəti dəyişir*) Sizin Tiflisə təşrif buyurmağınızın səbəbi mənə məlumdur, madmazel. Mən çalışaram atanızdan qalan mülkün bir hissəsi sizə qaytarılsın.

X u r ş i d b a n u. Knyaz həzrətləri, mən bütün mülklərimizin qaytarılmasını tələb edirəm. Mən varisiyektayam!

C a n i ş i n (*zarafatyana*). Siz tək qızsınız, o qədər mülk nəyinizə lazımdır?

X u r ş i d b a n u (*həyəcanla*). Mən tək deyiləm, knyaz həzrətləri! Mənim yaşadığım Şuşa şəhərinin əhalisi hələ də şor su içir! Kəndlilərimizin uşaqları məktəbsiz, elmsiz, kitabsız böyüyürlər. Mən onlara heç bir kömək eləyə bilmirəm.

C a n i ş i n (*qısa pauzadan sonra*). Yaxşı, madmazel, mən sizin xahişinizi olduğu kimi əlahəzrət imperatora çatdıraram. Ümid edirəm ki, imperator həzrətləri İbrahim xanın nəvəsindən öz iltifatını əsirgəməz.

X u r ş i d b a n u. Təşəkkür edirəm, knyaz həzrətləri. (*Qalxır*)

C a n i ş i n (*qalxır*). Arzu edirəm knyaginyanın təşkil etdiyi bu gecəki balda siz də vaxtınızı xoş keçirəsiniz. Zənn edirəm Knyaz Xasay sizi bala müşayiət etmək şərəfini qəbul edər.

K n y a z X a s a y. Məmnuniyyətlə.

X u r ş i d b a n u. Diqqətinizə qarşı minnətdaram, knyaz həzrətləri. İcazənizlə biz bu gün Şuşa qalasına yola düşməliyik.

C a n i ş i n. Nə deyə bilərəm, sizə yaxşı yol. (*Əl tutuşur*)

Xurşidbanu, Knyaz Xasaya da baş əyərək, Mirzə Ruhullanın müşayiəti ilə çıxır.

C a n i ş i n (*Xurşidbanunun ardınca baxaraq*). Ağıllı qızdır. (*Zarafatyana*) Knyaz, siz nə vaxtacan subay gəzəcəksiniz?

K n y a z X a s a y (*canişinin eyhamını başa düşərək, zarafatyana*). Görünür, tale özü qəsdən məni indiyə qədər dayandırırmış, knyaz həzrətləri.

C a n i ş i n (*gülümsəyir*). Eləmi?.. Xurşidbanu həqiqətən şahanə xanımdır... (*Zarafatyana*) Madam ki, tale sizi indiyə qədər subay gəzməyə məcbur eləmişdir, demək, indi öz bəxtinizi sınaya bilərsiniz... Əgər, Xurşidbanu ilə evlənsəydiniz, mən sizi ürəkdən təbrik edərdim... Zənn edirəm ki, bu izdivac əlahəzrət imperatorun özünə də xoş gələrdi. Siz ona sadiq, onun taxt-tacına yaxın müsəlman kübarısınız... İbrahim xanın nəvəsilə sizin izdivacınız Azərbaycan xalqına da psixoloji cəhətdən müsbət təsir edər, imperator hakimiyyətinə qarşı onların hüsn-rəğbətini artırar. (*Zarafatyana*) Necə deyərlər, siz bizi onlarla qohum edərsiniz.

K n y a z X a s a y. Başa düşürəm, əlahəzrət... Lakin mən namuslu adamam. Yalnız siyasətə görə evlənmək...

C a n i ş i n. Yox, knyaz, etiraf eləyin ki, bu gözəl xan qızı sizi məftun etmişdir.

K n y a z  X a s a y (*zarafatyana*). Bu hələ işin bir cəhətidir, əlahəzrət...

C a n i ş i n. Mən, Xurşidbanunun indi gedərkən sizə saldığı ani baxışından hiss elədim ki, bu məhəbbət qarşılıqlı ola bilər. (Zarafatyana) Axı, mən də belə incə duyğuların köhnə xiridarıyam...

K n y a z  X a s a y (*bir növ şadlıqla*). O məni Şuşa qalasına qonaq dəvət elədi.

C a n i ş i n. Gedin, knyaz.

K n y a z  X a s a y (*yarızarafatla*). Doğrusu, əlahəzrət, nə isə, özümdə bir cəsarətsizlik hiss edirəm.

C a n i ş i n. Cəsarətsizlik? İnanmaram. Siz ki, kübar salonlarının pələngisiniz! Təkrar edirəm ki, sizin Azərbaycan xanzadəsilə izdivacınız əlahəzrət imperatora da xoş təsir bağışlayar.

K n y a z  X a s a y. Qarabağ camaatı şiədir. Qorxuram onların böyük ruhaniləri keçmiş Qarabağ hakimi İbrahim xanın varisi olan Xurşidbanunun kənardan gəlmiş bir sünnüyə ərə getməsinə razılıq verməsinlər. Onlar çox mütəsib olurlar.

C a n i ş i n. Güman etmirəm Xurşidbanu kimi yüksək təhsil görmüş açıqfikirli bir qız elə xurafatlarla hesablaşsın... Mən sizin səfərinizin uğurlu olacağına əminəm...

K n y a z  X a s a y (*ruhla*). İmperator həzrətlərini məmnun etmək mənim üçün şərəfdir!

İ ş ı q  s ö n ü r

## İKİNCİ ŞƏKİL

İşıq yananda Şuşa qalası görünür. Xurşidbanunun malikanəsi. Zahir bəy eyvandan bağçaya düşərkən qarşıdan gələn Nəvvabla qarşılaşır.

Z a h i r  b ə y. Salam, Mirzə Nəvvab.

N ə v v a b (*istehza qarışıq zarafatla*). Salam olsun böyük şair Zahir bəy Fədaya.

Z a h i r  b ə y. Mirzə, yenə bəndəyi-həqirə sataşırsınız...

N ə v v a b (*eyni ifadə ilə*). Biz nəkarəyik ki, qubernatorun istəkli dostuna sataşaq. Nə üçün gedirsiniz, bəs, yığıncağımız olmayacaq?

Z a h i r  b ə y. Xeyr. Mirzə Ruhulla xəbər verdi ki, Xurşidbanu üzr istəyir, Tiflisdən qonağı gəldiyi üçün bu gün “Məclisi-üns”ün məşğələsi viqu bulmuyacaq.

N ə v v a b. Kimdir qonağı?

Z a h i r  b ə y. Tiflis canişininin yavəri dağıstanlı knyaz Xasay.

N ə v v a b. Hə... Belə de...

Z a h i r  b ə y. Xurşidbanunun onunla izdivac etmək istədiyini siz də eşitmisiniz?

N ə v v a b. Eşitmişəm.

Z a h i r  b ə y. Biabırçılıqdır. Məgər, bu boyda Qarabağda kişi bulunmadı ki, İbrahim xanın nəvəsi Dağıstandan gəlmiş bir ləzgiyə zövcə olmaq istəyir?

N ə v v a b. Nə olar ləzgiyə gedəndə?

Z a h i r  b ə y. Necə nə olar? Bu bizim qüruru milliyyətimizi təhqir etməkdir. Axı, Xurşidbanu adi adam deyil.

N ə v v a b (*zarafatla*). Zahir bəy, düzü, mən, məsələn, şəxsən sizin hansı millətdən olduğunuzu bilmirəm. (*Bərkdən gülür. Zahir bəy təəccüblə ona baxır*) Bəy, mən ölüm, inciməyin, zarafatdı da, eləyirik. Ancaq Banu bəyim ləzgiyə getməkdə heç bir günah eləmir. Dağıstanlılar igid, mərd xalqdırlar.

Nəvvabla Zahir bəy gedirlər.
Knyaz Xasayla Xurşidbanu eyvana çıxırlar.

X u r ş i d b a n u. Mən vətənimin keçirdiyi ağır günlər haqqında düşünərkən həmişə özümdə bir gücsüzlük hiss eləyib bir olan Allahdan nicat ummuşam. Elə bil ki, o da mənim bu faciəli xalqıma cəsarətlə xidmət eləməyim üçün səni göndərmişdir! (*Həyəcanla*) Sən güclüsən! Qafqaz canişininin dostusan. Səni əlahəzrət imperatorun özü sevir! Sənin məhəbbətin mənim köməyim, dayağım olacaq! Birinci dəfə səni görəndə, səni istədiyimi hiss eləyəndə, elə bil ki, birdən-birə özümdə səbəbini dərk eləmədiyim fövqəladə bir cəsarət, bir xoşbəxtlik duydum. Mənə elə gəldi ki, vətənim üçün dağı dağ üstünə qoya bilərəm!

K n y a z  X a s a y. Sizin qara camaat haqqında bu qədər ürək yanğısı ilə danışmağınız alicənablıqdır, Banu bəyim.

X u r ş i d b a n u. Qara camaat demə, knyaz. Mənim o sözdən acığım gəlir. Uşaqlıqda qoca müəllimim Mirzə Ruhullah Azərbayca-

nın azadlığı uğrunda vuruşmuş oğulların qəhrəmanlığı haqqında mənə heyrətli əhvalatlar nağıl edərdi. Mən belə igidləri sonralar da görürdüm. Onların kədərli taleyi ürəyimi ağrıdırdı. Dünyaya Nizami Gəncəvi kimi, Füzuli kimi dahilər vermiş Azərbaycanın bu gün dünya mədəniyyətindən bu qədər geri qalması izzəti-nəfsimi yaralayır! Mən onu da hiss edirəm ki, bu geriliyin səbəbi heç də mənim xalqımın istedadsızlığı və ya acizliyi olmamışdır!

K n y a z X a s a y. İndi siz danışdıqca, sanki mən də o yalçın qayalar üstündə dayanıb uzaqlara baxan qara yapıncılı Dağıstan igidlərini görürəm... Düşünürəm ki, bizim xalqların taleyi nə qədər bir-birinə bənzəyir.

X u r ş i d b a n u. Ah, Knyaz, mənim əzablar, iztirablar çəkmiş qəlbimin sənin sevginə, səmimiyyətinə o qədər ehtiyacı var ki...

K n y a z X a s a y (*Xurşidbanunu sinəsinə sıxaraq*). Banu bəyim, doğrusu, mən buraya gələnəcən sizi bu qədər istədiyimi bilmirdim. İndi mən bütün varlığımla, bütün qəlbimlə sizinəm! Siz mənim bəxt ulduzumsunuz! Uşaqlıqda bir qaraçı demişdi ki, sizin bəxt ulduzunuz tilsimli bir qala üzərində parlayacaq.

X u r ş i d b a n u (*qəribə bir vahimə ilə*). Necə? Tilsimli qala?!

Qapı döyülür.

X u r ş i d b a n u (*knyazdan aralanaraq*). Gəl.

D a ş d ə m i r (*gəlir*). Banu bəyim, bir oğlan təkidlə sizi görmək istəyir.

X u r ş i d b a n u. Nəkarədir?

D a ş d ə m i r. Soruşdum, demədi.

X u r ş i d b a n u. Qoy gəlsin.

Daşdəmir çıxır.

K n y a z X a s a y. Mən getdim öz otağıma.

X u r ş i d b a n u. Nə üçün, knyaz... Bir yerdə dinləyərik onu.

K n y a z X a s a y. Bəlkə məxfi bir sözü var.

Knyaz keçir o biri otağa, cavan bir oğlan olan
Seyid Hüseyn daxil olub təzim edir.

X u r ş i d b a n u. Kimsiniz, ay oğlan, nə istəyirsiniz?

S e y i d H ü s e y n. Cənubi Azərbaycandanam, xan həzrətləri. İran ərbabının əlindən qaçıb sizə pənah gətirmişəm.

X u r ş i d b a n u. İranda neyləyirlər sizə?

S e y i d H ü s e y n. Bizə zülm eləyirlər, xan həzrətləri! Bizi çarmıxa çəkirlər!

X u r ş i d b a n u. Bu mənə məlumdur. Ancaq siz açıq da gələ bilərdiniz, niyə qaçırdınız?

S e y i d H ü s e y n. Sizdən gizlini yoxdur, xan həzrətləri, biz bir dəstə cavan qərara almışdıq ki, şahın zülmündən vətənimizin xilası uğrunda fədai olaq. Biz kəndbəkənd, şəhərbəşəhər gəzib qardaş-bacılarımızı öz mətləbimizdən hali edirdik, onlar da bizimlə həmfikir olduqlarını ürək yanğısı ilə bəyan edirdilər... Ancaq bir kəndxuda bizim fəaliyyətimizi bilib, ərbaba xəbər yetirdi... Özü də öz azərbaycanlımız idi.

X u r ş i d b a n u. Öz azərbaycanlınız?

S e y i d H ü s e y n. Bəli, xan həzrətləri, öz içimizdəki satqınlar olmasaydı, şah bizi əsir-yesir eləyə bilməzdi.

X u r ş i d b a n u (*dərindən nəfəs alaraq*). İndi bizdən iltimasınız nədir?

S e y i d H ü s e y n. İltimasım odur ki, xan həzrətləri, mənə sığınacaq versinlər. Buradakı həmyerlilərim dedilər ki, çar məmurları mənim İrandan qaçdığımı bilsələr, qalada yaşamağıma icazə verməzlər. Məsləhət gördülər ki, sizə iltica edim.

X u r ş i d b a n u. Kimdir burada sizin həmyerliləriniz?

S e y i d H ü s e y n. Biri sizin baş mehtəriniz Muradalıdır. Biz onunla xalanəvəsiyik.

X u r ş i d b a n u. İsminiz nədir?

S e y i d H ü s e y n. Seyid Hüseyn, xan həzrətləri.

X u r ş i d b a n u. Burada nə iş görə bilərsiniz.

S e y i d H ü s e y n. Hər nə əmr etsəniz. Deyirlər siz təzə məktəb açdırırsınız, mən müəllimlik də eləyə bilərəm.

X u r ş i d b a n u. Fars dilində?

S e y i d H ü s e y n. Təhsilim fars dilində olub. Məlumunuzdur ki, İran məmləkətində bizim öz ana dilimizdə təhsil almağa ixtiyarımız yoxdur. Ancaq mən türkcəni fars-ərəb dillərindən pis bilmirəm. Şer-sənətdən də başım çıxır.

X u r ş i d b a n u. Bəs, indi harda sakin olmusunuz?

S e y i d H ü s e y n. Muradalının balaca mənzilində daldalanıram, xan həzrətləri.

Xurşidbanu zəngi səsləndirir. Daşdəmir daxil olur.

X u r ş i d b a n u (*Daşdəmirə*). Mirzə Ruhullahı buraya dəvət elə.

D a ş d ə m i r. Baş üstə. (*Çıxır*)

X u r ş i d b a n u. Siz mənə xan həzrətləri deməyin, biz xanlıq dövrilə çoxdan vidalaşmışıq.

S e y i d H ü s e y n. Bilirəm, xan həzrətləri.

X u r ş i d b a n u (*daxil olan Mirzə Ruhullaha*). Mirzə, xahiş edirəm mənim adımdan qala rəisindən rica eləyəsiniz ki, bu oğlanın Şuşa şəhərində sakin olmasına icazə versin. Sonra mənim mülkümdən bu oğlan üçün bir otaq ayırıb içini xalı-gəbə ilə döşəsinlər. Cənab Seyid Hüseyn! Etibar eləyib, şəhərdə açdığımız məktəbə sizi müəllim təyin edirəm. Nədən təlim keçməyinizi müdirlə həll edərsiniz. İndi isə mürəxxəssiniz.

S e y i d H ü s e y n. Mən sizin etibarınızı doğruldacam, Banu bəyim.

Təzim edərək Mirzə Ruhullah ilə çıxır. Qısa pauza. Xurşidbanu onların ardınca baxır. Sonra dibçəkdəki qərənfillərə yaxınlaşır. Sonra zəngi səsləndirir. Bəyim daxil olur.

X u r ş i d b a n u. Bəyim, sən mənim qərənfillərimə su vermisənmi?

B ə y i m. Bəli, Banu bəyim. Mən hər səhər onların dibinə su tökürəm.

X u r ş i d b a n u. Tapşır, Şuşaya çəkdirdiyimiz bulağın mühəndisi Əbdürrəhim Talıbzadəni nahardan sonra mənim yanıma çağırsınlar.

B ə y i m. Baş üstə. (*Xurşidbanu knyazın olduğu otağa keçir. Bəyim yazı stolunun üstündən şairənin* “*Qərənfil*” *şerini götürüb oxuyur*)

Səni kimdir sevən bica, qərənfil?
Sənə mən aşiqi-şeyda, qərənfil!
Səni gülşən ara aşüftə gördüm,
Yəqin bildim tutub sevda, qərənfil!
Belə pəjmürdə hal ilə durubsan,
Düşər güllər ara qovğa, qərənfil!
Düşər kim vəfasızdır bu gülşən,
Gedər bu tələti-ziba, qərənfil!
Üzündən pərdeyi-nazın kənar et!
Unutma aşiqi haşa, qərənfil!

İ ş ı q s ö n ü r

## ÜÇÜNCÜ ŞƏKİL

Muradalının evinin qabağında kiçik bağça. Bağçanın yanından yol keçir. Seyid Hüseyn və Muradalı.

M u r a d a l ı. Yenə şükür ki, qaçıb canını qurtarmısan, xalaoğlu... Deyirəm, görəsən, bu Şimali Azərbaycan olmasaydı, biz cənublular İran şahının zülmündən hara qaçardıq...

S e y i d  H ü s e y n. Sənin-mənim kimilərinin qaçıb canlarını qurtarmaqları ilə yaralar sağalarmı?! Axı, milyonlarla körpəli-qocalı ailə hara qaçsın? Neçə min il tarixi olan igid bir xalqı iki yerə parçalayıb gücdən saldılar.

M u r a d a l ı. On ildir ki, o tayda qalmış anamın, bacımın üzünə həsrətəm. Atam bizim obaya divan tutan o ərbabı öldürüb, məni də götürüb bu taya qaçanda on iki yaşım var idi... Deyirlər, bizdən sonra ərbabın adamları ev-eşiyimizi, bağımızı viran eləyiblər. Yazıq anam da bacımı götürüb Təbrizə qaçıb. Orada başlarına nə gəldiyindən indi də xəbərim yoxdur. Bilirəm ki, sənin də xəbərin olmaz. Səni də bir tikə vaxtından atan götürüb Tehrana fəhləliyə getmişdi.

S e y i d  H ü s e y n. Tehranda yazıq atam gündə on dörd saat xalı karxanasında fəhləlik eləyib məni oxudurdu. Sonra o cəhənnəm əzabına dözmədi...

M u r a d a l ı (*ah çəkir*). Eh, xalaoğlu...

Elə bu vaxt mahnı eşidilir.

Araz axar lil ilə,
Dəstə-dəstə gül ilə.
Mən yarımı sevirəm,
Şirin-şirin dil ilə.

M u r a d a l ı. Daşdəmirdi. Yaman şən oğlandı...

D a ş d ə m i r (*gəlir*). Salam, Muradalı! Salam, Seyid! Muradalı əmioğlu, Banu bəyim buyurdu ki, qala rəisinin yavəri zabit Mixaylov onun sevimli atı "Meymunu" minib bir neçə saat gəzmək istəyir. Deyir, əgər, zabit gələrsə, "Meymunu" yəhərləyib versin onun sərəncamına.

M u r a d a l ı. Nə olar, Mixaylov yaxşı oğlandı.

D a ş d ə m i r. Sonra sizə qəribə bir xəbər də gətirmişəm. İran şahının qardaşı, sizin Təbriz mahalının keçmiş hakimi bu taya qaçıb,

rus padşahından sığınacaq istəyib, padşah da onun Şuşa qalasında sakin olmasına izn verib, dünən otuz iki arvadı ilə tirmə yəhərli Həmədan eşşəklərində şəhərimizə varid oldu. Özü də arvad kimi qırmızı qanavuzdan tuman geyinib, əlləri də xınalı... (*Gülür*) Gör sizin kimi oğlanlara kim zülm eləyirmiş! Ҫiriniz onun başına bir güllə çaxmayıbsınız...

S e y i d  H ü s e y n. Bizim taleyimizə baxın! Cənubi azərbaycanlıların cəlladı Şimali Azərbaycanda sığınacaq da tapır.

D a ş d ə m i r. Özü də otuz iki arvadı ilə. Sizin canınız üçün, tirmə palanlı Həmədan eşşəkləri gəlib qabağımızdan keçəndə, şahzadənin arvadlarından biri rübəndini qaldırıb mənə gülümsədi... Mən də irişib, ona göz vurdum. Amma necə gözəl idi...

M u r a d a l ı. Deməli, o əclaf bizi o qədər biqeyrət hesab edir ki, gəlib burada, gözümüzün qabağında yaşamaq istəyir? Quduz it kimi öldürəcəm onu!

D a ş d ə m i r (*əlini xəncərinin qəbzəsinə qoyaraq*). Mən də sənə yoldaş! Nə vaxt?!

S e y i d  H ü s e y n. Yox, qardaşlar! Tək onu öldürməkdən nə çıxar? Siz bütün xalqı qırğına verərsiniz... Onsuz da, Cənubi azərbaycanlılara divan tutmaq üçün İran şahına bir bəhanə lazımdır.

M u r a d a l ı. Bəs, neyləyək? Başımıza arvad ləçəyi bağlayıb tamaşa eləyək?!

D a ş d ə m i r. O da otuz iki gözəllə kef çəksin...

S e y i d  H ü s e y n. Şahzadələri yetişdirən mütləqiyyəti tar-mar etmək lazımdır. Bunun üçün də gərək bütün xalq ayağa qalxsın.

M u r a d a l ı. Yox, xalaoğlu, səninki oldu dəryada balıq sövdası. Biz oturaq gözləyək baqqal Əbiş, "Üç badam, bir qoz" Fətiş nə vaxt ayılacaq?..

S e y i d  H ü s e y n. Xalq yalnız baqqallardan ibarət deyil. Dünyanın yükünü çiyinlərində daşıyan zəhmətkeş insanlar var!

D a ş d ə m i r. Tumanlı qırmızısaqqal, yəqin, harda gözəl görüb, çəkib hərəmxanasına.

M u r a d a l ı (*Daşdəmirə*). Sənin də canın qalıb o əclafın arvadlarının yanında...

D a ş d ə m i r. Mən görəni sən də görsəydin...

Rəqqasə qız Təhminə ilə kor kamançaçı bağçanın yanından keçirlər.

M u r a d a l ı (*həyəcanla*). Daşdəmir, sənə dediyim mütrüb qız, bax, budur. Qalada təzə peyda olub... Ey gözəl qız, keçin bura.

Qız, Muradalıya baxıb gülümsəyir və kor kamançaçının əlindən tutaraq bağçaya gətirir, sonra kor kamançaçı çalırız eyzən Muradalıya baxa-baxa oxuyub-oynayır.

T ə h m i n ə.

Sənin boyun sərv kimi ucadır,
Sənin gözün şəvə kimi qaradır.

Muradalı əlini qızın çənəsinə çəkmək istəyir.
Lakin rəqqasə işvə ilə gülümsəyib üzünü qaçırır.

T ə h m i n ə.

Mən çöllərdə bir ceyranam,
Heç bir kəsə ram olmaram.
Ürəyim Savalandadır,
Canım da Savalandadır...

Qız oynaya-oynaya qavalı oğlanların qabağına tutur, onlar da pul atırlar.

S e y i d  H ü s e y n. Ay qız, sən Savalan dağı haqqında mahnı oxumaqda, yoxsa, otaylısan?

T ə h m i n ə. Bəli ağa, İrandanıq.

M u r a d a l ı (*qıza yaxınlaşaraq, pıçıltı ilə*). Aşiq olmuşam sənə, ay qız, gəl, bu gecə görüşək.

T ə h m i n ə (*gülümsəyərək oxuyur*).

Baxışların qılıncdan da itidir,
Gülüşlərin ürəyimi titrədir.
Aşiq olan sevdiyinə kəm baxmaz,
Düz ilqarı, düz peymanı gərəkdir.

D a ş d ə m i r. Dostum Muradalı, bu keçməli can deyil! Afərin sənə!

Bu zaman “Yol verin! Şahzadə həzrətlərinə yol verin!” deyə səslər eşidilir və bunun ardınca kəcavədə əyləşmiş şahzadə, Məliküldövlənin müşayiətilə gəlib keçərkən, qızı görüb, kəcavəni dayandırır və bir qədər tamaşadan sonra Məliküldövləni işarə ilə çağırıb qulağına nə isə deyir. Sonra Məliküldövlə də işarə ilə qızı çağırıb qulağına nə isə deyir. Qız gülümsəyərək, razılıq mənasında başını tərpədir. Kəcavə yoluna davam edir.

M u r a d a l ı. Ay qız, o tumanlı meymunun adamı sənə nə deyirdi?

T ə h m i n ə. Şahzadəni əyləndirmək üçün bizi onun sarayına dəvət edirdi.

M u r a d a l ı. Getsən, öldürərəm!

T ə h m i n ə (*çalıb-oxuyur*).

Mən çöllərdə bir ceyranam,
Heç bir kəsə ram olmaram...

Və birdən qız ağzını Muradalının qulağına yaxınlaşdırıb nə isə deyir.

M u r a d a l ı (*bərk şadlanaraq*). Oldu!

İşıq sönür. Gecə. Eyni bağça. Təhminə və Muradalı.
Muradalı qızı qucaqlayıb öpür.

T ə h m i n ə. Yalvarıram, oğlan, mənə toxunma.

M u r a d a l ı. Nə üçün?

T ə h m i n ə. Çünki istəyirəm səni.

M u r a d a l ı. Yoxsa, sən istəmədiyin oğlanlarla olursan?

T ə h m i n ə. Mən bakirə qızam.

M u r a d a l ı. Səfeh-səfeh danışma. Bir sən qızsan, bir də nənəm.

Qızı yenə də qucaqlayır. Təhminə onun əlindən çıxıb, kənara sıçrayır.

T ə h m i n ə. And içirəm ki, elədir. Əgər, o fikrə düşsən, bir də məni görməzsən.

M u r a d a l ı. İstəyirsən şəriətin qanunu ilə səni burda qaldığımız müddətdə siğə eləyim özümə...

T ə h m i n ə (*həyəcanla*). Mən siğəyə nifrət edirəm!

M u r a d a l ı. Onda... Onda, gəl alım səni, ol mənim arvadım. Aldatmıram, düz sözümdür.

Təhminə “yox” mənasında başını bulayır.

M u r a d a l ı (*hövsələdən çıxaraq*). Bəs, sən deyirsən məni istəyirsən, axı?

T ə h m i n ə. Çox istəyirəm. Ancaq sabah, biri gün başıma nələr gələcəyini bilmirəm.

M u r a d a l ı. Başına nə gələcək... yenə də göbəyini əsdirə-əsdirə oynayıb, pul yığacaqsan dayna...

T ə h m i n ə (*mütəəssir halda*). Nə üçün ürəyimə toxunursan, oğlan? Sən elə bilirsən rəqqasənin pul yığmaqdan başqa ayrı dərdi ola bilməz?

M u r a d a l ı. Yaxşı, əgər, ürəyinə toxundumsa, bağışla. Mən namərd deyiləm. And içirəm namusuma ki, sənin sirrini xəncərlə də mənim ürəyimdən çıxara bilməzlər. De görüm, dərdin nədi? Axı, mən də sənin kimi otaylıyam... Bizim də orda evimiz, bağ-bağçamız var idi.

T ə h m i n ə (*birdən canlanaraq*). Bəs, niyə qoyub gəlmisən?

M u r a d a l ı. Bu gün səni sarayına dəvət eləyən o əclaf şahzadə kimilərinin zülmündən qaçmışıq...

T ə h m i n ə (*qəsdən*). Nə üçün əlahəzrət şahzadəni belə yamanlayırsan, oğlan?

M u r a d a l ı (*acıqlanır*). Sarsaq-sarsaq danışma, o əlahəzrət deyil, quduz canavardır! Dərisi iki qəpiyə dəyməyən o məlun yüzlərlə igid qanı tökdürüb. Yenə də deyirəm, əgər, puldan ötəri onun sarayına getsən, öldürərəm səni.

T ə h m i n ə. Mənə pul lazım deyil.

M u r a d a l ı (təəccüblə). Bəs, nə lazımdır?

T ə h m i n ə. Sənin sədaqətin, igidliyin!

M u r a d a l ı. Nə üçün?

T ə h m i n ə (*qəmli təbəssümlə*). Çünki sevirəm səni.

M u r a d a l ı. Yox, sənin, nə isə, bir sirrin var... Bəs, nə vaxt ürəyini mənə açacaqsan?

T ə h m i n ə (*məhəbbətlə gülümsəyir*). Nə vaxt məni, doğrudan da, istədiyinə inansam.

M u r a d a l ı. İnan mənə, Təhminə! Bir könüldən min könülə aşiqəm sənə. Əgər, səni bu qədər istəməsəydim, namərd oğlan olsaydım, indi xəncəri dirəyərdim böyrünə, istədiyimi eləyərdim. Sən getdikcə mənim daha çox xoşuma gəlirsən.

T ə h m i n ə (*ona sarılaraq*). Ax, igid oğlan! Mən sənin səsində qeyrət, cəsarət hiss edirəm! Mən sənin sadiq kənizin olaram! Gecə-gündüz başına dolanaram.

M u r a d a l ı (*həyəcanla*). Mən də, sən nə desən ona hazıram. Sən nəcib qıza oxşayırsan.

T ə h m i n ə (*ona qısılaraq*). Ürəyim, canım oğlan, sən nə yaxşı söz dedin mənə.

Oğlanı öpür.

İ ş ı q s ö n ü r

## DÖRDÜNCÜ ŞƏKİL

Xurşidbanunun malikanəsi. Xurşidbanu yazı stolunun qabağında dəftərçədən öz şerini oxuyur.

Əgərçi xoşdu mənə ətri, həm səfası gülün,
Cəfası çoxdu, nə hasil ki, yox vəfası gülün.
Cəfayi-xarı görüb, köçdü, köçdü bağidən bülbül,
Görən kim olub bu gülşəndə aşinası gülün?
Xəzanə meyl elədi, almadı vəfa nəzərə,
Yetişdi bülbülə çox-çox qəmü cəfası gülün.
Yazılsa nöqtəbənöqtə, deyilsə hərfbəhərf,
Qurtarmaz həşrə qədər halü-macarası gülün.
Cahanda zərrə qədər olmaz, ey könül, xəndan,
Ki, xuni-bülbül, əgər, olmasaydı qəzası gülün.
Tutardı xuni-cigərdən olaydı gər sirab,
Günəştək hər tərəfi, Natəvan, ziyası gülün.

Knyaz Xasay pərt gəlir.

X u r ş i d b a n u (*şadlıqla*). Xasay, sən gələnəcən mən də təzə bir şer yazdım, istəyirsən oxuyum.

K n y a z X a s a y. Üzr istəyirəm, Banu bəyim... Sizin şair həmkarlarınız məni şerlə kifayət qədər doyurmuşlar.

X u r ş i d b a n u. Nə olub, Xasay?

K n y a z X a s a y. İndiyə qədər sizə deyib qanınızı qaraltmaq istəmirdim. Onlar mənə nalayiq həcvlər yazırlar. Hətta, biri məni "qab qalaylayan ləzgi" adlandırmışdır. (*İsterik bir gülüşlə*) Axı, bizim ləzgilərdən yaxşı qalayçı olur...

Cibindən bir konvert çıxarıb Xurşidbanuya verir. Xurşidbanu konverti açıb həcvi oxuyur. Əsəbi hərəkətlə cırıb tullayır.

X u r ş i d b a n u. Bu nədir?

K n y a z X a s a y. Siz bikef olmayın, Banu bəyim. Qoy nə deyirlər, desinlər. Onsuz da, bilirəm ki, sizin kübarların lap ilk gündən məni görməyə gözü yoxdur.

X u r ş i d b a n u (*sarsılmış halda*). Mən bilirəm ki, o həcvləri yazanlar bizim həqiqi şairlərimiz deyillər. Məgər, mənim haqqımda uydurduqları bəs deyilmiş, indi də sənin üstünə düşüblər?! Guya, mən sənin qadının ola-ola, Şuşaya çəkdirdiyim bulağın mühəndisi Əbdür-

rəhim Talıbzadəyə eşq yetirmişəm... Bulaq çəkilən yerləri səyahət elədiyim zaman gecə meşədə onunla bir çadırda qalmışam... (*Ağlayır*)

K n y a z X a s a y. Bilirsiniz ki, mən də o barədə sizdən heç nə soruşmadım.

X u r ş i d b a n u. Mən o cür alçaq böhtanlar haqqında təşvişə düşməyi belə mənliyimə sığışdırmadığım üçün heç özümü təmizə çıxarmağa da çalışmadım. Axı, doğrudan da, mən o gecə mühəndis Talıbzadənin işlədiyi meşədə qalmışdım.

K n y a z X a s a y (*həyəcanla*). Peterburqun, Parisin salonları üzümüzə açıq olduğu halda, axı, biz nə üçün bu uzaq qalanı kəsdirib oturmuşuq? Nə işimiz var bizim bu qaragüruhun içində?! Siz nə qədər zəhmət, xərc çəkib, bu dağın başına şirin su çəkdirirsiniz, onlar da sizi elə mükafatlandırırlar.

X u r ş i d b a n u (*əsəbi*). Mən bulağı onlar üçün çəkdirmirəm! Mən o bulağı qışın çovğununda yeddi-səkkiz kilometr piyada yol gedib, meşədən şirin su gətirən zəhmətkeş əhali üçün çəkdirirəm!

D a ş d ə m i r (*gəlir*). Cənab şairlər sizin hüzurunuza müntəzirdirlər, Banu bəyim.

X u r ş i d b a n u (*bir gümrahlıqla*). Elə xəbislərə tutarlı sillə bizim təmkinimizdir, Xasay! Bu gün "Məclisi-üns"ün məşğələsi var, bəlkə sən də iştirak eləyəsən? Orda maraqlı söhbətlər olur... Təzə şerlər oxunur...

K n y a z X a s a y (*soyuq*). Yox, Banu bəyim. Mən gəzib yorulmuşam. (*O biri otağa keçir. Xurşidbanu fikirli-fikirli onun ardınca baxır*)

X u r ş i d b a n u (*Daşdəmirə*). De, buyursunlar.

Daşdəmir çıxır. Nəvvab, Mamayı, Zahir bəy, Ter Vahan, Seyid Hüseyn və Mirzə Ruhullah daxil olur. İşıq sönüb-yanır və bu zaman şair Mamayının öz şerini oxuduğunu görürük.

M a m a y ı.

Bir bikəsi zarəm vətənimdə, vətənim yox,
Bir bülbülü bibalpərəm, bir çəmənim yox.
Bir yanda vətən təhlükəsi canımı almış,
Bir fəhm edənim, ağlayanım, dərk edənim yox.

Z a h i r b ə y. Abidar mənzumədir. Siz bir kəlamə baxın: "Bir bikəsi zarəm vətənimdə, vətənim yox..." Gözəl deyib şair...

N ə v v a b. Şairin nidasında həddindən ziyadə ümidsizlik var, bu əhvali-ruhiyyə bizim xalqımıza xas deyil.

S e y i d H ü s e y n. Banu bəyim, icazənizlə möhtərəm şairə bir sual vermək olar?

X u r ş i d b a n u. Əlbəttə. Ağalar, Seyid Hüseyn cənabları sənət və ədəbiyyat aləmindən baxəbər, açıqfikirli bir ziyalıdır. Mən istəyirəm ki, bizim ədəbi məclislərimizdə o da iştirak eləsin.

Z a h i r b ə y. Da...a?!

S e y i d H ü s e y n. Cənab Mamayı, siz bu şerinizlə nə demək istəmisiniz?

M a m a y ı. Məgər, aydın olmurmu ki, mən millətimizin dərdini tərənnüm edirəm? Arazın o tayında İran şahlarının bizim qardaşlarımıza nə divan tutduqları gərək ki, sizə daha yaxşı məlumdur, cənab Seyid Hüseyn!

S e y i d H ü s e y n. Məlumdur... yaxşı məlumdur. Fəqət millətə vuruş lazımdır, ağalar, inilti yox!

Z a h i r b ə y. Bizim əfkari-amalımız məhəbbət və şəfqət olmalıdır. Binaənəley cənab Seyid Hüseyn, bilmək istərdik ki, siz nə cür vuruş nəzərdə tutursunuz?

S e y i d H ü s e y n. Mən xalqı həqiqi azadlığa, birliyə qovuşduracaq mübarizədən danışıram, cənab Zahir bəy.

Z a h i r b ə y. "Həqiqi azadlıq" bir qədər mücərrəd məfhumdur, bəlkə lütfən fikrinizi izah eləyəsiniz?

N ə v v a b (*zarafatyana*). Cənab Zahir bəy, siz neçə ildir qubernatora dilmanclıq eləyirsiniz, doğrudanmı, "həqiqi azadlığın" nə demək olduğunu anlamırsınız?

Z a h i r b ə y. Bu olmadı... Olmadı, cənab Nəvvab! "Anlamırsınız" bir qədər qeyri-məqbul kəlamdır. Bilirsiniz ki, mən izzət-nəfsimi sevən adamam.

N ə v v a b (*zarafatyana istehza ilə*). Əlbəttə... Bağışlayın, bəy.

S e y i d H ü s e y n. Cənab Zahir bəy, həqiqi azadlıq odur ki, insanlar yaltaq, rəzil, casus olmağa məcbur edilməsin! Hamı, sizin buyurduğunuz kimi, izzət-nəfsinin sahibi olsun! Cənab Mamayı şerində bizim öz vətənimizdə vətənsiz olduğumuzu ürək yanğısı ilə yazır, fəqət neyləmək lazım olduğunu göstərmir!

Z a h i r b ə y. Əfv buyurun, sizcə, neyləmək lazımdır?

N ə v v a b (*eyni zarafatyana ifadə ilə*). Bəy, yenə deyəcəm, xətrinizə dəyəcək, məgər, siz bilmirsiniz ki, neyləmək lazımdır? Nə üçün məhz o sözü bu oğlandan eşitmək istəyirsiniz?

Z a h i r b ə y. Yox, bu olmadı, olmadı!

S e y i d H ü s e y n. Cənab Zahir bəy, ilanı birdəfəlik məhv etmək üçün dərhal başını əzmək lazımdır, indi aydındırmı? İndicə siz də bir gözələ həsr etdiyiniz qəzəlinizi oxudunuz, axı, siz qul halına salınmış gözəlin nəyini vəsf edirsiniz? Şahın ərbabları Azərbaycan qızlarının namusunu ayaqlar altına salıb tapdalayırlar! Ağalar, siz əvvəl o gözəli azad eləyin, sonra hüsnünə şer yazın. Əl çəkin bu fars-ərəb sözləri ilə dolu qəzəlçilikdən, mədhiyyəçilikdən, ağalar! Qəzəl – mədhiyyə öz dövrünü çoxdan bitirmişdir, ağalar! İrəliyə baxın!

N ə v v a b. Doğrudur.

Z a h i r b ə y (*coşur*). Deməli, biz gərək Nizamidən, Füzulidən, Nəsimidən sərf-nəzər eləyək?

X u r ş i d b a n u. O parlaq ulduzların əsərlərindəki fars, ərəb təbirləri əsrlərlə bizim torpaqları at tapdağı eləyən yadelli qəsbkarların təsiri idi ki, indi biz özümüz də o bədnam təsirdən qurtara bilmirik.

Z a h i r b ə y (*coşur*). Ağalar, ərəb, fars dilləri milləti islamın iftixarı olduğu üçün, onların təsiri bizim kəlamımızı müzəyyən edir. Milləti islamın fituhatı bizi ərəb-fars münəvvərlərinə yaxınlaşdırmışdır.

N ə v v a b. Zahir bəy, bağışlayın, mən deyəndə ki, siz öz millətimizi tanımırsınız, rəncidə olursunuz. İslam millət deyil, dindir!

T e r V a h a n. Rus şairi Lermontov Azərbaycan dilinə valeh olub, onu Şərqin fransız dili adlandırmışdır.

X u r ş i d b a n u. Fransızların məşhur ədibi Aleksandr Düma bizə qonaq gələndə Azərbaycan dilinin musiqisinə heyran olduğunu söyləyirdi, fəqət hamıdan qabaq biz özümüz öz dilimizin qədir-qiymətini bilməliyik, ağalar.

T e r V a h a n. Vaqifin təmiz Azərbaycan dilində yazdığı şerləri oxuyanda insanın ruhu təzələnir. Elə bil, qayalardan qaynayıb çıxan bulaqların səsini eşidirsən...

N ə v v a b (*zarafatyana*). Bəh... Bəh... əcəb deyirsən, Vahan.

S e y i d H ü s e y n. Öz dilinə, öz milli varlığına sahib sənətkar bütün millətlər üçün əzizdir.

T e r  V a h a n. Erməni ədibi Mirzə Yusif Nersesov Vaqifin şerlərini toplayıb Tiflisdə kitab halında nəşr etmişdir.

X u r ş i d b a n u. Dil bizim milli varlığımızdır. Ağalar, nə qədər ki, Azərbaycan xalqı yaşayır, Azərbaycan dili də yaşayacaq! Mən Azərbaycan balalarının Homeri, Danteni, Şekspiri, Höteni, Puşkini öz doğma – gözəl ana dillərində oxuyacaqları günü görürəm!

İ ş ı q  s ö n ü r

## BEŞİNCİ ŞƏKİL

Xurşidbanunun malikanəsi. Hələ səhnə qaranlıq ikən Xurşidbanunun şəninə şən alqışlar eşidilir: "Sağ olsun, Banu bəyim! Şairəyə uzun ömür!" Xurşidbanu, Mirzə Ruhullah, Nəvvab, Seyid Hüseyn, Mamayı, Ter Vahan və bir neçə başqa əyanın müşayiətilə səhnəyə daxil olur.

N ə v v a b. Banu bəyim! Gur meşələrin, sərt qayaların arasından çəkdirib, bu uca qalaya çıxartdığınız o bulaq gələcək nəsillərə sizdən unudulmaz yadigardır.

S ə s l ə r. Təbrik edirik!

X u r ş i d b a n u. Sağ olun, ağalar! Lakin mən əminəm ki, gələcək nəsillər elə kiçik bulaqlarla kifayətlənməyəcək!

N ə v v a b. Varını verən utanmaz, Banu bəyim. Siz əlinizdən gələni əsirgəmirsiniz.

M a m a y ı. O kiçik bulaq gecə-gündüz sizin şəninizə nəğmələr oxuyacaq.

S ə s l ə r. Sağ olsun Xurşidbanu! Ömrü uzun olsun şairənin!

X u r ş i d b a n u (*Mirzə Ruhullaha*). Mirzə, tapşırın xəbər versinlər ki, bulağın açılışı münasibətilə sabah bütün şəhər əhli mənim qonağımdır. Bu axşam isə, siyahı üzrə bütün kasıblara şirniyyat, düyü və yağ paylansın.

N ə v v a b. Sağ olun, Banu bəyim. Sizi bir daha təbrik edirik. Gedək, ağalar. Şairəyə dincəlmək lazımdır. Səhərdən ayaq üstündədir.

Hamı çıxır. Şairənin üzü fikirli, tutqun bir ifadə alır. Və o, zəngi səsləndirir. Bəyim daxil olur.

X u r ş i d b a n u. Knyaz hələ gəzməkdən qayıtmayıb?

B ə y i m. Xeyr.

X u r ş i d b a n u (*dərindən nəfəs alaraq, öz-özü ilə danışırmış kimi*). Knyaz darıxır...

B ə y i m. Oy, Banu bəyim, knyaz sizi o qədər istəyir... Nə üçün darıxsın?!

X u r ş i d b a n u. Görünür, darıxmamaq üçün təkcə istəmək azdır, Bəyim... Mənim həmyerlilərim onun yanında məni eyzən xar eləyirlər. Heç bir əyan onunla kəlmə kəsib danışmır, hansı onu görürsə, üzünü yana çevirir...

B ə y i m. Qoy üz çevirsinlər, məgər, sizin sevginiz onun üçün kifayət deyilmi?

X u r ş i d b a n u. Axı, biz knyazla yiyəsiz adada deyilik! Biz cəmiyyət içində yaşayırıq! Mən xəcalət çəkirəm.

B ə y i m. Bir söz desəm, mənə acığınız tutmaz ki?

X u r ş i d b a n u. Yox! Sənə demişəm ki, ürəyinin sözünü həmişə aç, de!

B ə y i m. Cənab knyazın özü də adamlarla qaynayıb-qarışmır.

X u r ş i d b a n u. Knyaz qəribədir! Məndən ötəri elini, vətənini atıb gəlib.

B ə y i m. Cənab knyaz da, o biri ağalar kimi, çörəklərini halal zəhmətlə qazanan adamlara yuxarıdan aşağı baxır, amma sizin kasıb adamlarla rəftarınız məni fərəhləndirir, Banu bəyim.

X u r ş i d b a n u (*əsəbi halda*). Əgər, ağalar, çörəklərini halal zəhmətlə qazanan adi insanlara həqarətlə baxırlarsa, qoy onlar da, həmin ağaları adam yerinə qoymasınlar!

B ə y i m. Bu mümkün deyil, Banu bəyim.

X u r ş i d b a n u. Nə üçün?

B ə y i m. Çünki... onda balaları ac qalar, yurdları viran qoyular!

Qısa pauza.

X u r ş i d b a n u (*dərindən nəfəs alaraq*). Görünür, elədir. Sən həqiqəti məndən aydın dərk edirsən, Bəyim.

B ə y i m. Elə deməyin, Banu bəyim. Sizin qarşınızda mən kiməm ki...

X u r ş i d b a n u (*əsəbi halda*). Sən – insan! Allah, Peyğəmbər harada deyib ki, ağa rəiyyətdən əşrəfdir?! Heç vaxt demə “Mən

kiməm ki...” (*Bayırda at ayaqlarının tappıltısı eşidilir*) Knyaz gəldi. Get aşpaza de stolu düzəltsin.

Bəyim tələsik gedir. Knyaz Xasay daxil olur.

X u r ş i d b a n u. Ax, Xasay, nə üçün sən bu gün bizim şənliyimizdə iştirak eləməyib, çıxıb getmisən? Bircə görsəydin ki, bulağın açılışına qala əhli necə sevinir... Elə bil ki, bayram idi...

K n y a z X a s a y (*gizli dalğınlıqla*). Bir özünüz düşünün. Banu bəyim, arvad o cür işlər görür, camaat əl çalıb onu alqışlayır, ər isə, kənarda dayanıb gözünü döyür...

X u r ş i d b a n u (*alınaraq*). Mən hər bir yaxşı işimdə səni öz yanımda hiss edirəm, knyaz. Elə bil ki, biz bir adamıq...

K n y a z X a s a y (*pərt halda gülümsəyir*). Biz bir-birimizi nə qədər sevsək də, ər ərdir, arvad da arvad! (*Xurşidbanunun pərtliyini hiss edərək*) Mən sizi başa düşürəm, Banu bəyim. Sizin xalqınızı da qiymətləndirirəm... Lakin onu da etiraf edirəm ki, elə bu, məni öz gözümdən salır. Mən özüm-özümə avara-sərgərdan bir adam kimi görünürəm... İnanın ki, bunun səbəbini soruşsanız, izah eləyə bilmərəm, ancaq... elə bil ki, siz mənə məzəmmətlə baxıb soruşursunuz: “Heç öz xalqından xəbərin varmı?”

X u r ş i d b a n u (*son dərəcə pərişan*). Mən deməyə söz tapmıram, Xasay.

K n y a z X a s a y (*Xurşidbanunu öpərək*). Nə olursa-olsun, mən sizin məhəbbətinizdən başqa heç nə haqqında düşünmək istəmirəm. Əgər, mən indiyə qədər öz xalqımın taleyinə biganə olmuşamsa, günahkar özüməm.

Xurşidbanunun qoluna girərək o biri otağa keçirlər.
Bəyim daxil olub fikirli-fikirli onların ardınca baxır.

D a ş d ə m i r (*qapıdan boylanaraq*). Bəyim...

B ə y i m. Diksindim, Daşdəmir.

D a ş d ə m i r (*içəri girərək*). Yenə nə fikrə getmisən, Bəyimcan?

B ə y i m. Bu axır vaxtlar knyaz bir cür olub...

D a ş d ə m i r. Nə cür yəni?

B ə y i m. Gününü eyzən dağlarda, meşələrdə keçirir.

D a ş d ə m i r. Yəqin Dağıstan yadına düşüb...

B ə y i m. Evdə olanda da, ya kitab oxuyur, ya da artırmada, bağçada var-gəl edir.

D a ş d ə m i r. Tay neyləsin, xışın qulpundan yapışıb, yer şumlamayacaq, at tumarlamayacaq... Knyazdı dayna... Bəs, ağa nə cür olar?

B ə y i m. Başa düş, Daşdəmir... Onun belə hərəkəti Banu bəyimə pis təsir eləyir...

D a ş d ə m i r. Banu bəyim səhərdən axşamacan işdə-gücdə olur. Knyaz da qalır tək, bilmir neyləsin... Bizim ağaların da onunla arası yoxdur ki, knyaz onlarla qumar oynasın, şərab içib, kef çəksin. Eh, ağaların dərdi bizə qalmayıb ki, az, sən özümüzdən danış.

B ə y i m. Daşdəmir, yenə "az". Sarayda bütün qulluqçular mənə xanım deyir!

D a ş d ə m i r. Yəni, deyirsən, mən də sənə xanım deyim?

B ə y i m. Əlbəttə. (*Daşdəmir pıqqıldayır*) Niyə gülürsən, Daşdəmir?

D a ş d ə m i r. Axı, xanım, bəylərin, xanların qızlarına deyirlər.

B ə y i m. Mən xan qızının freylinasıyam. (*Gizli zarafatla*) Banu bəyim deyir səni elə oğlana verəcəyəm ki, lap bəy balası kimi olsun.

D a ş d ə m i r. Nə danışırsan, Bəyimcan? (*Oxuyur*)

Bəs məni neyləyirsən?
Sürməni neyləyirsən?

B ə y i m (*gizli zarafatla*). Daşdəmir, mən bu cür xanım kimi geyinirəm, bu cür xanım kimi yaşamağa öyrənmişəm, bu cür sarayda oluram, gedib sizin qaranlıq daxmanızda neyləyəcəyəm?

D a ş d ə m i r. Qaranlıq daxma nədi, az... Dədəmin üç mərtəbə bir imarəti var ki, baxan deyir bir də baxım. Dövlətdə də bəylər ona həsəd aparır... Kişidə qızıl xurcunla. Almaz... Brilyant... Eh... danışırsan da.

B ə y i m. Bəs, niyə gəlib sarayda xidmət eləyirsən, Daşdəmir?

D a ş d ə m i r. Mən gəlməmişəm. Xurşidbanu bizim kəndə gəlib kəndlilərin yaşayışlarıyla tanış olanda məni görüb, xoşuna gəlmişəm, atamdan xahiş eləyib ki, göndərsin məni onun sarayına. Bilirsən, qaydadır da, xan saraylarında gərək qəşəng oğlanlar olsun...

B ə y i m (*gülür*). Bah... bah... Çək özünü, Daşdəmir...

D a ş d ə m i r. Nə var, yoxsa, məndən xoşun gəlmir?

B ə y i m. Gəlir...

D a ş d ə m i r. O nə cür "gəlir" deməkdi, az?

B ə y i m. Səndən yaman xoşum gəlir, Daşdəmir.

D a ş d ə m i r. Nə olsun? Məndən hamının xoşu gəlir, bu, sevgi oldu?

B ə y i m (*bərkdən gülərək*). Ölürəm səndən ötəri, Daşdəmir...

D a ş d ə m i r. Ələ salırsan?!

B ə y i m (*oğlanın əlindən tutaraq məhəbbətlə*). İnsafsız!

Qapı astaca döyülür. Daşdəmir gedib qapını açır.

D a ş d ə m i r. Oho, cənab Mixaylov! Buyurun, buyurun!

Mixaylov daxil olur.

M i x a y l o v. Salam.

D a ş d ə m i r. Əleykəssalam. Xoş gəlmişsiniz. Bu da (*qızı göstərir*) mənim nişanlım Bəyim xanımdı. Banu bəyimin freylinasıdır.

Mixaylov, Bəyimə təzim edir.

M i x a y l o v (*gülümsəyir*). Gözəl qızdır. Yaraşırsınız bir-birinizə.

D a ş d ə m i r (*Bəyimə*). Eşitdin ki...

B ə y i m (*zabitdən utanır*). Yaxşı.

D a ş d ə m i r. Cənab zabit, deyirlər ki, siz də knyazsınız?

M i x a y l o v. Elədir.

D a ş d ə m i r. Amma heç oxşamırsınız?

M i x a y l o v (*gülümsəyir*). Nə üçün?

D a ş d ə m i r. Özünüzü çəkib dağın başına qoymursunuz.

M i x a y l o v. Başa düşmürəm.

B ə y i m. Demək istəyir ki, özünüz knyaz olduğunuz halda, Muradalı kimi, Daşdəmir kimi sadə oğlanlarla dostluq edirsiniz.

M i x a y l o v (*gülümsəyir*). Hə... (*Daşdəmirə*) Çünki siz yaxşı oğlanlarsınız, knyazdan heç də əskik deyilsiniz.

D a ş d ə m i r (*coşğunluqla*). Sağ olun, vallah!

Xurşidbanu daxil olur.

X u r ş i d b a n u. Xoş gördük, cənab Mixaylov.

Mixaylov ehtiramla təzim edir.

M i x a y l o v. Banu bəyim, mən sizin gözəl atlarınızı gördüm. Onların yerişi, duruşu, qaçışı insanı heyran edir.

X u r ş i d b a n u. O atlar da bizə, bu qalalar kimi, babalardan yadigardır, cənab zabit.

M i x a y l o v. O atları minən Azərbaycan oğullarının öz vətənlərinin azadlığı uğrunda necə igidliklə vuruşduqları mənə məlumdur.

X u r ş i d b a n u. Mən bilirəm ki, azadlıq həmişə böyük rus xalqının da müqəddəs amalı olmuşdur, cənab zabit.

M i x a y l o v. Bu sözləri sizdən eşitdiyim üçün qarşınızda baş əyirəm, Banu bəyim. (*Təzim edir*) Sizin öz xalqınız üçün necə fədakarlıqlar göstərdiyinizi bilirəm. İcazə verin, dərin hörmət əlaməti olaraq, bizim bu dünyadan çox tez gedən şairimiz Lermontovun təzə nəşr olunmuş kitabını sizə təqdim edim.

Kitabı Xurşidbanuya verir.

X u r ş i d b a n u. Lermontov bizim üçün də əzizdir.

M i x a y l o v. O burada olmuşdur.

X u r ş i d b a n u. Bilirəm. Lermontov dünyada ən böyük səadət olan azadlığı tərənnüm etmişdir.

M i x a y l o v. Nə etməli, mütləqiyyət üsuli-idarəsinin yetişdirdiyi qəddar, xudpəsənd tufeylilər Lermontovu çox tez məhv etdilər. Şair axırıncı sözünü demədən getdi...

X u r ş i d b a n u (*dərindən nəfəs alaraq*). Həqiqəti söyləyən şairlərin taleyi həmişə faciəli olmuşdur.

M i x a y l o v. Elədir. Siz özünüzü satqınlardan gözləyin, Banu bəyim.

X u r ş i d b a n u. Kimlərdir onlar, cənab zabit?

M i x a y l o v. Mən onların adlarını desəm, öz vəzifəmə xəyanət etmiş olaram, Banu bəyim, ancaq onlar vardır! Onlar rəzil qorxaqlar olduğu üçün açıq hərəkət etmirlər, qulaqlara pıçıldayırlar. Bu lənətə gəlmiş zəmanədə xeyirxah arzular, həqiqi sənət hər addımda xəyanətlə, kobudluqla üz-üzə gəlir! Yaltaqlar, satqınlarsa töhfə təbərcehi olub yuxarı başa keçirilir!

X u r ş i d b a n u. Bu, hər dövrdə belə olmuşdur, cənab zabit, Nəsiminin dərisini soydular, doxsan yaşlı qoca Vaqifin boynunu vurdular.

M i x a y l o v. Lakin bir gün azadlıq günəşi doğacaqdır, Banu bəyim.

Pridyot jelannaya pora:
. . . . . . . . . . . . . .
Okovı tyajkiye padut,
Temnitsı ruxnut – i svoboda
vas primet radostno u vxoda
i bratya meç vam otdadut!

Mən sizin igid xalqınızın böyük gələcəyinə inanıram! Mixaylov təzim edərək çıxır.

X u r ş i d b a n u (*tək*). Mən nə günahın sahibiyəm ki, özümü müdafiə eləyim? Hansı satqından özümü gözləyim?!

Bu zaman rəqqasə Təhminənin bağçada kor kamançaçının müşayiətilə oynayıb oxuduğu pəncərədən görünür. Xurşidbanu onlara tamaşa edərək qulaq asır.

T ə h m i n ə.

Xan Eyvazı bir quruşa satdılar,
Xan Eyvazı Savalanda tutdular,
Qara gözlərin xəncərlə oydular,
Ah, nə deyim sizə, ellər, obalar,
Ah, nə deyim sizə, igid cavanlar...

X u r ş i d b a n u (*tək*). Nə vaxta qədər bu xalq faciəli mahnılar oxuyacaq, ilahi! Nə oldu onun sevinci, bəxtiyarlığı?

İ ş ı q s ö n ü r

## ALTINCI ŞƏKİL

Xurşidbanunun malikanəsi. İşıq yananda knyaz Xasay daxil olur. Hiss olunur ki, nə isə, dalğındır. Əsəbi hərəkətlə zəngi götürüb səsləndirir. Daşdəmir gəlir.

K n y a z X a s a y. Banu bəyim Mil düzü səyahətindən hələ qayıtmayıb?

D a ş d ə m i r. Xeyr, ağa.

K n y a z X a s a y (*dilxor halda*). Yaxşı, get.

D a ş d ə m i r. Ağa, Dağıstandan qonaqlar gəlib.

K n y a z X a s a y (*təəccüblə*). Dağıstandan?

D a ş d ə m i r. Bəli.

K n y a z X a s a y. De, buyursunlar. (*Daşdəmir çıxır. Sonra qoca knyaz daxil olur. Knyaz Xasay cəld onun qabağına yeriyərək böyük*

*hörmətlə*) Xoş gördük, əmi. Təşrif buyurduğunuzu bilsəydim, qabağınıza gələrdim.

Q o c a  k n y a z. Tapşır, mənim müridlərimə yaxşı hörmət eləsinlər.

K n y a z  X a s a y. Narahat olmayın, əmi, nə lazımsa, eləyəcəklər. Buyurun, əyləşin.

Q o c a  k n y a z (*kresloda əyləşərək*). Yolda bizə dedilər ki, xan qızı Xurşidbanu Mil düzünə səyahətə çıxıb...

K n y a z  X a s a y. Bəli, əmi, Xurşidbanu Arazdan Mil düzünə arx çəkdirmək istəyir.

Q o c a  k n y a z. Oho... Bu çox maraqlıdır. (*Kinayə ilə*) Bəs, sən niyə xanımı müşayiət eləməmisən?

K n y a z  X a s a y. Mən getmək istəmədim, əmi.

Q o c a  k n y a z (*eyni ifadə ilə*). Qorxmadınmı, bu, Xan qızının kefinə toxunsun?

K n y a z  X a s a y (*tutularaq*). Siz çox qəzəblisiniz, əmi...

Q o c a  k n y a z (*yaşına uymayan bir ötkəmliklə*). Bir arvaddan ötəri vətənini – ata-baba yurdunu atan oğula qarşı mən nə cür olmalıyam? Mən on il səni Petroqradda bunun üçünmü oxutdurdum?! Sən ordan qayıdanda dağıstanlılar Allaha dua eləyirdilər ki, onların da elmli, əqilli adamları yetişir. Onlar sənə ümid bağlayırdılar. Canişinin idarəsində sənin kimi adamları olduğuna sevinirdilər. Onlar səninlə fəxr edirdilər. Sən isə, qaçıb girdin sehrkar bir şiə arvadının tumanına!

K n y a z  X a s a y. Əmi! Xurşidbanu Allahın buyurub, Peyğəmbərin xəbər verdiyi qanunla mənim halal zövcəmdir. Rica edirəm onun haqqında nalayiq kəlama yol verməyəsiniz! Şiə-sünnü məsələsi avam ruhanilərin uydurmasıdır. Peyğəmbər heç bir zaman müsəlmanları bu cür iki yerə ayırmamışdır. Əgər, şiəni də, sünnünü də bir olan Allah yaradıbsa, nə üçün biri yaxşı olsun, o biri pis?

Q o c a  k n y a z. Bəsdir! İcazə vermirəm mənim hüzurumda böyük olan Allahın işlərinə əl aparasan! Əgər, bir atanın beş oğlu varsa, beşi də o zaman atanın əziz-xələfi olar ki, heç biri onun göstərdiyi yoldan çıxmasın! Biri o birinin köməyi olsun! Arvad kimi əlinə, saçına həna qoyan biqeyrət İran şahı islam aləminin heç bir xeyir-şərinə qarışmır. Dara düşən, öz azadlığı üçün vuruşan heç bir müsəlman xalqının imdadına çatmır! Xarici dövlətlərin qarşısında isə, "Ağayi fərmayiş" deyib ikiqat olur!

K n y a z  X a s a y. Ədalətlə desək, bu, İran xalqının təqsiri deyil, əmi, bütün bunların Xurşidbanuya da heç bir aidiyyəti yoxdur. İran şahı azərbaycanlıların da düşmənidir.

Q o c a  k n y a z. Mən doxsan yaşlı qoca dörd gün at sürüb, Dağıstandan bura gəlmişəm ki, Xan qızı barədə səninlə söz güləşdirəm? (*Qısa pauza. Dərindən nəfəs alaraq mülayim səslə*) Özün bilirsən ki, məndən sonra, bizim neçə yüz il tarixi olan o müqəddəs yurdumuzda bir başıpapaqlı sən qalırsan. Sən də böyük əcdadımızın çırağını söndürüb, düşmənlərimizi sevindirmə! İgid babalarının ruhundan utan, qayıt vətəninə! (*Peşmetinin cibindən iri qızıl saatını çıxarıb baxır*) Mən gedirəm namaza. Özüm də səhərə qədər sənin qərarını gözləyirəm. Səhər qayıdasıyam Dağıstana.

Qalxıb ağır addımlarla çıxır. Knyaz Xasay əsəbi halda var-gəl edir.
Xurşidbanu şən əhvalla daxil olur.

X u r ş i d b a n u. Salam, əzizim. (*Knyazı öpür*) Mil düzünü gəzdiyimi eşidib, Şahsevən, Afşar camaatı tökülüb gəlmişdilər. Mənim Arazdan Mil düzünə arx çəkdirmək istədiyimi bilib o qədər sevinirdilər ki, əllərindən güclə qurtarmışam. Axı, yarı canım qalmışdı sənin yanında. Deyir, Dağıstandan qonaqlarımız gəlib...

K n y a z  X a s a y. Bəli, əmim gəlib.

X u r ş i d b a n u. Nə yaxşı oldu, mən əmini o qədər görmək istəyirdim ki. Yəqin hələ nahar eləməyiblər. Aşpaza tapşırıq vermək lazımdır. Görəsən, əmin hansı təamları xoşlayır.

K n y a z  X a s a y. Zəhmət çəkməyin, Banu bəyim, əmim şiə əli dəyən xörəyi yemir.

X u r ş i d b a n u. O... bu nə pis oldu. Bəs, sən nə üçün bikefsən?

K n y a z  X a s a y. Əmim məni aparmağa gəlib.

X u r ş i d b a n u. Yəqin qonaq dəvət edir. Axı, sən Dağıstandan çoxdan çıxmısan...

K n y a z  X a s a y. Yox, Banu bəyim, əmim istəyir ki, həmişəlik qayıdım Dağıstana.

X u r ş i d b a n u (*bərk sarsılaraq*). Həmişəlik?

K n y a z  X a s a y. Bəli.

X u r ş i d b a n u (*bərk sarsılır. Ağır pauza*). Bəs sən nə düşünürsən, Xasay?

K n y a z  X a s a y. Mən heç bir qərara gələ bilmirəm!

X u r ş i d b a n u. Nə qədər də olsa, siz kişilər biz qadınlardan güclüsünüz... Xahiş edirəm, neyləmək lazım olduğunu sən özün deyəsən!

Pauza.

K n y a z  X a s a y. Əmimin yaşı doxsanı keçib... Ondan sonra ata-babamızın yurdunda tək mən qalıram. Əgər, mən də oranı həmişəlik tərk eləyib, xaraba qoysam, düşmənlər sevinəcək, dostlarsa mənə nankor, yaramaz bir oğul kimi lənət yağdıracaq.

X u r ş i d b a n u (*sanki bütün cəsarətini toplayaraq*). Knyaz, mən sənin öz həmvətənlərinin lənətlərinə məruz qalmağına dözmərəm!

K n y a z  X a s a y. Bilirəm ki, siz dünyanın ən alicənab qadınısınız! Gedək, Dağıstana, Banu bəyim. İndiyə qədər Qarabağda yaşamışıq, qoy bundan sonrakı ömrümüz də Dağıstanda keçsin.

X u r ş i d b a n u. Yox, Xasay! Öl desən, ölərəm, amma bu faciəli vətənimi atıb getmərəm. Mənim kəndlilərim mənə ana kimi baxırlar. Dərdlərini-sərlərini mənə açırlar. Məndən kömək umurlar.

K n y a z  X a s a y. Siz tez-tez gəlib onlara baş çəkərsiniz. Axı... axı... Sizin öz həyatınız da var, Banu bəyim!

Xurşidbanu heç bir cavab verməyərək, qəti addımlarla knyaz Xasaya yaxınlaşaraq boynundakı medalyonu açıb onun boynundan asaraq, yaxasını düymələyir.

X u r ş i d b a n u. Bu medalyonun içində bizim övladlarımızın – Mehdiqulu ilə Xanbikənin şəkilləri qoyulub. Apar özünlə! Allah səni həmvətənlərinlə xoşbəxt eləsin.

K n y a z  X a s a y (*həyəcanla*). Ax, Banu bəyim.. (*Xurşidbanunu sinəsinə sıxır*)

X u r ş i d b a n u (*onu bərk-bərk öpür*). İndisə get, knyaz! Bizim birlikdə keçirdiyimiz günlərin xatirələri mənim üçün o qədər əzizdir ki, bundan sonra ömrümə on ömür də calansa, yenə də onlar məni yaşatmağa kifayət edər!

Knyaz Xasay sürətlə otaqdan çıxır. Xurşidbanu bütün gücünü toplayaraq, mərdanəliklə ayaq üstə dayanıb onun ardınca baxır.

İ ş ı q  s ö n ü r

## YEDDİNCİ ŞƏKİL

Xurşidbanunun malikanəsi. Bəyim, Xurşidbanunun qərənfillərinə su tökür. Daşdəmir qapını aralayıb başını içəri uzadaraq, ona xitabən, şən əda ilə oxuyur.

D a ş d ə m i r (*oxuyur*).

Araz axır lil ilə,
Dəstə-dəstə gül ilə,
Mən yarımı sevirəm
Şirin-şirin dil ilə.

B ə y i m. Kefim yoxdur, Daşdəmir.

D a ş d ə m i r. Nə üçün?

B ə y i m. Banu bəyimin əhvalı ürəyimi qana döndərir.

D a ş d ə m i r. Niyə, nə olub Banu bəyimə?

B ə y i m. Knyaz Xasayı yaddan çıxara bilmir.

D a ş d ə m i r. Nə deyir ki?

B ə y i m. Heç nə demir... Amma hiss eləyirəm ki, ürəyi yenə də onun yanındadır. Nə eləyirsə, könlü açılmır.

D a ş d ə m i r. Nahaq yerə. Denən, xanım, o ki, sənin kimi canı qoyub getdi, sən də heç onun adını tutma.

B ə y i m. Bəyəm deməklədir? Özü hamının başına ağıl qoyur... Amma...

Möhnət və Şahmar gəlirlər.

M ö h n ə t. Salaməleyküm!

Ş a h m a r. Hər vaxtınız xeyir.

M ö h n ə t. Xan qızını görmək olar?

B ə y i m. Nahara əyləşiblər.

Ş a h m a r. Nə olar, gözlərik. (*Birdən Daşdəmiri tanıyaraq*) Bıy, ə, qağa, sən naxırçı Gülmalının oğlu deyilsən? Tu... tu... Bədnəzərdən uzaq, nə yaxşı oğlan olmusan, ə? Gümüş xəncərə bax, gümüş vəznəli çuxaya bax... Barı, Gülmalı kişiyə qənddən-çaydan alıb göndərirsən-mi, ə?

D a ş d ə m i r (*dilxor halda*). Mən niyə göndərirəm?

B ə y i m. Atasının puluna nə gəlib?

Ş a h m a r (*təəccüblə*). Yox a... Bəlkə kişi qızıl-zad tapıb, ə?

D a ş d ə m i r. Mən, sən deyən Gülmalının oğlu deyiləm. Mənim atama pullu Gülmalı deyirlər.

Ş a h m a r. Məni dolama, ə. Bizim Şahsevəndə sənin dədən naxırçı Gülmalıdan savayı Gülmalı var? (*Gülür*) Hi... hi... Ə, qodux, gözümüzün qabağında böyüməmisən? O daxmanızın üstü çürüyüb tökülür... Gör düzəldib fağır Gülmalıya beş-on manat göndərə bilərsənmi, heç olmazsa, daxmanızın üstünü düzəltsin, yağış başlarına tökülməsin.

B ə y i m. A... Daxma nədi... Bu nə danışır, Daşdəmir?

D a ş d ə m i r (*Şahmara*). Dədəmin üçmərtəbə evinə nə gəlib...

Ş a h m a r. Necə üçmərtəbə ev? Bəlkə səni qara basır, qağa?

Bəyim təəccüb və məzəmmətlə Daşdəmirə baxır.

M ö h n ə t. Ay Şahmar, bir dayan görək dayna.

B ə y i m (*pıçıltı ilə Daşdəmirə*). Çox sağ ol!

Bəyim pərt halda tələsik gedir.

M ö h n ə t (*Daşdəmirə*). Qağa, yeri gör Xan qızı nahardan qalxıbsa, xəbər ver ki, Möhnətlə Şahmar gəlib, səni görmək istəyirlər.

D a ş d ə m i r (*acıqlı*). Siz də gəlməyə vaxt tapmısınız. Dedim ki, Banu bəyim nahara əyləşib... Heç qəbul vaxtıdır...

Ş a h m a r. Sənin işin yoxdu, qağa, yeri xəbər ver. (*Daşdəmir hirsli halda gedir*) Üçmərtəbə ev ha... Sən ölmüyəsən, dünya xarab olub. Ə, bu naxırçı Gülmalının oğlu niyə əslini danır? Səfehləyib nədi?

M ö h n ə t. Ə, arif ol, dayna. Yəqin o göyçək qıza gop eləyib ki, bağ belə, bostan belə... Sən də durub kişinin oğlunun yalanını çıxarırsan...

Ş a h m a r (*gülür*). Sən ölmüyəsən, yəqin heylədi... Dəsgahın olsun Gülmalı, bu da kişinin axır əməli...

Xurşidbanu gəlir.

X u r ş i d b a n u. Xoş gördük sizi.

M ö h n ə t. Həmişə xoş günün olsun, Banu bəyim.

X u r ş i d b a n u. Nə əcəb gəlmisiniz?

M ö h n ə t. Banu bəyim, sən bir ətək pul töküb Şuşa əhlinin canını o şor sudan qurtardın...

Ş a h m a r. Üstümüzdən əskik olmayasan, Banu bəyim.

M ö h n ə t. Biz ilan mələyən Haramıdan gəlirik. Arazın iki ağaclığında olan ucsuz-bucaqsız Mil düzünün bərəkətli torpaqları

zəbanə çəkib yanır. Şahsevən, Afşar, Ağcabədi, Qarabulaq camaatı su dərdindən o torpaqları əkib-becərə bilmir. Sən xeyir işlər anasısan, Banu bəyim. Bəlkə Arazdan da Mil düzünə bir arx çəkdirəsən, bizim əlimizi çörəyə çatdırasan. Dana-dunamızın dalınca arana-dağa ayaq döyməkdən canımız qurtarar.

Ş a h m a r. Qapı-bacamızda dirrikdən-zaddan əkib dolanarıq.

M ö h n ə t. Oturaq olub, ev-eşik tikərik...

Ş a h m a r. Bağ-bağat salarıq.

M ö h n ət. Əl çəkərik o qaraçı yaşayışından, yorulmuşuq!

Ş a h m a r. Sən heylə bir iş başlasan, biz də əlimizdən gələn köməyi elərik, Banu bəyim. Biz sənin bir sözünlə dağı dağ üstünə qoyarıq!

X u r ş i d b a n u. Mən o barədə fikirləşirəm. İnşallah, tezliklə işə başlarıq.

M ö h n ə t. Ömrünüz uzun olsun.

Ş a h m a r. Gedib gözləyəcəyik, Banu bəyim.

M ö h n ə t. Salamat olun, Banu bəyim.

Ş a h m a r. Salamat olun.

X u r ş i d b a n u. Xoş gəldiniz.

Möhnətlə Şahmar gedirlər. Xurşidbanu stulda əyləşib nə isə yazır.
Bəyim əlində məktub gəlir.

B ə y i m (*Xurşidbanuya məktubu təqdim edərək*). Firəng yazıçısı Aleksandr Dümadandır.

X u r ş i d b a n u (*məktubu nəzərdən keçirərək*). Yəqin Düma elə bilir ki, biz Knyaz Xasayla bir yerdəyik. O bizə qonaq gələndə knyazla təzə evlənmişdik, həyatımızın gözəl çağları idi... O zaman heç bilməzdim ki, ömrümün xoşbəxt günləri bu qədər qısa olacaq. (*Bəyim özünü saxlaya bilməyərək ağlayır*) Ağlamaq nə üçün?

B ə y i m. Siz elə dediniz, ürəyim davam gətirmədi.

X u r ş i d b a n u. Görürsən ki, mən davam gətirirəm... Bu qəmli dünyada məhəbbətlə kədər əkiz yaranmışdır, Bəyim.

B ə y i m (*gözünün yaşını silərək üsyanla*). Yaddan çıxardın onu, Banu bəyim! O necə sizi qoyub gedə bildi?!

X u r ş i d b a n u. Onu vətəni, ata yurdu çağırırdı, məni də vətənimin dərdi saxlayırdı... Bizim ikimizin də taleyimiz bir idi.

Mirzə Ruhullah daxil olur. Bəyim çıxır.

M i r z ə  R u h u l l a h. Banu bəyim, İran şahzadəsi səninlə nəzakət görüşünə gəlib.

X u r ş i d b a n u. Yoxsa, elə bilir ki, onun cənubi azərbaycanlılara tutduğu divan yadımızdan çıxıb? Deyin, mən onu qəbul eləmək istəmirəm!

M i r z ə  R u h u l l a h. Qəbul eləmək lazımdır, Banu bəyim. Bu, dövlətlər arasında qaydadır.

X u r ş i d b a n u. Getsin canişinin hüzuruna. Biz ki, dövlət deyilik, Mirzə.

M i r z ə  R u h u l l a h. Sən İbrahim xanın nəvəsisən! Sən məşhur Azərbaycan şairəsisən! Sən onu qəbul elə, qoy görsün ki, şahlar Azərbaycan xalqını iki yerə parçalayıb, zorla bir-birindən ayrı salsalar da, onun milli ləyaqəti yaşayır!

X u r ş i d b a n u. Yaxşı, mirzə, qoy gəlsin.

Mirzə Ruhullah çıxır. Şahzadə, Mirzə Ruhullahın müşayiətilə daxil olur.

Ş a h z a d ə. İbrahim xanın nəvəsi, Mehdiqulu xanın qızı, Qarabağın gözəl şairəsi Xurşidbanu bəyimə öz dərin hörmətimi bəyan etməklə bəxtiyaram.

X u r ş i d b a n u. Təşəkkür edirəm, əlahəzrət. Ancaq biz qadınlar bir qədər şöhrətpərəst oluruq. Əlahəzrətin nəzərinə çatdırmaq istərdim ki, mən yalnız Qarabağın deyil, bütün Azərbaycanın – həm Şimali, həm də Cənubi Azərbaycanın şairəsiyəm! Özüm də bununla fəxr edirəm!

Ş a h z a d ə. Mən buna çox şadam, Xurşidbanu bəyim. Böyük İran səltənəti şeri-sənəti qiymətləndirməyi bacarır. Xüsusən də şer kəlamı bu qədər nəfis xanımın qəlbindən zahir ola...

X u r ş i d b a n u. Görünür, əlahəzrətin özü də şeri çox sevir.

Ş a h z a d ə. Bəli, Xurşidbanu bəyim, Firdovsinin, Hafizin, Sədinin kəlamı ilə dil açan şəxs şeri-sənəti sevməyə bilməz.

X u r ş i d b a n u. Dünyada qəribə təzadlar olur, əlahəzrət, şer-sənət nəcib hisslərin, nəcib fikirlərin tərcümanı olduğu halda, bəzən qəddar hökmdarlar da onu sevir.

Ş a h z a d ə (*Xurşidbanunun eyhamını başa düşərək*). Ona görə ki, Xurşidbanu bəyim, insan anadan qəddar doğulmur. Əgər, məsum bir uşaq böyüyüb ağıllı bir hökmdar olursa, özündən asılı olmayaraq, səltənətin mənafeyi onu qəddarlığa vadar eləyəcək! Belə olmasaydı,

İran şahları neçə min il taxt-səltənətdə əyləşə bilməzdi. Hətta, böyük Nuşirəvan Adil belə zəncirlərin ucunu ancaq qılınc gücünə əlində saxlayıb.

X u r ş i d b a n u (*əsəbiliyini güclə saxlayaraq*). Ona görə də, həmin Nuşirəvan Adil qardaşlıq, bərabərlik təbliğ eləyən Məzdəki boğazından asdırdı.

Ş a h z a d ə (*Xurşidbanunun sözünün üstündən keçərək*). İran şahları həmişə şerin, sənətin himayədarı olmuşlar. Firdovsilər, Sədilər, Hafizlər o böyük qayğı və məhəbbətdən ruh almışlar.

X u r ş i d b a n u. Məncə, o ulduzlar qədim İran mədəniyyətindən işıq almışlar. Mədəniyyəti isə xalq yaradır.

Ş a h z a d ə. İran mədəniyyətini belə qiymətləndirməyinizə xeyli şadam, Xurşidbanu bəyim. Ancaq sizin lütfən xalq adlandırdığınız qaragüruhun əksəriyyəti günahkarlardan, canilərdən ibarətdir ki, möhkəm hökmdar olmasa, onların öhdəsindən gəlmək olmaz!

X u r ş i d b a n u (*artıq əsəbiliyini saxlaya bilməyərək*). Güman edirəm ki, əlahəzrət xalq haqqında bu qədər sərt mülahizədə olmasaydı, cənubi azərbaycanlılarla, bəlkə də, başqa cür rəftar edərdi...

Ş a h z a d ə. Etiraf edirəm ki, biz azərbaycanlıların zəkasını, cəsurluğunu lazımi qədər qiymətləndirməmişik... Axı, İranın şah İsmayıl kimi, Nadir şah kimi qəvi hökmdarları azərbaycanlı olmuşdur. Mən hələ Qacarları demirəm.

X u r ş i d b a n u. Biz öz tariximizi yaxşı bilirik, əlahəzrət. (*Saatına baxır, bununla da görüşün qurtardığını hiss etdirir*)

Ş a h z a d ə. Bizim bu görüşümüz cənabınıza qarşı məndə böyük hörmət və heyranlıq hissi doğurdu. (*Qalxır*) Xudahafiz, xanım.

Şahzadə çıxır.

X u r ş i d b a n u (*artıq qəzəbini saxlaya bilməyərək qışqırır*). Cəllad! İkiüzlü qaniçən!

M i r z ə  R u h u l l a h. Əsəbiləşməyin, Banu bəyim. Bizim taleyimiz səbir-mətanət istəyir, mənzil uzaq, yol çətindir.

X u r ş i d b a n u. Ax, Mirzə, elə bil ki, məni dəmir məngənə arasına qoyub sıxırlar. Bəzən mənə elə gəlir ki, biz heç bir zaman bu məngənədən xilas ola bilməyəcəyik.

M i r z ə  R u h u l l a h. Xilas ola biləcəyik! Tarix çox məngənələri, zəncirləri qırıq-qırıq eləyib!

X u r ş i d b a n u (*coşğunluqla*). Nə vaxt yetişəcək o tarix?!

M i r z ə  R u h u l l a h. Azərbaycan oğullarının zəkası, cəsurluğu yaşayır! Tarix bir-iki nəslin ömründən ibarət deyil, Banu bəyim. O böyük azadlığı biz görməsək də, damarlarında bizim qanımız axan gələcək nəsillər görəcək! İndi bizim bu vətən torpağında üst-üstə qoyduğumuz hər kərpic düşmənə bir güllədi! (*Çıxır*)

Qısa pauza. Daşdəmir gəlir.

D a ş d ə m i r. Seyid Hüseyn hüzurunuza gəlmək istəyir.

X u r ş i d b a n u. Seyid Hüseyn yox, "cənab Seyid Hüseyn!"

D a ş d ə m i r. Bağışlayın, Banu bəyim, cənab sözü yadımdan çıxdı.

X u r ş i d b a n u. Bundan sonra yadından çıxmasın. Qoy buyursun.

Daşdəmir çıxır. Seyid Hüseyn daxil olub təzim edir.

X u r ş i d b a n u. Əyləşin, cənab Seyid Hüseyn.

S e y i d  H ü s e y n (*əyləşməyərək*). Banu bəyim, sizin tapşırığınız mövcibincə beş nəfər Rusiyaya, beş nəfər də Parisə təhsilə göndərmək üçün istedadlı gənclər intixab etdik.

X u r ş i d b a n u. Özləri necə baxırlar bu işə?

S e y i d  H ü s e y n. Çox sevinirlər, Banu bəyim.

X u r ş i d b a n u. Bəs valideynləri?

S e y i d  H ü s e y n. Bəziləri əvvəl razı olmaq istəmirdilər, deyirdilər oxutmağa gücümüz çatmaz, fəqət mən onları başa saldım ki, cavanlar onların yox, sizin xərcinizlə təhsil alacaqlar! Ondan sonra məmnuniyyətlə razılıq verdilər.

Hidayət xan daxil olur.

H i d a y ə t  x a n (Seyid Hüseynə əhəmiyyət verməyərək). Salam, əmizadə.

X u r ş i d b a n u. Xoş gəlmisən, Hidayət.

H i d a y ə t  x a n. Bizim Arazqırağı kəndlərimizdəki darğamız bu gün xəbər gətirib ki, guya, sən Arazdan Mil düzünə arx çəkdirmək istəyirsən. Özü də bu arx bizim torpaqlardan keçəsidir...

X u r ş i d b a n u. Bəli, elədir.

H i d a y ə t  x a n. Məqsədin nədir?

X u r ş i d b a n u. Məqsədim odur ki, min illərdən bəri əkilməyən torpaqlar camaata xeyir versin.

H i d a y ə t  x a n. Aha... Demək, sən arxı camaat üçün çəkdirmək istəyirsən.

X u r ş i d b a n u. Əlbəttə. Mən böyük el arxı çəkdirirəm.

H i d a y ə t  x a n. Məgər, sən bilmirsənmi ki, bizim o yerlərdəki rəiyyətlərimizin hamısı köçəridir. Qışlaqda cəmi iki-üç ay olurlar. Qoyun-quzularını bir ay burada otarırlar, bir ay orada... Demək onlara sən düşünən arx lazım deyil.

X u r ş i d b a n u. Su olarsa, onlar da yavaş-yavaş köçərilikdən əl çəkib, oturaq həyata keçərlər. Özlərinə ev-eşik tikib, uşaqlarını oxudarlar, qaraçı günündə yaşamazlar!

H i d a y ə t  x a n. Əgər, onlar oturaq həyata keçmək istəmirlərsə?

S e y i d  H ü s e y n. Bağışlayın, xan, oturaq həyata keçmək istəməyən o adamlardır ki, hər birinin dörd-beş min qoyunu var. Yüzlərlə atı-dəvəsi var. Kasıb tərəkəmələr üçünsə köçəri həyat əzabdır. Köçəri həyat bizim tərəkəmələri müasir mədəniyyətdən, elmdən neçə əsr geri qoymuşdur. Xaricilər bizim köçəriləri tuzem adlandırırlar.

H i d a y ə t  x a n (*kəskin istehza ilə Xurşidbanuya*). Əmizadə, yoxsa, bu fikri də sənin başına bu təzə vəzirin salmışdır?

X u r ş i d b a n u. Bu nə sözdür, Hidayət?

S e y i d  H ü s e y n. Xan, mən vəzir deyiləm. Və heç bir zaman da vəzir olmaq fikrinə düşməmişəm. İnsanların qaraçı həyatından əl çəkib elmə, mədəniyyətə sahib olması tarixin tələbidir!

H i d a y ə t  x a n. Elə isə, qoy tarix özü o zamanı gətirib yetişdirsin, daha sənin kimiləri ortalığa düşüb, vaxtsız xoruz kimi banlamasın!

X u r ş i d b a n u. Hidayət, mən ixtiyar vermirəm ki, sən bizim müəllimlə bu cür rəftar eləyəsən!

S e y i d  H ü s e y n. Mən sizi başa düşürəm, xan. Qoyunçuluqla məşğul olan köçərilərdən aldığınız vergilər, xaricə satdığınız yundan gələn mənfəət sizi belə danışmağa vadar edir!

H i d a y ə t  x a n (*əlini xəncərinin qəbzəsinə qoyub qışqırır*). Sənə dedim ki, burnunu soxma!

X u r ş i d b a n u (*qəzəblə*). Hidayət!

H i d a y ə t  x a n. Xəbərdarlıq eləyirəm səni, Banu bəyim, mən qoymayacağam o arx bizim torpaqlardan keçsin! Eşitdinmi, qoymayacağam!

Hidayət xan hirsli halda çıxır.

S e y i d  H ü s e y n. Siz məyus olmayın, Banu bəyim.

X u r ş i d b a n u (*əsəbi coşğunluqla*). Məyus olmaq? Yox! Mən öz taleyimə qalib gəlmək istəyirəm! (*Eyni əsəbiliklə zəngi səsləndirir. Daşdəmir gəlir*) Mən Muradalını çağırmışdım.

D a ş d ə m i r. Muradalı hüzurunuza müntəzirdir.

X u r ş i d b a n u. Qoy gəlsin. Özün də bu saat mühəndis Əbdürrəhim Talıbzadənin yanına gedib deyərsən ki, mən arxın layihəsini gözləyirəm, tələssin!

D a ş d ə m i r. Baş üstə. (*Çıxır*)

S e y i d  H ü s e y n. Mühəndis mənə dedi ki, layihə hazırdır.

Muradalı daxil olub təzim edir.

X u r ş i d b a n u (*eyni əsəbi əhvalla ona xitabən*). İki aydan sonra Parisdə ən qaçağan atların yarışı keçiriləcək. Bizim Qarabağ atlarının da o yarışda iştirakını arzu edirlər.

M u r a d a l ı. Biz hazır, Banu bəyim.

X u r ş i d b a n u. Yaxşı hazırlaşın! Gərək bizim atlarımız o yarışda birinci çıxsınlar. Eşidirsənmi, birinci! Qoy görsünlər Azərbaycanın yaxşı kişiləri yaxşı atları mərd oğullara tapşırıb gediblər!

İ ş ı q  s ö n ü r

## SƏKKİZİNCİ ŞƏKİL

Xurşidbanunun malikanəsi. Haradasa xanəndə, Xurşidbanunun şerini tarın müşayiətilə oxuyur. Xurşidbanu pəncərə qarşısında dayanıb kədər içində qulaq asır.

Tükəndi tab-təvan, ey xudayi-ləmyəzəli,
Ya tez canımı al, ya yetir vücala məni.
Nə vaxtadək qəmi-hicrində ahu-zar çəkim?
Tərəhhüm eylə, gətir sən də bir xəyalə məni.

Birdən Xurşidbanu əllərilə üzünü qapayıb kresloya oturur.
Mirzə Ruhullah daxil olur. Dayanıb Xurşidbanuya baxır.

M i r z ə  R u h u l l a h (*asta səslə*). Banu bəyim. (*Xurşidbanu cavab vermir. Ona yaxınlaşaraq, əlini usdufca çiyninə qoyur*) Nə olub, qızım?

X u r ş i d b a n u (*əlini üzündən çəkərək*). Heç nə. Uşaqlıqda siz həmişə mənə deyərdiniz ki, insan xoşbəxtlik üçün yaranmışdır. Mən isə, xoşbəxt olmadım. Ancaq məni düşündürən bu deyil, Mirzə, uşaqlarımın taleyidir! Qorxuram, Mirzə... Qorxuram ki, onların da taleyi mənimki kimi ola...

M i r z ə R u h u l l a h. Sənin öz taleyindən şikayət etməyə haqqın da yoxdur, Banu bəyim. Böyük yaradan həqiqi insan üçün lazım olan nəcibliklərin heç birini səndən əsirgəməmişdir! Sən xoşbəxtsən, qızım! Əgər, xoşbəxt olmasaydın, xalq səni bu qədər sevməzdi, sənin cavan qəlbin də ona bu qədər bağlanmazdı! Sən bizim igid qızımızsan! Qalx ayağa! İran şahzadəsinin vəziri Məliküldövlə səni təklikdə görmək istəyir.

X u r ş i d b a n u (*ayağa qalxaraq*). Təklikdə?

M i r z ə R u h u l l a h. Bəli, deyir, Banu bəyim həzrətlərinə vacib məxfi söz deməliyəm.

X u r ş i d b a n u. Mənə nə məxfi sözü ola bilər onun?

M i r z ə R u h u l l a h. Mənə də çox maraqlı görünür, Banu bəyim. Eybi yoxdur, qəbul elə, görək nə ərz eləyir...

X u r ş i d b a n u. Yaxşı, Mirzə, qoyun gəlsin. (*Mirzə Ruhullah çıxır. Məliküldövlə daxil olub təzim edir*) Buyurun, əyləşin.

M ə l i k ü l d ö v l ə (*səndələ əyləşərək*). İltifatınıza qarşı mütəşəkkirəm, Banu bəyim həzrətləri. Bu səhər, sizin təzə saldırdığınız bağda əlahəzrət vəliəhdlə seyrə çıxmışdıq. Oradakı dilrübu güllər, çiçəklər mənə Təbrizdəki baxçamızı xatırlatdı.

X u r ş i d b a n u. Məgər, siz Təbrizdənsiniz?

M ə l i k ü l d ö v l ə. Bəli, mən azərbaycanlıyam. Əsl adım da Mirzə Kərimdir.

X u r ş i d b a n u. Aydındır... Mənə nə qulluğunuz vardı, cənab Məliküldövlə!

M ə l i k ü l d ö v l ə. Banu bəyim həzrətləri! Siz ağıllı bir qadın olduğunuz üçün mən heç bir müqəddiməyə şiru etmədən birbaş mətləbə keçirəm.

X u r ş i d b a n u. Buyurun!

M ə l i k ü l d ö v l ə. İran taxtının vəliəhdi şahzadə həzrətləri sizinlə izdivac təmənnasındadır.

X u r ş i d b a n u. Məgər, otuz iki hərəm şahzadə həzrətlərinə kifayət deyil?

M ə l i k ü l d ö v l ə. Vəliəhd həzrətləri sizi, necə ki, fövqəladə ağıl sahibi bir xanım kimi taxt-taca varislik ixtiyarilə baş hərəm eləmək fikrindədir.

X u r ş i d b a n u. O... nə böyük iltifat.

M ə l i k ü l d ö v l ə. Bəli... Bəli! Mən sizi əmin eləyə bilərəm ki, bu vəliəhdin ürək sözüdür. O sizin əqlinizə, gördüyünüz işlərə, nəfis gözəlliyinizə heyran olmuşdur.

X u r ş i d b a n u. Cənab Məliküldövlə, siz necə ki, bizim azərbaycanlımız, soruşuram: bəs, belə bir izdivaca siz özünüz necə baxardınız?

M ə l i k ü l d ö v l ə. Banu bəyim, əlbəttə ki, neçə minillik tarixə malik İran səltənətilə qohum olmaq biz azərbaycanlılar üçün xoşbəxtlik olar. Sizin babanız İbrahim xan ağıllı bir dövlət xadimi olduğu üçün hələ o vaxt bunu düşünüb qızı Ağabəyim ağanı Fətəli şaha ərə vermişdi. Ağabəyim ağa da dərin zəka sahibi olduğu üçün şah onu baş hərəm, yəni Şahbanu təyin etmişdi. Mühüm dövlət məsələlərini onunla məsləhətləşirdi.

X u r ş i d b a n u. İbrahim xan İran şahının etibarını qazanmaq üçün gözəl qızı Ağabəyim ağanı ona, bir növ, girov vermişdi. Bu xan babamın bağışlanılmaz günahı idi.

M ə l i k ü l d ö v l ə. Banu bəyim, dini islam Yer üzündəki bütün müsəlmanların birliyini buyurur. Bilirsiniz ki, məmləkəti Azərbaycan iki böyük dövlətdən birinə iltica etməlidir. Belə bir dövlət isə, əlbəttə ki, dini dinimizdən olan böyük İran səltənətidir.

X u r ş i d b a n u. Əgər, İran şahları öz dini qardaşlarının qədrini bilirdilərsə, nə üçün qoşun çəkib, Azərbaycan əhalisinin əlsiz-ayaqsızlarını qılıncdan keçirirdilər? Nə üçün sizin vəli nemətiniz vəliəhd Cənubi Azərbaycana divan tuturdu? Nə üçün İran şahları Cənubi azərbaycanlıların dilini, milli hüququnu əlindən alıb, onları öz içlərində əritmək istəyirlər?!

M ə l i k ü l d ö v l ə. Banu bəyim! Sizi inandırıram ki, İran hökmdarlarının bizi farslaşdırmaq siyasəti biz azərbaycanlıların xoşbəxtliyidir!

X u r ş i d b a n u. Xoşbəxtliyidir?

M ə l i k ü l d ö v l ə. Şübhəsiz, o zaman biz də farslarla bir hüquqda olarıq, dövlət işlərində onlarla bərabər iştirak edərik! Bəli!

X u r ş i d b a n u. Ona görə də, siz əsli-nəcabətinizi danıb, Məliküldövlə olmusunuz?

M ə l i k ü l d ö v l ə. Banu bəyim həzrətləri...

X u r ş i d b a n u (*son dərəcə qəzəbli*). Tutmayın mənim adımı! Rədd olun, nökər! Qab dibi yalayan nökər, rədd olun!

M ə l i k ü l d ö v l ə (*öz-özünə*). Bu nədi, baba! (*Cəld çıxır*)

Mirzə Ruhullah daxil olur.

M i r z ə R u h u l l a h. Nə olub, Banu bəyim?

X u r ş i d b a n u. Yerlər-göylər bu rəzalətə necə dözür? Adı azərbaycanlı olan bu rəzil, minlərlə azərbaycanlının qatili üçün mənə elçi gəlir... Farslaşmağı Azərbaycan üçün xoşbəxtlik adlandırır?! Doğrudanmı, yadelli qəsbkarların istilaları bu xalqın milli qürurunu öldürmüşdür?

M i r z ə R u h u l l a h. Sən ruhi müvazinətini itirmə, Banu bəyim! Vaxt gələcək, xalq özü vətən xainlərinə divan tutacaq. (*Qısa pauza*) İcazənlə sənə bəzi sözlər ərz etmək istəyirəm.

X u r ş i d b a n u. Buyurun, Mirzə.

M i r z ə R u h u l l a h. Bizim yüksək cəmiyyətlərdə necə iftiralar, böhtanlar quraşdırıldığını bilirsən...

X u r ş i d b a n u. Nə olub, Mirzə, yenə qarğalar ağız-ağıza verib nə qarıldaşırlar?

M i r z ə R u h u l l a h. Məlumundur ki, sənin açıq, mərdanə hərəkətlərin, zəhmətkeş adamların sənə ehtiramı bəzən ağaların xoşuna gəlmir... Hətta qəzəblərinə səbəb olur. Ona görə də, bütün iftiralara, dedi-qodulara son qoymaq üçün məsləhət budur ki, sən subay qalmayasan.

X u r ş i d b a n u. Qorxmuram mən onların böhtanlarından, Mirzə! Onsuz da, mən heç bir zaman onlardan yaxşı söz eşitməmişəm.

M i r z ə R u h u l l a h. Məsələ qorxmaqda deyil, Banu bəyim. Bir tikə vaxtından mən sənin müəllimin olmuşam. Ona görə də, açıq danışdığım üçün üzr istəyirəm. Sən cavansan... Bütün ömrün boyu subay qala bilməzsən. Bir də ki... Sənə kömək lazımdır. Həqiqi rəfiq lazımdır.

Qısa pauza.

X u r ş i d b a n u. Yaxşı, Mirzə, mən o barədə fikirləşərəm.

Mirzə Ruhullah təzim edərək çıxır. Pauza. Hiss olunur ki, Xurşidbanu dərin psixoloji sarsıntı keçirir. Və birdən zəngi səsləndirir. Bəyim daxil olur.

X u r ş i d b a n u. Get Seyid Hüseyni bura çağır, Bəyim. (*Bəyim çıxır. Qısa pauza. Seyid Hüseyn daxil olub təzim edir*) Seyid Hüseyn! Mənə xəbər verdilər ki, siz hər gün bağçanın qalınlığında dayanıb, mənə gizlin tamaşa edirsiniz. Nə üçündür bu maraq? (*Pauza*) Niyə dinmirsiniz?

S e y i d  H ü s e y n. Qəbahətimi əfv buyurun, Banu bəyim.

X u r ş i d b a n u. Siz mənim sualıma cavab vermədiniz...

S e y i d  H ü s e y n. Banu bəyim! Mən ancaq sizdən üzr istəyə bilərəm...

X u r ş i d b a n u (*qəsdən*). Bəlkə, siz, İrandan göndərilmiş bir casussunuz... Bəlkə, həbsdən qaçmış bir canisiniz?

S e y i d  H ü s e y n (*yalnız indi Xurşidbanuya kəskin bir cəsarətlə baxaraq*). Mən namuslu adamam, Banu bəyim! Mən sizə yalan ərz etməmişəm!

X u r ş i d b a n u. Bəs, onda, sizin o qəribə hərəkətlərinizi nə ilə izah etmək olar?

S e y i d  H ü s e y n. Əfv buyurun, Banu bəyim! Onsuz da, mən gecə-gündüz cəhd edirəm bu günahkar məhəbbəti ürəyimdən çıxarım!

X u r ş i d b a n u. Nə üçün siz o məhəbbəti günahkar hesab edirsiniz? Yoxsa, siz sufisiniz?

S e y i d  H ü s e y n. Mən özümü bu məhəbbətə layiq bilmirəm.

X u r ş i d b a n u. Nə üçün? Siz belə gözəl, sağlam, savadlı bir oğlan...

S e y i d  H ü s e y n. Mən kimsəsiz, yoxsul bir adamam...

X u r ş i d b a n u. Məgər, yoxsulların sevməyə ixtiyarı yoxdur? (*Qəribə bir tənə ilə*) Cənab Seyid Hüseyn! Mən, İbrahim xanın nəvəsi, Mehdiqulu xanın qızı Xurşidbanu, Allahın buyurub, Peyğəmbərin xəbər verdiyi qanun üzrə sizin zövcəniz olmaq istəyirəm. Siz buna razısınızmı?

S e y i d  H ü s e y n. Banu bəyim!

X u r ş i d b a n u (*əsəbi*). Bəsdirin! Məgər, mən də öz vətənimdə kimsəsiz deyiləmmi? Məgər, bizim səsimiz Qaf dağında tilsimə salınmış əfsanəvi Zümrüd quşunun səsi kimi bir yana gedib çıxırmı? Yox, Seyid Hüseyn, tale bizi əbəs yerə bir-birimizə rast gətirməmişdir! Biz

indi əlacsız da olsaq, çərxi-dövranı geriyə döndərə bilməsək də, mücahidik! Qoy böyük Yaradan bizim izdivacımızı vətənimiz üçün uğurlu eləsin!

S e y i d  H ü s e y n. Amin!

İ ş ı q  s ö n ü r

## İKİNCİ PƏRDƏ

### DOQQUZUNCU ŞƏKİL

Xurşidbanunun malikanəsi. Xurşidbanu divanda əyləşmiş halda əlində açıq bir məktub yuxulamışdır. Açıq pəncərədən Şuşa qalasının duman içində olduğu görünür və bayırda bu duman içindən Knyaz Xasay çıxaraq ətrafa diqqətli nəzər salıb pəncərəyə yaxınlaşır və cəld hərəkətlə pəncərədən sıçrayıb içəri keçir. Xurşidbanuya tamaşa edir. Əlini uzadıb ona toxunmaq istəyir, lakin toxunmur.

K n y a z  X a s a y (*pıçıltı ilə*). Banu bəyim!

Xurşidbanu diksinib ayılaraq, vahimə içində ona baxır.

X u r ş i d b a n u (*təəccüblə*). Necə? Məgər, bu yuxu deyilmi? (*Tamam ayılaraq*) Axı, mən indicə səni yuxuda görürdüm, knyaz.

K n y a z  X a s a y. Mən sizin ərə getdiyinizi eşidib, üç gün, üç gecə at sürərək, Dağıstandan gəlirəm, Banu bəyim. Sizin üçün söz-həkət olmasın deyə, atları nökərimlə Daşaltında qoyub, Xəzinə qayasından çıxmışam. Buradan gedəndən bəri elə bir gün olmayıb ki, mən sizin ayrılığınızın sitəmini çəkməyim... Mən sizdən ayrılmaqla özümə zülm eləmişəm, Banu bəyim. Gəlin nikahımızı təzələyək. Bir də heç bir zaman bir-birimizdən ayrılmayaq!

X u r ş i d b a n u. Gedən səadət bir də geri qayıtmaz, knyaz. Mən başqasına söz vermişəm.

K n y a z  X a s a y. Mən elə güman edirəm ki, siz hələ də məni sevirsiniz.

X u r ş i d b a n u (*incik*). Gəl, o barədə danışmayaq, knyaz. Mən qəlbi qara adamların iftiralarından təngə gəlib, adi, yoxsul bir adama ərə gedirəm ki, öz vətənimə sərbəstliklə, cəsarətlə xidmət eləyim!

K n y a z  X a s a y. Bu şair xəyalının romantikasıdır, Banu bəyim... Siz öz sinfinizin tənəsinə dözə bilməzsiniz.

X u r ş i d b a n u. Mən öz sinfimdən o qədər pisliklər görmüşəm ki, daha öyrənmişəm.

K n y a z  X a s a y. Sizdən ayrılıb getdiyim üçün məni bağışlayın, Banu bəyim. Mən sonradan başa düşdüm ki, sizsiz həyat mənə cəhənnəmdir.

X u r ş i d b a n u. Mən səni təqsirləndirmirəm, knyaz. Səni də öz elin-oban çağırırdı.

K n y a z  X a s a y. Elə bilirsiniz o yalçın qayalar arasında dərin uçurumlarla bir-birindən ayrı düşüb, hər aulu bir dildə danışan xalqım üçün mən bir şey eləyə bilmərəm? Sizdən ayrılıb gedəndən sonra, mən də məktəblər açmağa, tayfalar arasında olan qanlılığı ortadan götürməyə çalışdım. Təhsil üçün Rusiyaya cavanlar göndərdim. Lakin bizimlə dədə-baba ədavətləri olan kübarlar çara danos verdilər ki, guya, mən millətçilik eləyirəm, Şeyx Şamilin yolu ilə gedirəm. Məni təqib edirlər, Banu bəyim. Mən azad gəzən bir məhbusam! Bu lənətə gəlmiş zəmanədə xeyirxah arzularla həyat arasında elə dəhşətli bir uçurum vardır ki, onu keçmək mümkün deyil, Banu bəyim!

X u r ş i d b a n u. Nə etməli, əgər, bizə "xoh" eləyəndə, geri çəkilsək, gələcək nəsillər bizi lənətlərlə yad edərlər.

K n y a z  X a s a y. Hər şeyi tarix özü gətirib yetişdirməlidir, Banu bəyim. Gələcək nəsillər üçün bizim özümüzü qurban verməyimiz boş bir aldanışdır. (*Qızğınlıqla*) Bizdən sonra həyat yoxdur, Banu bəyim, inanın bu fəlsəfəyə! Gəlin gedək... Gedək uzaqlara... İstəyirsinizsə, Parisə... İstəyirsinizsə, İtaliyaya...

X u r ş i d b a n u. Yox, knyaz. Mən səni indi də istəyirəm. Yəqin ki, ölənəcən də istəyəcəyəm. Ancaq... bu vətənimi atıb getmək... yox, bu mümkün deyil!

K n y a z  X a s a y (*dərindən nəfəs alaraq*). Görünür, bu dünyada qismətdən artıq götürmək olmazmış... Yəqin ki, uşaqlar yatıb... Axı, indi onların istirahət vaxtıdır.

X u r ş i d b a n u. İstəyirsən, oyadım. Onlar səni tez-tez xatırlayırlar, knyaz. (*Mütəəssir halda*) Bilsən ki, bu mənim üçün nə qədər ağırdır...

K n y a z  X a s a y. Qoy yatsınlar. Qoy onlar atalarını unutsunlar. Əlvida, Banu bəyim! Mən bu qəhrəman qalada dünyanın ən nəcib qadınını qoyub gedirəm.

X u r ş i d b a n u. Əlvida, mənim əzizim, qoy böyük Allah sənin himayədarın olsun!

Knyaz Xasay yenə də pəncərədən düşüb gedir. Xurşidbanu halsız halda divanda əyləşərək, əllərilə üzünü tutur. Uzaqda tarın müşayiətilə xanəndə onun şerini oxuyur.

Nə mən olaydım, ilahi, nə də bu aləm olaydı,
Nə də bu aləm ara dil müqəyyədi-qəm olaydı...
Nə hicran atəşinə odlanıb yanaydı dilim ki,
Nə eşqin içrə könül böylə xürrəm olaydı...

Xurşidbanu muğamı eşitməmək üçün, əsəbi hərəkətlə qalxıb, zəngi səsləndirir. Bəyim gəlir.

X u r ş i d b a n u (*həyəcanlı, əsəbi*). Kəs xanəndənin səsini. Denən oxumasın!

B ə y i m (*təəccüblə*). Oxuduğu sizin şerinizdir, Banu bəyim.

X u r ş i d b a n u. Denən, oxumasın!

Bəyim heç bir şey başa düşməyərək, təəccüb içində çıxır. Xanəndə susur. Xurşidbanu əsəbi halda kresloya yıxılır. Hidayət xan daxil olur.

H i d a y ə t x a n. Salam, əmizadə.

X u r ş i d b a n u. Salam.

H i d a y ə t x a n. Nə olub, səni qanıqara görürəm... Axı, gərəkdir ki, sən şadlıq eləyəsən.

X u r ş i d b a n u. Nəyə görə?

H i d a y ə t x a n. Necə "nəyə görə?" Deyirlər ərə gedirsən...

X u r ş i d b a n u (*cəsarətlə*). Bəli, gedirəm!

H i d a y ə t x a n. Cəsarətli qadınsan.

X u r ş i d b a n u. Nə barədə?

H i d a y ə t x a n. Hər barədə. Əgər, Qarabağ hakimi İbrahim xanın nəvəsi, Mehdiqulu xanın qızı heç kəsin rəyini nəzərə almayıb, əvvəl Dağıstandan azıb gəlmiş sünnü bir ləzgiyə, sonra da İrandan qaçmış, əsli-kökü məlum olmayan səfil bir gədəyə ərə gedirsə, demək, onun üçün, heç bir hüdud yoxdur!

X u r ş i d b a n u. Rica edirəm, nə knyaz haqqında, nə də cənab Seyid Hüseyn haqqında belə təhqiramiz kəlama yol verməyəsən!

H i d a y ə t x a n. Oho... Cənab Seyid Hüseyn... Görünür, Seyidin gözəl siması onu sənin gözündə "cənab Seyid Hüseyn" etmişdir.

X u r ş i d b a n u. Yox! (*Bir növ, zarafatyana*) Gözəlliyə qalsaydı, səndən gözəl, yaraşıqlı kim var idi... Sən zadəgan salonlarına girəndə, kübar xanımlar özlərindən gedirdilər...

H i d a y ə t x a n (*eyni zarafatyanalıqla*). Amma sən mənə gəlmədin... Eləmi? Yaxşı, gəl, bu atmacaları-zadı kənara qoyaq... Axı, fikirləşirsənmi ki, sən o gədəyə ərə getsən, özünü də, bizi də biabır eləmiş olarsan?

X u r ş i d b a n u (*qəzəblə*). Gədə deyil o! Mən böyük əsl-nəsəb sahibi olan knyaz Xasaya ərə gedəndə, hamınız ağız-ağıza verib məni məzəmmət eləyirdiniz ki, xan qızı bu boyda Qarabağda bir kişi tapmadı, getdi ləzgiyə. İndi də xalis azərbaycanlıya ərə gedəndə, deyirsiniz "xan qızı bir gədəyə ərə gedir". Çünki bu sizin ağalıq şəninizə toxunur. (*Qəzəblə*) Mən xan qızı Xurşidbanu bu izdivacımla kübar cəmiyyəti ilə rəiyyət arasında çəkilən mənhus səddi uçururam!

H i d a y ə t x a n. Uçura bilməzsən, əmiqızı! O sədd, səddi-Çindən də möhkəmdir! Elə güman edirsən ki, sənin atdığın addımı təqdir eləyənlər tapılacaq? Bilirsənmi, indi kübar məclislərində necə söhbətlər gedir? Deyirlər xan qızı surətpərəst, əxlaqsız bir şairə olduğu üçün iranlı gədəsinə təşüq yetirmişdir.

X u r ş i d b a n u (*acı gülüşlə*). Sən onların bu alçaq sözlərini təkrar etməklə elə bilirsən ki, mənə təsir eləyəcəksən? Mən kasıb bir rəiyyət oğlu olan Hüseynə ərə gedəcəyəm və bununla da söhbəti bitmiş hesab edirəm!

H i d a y ə t x a n (*qəzəblə*). Mən çoxlarının dərsini verdim. Hamının da dilini kəsmək olmaz! Deməк, sən dediyindən dönmürsən?! Yaxşı!

Hidayət xan çıxır. Qısa pauza. Mirzə Ruhullah gəlir.

M i r z ə R u h u l l a h. Nə olub, Banu bəyim, xan acıqlı...

X u r ş i d b a n u. Xan mənim Seyid Hüseynə ərə getmək istəməyimdən qəzəbnak olub. Ah, Mirzə, millətim ilan zəhərini mənim qanıma damcı-damcı yeridir...

M i r z ə R u h u l l a h. Millət yalnız ağalardan, bəylərdən ibarət deyil, Banu bəyim. Düzünü bilmək istəyirsənsə, onların heç millətə dəxli yoxdur. Elə bilməyin ki, mən kasıb bir rəiyyət oğlu olduğum üçün belə deyirəm. Bir sinif ki, yadelli qəsbkara qul olacaqmış, onu necə millət adlandırmaq olar? Bu o sinifdir ki, minlərlə azərbaycanlıya

divan tutmuş Ağa Məhəmməd şah kimi qaniçəni öldürüb, insanların canını qurtaran qəhrəmanı tutub, ayağına nal vuraraq, İran şahının hüzuruna göndərdi.

X u r ş i d b a n u. Bütün bunlar nə qədər dəhşətli, nə qədər anlaşılmazdır!

M i r z ə  R u h u l l a h. Yox, Banu bəyim, hər şey çox aydındır. Bəşəriyyətin birinci düşməni həmişə hakimiyyət başında əyləşən vicdansız ağalar olmuşdur. Əgər, Arximed Yer kürəsini aşırmaq üçün istinad nöqtəsinin harda olduğunu məndən soruşsaydı, deyərdim: insanların vicdanındadır o istinad nöqtəsi! Vicdan gücü isə, o kəsdədir ki, onlar ata-babadan bəri öz əllərinin halal zəhmətilə yaşayıb, vətən torpağı ilə ünsiyyət bağlamışdır. Mən sənin adi bir rəiyyət oğlu olan Hüseynlə izdivacını alqışlayıram!

İ ş ı q  s ö n ü r

## ONUNCU ŞƏKİL

Xurşidbanunun malikanəsi. Xurşidbanu və Seyid Hüseyn.

S e y i d  H ü s e y n (*Xurşidbanunun əlindən tutaraq*). O zaman sizi sevdiyim üçün, sizi ürəyimdən çıxara bilmədiyim üçün özümü danlayırdım... Özümə əzab vermək istəyirdim. Çünki sizə çatmaq, sizin məhəbbətinizə nail olmaq səadəti mənə xəyal kimi görünürdü. Siz mənim bütün qəlbimə hakim olduğunuz halda, məndən ulduzlar qədər uzaq idiniz... İndi də bizim izdivacımız bəzən mənə yuxu kimi gəlir, Banu bəyim...

X u r ş i d b a n u (*xəfif bir təbəssümlə əlini onun əlindən geri çəkərək*). Əzizim Hüseyn, biz bir-birimizə sadiq, səmimi rəfiqlər olacayıq. Bizim sevgidən danışmaq vaxtımız keçib.

S e y i d  H ü s e y n (*dərin məyusluqla*). Nə üçün elə deyirsiniz, Banu bəyim? Biz hələ otuz yaşına yenicə qədəm qoyuruq?

X u r ş i d b a n u (*dərindən nəfəs alaraq*). Amma mənə elə gəlir ki, ürəyim yüz il qocalmışdır.

S e y i d  H ü s e y n (*eyni məyusluqla*). Yox, Banu bəyim, ürəyiniz qocalmamışdır, ancaq...

X u r ş i d b a n u (*onun alnından öpərək, çox mehriban*). Gecən xeyrə qalsın, mənim əzizim. (*O biri otağa keçir*)

S e y i d  H ü s e y n (*eyni məyusluqla onun ardınca baxaraq öz-özünə*). Ürəyiniz qocalmamışdır. Mən hər şeyi başa düşürəm, Banu bəyim... Ancaq, bununla belə, madam ki, siz, özünüzü mənə zövcə olmağa layiq bilmisiniz, mən də sizə layiq ər olduğumu sübut eləyəcəyəm! İndi "səfil bir seyid" deyə mənə həcv yazan şairciklər o zaman utanıb yerə girəcəklər.

Birdən bayır qapısı taybatay açılır. Hidayət xan iki nəfərlə daxil olur.

H i d a y ə t  x a n (*istehza ilə*). Ağa Seyid, Peyğəmbər övladı olduğun üçün mən əlimi sənin qanına bulamaq istəmirəm. Ancaq şələ-şüləni yığışdır, bu gədələr səni aparıb Arazdan İrana ötürəcəklər ki, cəhənnəm olub bir də bu tərəflərə üz çevirməyəsən. Əgər, bu dəqiqə getmək istəməsən, bunlar səni boğub o kisəyə (*çiyni üstündən birinin əlindəki kisəyə işarə edir*) salaraq, aparıb Xəzinə qayasından tullayacaqlar.

S e y i d  H ü s e y n. Nə üçün, xan, mənim günahım nədi?

H i d a y ə t  x a n. Sən kimsən ki, gəlib Mehdiqulu xanın iqamətgahına dürtülüb, onun qızıyla izdivaca cəsarət eləyirsən? Kimsən?!

S e y i d  H ü s e y n. Mən insanam, xan!

H i d a y ə t  x a n. Mənə filosofluq etmə! Yığışdır şələ-şüləni! İnsan!

S e y i d  H ü s e y n. Xan, mən İran şahının zülmündən qaçıb, sizə pənah gətirmişəm.

H i d a y ə t  x a n. Pənah gətirən başından böyük qələt eləməz! Həmşəri gədəsi!

S e y i d  H ü s e y n. Xan, tərbiyəli danışın!

H i d a y ə t  x a n (*canilərə qışqırır*). Qurtarın bununla!

Canilər Seyid Hüseyndən yapışıb, onu boğmaq istəyirlər. Seyid Hüseyn müqavimət göstərir. İşıq Xurşidbanunun otağına düşür. Xurşidbanu çarpayıda yatmışdır. Bəyim həyəcanla yaxınlaşıb onu oyadır.

B ə y i m. Banu bəyim! Banu bəyim!

X u r ş i d b a n u (*həyəcanla oyanıb dikələrək*). Nə olub, Bəyim?

B ə y i m. Hidayət xanın gədələri Seyid Hüseyni öldürürlər!

X u r ş i d b a n u. Necə?! (*Qalxıb gecə köynəyində yüyürür. İşıq yenə də Seyid Hüseynin otağına düşür. Canilər Seyid Hüseynlə əlləşib, onu boğmaq istəyirlər. Hiss olunur ki, Seyid Hüseyn taqətdən düşmək üzrədir. Xurşidbanu içəri girir*) Dayanın!

Canilər özlərini itirib, key nəzərlə xana baxırlar.

X u r ş i d b a n u (*Hidayət xana*). Ar olsun sənə!

H i d a y ə t x a n (*canilərə qışqırır*). Çıxın bayıra! (*Canilər çıxırlar. Xurşidbanuya*) Arvad naməhrəm kişilərin qabağına bu cür çılpaq çıxmaz!

X u r ş i d b a n u. Kişilərin? Hansı kişilərin? (*Seyid Hüseynə işarə ilə*) Bu mənim qanuni ərimdir, qaldı sən...

H i d a y ə t x a n. Yalan deyirsən! Bu hələ sənin ərin deyil! Şuşa qalasında heç bir molla sizə kəbin kəsməyə cəsarət eləməz!

X u r ş i d b a n u. Cəsarət eləyən tapıldı. Kürdüstanlı cavan axund Hacı Şükür bu gün bizim kəbinimizi kəsmişdir.

H i d a y ə t x a n (*yanıb-tökülərək əlini xəncərin qəbzəsinə atır*). Ah, ifritə! İfritə!

X u r ş i d b a n u. İfritə, hər halda, namərd kişidən yaxşıdır. Silahsız, günahsız adamı canilərin əli ilə öldürmək istəyirsən?

H i d a y ə t x a n. Sən bu iranlı gədəsinə uyub, Pənah xan nəslinin papağını yerə vurdun. Mən utandığımdan əyanların üzünə baxa bilmirəm! Sənin bu səfilə ərə getməyin bizi əlahəzrət imperatorun da gözündən salacaq!

S e y i d H ü s e y n. Siz nahaq yerə bizi təhqir edirsiniz, xan. Mən sizə acıyıram.

H i d a y ə t x a n (*əlini xəncərinin qəbzəsindən götürərək, təəccüblə*). Sən mənə acıyırsan?

S e y i d H ü s e y n. Bəli! Çünki, görünür, əlahəzrət imperator sizin kimi gözəl, ziyalı oğlanın azadlığı ilə bərabər, olan ağlını da əlindən alıb. Bu, dəhşətdir, xan!

H i d a y ə t x a n (*birdən qəribə bir sakitlik və maraqla*). Sən nəyə görə məni ağıldan məhrum edilmiş sanırsan?

S e y i d H ü s e y n. Ona görə ki, xan, siz, kim, haralı olduğunuzu, hansı xalqa mənsub olduğunuzu çoxdan unutmusunuz. Sizin üçün "Azərbaycan" sözü yoxdur. Siz öz ana dilinizdə danışmağı belə ar bilirsiniz.

H i d a y ə t x a n. Tutaq ki, mən azərbaycanlı olduğumu başa düşürəm, neyləyə bilərəm?

S e y i d H ü s e y n. Xalqına, vətəninə canıyanan, onun dərdindən halı olan adam belə sual verməzdi, nə etmək lazım olduğunu ona ürəyi, vicdanı söyləyərdi...

H i d a y ə t  x a n. Nə ərz etmək istədiyini başa düşürəm, ağa Seyid. Ancaq Yer kürəsini öz məhvərindən çıxarmaq olmaz!

S e y i d  H ü s e y n. Yox, xan. Yer kürəsi öz məhvərindən çıxacaqdır.

H i d a y ə t  x a n. Ağa Seyid, sən nə əvvəlinci malxulyaçısan, nə də axırıncı. Madam ki, İbrahim xanın nəvəsi, Mehdiqulu xanın qızı sənin kəbinli arvadın olub, daha səni öldürməyin mənası yoxdur. Qoy şərəf və şöhrətlərini sənin kimilərinin ayaqları altına saldığı üçün Banu bəyim xan babalarının, atasının ruhlarına o dünyada özü cavab versin! Ancaq Banu bəyim, nahaq yerə sən boşboğazın mənasız nitqlərinə aludə olub, özünü biabır elədin.

X u r ş i d b a n u. Mən kübar cəmiyyətindəki ikiüzlü əxlaq qanunlarının zəncirini qırdığım üçün özümü quş kimi azad hiss edirəm.

H i d a y ə t  x a n (*dərindən nəfəs alaraq*). Sən özün özünü aldadırsan... Banu bəyim... Heyf səndən... (*Sürətli addımlarla çıxır*)

S e y i d  H ü s e y n. Banu bəyim, siz məni mənasız bir ölümdən xilas etdiniz. O da mənə əyan olmuşdur ki, siz, sadəcə olaraq, mənə bir həyat rəfiqi kimi hörmət edirsiniz. Bunu düşünmək mənim üçün hər nə qədər ağır olsa da, siz etibar eləyib, mənim kimi adi, yoxsul bir oğlanı özünüzə rəfiq intixab elədiyiniz üçün bu tikanlı, uçurumlu yollarda son nəfəsimə qədər sizin xilaskarınız olacağam!

Seyid Hüseyn Xurşidbanunun qolundan yapışaraq, onu otağına aparır. Bəyim daxil olaraq, onların ardınca baxır. Daşdəmir həyəcanlı halda gəlir.

D a ş d ə m i r (*pıçıltı ilə*). Bəyim! (*Bəyim geri çevrilir*) Nə olub burada?

B ə y i m (*ondan incidiyini unudaraq, həyəcanla*). Hidayət xanın gədələri Seyid Hüseyni öldürmək istəyirdilər.

D a ş d ə m i r (*xəncərindən yapışaraq*). Bəs, niyə yüyürüb mənə xəbər vermirdin ki, gəlib o gədələri ləzgi xəngəli kimi doğrayım.

B ə y i m (*birdən Daşdəmirin yalanını xatırlayaraq*). Gopçu.

D a ş d ə m i r. Gopçu niyə oluram, az?!

B ə y i m (*onu yamsılayaraq*). “Dədəmin qızılı xurcunladır... Üçmərtəbə evlərimiz belə oldu... At ilxıları belə getdi...”

D a ş d ə m i r. Bəyimcan, zarafat idi, eləyirdik dayna...

B ə y i m. Elə zarafat olar?

D a ş d ə m i r. Axı, neyləyim, başlamısan ki, “hamı mənə Bəyim xanım deyir... Mən gedib sizin daxmanızda neyləyəcəyəm”, amma görürsən, Banu bəyim kimi xan qızı Seyid Hüseyn kimi kasıb oğlana getdi.

B ə y i m. Seyid Hüseyn, Banu bəyimin dərdindən dəli-divanə idi.

D a ş d ə m i r. Gərək mən də gedəm özümü Xəzinə qayasından atam ki, səni istədiyimə inanasan!

B ə y i m. İstəyən özünü qayadan atmaz!

D a ş d ə m i r. Bəs, neyləyər?

B ə y i m. Sevgilisini alıb aparıb qoyar evinə.

D a ş d ə m i r. Axı, sən daha məni istəmirsən.

B ə y i m (*gülümsəyərək zərif, mehriban əda ilə*). İstəyirəm.

D a ş d ə m i r (*bicliklə*). Eşitmədim, Bəyim can, bir də de...

B ə y i m (*bərkdən*). İstəyirəm.

D a ş d ə m i r. Ox... nə gözəl dedin, Bəyimcan. Bəs atam...

B ə y i m. Nə olsun, mən özüm xan qızı deyiləm ki... (*Birdən acıqlı*) Sevən kasıblığına, dövlətliliyinə baxmaz, Daşdəmir.

D a ş d ə m i r (*heyranlıqla*). Sağ ol, vallah, tay sənə xanım deməyim ki?.. (*Bəyim gülümsəyərək* “*yox*” *mənasında başını bulayır*) Sən nə yaxşı qızsan, Bəyimcan. (*Qızı özünə tərəf çəkir*)

İ ş ı q s ö n ü r

## ON BİRİNCİ ŞƏKİL

İran şahzadəsi və Məliküldövlə.

Ş a h z a d ə. Siz, bu xan qızı Xurşidbanunun əməlinə baxın?! Böyük İran səltənətinin vəliəhdini rədd eləyib, Cənubi Azərbaycandan qaçmış bir gədəyə ərə gedir?! (*Şərab içir*) Xeyrini-şərini başa düşən deyil sənin bu Azərbaycan millətin, Məliküldövlə...

M ə l i k ü l d ö v l ə. Siz məni rəncidəxatir eləyirsiniz, qurban... Məgər, məndə azərbaycanlılıqdan bir əlamət qalmışdır?

Ş a h z a d ə. Lakin bir həqiqət var ki, İran taxtına mənim yolum Cənubi Azərbaycandandır. Cənubi azərbaycanlılar İran şahının siyasətindən bərk incikdirlər. Biz bundan bə qədri qüvvə istifadə etməli-

yik! Düşündüm ki, İbrahim xanın nəvəsi Xurşidbanu ilə evlənmək məni azərbaycanlılarla qohum edər. Onlar da bu ali qohumluğa binaən mənim vədlərimə inanıb, taxta sahib olmağıma kömək edərlər. Özləri də vuruşmağı bacaran cəsur millətdir.

M ə l i k ü l d ö v l ə. Onlar rusları üstün tuturlar, qurban...

Ş a h z a d ə. Bəs, dini-islam? Məgər, onlar bunu düşünmürlərmi?

M ə l i k ü l d ö v l ə. Xeyr, qurban, düşünmürlər. Xurşidbanu cavanları dəstə-dəstə Rusiyada təhsil almağa göndərir...

Ş a h z a d ə (*əsəbi*). Nəhs gətirmə, baba! Siyasət əzm və hərəkət tələb edir. (*Şərab içir*) Günü sabah sən Xurşidbanuya mənim adımdan qiymətli bir hədiyyə apararsan, qoy elə güman etməsin ki, mənimlə izdivaca razı olmadığı üçün ondan incimişəm.

M ə l i k ü l d ö v l ə. Bə görmədinizmi, o məni necə bihörmətliklə qovdu?

Ş a h z a d ə. Eybi nə darəd, baba, siyasət tələb edir, bu üzünə tüpürürlər, o biri üzünü çevir. Sonra Təbrizə, Əhrə, Cənubi Azərbaycanın başqa şəhərlərinə gizli adamlar göndərib, onlara vəd edilməlidir ki, əgər, mənə kömək eləsələr, taxt-taca sahib olan kimi məşrutə verərəm.

M ə l i k ü l d ö v l ə. Onlar buna inanarlarmı?

Ş a h z a d ə (*əsəbi*). Nəhs gətirmə, baba! İnandırmaq lazımdır.

M ə l i k ü l d ö v l ə. Bə çeşm, qurban.

Ş a h z a d ə. Məgər, şeytanın belə əqlinə gəlməyən hiylələrlə məlun qardaşımı İran taxtına çıxaran sən olmadınmı?

M ə l i k ü l d ö v l ə (*yana-yana*). Amma bunun müqabilində, o, taxta əyləşən kimi mənim boynumu vurdurmaq istədi.

Ş a h z a d ə. Bilirsən ki, anamız məni gizlincə xəbərdar etməsəydi, o xain qardaş mənim də gözlərimi çıxartdıracaymış. Şübhələnirmiş ki, mənim taxt-tacda gözüm var. Eybi nə darəd. Mən İran taxtına çıxan kimi səni vəziri-əzəm eliyəcəyəm. Bəli!.. Bəli!.. Vəziri-əzəm!

M ə l i k ü l d ö v l ə. İnşallah.

Ş a h z a d ə. İndisə, get rəqqasəni göndər bura. Qapıçıya da tapşır ki, heç kəsi mənim yanıma buraxmasın. Hərəmbaşına da desin ki, mən bu gecə istirahət etmək istəyirəm.

M ə l i k ü l d ö v l ə. Bə çeşm.

Ş a h z a d ə. Di xub...

Məliküldövlə çıxır. Təhminə kor kamançaçı ilə gəlir. Kor kamançaçı çalır, Təhminə rəqs edir. Muradalı gizlənib baxır. Şahzadə şərab içir və birdən qalxıb qızın biləyindən tutub özünə tərəf çəkir.

T ə h m i n ə (*Şahzadənin qulağına pıçıldayır*). Əlahəzrət, icazə verin, atamı aparım yatsın, sonra...

Ş a h z a d ə. Tez qayıt, qız! Tez!

T ə h m i n ə (*kor kamançaçıya*). Gedək. Əlahəzrət istirahət etmək istəyir.

K o r k a m a n ç a ç ı. Əlahəzrət, icazə verin, bu qərib ölkədə, vəli nemətimiz vəliəhdin əlindən öpmək şərəfinə nail olum.

Ş a h z a d ə (*əlini uzadaraq*). Xub...

Təhminə kor kamançaçının əlindən tutub, şahzadənin yanına gətirir. Kor kamançaçı fövqəladə bir cəldliklə şahzadəni yaxalayıb, boğazından yapışır.

K o r k a m a n ç a ç ı. Əlahəzrət, mən Savalan dağlarında gözlərini çıxartdırıb, cavan gəlinini əlindən aldığın Eyvazam. Neçə vaxtdır ki, sənin ardınca diyarbədiyar gəzib intiqamımı öz əllərimlə, bax, beləcə almağa fürsət axtarırdım!

Kor kamançaçı geyməsinin altından çıxartdığı balaca xəncərlə Şahzadəni vurur. Muradalı səssizcə çıxaraq, getmələri üçün işarə edir. Kor kamançaçı, Təhminə və Muradalı gedirlər. Məliküldövlə gəlir.

M ə l i k ü l d ö v l ə (*öz-özünə*). Musiqi birdən-birə susdu... Sarayda da ayaq səsləri, hənirti eşidildi... (*Birdən yerə yıxılmış şahzadəni görür... Əyilib baxır*) Nə oldu buna? (*Dəhşət içində bir neçə saniyə susur*) Elə bil, qeybdən bir səs mənə deyir: “Bu ölən sənin son ümidindir, Məliküldövlə! İmanını yandırdın, vətənini satdın, xalqına xəyanət elədin... Hiylələr, fəsadlar qurdun, şahların təhqirinə dözdün, axırıncı ümidini bu zalım əxlaq düşgününə bağladın, o da belə oldu... Ey böyük Yaradan! Sən əlrəhmərrahimsən, bağışla mən üzü qara bəndənin günahlarını! Yox, hiss edirəm ki, eşitmək istəmir Allah mənim səsimi... Hara üz çevirəcəksən, Məliküldövlə? Kimə iltica edəcəksən? Yoxdur bu dünyada sənə yer! Bütün var-dövlətin də bu məlunun ucbatından qaldı İranda. Heç nə götürməyə macal tapmadın. Deyirlər əqrəb düşdüyü torda öz-özünü sancıb öldürür.

Özünü öldürmək üçün əlini belindəki balaca xəncərə aparır. Lakin cəsarəti çatmır. Dərin bir ümidsizlik içində gözlərini yumur... Səhnə qaranlıqlaşır.

## ON İKİNCİ ŞƏKİL

Qala rəisinin otağı. Qala rəisi, Zahir bəy Fəda, Mixaylov.
O, ara-sıra nə isə yazır.

Q a l a r ə i s i (*əsəbi*). Məsələ aydındır! Bu, bizimlə İran şahının arasını vurmaq üçün təşkil edilmiş bir provakasiyadır. Bəli! Bəli, provakasiya!

F ə r ə c b ə y. Da... da... Elədir ki, var!

Z a h i r b ə y. Bəndeyi həqiriniz də, o fikirdədi, cənab rəis.

Q a l a r ə i s i. Beynəlxalq vəziyyətin indiki şəraitində bizi ittiham eləyib, özünə borclu çıxarmaq üçün İran şahına bəhanə lazımdır! Cənab Zahir bəy, sizcə kimlər ola bilər bu işin təşkilatçıları?

Z a h i r b ə y. Cənab rəis, hayana çevirsən bu cinayətin bir ucu gedir çıxır Xan qızı Xurşidbanunun sarayına!

F ə r ə c b ə y. Da... da... Elədir ki, var.

Q a l a r ə i s i. Nəyə görə siz bu fikrə gəlmisiniz, cənab Zahir bəy?

Z a h i r b ə y. Mən dəfələrlə qulluğu şərəfinizə ərz etmişəm ki, Xurşidbanunun təşkil elədiyi "Məclisi-üns" əlahəzrət imperatora düşmən kəsilmiş siyasi bir ocağa çevrilmişdir. Onlar "Məclisi-üns"də şerdən çox siyasətdən, azadlıqdan danışırlar.

Q a l a r ə i s i (*əsəbi*). Hansı azadlıqdan?

Z a h i r b ə y. Məlumdu hansı azadlıqdan...

Q a l a r ə i s i. Yoxsa, dekabristlərin cinayətkar xülyaları buralara da gəlib çıxmışdır?! Yoxsa, qorxmurlar onlar imperatorun divanından?!

Z a h i r b ə y. Vəliəhd öldürülən gecənin səhəri Xurşidbanunun baş mehtəri Muradalı yox olmuşdur. Muradalı isə, Xurşidbanunun ərə getdiyi Seyid Hüseynin xalası oğludur.

F ə r ə c b ə y. Da... da... Elədir ki, var...

Q a l a r ə i s i. Şahzadə öldürülən gecə həmin Muradalını onun sarayının yanında görüblər... Belə düşünmək olar ki, Seyid Hüseyn Təbrizin keçmiş hakimi Şahzadəni öldürmək üçün Cənubi azərbaycanlılar tərəfindən göndərilmiş bir terrorçudur!

F ə r ə c b ə y. Da... da... Elədir ki, var.

M i x a y l o v (*qəzəblə*). Fərəc bəy, imkan verin!

Q a l a  r ə i s i (*Mixaylova*). Sakit.

Z a h i r  b ə y. Digər tərəfdən, cənab rəis, İbrahim xanın nəvəsi, Mehdiqulu xanın qızı Xurşidbanunun lüt bir Cənubi azərbaycanlı gədəsinə ərə getməsi özü də çox qəribə deyilmi? Bu əcayib əhvalat bütün zadəganları qəzəbləndirmişdir! Həmin Seyid Hüseynin də taxt-tac əleyhinə necə qəzəbli nitqlər irad etdiyini sizə demişəm. Mən öz millətimin halına yanıram, cənab rəis, onlar bizi əlahəzrət imperatorun nəzərindən sala bilərlər.

F ə r ə c  b ə y. Da... da... Elədir ki, var.

Q a l a  r ə i s i (*qalxaraq*). Yaxşı, cənab Zahir bəy, biz, Şahzadənin öldürülməsi ilə əlaqədar qalaya gələn canişin həzrətlərini qarşılamağa getməliyik. Əlahəzrət hökuməti sizin xidmətinizi yenə də əvəzsiz qoymaz.

Z a h i r  b ə y. Mən əlahəzrət imperatorun sadiq quluyam.

Q a l a  r ə i s i. Rica edirəm, bu biri qapıdan çıxasınız.

Z a h i r  b ə y (*kinayəli təbəssümlə*). Başa düşürəm. (*Çıxır*)

Q a l a  r ə i s i. Bu qrafoman şairin söylədiklərini yazdınmı, Seryoja?

M i x a y l o v. Yazdım. Ancaq bu hərif qrafoman olmaqdan savayı, həm də, satqının biridir. Həmvətənləri bunu əclaf bir adam kimi tanıyırlar.

Q a l a  r ə i s i. Bizə nə dəxli var ki, Zahir bəy istedadsız şairdi, əclafdı... Adı şairdir, qurtardı. Elə deyilmi, cənab Fərəc bəy?

F ə r ə c  b ə y. Da... da... Elədir ki, var.

M i x a y l o v. İvan Petroviç, mən Zahir bəy kimi şərəfsiz bir vəzifəbazın “Məclisi-üns” haqqında, Xurşidbanu və onun əri Seyid Hüseyn haqqında dediklərinə inanmıram!

Q a l a  r ə i s i. İnanmaq lazımdır! Yoxsa, azərbaycanlıları sən Zahir bəydən, Fərəc bəydən yaxşı tanıyırsan? (*Qəzəblə*) Kim səni vəkil eləyib ki, bu qaçaq-quldur tuzemləri müdafiə eləyəsən?

M i x a y l o v. Onlar tuzem deyil, İvan Petroviç!

Q a l a  r ə i s i. Bura bax, Seryoja! Sən mənim arvadımın yaxın qohumu da olsan, unutma ki, dayın bir dekabrist kimi tutulub sürgün edilmişdir! (*Qışqırır*) Sən əlahəzrət imperator hökumətinin zabitisən!

M i x a y l o v. Bu o demək deyil ki, mən gözlərimi yumub, hər şeyi kor-koranə qəbul edəm. Ədalət lazımdır!

Q a l a  r ə i s i. Bizim üçün ən böyük ədalət əlahəzrət imperatorun şərəfini qorumaqdır! Aydındırmı?

M i x a y l o v (*dərindən nəfəs alaraq*). Aydındır!

İ ş ı q  s ö n ü r

## ON ÜÇÜNCÜ ŞƏKİL

Xurşidbanunun malikanəsi.

X u r ş i d b a n u. Mirzə Ruhullah, Seyid Hüseyn...

S e y i d  H ü s e y n. Banu bəyim, əgər, Muradalının elə bir qəsdi olsaydı, mən bilərdim.

X u r ş i d b a n u. Təəccüblüdür, bəs, necə olub ki, Muradalı hara getdiyini bizə deməyib?

S e y i d  H ü s e y n. Bu mənim üçün də bir müəmmadır, Banu bəyim.

Nəvvab, Ter Vahan daxil olurlar.

N ə v v a b. Banu bəyim, başa düşə bilmirik ki, bu necə məsələdir? Şahzadənin əhvalatından sonra qala rəisinin müavini Fərəc bəy "Məclisi-üns"ün üzvlərini bir-bir çağırıb sorğu-suala tutur, ağlagəlməz qəribə şeylər soruşur. Hətta, qorxudur da...

Mamayı tələsik gəlir.

M a m a y ı. Banu bəyim, bu işlərdən sizin xəbəriniz var?

X u r ş i d b a n u. Nə olub?

M a m a y ı. Rəisin müavini Fərəc bəy çağırıb məni sıxma-boğmaya salıb ki, sən əlahəzrət imperatorunun əleyhinəsən, yazmısan ki, "vətənimdə vətənim yox...". Deyirəm mən zülm içində olan Cənubi azərbaycanlıları nəzərdə tutmuşam, deyir, xeyr, əlahəzrət imperatora sataşmısan...

M i r z ə  R u h u l l a h. Dad yarımçıq əlindən...

T e r  V a h a n. Fərəc bəy məni çağırıb deyir ki, "Ter Vahan, sən xristian adamsan, nə üçün gedib o "Məclisi-üns" şairlərinə qoşulmusan? Bilmirsənmi ki, bizim müsəlmanlardan yaxşı iş baş verməz?!" Mən də dedim: "Cənab nəçərnik, vallah, indi siz deyirsiniz yadıma düşür ki, mən xristianam". (*Gülür*)

Daşdəmir tələsik daxil olur.

D a ş d ə m i r (*Xurşidbanuya*). Fərəc bəy iki nəfər polislə gəlmişdir. Sizi görmək istəyir.

X u r ş i d b a n u. Necə? Mənim sarayıma polislə gəlmək?! (*Qışqırır*) Denən bu saat rədd olub getsin! (*Daşdəmir yerindən tərpənmir*) Nə üçün durmusan?

M i r z ə R u h u l l a h. Yox, Banu bəyim, madam ki, o, polislə gəlib, Daşdəmirin sözü ilə geri qayıtmaz.

X u r ş i d b a n u (*Daşdəmirə*). Qoy gəlsin!

Daşdəmir çıxır. Fərəc bəy tək daxil olub, Xurşidbanuya təzim edir.

F ə r ə c b ə y. Xan qızı Xurşidbanuya hörmət və ehtiram.

X u r ş i d b a n u (*qəzəblə*). Nə ixtiyarla mənim sarayıma polislə gəlmisiniz?

F ə r ə c b ə y. Banu bəyim! Əgər, vəziyyət məcbur etməsəydi, əlbəttə, gəlməzdik. Da... da... Ancaq... Yenə də məhz sizə dərin hörmətimizə binaən mən kiçik rütbəli çinovnik göndərməyib, şəxsən özüm gəldim...

X u r ş i d b a n u. O!.. Nə böyük nəzakət... (*Qəzəblə*) Niyə gəlmisiniz?

F ə r ə c b ə y. Da... da... Əlahəzrət imperator hökuməti adından mən cənab Seyid Hüseyni həbs etməliyəm.

X u r ş i d b a n u. Nə üçün?

F ə r ə c b ə y. Üzr istəyirəm ki, mən bunu indi sizə söyləyə bilməyəcəyəm. Da... da... Ancaq Seyid Hüseyn bizimlə getməlidir.

X u r ş i d b a n u. Seyid Hüseyn heç bir günah sahibi olmadığı üçün heç yerə getməyəcək!

F ə r ə c b ə y. Ərz elədim ki, mən əlahəzrət imperator hökuməti adından gəlmişəm.

X u r ş i d b a n u (*qəzəblə*). Mən xan qızıyam! Seyid Hüseyn də mənim ərimdir, onu həbs etməyə sizin ixtiyarınız yoxdur!

F ə r ə c b ə y. Seyid Hüseynin həbsə alınması barədə prokurorun sərəncamı var.

X u r ş i d b a n u. Dedim ki, o heç yerə getməyəcək!

S e y i d H ü s e y n (*qalxaraq*). Banu bəyim...

X u r ş i d b a n u (*eyni qəzəblə Seyid Hüseynə*). Sən dayan! (*Fərəc bəyə*) Bura Mehdiqulu xanın sarayıdır!

F ə r ə c  b ə y. Bağışlayın, Banu bəyim... İ... i... Elə eləməyin ki, mən polis nəfərlərini içəri çağırmalı olum...

X u r ş i d b a n u (*ağlını itirəcək dərəcədə qəzəbli*). Necə? (*Yaxınlaşıb Fərəc bəyi sillə ilə vurur*) Rədd ol! Bu saat! Bu dəqiqə!

F ə r ə c  b ə y (*təəccübdən hələ də özünə gələ bilməyərək*). Siz dəli olmusunuz, nədir?

X u r ş i d b a n u (*qışqırır*). Çıx dedim! (*Dalbadal iki sillə vurur. Fərəc bəy qəribə keyliklə dönüb tələsik çıxır*) Alçaqlar!

N ə v v a b. Afərin, Banu bəyim. Qoy tarix görsün ki, şairə satqınların təhqirini cavabsız qoymadı!

T e r  V a h a n. Şairəni təhqir etmək şeri-sənəti təhqir etmək deməkdir!

M i r z ə  R u h u l l a h. Şairəni təhqir etmək bütün xalqı təhqir etməkdir.

S e y i d  H ü s e y n (*qətiyyətlə*). Banu bəyim, onlar məndən əl çəkməyəcəklər. Ona görə də, özüm gedirəm: görək mənim günahım nədən ibarətdir?! Əgər, gəlməsəm, darıxma! Hələlik, ağalar.

Sürətlə çıxır. Ağır pauza. Birdən Xurşidbanu zəngi səsləndirir. Daşdəmir gəlir.

X u r ş i d b a n u (*Daşdəmirə*). Denən tez karetanı qoşsunlar! (Daşdəmir çıxır) Ağalar! Mən bu saat getməliyəm canişinin yanına.

İ ş ı q  s ö n ü r

## ON DÖRDÜNCÜ ŞƏKİL

Qala rəisinin otağı. Tiflisdən gəlmiş canişin və Xurşidbanu.

C a n i ş i n. Əlbəttə, Fərəc bəy sizin sarayınıza gəlməkdə qəbahət iş tutmuşdur. (*Zarafatyana*) Siz də onu pis cəzalandırmamısınız. Lakin, Banu bəyim, bəla orasındadır ki, həmin həbs olunan adamlar haqqında bütün məlumatı sizin öz millətinizdən, hətta, öz zadəgan sinfinizdən olan adamlar vermişdir.

X u r ş i d b a n u. Ah, knyaz, bilirsiniz ki, namuslu adam heç vaxt bu dərəcədə alçaqlıq eləməz!

C a n i ş i n. Doğrudur. Mən sizə inanmaya bilmərəm. Lakin o məlumatların yalan olduğuna əlahəzrət imperatoru inandırmaq

çətindir. (*Eyhamla*) Axı, bizdə məxfi şöbə də var... Vəliəhdin öldürülməsinin siyasi nəticəsi biz gözləyən kimi də oldu: İran şahı bizi ittiham edir.

X u r ş i d b a n u. Əlahəzrət hökumətinin bu işdə əli olmadığını sübut üçün günahsız adamları badi-fənaya vermək olarmı, knyaz?

C a n i ş i n (*bir qədər aralanaraq*). Hər şey diqqətlə öyrəniləcəkdir. Həbs edilən şəxslər, hətta, siz özünüz də əlahəzrət hökumətinə qarşı düşmənçilikdə təqsirləndirilirsiniz.

X u r ş i d b a n u. Vətən, millət xainləri sizə dürüst məlumat verməyiblər, knyaz!

C a n i ş i n. Bəs, dürüstü nədən ibarətdir, Banu bəyim?

X u r ş i d b a n u. Biz istəyirik ki, Cənubi azərbaycanlılar qəddar İran şahlarının zülmündən azad olsun. Biz öz qan qardaşlarımızla birləşmək istəyirik. Biz onu da bilirik ki, tək-tək caniləri qətlə yetirməklə bu böyük amala yetə bilmərik, böyük döyüşə isə, gücümüz çatmır... Bizə kömək eləyən yoxdur...

C a n i ş i n. Mən sizi başa düşürəm, Banu bəyim. Çox təəssüf ki, beynəlxalq vəziyyətin indiki halında imperator həzrətləri sizə heç bir kömək eləyə bilməz. Arzular müxtəlif olduğu qədər də ziddiyyətlidir; deyirlər sizin yazıçılar, ziyalılar hər cürə mütləqiyyət əleyhinədirlər. Axı, cümhuriyyət, məsələn, qədim Romaya hansı xoşbəxtliyi bəxş etdi? Dostları Sezarı öldürdülər ki, o, özünü imperator elan etmək istəyir. Amma Sezardan sonra bir-birilərilə tutuşaraq, xalqı qırğına verdilər. Fransızlar on altıncı Lyüdovikin başını gilyatinaya qoydular ki, "respublika istəyirik". Amma həmin respublikaçılar özləri xalqa divan tutdular.

X u r ş i d b a n u. Şəxsiyyət, vicdan azadlığı olmayan yerdə hansı həyatdan danışmaq olar? Əgər, xalq öz müqəddaratının sahibi deyilsə, onun dühası, cəsurluğu neyləyə bilər?

C a n i ş i n. Siz zərif bir şairəsiniz. Banu bəyim, həyatın sərt üzünü görməmisiniz. Xalq sizə əlvan buludlar üzərində uçuşan mələklər kimi görünür.

X u r ş i d b a n u. Knyaz, mən xan qızı, əminəm ki, əgər, şeytanlar, mənsəb düşkünləri olmasaydı, zəhmətkeş xalqın, doğrudan da, mələk olduğuna siz də inanardınız! Satqınların, rəzil ikiüzlülərin qurduqları hiylə-fəsadların istedadlı, namuslu, mərd insanlara güc gəlməsi məni yandırır, knyaz!

C a n i ş i n (*dərindən nəfəs alaraq*). Etiraf edirəm ki, sizin sözlərinizdə həqiqət vardır. Lakin insanlar bu həqiqətin təntənəsini nə vaxt görəcək? O barədə bir söz deməkdə acizəm. (*Pauza*) Mən çalışaram, heç olmasa, sizin rəfiqiniz Seyid Hüseyni azad etdirim. İmperator sizin xətrinizi istəyir.

X u r ş i d b a n u (*qalxaraq*). Knyaz! Mən yalnız ərimin təvəqqəsi üçün gəlməmişəm. Mən istəyirəm ki, şahzadənin öldürülməsi Azərbaycanın üzərinə qara kölgə salmasın!

C a n i ş i n. Mənim hər şeyin ədalətlə həll olunmasına çalışacağıma əmin ola bilərsiniz, Banu bəyim.

Xurşidbanu xəfif təzimlə çıxır.
İ ş ı q s ö n ü r

## ON BEŞİNCİ ŞƏKİL

Xurşidbanunun malikanəsi. İşıq yananda Xurşidbanu, Mirzə Ruhullah, Nəvvab, Mamayı, Ter Vahan yan qapıdan çıxaraq, həyəcanlı halda Zahir bəylə qarşılaşırlar.

Z a h i r b ə y (*gəlir*). Salam, ağalar. Gəncəyə getmişdim, bu saat gəlib faytondan düşürəm, deyir, bizim adamlardan neçəsini, hətta, Seyid Hüseyni də həbs eləyiblər, bu nə işdir, canım? Axı, o yazıqların nə günahı var?

X u r ş i d b a n u (*əsəbi*). Yazıq deməyin! Yazıq deyə-deyə bu milləti aciz qələmə vermisiniz! Yazıq onları satan namussuz həmvətənləridir!

Möhnətlə Şahmar başıalovlu gəlirlər.

Ş a h m a r. Hidayət xan başımıza oyun açdı, Banu bəyim!

X u r ş i d b a n u. Nə olub?

M ö h n ə t. Xanın darğası neçə atlı ilə gəlib Mil düzünə çəkdirdiyimiz arxın dəhnəsini dağıtdırdı, fəhlələri də döyə-döyə qovdurdu. O cavan injinarı da az qalmışdı öldürələr, birtəhər camaat əllərindən aldı.

Ş a h m a r. Sənin əmizadən olduğu üçün əl-qolumuz bağlandı, Banu bəyim. Yenə tüfəngi götürüb qalxardım at belinə...

X u r ş i d b a n u. Yoxdur mənim əmizadəm! Hidayət xan mənə də, üstündə durduğumuz bu torpağa da yaddır! (*Qışqırır*) Düşməndir!

Mən xan qızı Xurşidbanu inanmıram öz sinfimin vətən namusuna, eşidirsinizmi, inanmıram! Bu dəqiqədən etibarən mən onlara yadam!

Mixaylov gəlir.

M i x a y l o v (*daxil olub, Xurşidbanuya təzim edir*). Üzr istəyirəm, Banu bəyim. Mən öz vəzifəmdən istefa verib bir saatdan sonra yola düşürəm. Ancaq mən burda yaşadığım müddətdə sizin xalqınızdan elə səmimi hörmət və məhəbbət gördüm ki, içinizdəki bir xaini sizə tanıtdırmadan getməyə vicdanım yol vermədi!

S ə s l ə r. Kimdir o xain?

M i x a y l o v. O xain budur, qarşınızda dayanmışdır. (*Zahir bəyi göstərir*)

Z a h i r  b ə y (*bağırır*). Cənab zabit!

M i x a y l o v. Buyur cənab! Əgər, məni duelə çağırmaq istəsəniz, səfərimi bir gün təxirə sala bilərəm!

N ə v v a b. Cənab zabit, o sizi duelə çağıra bilməz. Əgər, onda kişilik olsaydı, vətəndaşlarına o cür alçaq böhtanlar yapışdırmazdı.

M i r z ə  R u h u l l a h. Mən bu şair bəyin satqın olduğunu çoxdan duymuşdum.

Ş a h m a r (*qışqırır*). Bəsdir siz bəylərin əlindən çəkdiklərimiz!

Şahmar xəncərini sivirərək Zahir bəyi vurmaq istəyir.
Zahir bəy adamların arxasında gizlənir.

X u r ş i d b a n u. Qoymayın oğlanı!

Möhnət, Şahmarı tutub saxlayır.

Ş a h m a r (*qışqırır*). Biqeyrətlər! Ə, Möhnət, qoy bu köpəkoğlunu isti-isti öldürüm!

X u r ş i d b a n u. Onu öldürəcəksən, başqa bir Zahir bəy peyda olacaq!

Z a h i r  b ə y. Siz milləti-islamı badi-fənaya verirsiniz. Eşidirsinizmi, badi-fənaya verirsiniz! (*Gedir*)

X u r ş i d b a n u. Bu satqın ağalar hələ millətlə dini bir-birindən ayıra bilmirlər.

Hidayət xan daxil olur və onu görən kimi
Xurşidbanudan başqa hamı səhnədən çıxır.

H i d a y ə t  x a n. Salam, əmizadə. (*Xurşidbanu dinmir*) Dinmirsən... Amma mənim ürəyim dözmədi, yenə də gəldim.

X u r ş i d b a n u. Nə olub, yoxsa, mənim çəkdirdiyim arxı uçurdub dağıtdığına görə ürəyin nazilib?

H i d a y ə t x a n. Yox, əmiqızı... Ürəyimi kövrəldən sənin taleyindir.

X u r ş i d b a n u. O!.. Doğrudanmı?

H i d a y ə t x a n. İstehza lazım deyil, Banu bəyim. Onsuz da çərxi-dövran bizim əleyhimizə işləyir. Xanlıq getdi, mülklərimizin çoxu əlimizdən çıxdı. İgid Pənah xanın yurdunda biz iki nəfər qalmışıq. Sən də ki, belə eləyirsən. Deyirlər indi də bütün ata mülkündən, kəndlərindən əl çəkirsən, nə üçün belə eləyirsən, Banu bəyim? Çarın özü bizi tanıyır. Nə üçün bizi onun gözündən salırsan? Nə üçün xan babalarımızın şərəfini gədə-güdənin ayaqları altına atırsan? Banu bəyim! Əmi qızı! İndiyə qədər nə olub-olub. Daha bəsdir boş xəyallara uyub, özünü də, bizi də cümlə-əyan içində bədnam elədin. Axı, nə işin var sənin siyasətlə, niyə "xalq, xalq" deyib vardan-yoxdan çıxırsan?

X u r ş i d b a n u. Mən öz elədiklərimdən peşman deyiləm. Əgər, mən dünyaya ikinci dəfə gəlsəydim, yenə də bu yolu tutardım.

H i d a y ə t x a n. Bu sənin qəti sözündür?

X u r ş i d b a n u. Qəti!

H i d a y ə t x a n (*qalxır*). Qoy bir olan Allah bilsin ki, mən səni düşdüyün burulğandan çəkib çıxarmaq istəyirdim. Amma sən buna razı olmadın!

X u r ş i d b a n u. Əgər, sən insanları burulğanlardan çıxarmaq haqqında düşünsəydin, Arazın o tayında boğulan azərbaycanlılar bir dəfə də olsa, yadına düşərdi!

Daşdəmir gəlir.

D a ş d ə m i r. Sizə məktub var, Banu bəyim. (*Məktubu verib çıxır*)

H i d a y ə t x a n. Heyf səndən, Banu bəyim! Əlvida! (*Dərindən nəfəs alaraq çıxır*)

Xurşidbanu məktubu həyəcanla açıb baxır. Mavi projektorun işığı onun baxdığı səmtdə nə isə yazan knyaz Xasayın üzərinə düşür və o yazdıqca səsini eşidirik: "Beləliklə, hər şey məhv olub getdi, Banu bəyim. İndi məni bu uzaq yerə sürgün eləyiblər. Bu tilsimin sonu görünmür. Mən daha sürünmək istəmirəm, Banu bəyim. Zənn edirəm ki, buna sən də razı olmazdın. Əlvida, Banu bəyim. Heç olmasa, sən möhkəm dayan, Banu bəyim!" Məktubu zərfə qoyaraq, qalxıb tapançanı götürüb ürəyinə dirəyir və atəş açılanda knyazın üzərinə düşən işıq sönür. Xurşidbanu dəhşətlə qışqırır.

X u r ş i d b a n u. Knyaz!

Mirzə Ruhullah həyəcanla daxil olur.

M i r z ə R u h u l l a h. Knyaz burada yoxdur, Banu bəyim.

X u r ş i d b a n u (*özünə gələrək*). O nə güllə idi, Mirzə?

M i r z ə R u h u l l a h. Hidayət xan tapança ilə sağsağana güllə atırdı.

X u r ş i d b a n u. Vurdu?

M i r z ə R u h u l l a h. Vurdu!

X u r ş i d b a n u. Niyə vururdu? Axı, deyirlər o xeyir xəbər gətirən quşdur.

M i r z ə R u h u l l a h. Onlar bu dünyaya xeyir xəbərləri vurmaq üçün gəliblər, Banu bəyim!

X u r ş i d b a n u. Mirzə, zəhmət olmasa, Daşdəmirlə Bəyimi bura göndər.

Mirzə Ruhullah çıxır. Musiqi. Daşdəmirlə Bəyim gəlirlər.

X u r ş i d b a n u. Üç ildən artıqdır ki, siz mənim sarayımda xidmət edirsiniz. O da mənə məlumdur ki, bir-birinizi istəyirsiniz. İndi daha vaxtdır ki, özünüzə ailə qurasınız. Mən bu gündən sizi azad edirəm. (*Stolun yeşiyindən iki pul kisəsi çıxarıb, hərəsinə birini verir*)

B ə y i m. Oy, Banu bəyim, mən ölənəcən sizə xidmət eləmək istəyirəm.

X u r ş i d b a n u. Daha mənə xidmətçi lazım deyil, Bəyim. Gedin ləyaqətlə yaşayın. (*Həyəcanla*) Gedin kəndlilərə deyin ki, onlar daha mənə vergi verməyəcəklər. Daha xan qızı Xurşidbanunun kəndi, torpağı yoxdur! Deyin ki, mən Xurşidbanu Natəvan bu əzablı yolları onlarla birlikdə gedəcəm! Onu da deyin ki, bu uçurumlu yolların sonunda bizi öz milli birliyini, azadlığını tapmış azad Azərbaycan gözləyir!

Musiqi.

P ə r d ə

*1978*

# SEVGİLİLƏRİN CƏHƏNNƏMDƏ VÜSALI

İ Ş T İ R A K E D İ R L Ə R

A y a z T u r a n
S ə l i m B a b a y e v
M ə d i n ə
X u m a r
M a y i s K a z ı m o v
C a b b a r
M i r c ə f ə r B a ğ ı r o v
A f ş a r H ü s e y n
H a c ı q u l u
M ə h ə m m ə d C u v a r l ı
Ə d h ə m N ə c ə f o v
A n a ş k i n
B i r i n c i m i l i s
İ k i n c i m i l i s
Q ı z
T e a t r i ş ç i s i

## BİRİNCİ PƏRDƏ

### BİRİNCİ ŞƏKİL

Səhnə arxasında gurultulu alqış səsləri eşidilir. Səhnə işıqlananda Şeyx Sənan rolunun ifaçısı Ayaz Turan bir neçə dostunun müşayiətilə səhnəyə çıxır. Dostları onu təbrik edirlər. Eyni zamanda, səhnə arxasından onun şəninə deyilən alqış səsləri davam edir. Kənarda dayanıb, heyran-heyran ona baxan Xumarın üzü tez-tez işıqlanır.

S ə h n ə a r x a s ı n d a n s ə s. Ayaz, sən Şeyx Sənanı ərşi-əlaya qaldırdın!

S ə h n ə a r x a s ı n d a n s ə s. Yaşasın Ayaz Turan!

S ə h n ə a r x a s ı n d a n s ə s. Eşq olsun böyük sənətkarımıza!

A y a z. Sağ olun, dostlar!

Səhnə bir an qaranlıqlaşır, işıqlananda isə, Ayaz teatrda öz geyim otağında görünür. Qapı usdufca döyülür. Xumar daxil olur və özünü atır Ayazın üstünə.

X u m a r. Mənim qəhrəmanım! Mənim böyük Şeyxim! Mən də, Sənanın sevgilisi Xumar kimi, səninlə ərşi-əlaya, göylərin sonsuz əbədiyyətinə uçmaq istəyirdim. Ay Allah! Sən səhnədə bu qədd-qamətinlə... Bu cavan, saqqallı çöhrənlə nə qədər gözəl görünürdün... Elə bil, gözlərində insanın qəlbini təlatümə gətirən sehrkar bir nur şölələnirdi...

A y a z. Mən bilirdim ki, mənim sevgilim... Mənim Leylim... zalda əyləşib mənə baxır. Xumar, sən bilsəydin ki, sənin zalda əyləşib, mənə tamaşa etməyin mənim üçün necə ülvi bir fərəhdir... Mənim ruhum! Mənim Leylim! (*Onu öpür*)

X u m a r. Mənə Leyli demə, Ayaz!! Qorxuram...

A y a z (*təəccüblə*). Nədən?

X u m a r. Bilmirəm... Qoy Allah bizim sevgimizi o böyük aşiqlərin – Leyli və Məcnunun məhəbbəti kimi nakam eləməsin! Qoy Allah bizim sevgimizi vüsala yetirsin!

A y a z. Amin!

X u m a r. Şeyx Sənan rolunda sənə tamaşa eyləyəndə, elə bilirdim sən o sözləri səhnədəki Xumara yox, mənə deyirsən.

A y a z. Mən də elə bilirdim ki, səhnədəki Xumar sənsən.

X u m a r. Mənim Şeyxim, indi mənə elə gəlir ki, mənim bütün xəyallarım sənin ülviyyətindir. Sən, Xumarla uçuruma atılanda mən qışqırmaq istəyirdim ki, dayan, Şeyx...

A y a z. Amma mənə elə gəlirdi ki, biz səninlə əl-ələ tutub, əbədi vüsala doğru uçuruq.

X u m a r. Toyumuzu tez eləyək, Ayaz! Sevgimizin şiddəti məni qorxudur. Axı, deyirlər, böyük məhəbbət heç vaxt kama yetmir. Necə ki, Leyli ilə Məcnun, Romeo ilə Cülyetta, Əsli ilə Kərəm bu dünyadan nakam getdilər. Yəqin ki, bu qəmli dastanlar havayı yaranmamışdır. Özümüz də elə bir vaxtda yaşayırıq ki, bütün ölkə dəhşətli bir vahimə içindədir. Dəniz qırağındakı idarənin bayquş kimi ulayan maşınları hər gecə onlarca günahsız insanı tutub cəhənnəmə aparır. Dünən gecə bizim qonşuluğumuzda olan narkomu da arvadı ilə birlikdə tutub apardılar.

A y a z. Onların bir körpə uşağı var idi. Bəs, o necə oldu?

X u m a r. Ayaz... o dəhşət idi... iki yaşında oğlan uşağını qışqırda-qışqırda anasının qucağından qoparıb qonşuya tapşırdılar. Ana yalvardı ki, qoyun özümlə aparım... Cəlladlar ananı da sürüyə-sürüyə əri ilə birlikdə apardılar... Körpə qaldı qışqıra-qışqıra... Heç kəs bilmədi ki, bu zülmün səbəbi nədir? Xalq düşməni nə deməkdir?

A y a z. Heç dayından soruşmamısan? Axı, dayın dövlət təhlü-kəsizlik narkomudur.

X u m a r. Nə danışırsan? Ondan elə şey soruşmaq olar? O, evdə özünü elə aparır ki, elə bil, heç o idarədə işləmir. Həmişə susur.

A y a z. Heç nədən qorxma, Xumar. Biz heç bir günah iş tutmamışıq. Heç bir xilaf iş dalınca getməmişik. Taleyimiz elə gətirib ki, ikimiz də gözümüzü açıb, özümüzü atasız-anasız görmüşük. Mən uşaq evində böyümüşəm. Səni də dayın saxlayıb.

X u m a r. Sonra ikimiz də bir-birimiz üçün ata-ana... bir can.. bir qəlb olduq. Səhər yuxudan gözümü açanda ilk sevincim... ilk fərəhim odur ki, bu dünyada sən varsan! Sənin məni görəndə məhəbbətlə gülümsəyən gözlərin var... Mən ilk dəfə səni Hamlet rolunda görüb, qədd-qamətinə, danışığına, səsinin ahənginə, hərəkətlərindəki son dərəcə təbii qəhrəmanlıq çalarlarına, gözlərindəki məğrur alicənab ifadəyə vurulanda, ay Allah, dedim, əgər, bu oğlan məni, mənim yarım qədər sevsəydi, mən ata-ana məhəbbəti görməyən kimsəsiz bir qız, özümü dünyanın ən xoşbəxt məxluqu sanardım...

A y a z (*zarafatyana*). Sonra görəndə ki, cavan artist səni dünyalar qədər sevir... Səhnədəki qələbələrimin sirri, səbəbi sənin məhəbbətin olub! (*Qapı döyülür. İçəri teatrın işçilərindən biri daxil olur*)

T e a t r  i ş ç i s i. Ayaz, bu gülləri universitetin müəllimləri gətirib.

X u m a r (*güllərin içindəki kağız parçasını açıb bərkdən oxuyur*). “Xalqımızın böyük sənətkarı Ayaz Turana eşq olsun! Biz səninlə fəxr edirik.” Ayaz, qorxuram sənə öz gözüm dəyə. Axı, mən bədnəzərin olmasına inanıram. Sənin hər yeni rolunda tamaşaçılar tərəfindən necə alqışlandığını görəndə, küçəmizin tinində oturan şikəst arvada bir manat nəzir verirəm. (*Pıçıltı ilə*) Bilirsənmi, Ayaz, səni sevəndən bəri mənə qəribə bir ilham gəlib. Mən hardasa var olan, hardasa bizim məhəbbətimizi seyr eləyən qadir bir qüvvənin... Bəlkə də Allahın olduğunu hiss etməyə başlamışam. Gecə yerimə girib yatanda, ona müraciətlə deyirəm: “Ay Allah! Ey bizim köməyimiz, o oğlanı qanadının altına al! Onu yerin-göyün bəlasından hifz elə! O, bu qorxulu dünyanın ən günahsızı, ən təmiz oğlanıdır. Ancaq bu zaman eyzən ürəyim təsəlli tapıb sakit olur...”

A y a z. Xumar, qoy sənin nəcib qəlbin heç nədən, heç zaman narahat olmasın!

Q ı z (*Əlində bir dənə gül içəri daxil olur*). Sevimli sənətkarımız, sizi yeni qələbəniz münasibətilə təbrik edirəm. Qoy böyük yaradan sizi bizim səhnəmizə çox görməsin!

A y a z. Sağ olun...

Q ı z. Xahiş edirəm, bura bir avtoqraf yazasınız.

A y a z (*qol çəkir*). Buyurun.

Q ı z. Sağ olun.

X u m a r. Bir də fikirləşirəm: səni ki, xalq bu qədər sevir, bu qədər alqışlayır... Cavan tamaşaçılar gecə teatrdan çıxanda evə qədər səni aparıb ötürür – gərək bu xalq məhəbbəti səni hər bəladan hifz eləsin. Elə deyilmi?

A y a z (*dərindən nəfəs alaraq kədərlə*). Elədir.

X u m a r (*təşvişlə*). Bəs, nə üçün birdən tutuldun?

A y a z (*gülümsəyir*). Sənə elə gəlir, Xumar, narahat olma! (*Onu öpür*) Biz Aydan arı, sudan duru günahsız cavanlarıq!

X u m a r (*birdən şənlənərək*). Doğrudan da... Axı, biz neyləmişik ki, qorxu çəkək?! Bayaq sən yaxşı dedin: "Biz bir günah iş tutmamışıq!.. Bir xilaf iş dalınca getməmişik!.."

Qapı yavaşca döyülür. Artist Cabbar, Şeyx Mərvan paltarında gəlir. Əlində portfel var.

C a b b a r. Ayaz, qardaşım, bir yaxın gəl, səni öpüm. Xumar, gözəl qızım, Ayazın bugecəki təntənəsi ilə səni də təbrik edirəm. Mən bilirəm ki, bu parlaq təntənənin sirri Ayazın sənə olan ülvi məhəbbətidir.

A y a z. Mən də səni təbrik edirəm. Sən də Şeyx Mərvanı əla oynadın.

C a b b a r. Əşi, bu rolun məşqlərində sözləri əzbərləyincə, gedib o dünyanı görüb gəlmişəm.

X u m a r. Elə nə üçün, Cabbar əmi?

C a b b a r. Bilirsən, Xumar, bu qafiyə ilə, mən nə bilim, əruz vəzniylə yazılan şerləri əzbərləyincə mənimki mənə dəyir.

A y a z (*bərkdən gülərək*). Deyirlər ki, keçmişdə Peterburqda Aleksandriyski teatrının məşhur artisti Davıdov da sənin kimi söz əzbərləməkdə həmişə əzab çəkirmiş. Ondan soruşanda ki, sənətdə ən çətin olan şey nədir? Deyərmiş ki, söz əzbərləmək. (*Gülürlər*)

C a b b a r. Xumar, sizin hüzurunuza xoşunuza gəlməyən bir qonaqla gəldiyim üçün üzr istəyirəm...

A y a z. Hansı qonaq?

X u m a r. Hanı o qonaq?

C a b b a r. Bax, burdadır. (*Portfeli açıb içindəki araq şüşəsini göstərir. Hamı gülür*) Düzdü, mənim özümün də bundan xoşum gəlmir...

A y a z (*zarafatla*). Oho...

C a b b a r. Bu da bizə gülüb deyir: “Xoşunuza gəlmir. Eyzən mənim əleyhimə danışırsınız, amma bir şən məclisiniz də mənsiz keçmir...”

A y a z (*zarafatla*). Deyir, mən olmayanda, Cabbarın kefi istiot dadı verir.

C a b b a r. Nə ki, düzdü, düzdü... Xumar bacı, dedim, mən qardaşımın bugecəki qələbəsini də təbrik eləməyə bilmərəm! (*Ayaza*) Qardaş, bilirəm, sənin araqdan xoşun gəlmir... Ancaq, düzü, konyaka da pulum çatmadı. (*Qədəhi doldurub Ayaza verir. Stolun üstündəki çay stəkanını da özü üçün doldurur*) Ayaz, qardaşım! Sən Hamleti, sonra Yuli Sezarı da bu qədər böyük müvəffəqiyyətlə oynamısan! Ancaq sənin bugecəki qələbən ona görə mənim üçün daha qiymətlidir ki, sən adlarını yazıçı qoyan “gilizdən çıxma” gədə-güdənin “burjuaziya yazıçısı, pantürkist” deyə cürbəcür mənfur damğalar vurduğu Cavidin o nurlu qəhrəmanını göylərə ucaltdın! Sağ ol, qardaşım! Qoy Allah sənin böyük istedadının himayədarı olsun!

X u m a r. Amin! Sizin sənətinizə söz ola bilməz, Cabbar əmi. O gecə “Müfəttiş” pyesində Osipi elə təbii oynayırdınız ki, elə bil, lap Osipin özüsünüz.

C a b b a r. Mən də pis artist deyiləm. Özüm də səhnənin aşiqiyəm. Amma nə ki, düzdür, düzdür! Mən Ayaz deyiləm!

A y a z. Hər bir istedadlı aktyorun sənətdə öz şərəfli yeri var...

C a b b a r. Xumar, icazə verin, birini də vurum.

X u m a r. Vurun!

C a b b a r (*stəkanı doldurur*). Sizin quracağınız müqəddəs ailənin xoşbəxtliyi şərəfinə! Allah sizi bir-birinizdən ayırmasın! Toyunuzu tez eləyin. Könlümüz şənlik, çalıb-oynamaq istəyir.

İ ş ı q s ö n ü r

## İKİNCİ ŞƏKİL

Səlim Babayevin evi. Səlim və Mədinə.
Səlim əsəbi halda var-gəl edir.

S ə l i m (*birdən dayanaraq*). Bu gün mənə xəbər veriblər ki, mənim bacım qızı Xumar o artist Ayazla görüşür. Hər tamaşasından sonra ona gül dəstələri təqdim edir. Səncə, bu nə deməkdir?

M ə d i n ə. Ayaz çox gözəl aktyordur. Onu hamı sevir. Əgər, Xumar onu xoşlayırsa, ona gül dəstələri təqdim edirsə, bunda nə qəbahət var ki?

S ə l i m (*əsəbi*). Deyirlər, guya, onlar bir-birilərinə eşq yetiriblər... Guya, bir-birilərini sevib evlənmək istəyirlər...

M ə d i n ə. Ayaz yüksək əxlaqlı, elə gözəl sənətkardır ki, hər bir qız məmnuniyyətlə onun arvadı olmaq istəyər.

S ə l i m. Siz qadınların ağlınız gözünüzdədir. Hansı kişi ki, gözünüzə bir az cazibədar göründü, qurtardı. Olmaya, sən də ona aşiq olmusan?

M ə d i n ə (*həqiqi hisslə*). Yox, Səlim, sən mənim ruhumu, qəlbimi elə qurutmusan ki, mən eşq, məhəbbət anlayışına çoxdan yad olmuşam.

S ə l i m. Mən sənə neyləmişəm ki? Sənin özün mənə qarşı soyuq olmusan...

M ə d i n ə. Ola bilər...

S ə l i m. Demək, etiraf edirsən?

M ə d i n ə. Adamların sənə vahimə ilə baxmaları, sənin gözünə görünmək istəməmələri, hətta, sənin arvadın olan mənimlə də çəkinə-çəkinə, qeyri-təbii danışmaları, məndən uzaq olmağa çalışmaları mənə pis təsir eləyir. Səndən nə gizlədim, bəzən elə bil ki, kimsə məndən soruşur: “Sən bu qorxulu adamla necə bir yastığa baş qoyursan? Onunla yaxınlıqdan necə zövq alırsan?” Elə bil ki, səninlə yaxınlıq məni əsl həyatdan, insanlardan, insan ünsiyyətlərindən həmişəlik uzaqlaşdırmışdır.

S ə l i m. Səni başa düşürəm... Amma sən unudursan ki, mən başqa cür ola bilmərəm. Mən böyük tarixi vəzifə icra eləyən bir dövlətin vuran qoluyam... Kəsən qılıncıyam.

M ə d i n ə. Ona görə də, qılınc kimi hissiz... duyğusuz...

S ə l i m. Ola bilər... Böyük ideyanın qələbəsi böyük də qurbanlar tələb edir... Bəşəriyyətin yeganə xilas yolu olan kommunizm sülhlə yarana bilməz. Kommunizm fütuhatı bir sinif... bir kateqoriya insanların məhvini tələb edir. Stalin cəmiyyəti təzələmək, Yer planetində yeni dünya yaratmaq istəyir. (*Saatına baxaraq*) Mən işə getməliyəm. (*Yarızarafat, yarıciddi*) Sənin əksinqilabçı mülahizələrinlə məşğul olmağa vaxtım yoxdur.

M ə d i n ə. Sizin iş metodunuz hər cürə mübahisənin düşmənidir. Siz mübahisə etmirsiniz, kəsirsiniz!

S ə l i m (*gülümsəyir*). Düz sözə nə demək olar! Ona görə də, Xumara tapşır ki, mən o artistin adını belə tutmağı ona qadağan eləyirəm.

M ə d i n ə. Mən ona belə söz deyə bilmərəm. O, Ayazı sevir... Çox sevir. (*Həyəcanla*) İnsafın olsun, o sənin bacın qızıdır. Yazıq bacın Şirinbəyim xanım vəfat eləyəndə, onu bizə – səninlə mənə tapşırmışdı. Mən on beş il onunla bir yerdə oxumuşam. Mən onun xatirəsinə xəyanət eləyə bilmərəm.

S ə l i m. Biz rəhmətlik bacıma xəyanət etmirik. Onun yeganə qızını böyüdüb, oxudub, ləyaqətlə boya-başa çatdırmışıq. İndi bacımın heç ruhu da razı olmaz ki, bu qızın axmaq bir hərəkəti ucundan mən özümü məhv eləyəm.

M ə d i n ə. Axı, gənc, günahsız bir qızın, təmiz, əxlaqlı bir oğlanı, xalqın başına and içdiyi sənətkarı sevməsi səni nə üçün məhv edir?!

S ə l i m (*qəzəblə*). Onun üçün ki, bir il bundan qabaq mən həmin Ayazın doğma xalası oğlunu güllələmişəm! Bildinmi?!

M ə d i n ə. Nəyə görə?

S ə l i m. Ona görə ki, o, Bağırova sui-qəsddə günahlandırılırdı. Bağırova sui-qəsd etmək Stalinə sui-qəsd etmək deməkdir. Bütün sovet hökumətinə sui-qəsd etmək deməkdir! Aydındırmı? İndi siz istəyirsiniz ki, biz elə bir xalq düşməni ilə qohum olaq?! (*Qışqırır*) Biz xalq düşmənlərinin kökünü kəsmək istəyirik!

M ə d i n ə. Qışqırma! Özün bilirsən ki, mən qorxan deyiləm! Səndən isə heç qorxmuram! Sən öz doğma qardaşın oğlu Qəhrəmanı, o cür gözəl, gənc alimi tutub güllələtdirdin. Qəhrəmanın anası, bax, bu otaqda dizin-dizin sürünüb, göz yaşları içində boğula-boğula sənə yalvardı...

S ə l i m. Mən başqa cür eləyə bilməzdim. Kəşfiyyat idarəsi Bağırova xəbər vermişdi ki, Qəhrəman mühazirə oxumaq üçün Türkiyəyə dəvət olunanda, ordakı müsavatçılarla sıx əlaqədə olub, onlardan təlimat alıb! Bağırov mənə dedi ki, bilirəm, o sənin qardaşın oğludur... ancaq güllələmək lazımdır!

M ə d i n ə. Sən, heç olmazsa, Qəhrəmandan verilən donosun doğru olub-olmadığını da yoxlamadın...

S ə l i m. Madam ki, Bağırov demişdi, mənim yoxlamağıma ehtiyac yox idi! Mən Bağırovun göstərişini təftiş eləyə bilməzdim. Öz doğma oğlum olsaydı, yenə də güllələyərdim! (*Saatına baxaraq*) Get, Xumarı göndər bura. (*Mədinə ağır addımlarla otaqdan çıxır. Səlim ətrafı vahimə ilə nəzərdən keçirir. Sanki kiminsə onu eşidəcəyindən qorxur*) Mən "xalq düşməni" damğası basılan adamları tuturam, güllələyirəm, Sibirin uzaq, buzlu çöllərinə göndərirəm, lakin heç kəs bilmir ki, qorxudan, dəhşətdən gecələr gözümə yuxu getmir! Mən özümün də bir gün – bəlkə bu gün... bəlkə sabah... bəlkə bir ildən sonra tutulub güllələnməyəcəyimdən arxayın deyiləm... Arxayın deyiləm...

Adamların Bağırova sui-qəsd hazırladıqlarını, ya sovet hökuməti əleyhinə, Stalin əleyhinə olduqlarını zorla boyunlarına qoymaq üçün onlara verdirdiyim işgəncələr məni dəhşətə salır. Bir gün bu əzabların mənə də veriləcəyini düşünəndə, tüklərim biz-biz durur!

X u m a r. Salam, dayı!

S ə l i m (*mülayim təbəssümlə*). Salam. Bu təzə kostyum sənə gözəl yaraşır.

X u m a r. Doğrudan?! Bunu mənə dünən Mədinə xanım alıb.

S ə l i m (*eyni mehriban, zarafatyana ifadə ilə*). Bacıqızı belə qəşəng geyinməklə hara hazırlaşır?

X u m a r. Rəfiqəm Cəmilə ilə dram teatrına getmək istəyirik. Təzə premyera var...

S ə l i m. Hansı əsərdir göstərilən?

X u m a r. Şekspirin "Üçüncü Riçard" əsərinin tamaşasıdır.

S ə l i m (*qəsdən*). Baş rolda kimdir?

X u m a r (*şən təbəssümlə*). Ayaz Turan.

S ə l i m. Mən çoxdandır teatra getmirəm... Deyirlər, o, yaxşı aktyordur.

X u m a r (*eyni şən açıq-saçıqlıqla*). O, çox böyük sənətkardır, dayı. Moskvada qastrolu zamanı Türkiyə səfiri onun yaratdığı Hamlet

obrazına heyran olub. Deyirmiş, onu dünyanın ən böyük aktyorları ilə müqayisə etmək olar...

S ə l i m (*tutqun*). Səfir kimə deyirmiş? Ayazın özünə?

X u m a r. Xeyr, Ayazla tanış olan bir qadına.

S ə l i m. Kimdir o qadın?

X u m a r. Bilmirəm. Ayazdan soruşmadım.

S ə l i m. Sən bu təriflərə görə ona aşiq olmusan?

X u m a r (*diksinir, özünü itirir*). Ah, dayı... Birdən, elə qəfil soruşdunuz ki...

S ə l i m. Ona görə ki, mən səninlə açıq danışmaq istəyirəm, bacıqızı! Bilirsən ki, bizim idarə yerin altını da bilir, üstünü də. Mənə məlumat verilib ki, siz bir-birinizi sevirsiniz... Hətta, evlənmək də istəyirsiniz... Doğrudur? (*Ağır pauza*) Niyə dinmirsən? (*Bir qədər sərt*) Doğrudur?

X u m a r (*birdən qəti cəsarətlə*). Bəli, doğrudur.

S ə l i m. Bəs, sən bilmirsən ki, onun yaxın qohumları xalq düşməni kimi tutulub? Doğma xalası oğlu "xalq düşməni" kimi güllələnib?

X u m a r. Xeyr... bilmirəm... bir də ki...

S ə l i m. Bir də ki, nə?

X u m a r. Axı, qohumlarının günahı varsa, o neyləsin? Bircə bilsəniz ki, o nə qədər nəcib... nə qədər yaxşı oğlandır... Necə təmiz ürəyi var...

S ə l i m. Bacıqızı! Nəciblik... təmizlik-filan nisbi şeylərdir. Belə sentimental hisslər hələ sənin onunla xoşbəxt ola biləcəyinə zəmanət vermir... Dedim ki, onun qohumları "xalq düşməni" kimi ifşa olunublar. "Xalq düşməni" isə, Stalinə, Bağırova, sosializm ideyasına düşmən olmaq deməkdir. Hələ məlum deyil ki, o artistin öz taleyi necə olacaq. Xüsusilə indiki zamanda həyata ayıq gözlə baxmaq lazımdır. Burulğana düşəndən sonra gec olacaq.

X u m a r. Sənin sözlərin məni qorxudur, dayı! And içirəm ki, o aktyor dünyanın ən günahsız adamıdır!

S ə l i m. Həzrət İsa da dünyanın ən müqəddəs adamı idi. Amma onu bir cinayətkar kimi dara çəkdilər. Çünki İudaya belə lazım idi. O Ayaz Turan da, sənin sevimli şairin Hüseyn Cavid də həbs edilmişdir.

X u m a r (*vahimə içində*). Dayı!

S ə l i m. Ayazla görüşməyi, hətta, onun iştirak elədiyi tamaşalara getməyi də bu gündən sənə qadağan edirəm.

X u m a r (*həyəcan və qorxu içində yaxınlaşaraq, ayaqlarının altına yıxılmaq istəyir. Lakin Səlim onu usdufca özündən kənar edir*). Dayı! Dayıcan!

S ə l i m (*soyuqqanlı*). Qurtardıq!

Xumar qalxıb ölgün addımlarla otaqdan çıxır. Səlim bir an fikrə gedir. İşıq sönür, yananda Səlim telefonla danışır.

M a y i s i n  s ə s i. Eşidirəm, yoldaş komissar.

S ə l i m. Artist Ayaz Turanı ciddi nəzarət altına alın.

M a y i s i n  s ə s i. Başa düşdüm, yoldaş komissar.

S ə l i m. Bu gün aldığım bir məlumata görə, Moskvada qastrol zamanı Türkiyə səfiri onu tərifləyirmiş, çox ehtimal ki, bu, artistin pantürkizm ilə olan əlaqələri ilə bağlıdır. Tez qurtarın onun işini!

M a y i s i n  s ə s i. Baş üstə, yoldaş komissar!

İ ş ı q  s ö n ü r

## ÜÇÜNCÜ ŞƏKİL

Mircəfər Bağırovun kabineti. Gecədir.

M i r c ə f ə r  B a ğ ı r o v (*telefonla danışır*). Arxayın ol, arxayın ol, Lavrenti! Biz heç bir xalq düşməninə aman verməyəcəyik. Biz elə dünən Qarabağın Arazqırağı tərəkəmələrindən qoyunları, malqaraları əllərindən alınan, sonradan kolxoza soxulan üç yüz kulakı həbs eləyib, Şpartı düzündə güllələdik. Bizə qarşı çıxsaydılar, hərəsi bir bölük adamımızın qabağını saxlardı... Mən bu barədə Stalin yoldaşa informasiya vermişəm... Stalin yoldaş özü maraqlanırdı... Əmin ola bilərsən, Lavrenti. Sən də, Stalin yoldaş da yaxşı bilirsiniz, mən 20-ci ildən indiyə qədər Azərbaycanda əksinqilabçılarla, müsavatçılarla, pantürkistlərlə həmişə amansız mübarizə aparmışam. Tamamilə doğrudur. Xalq düşmənləriynən mübarizə apararkən, şəhər ziyalılarını da bir an nəzərdən qaçıra bilmərik. Bir ziyalı "xalq düşməni" min avam kulakdan qorxuludur. (*Səlim Babayev gəlir, salam verir*) Beriya zəng eləmişdi... deyir, Azərbaycan, xalq düşmənləriynən zəif mübarizə aparır... Sən buna necə baxırsan?

S ə l i m (*payını götürür*). Bu, bizim üçün böyük ittiham olar, yoldaş Bağırov. Qafqazda ən çox xalq düşməni güllələyən, ən çox kulak ailəsi sürgün eləyən bizim respublikadır...

M i r c ə f ə r B a ğ ı r o v (*onun sözünü kəsir*). Mən bunu Lavrenti Pavloviçə dedim... Bunu da dedim ki, biz heç bir xalq düşməninə aman verməyəcəyik. (*Əsəbi halda*) Beriya haqlıdır... biz xalq düşmənləriynən mübarizə apararkən, şəhər ziyalılarını da bir an nəzərdən qaçıra bilmərik. Bir ziyalı "xalq düşməni" yüz avam kulakdan qorxuludur... Hüseyn Cavid... Əhməd Cavad... Mikayıl Müşfiq, professor Bəkir Çobanzadə kimi xalq arasında nüfuzu olan belə pantürkistlərin hərəsi Sovet Azərbaycanı üçün bir təhlükədir! (*Gəzişir*) Mən Üzeyir bəy haqqında da düşünürəm. Hələlik, onu bu siyahıya qatmaq istəmirəm. (*Birdən əsəbi halda*) Sluşi... o artist... Ayaz Turan nə vaxtacan göylərdə uçacaq? Proletar yazıçısı Şəfi Sadıqovun pyesində xalq düşməni rolunu oynamaqdan boyun qaçırır. Amma Cavidin əsərlərində tufan qoparır. Gah İblis olur, gah Ərəbistandan gələn Şeyx Sənan! (*Qəzəblə*) Nə vaxt qurtaracaqsan onunla?

S ə l i m. Ciddi nəzarət altındadır.

M i r c ə f ə r B a ğ ı r o v. Yoxsa, deyirsən Ayaz Turan tutulsa, Azərbaycan teatrı məhv olar?

S ə l i m. Biz onun haqqında material toplayırıq. Ciddi nəzarət altındadır.

M i r c ə f ə r B a ğ ı r o v. Nə material? Hər bir hərəkəti – pantürkistliyi, Şəfi Sadıqov kimi yeni proletar yazıçılarına nifrəti göz qabağındadır.

S ə l i m. Yoldaş Bağırov! Şəfi Sadıqov zəif yazıçıdır, pyesi də çox sünidir. Xalq düşməninin obrazını da bədii cəhətdən əsaslandıra bilməyib.

M i r c ə f ə r B a ğ ı r o v (*bir qədər yumşalaraq*). Nə olar? Hər halda, apardığımız siyasətlə ayaqlaşmağa, xalq düşmənlərini ifşa etməyə çalışır, daha Cavid kimi göylərə uçmur.

S ə l i m. Cavidnən onu bir tutmaq günahdır...

M i r c ə f ə r B a ğ ı r o v. İndi sözün nədir? Deyirsən dünən meydana çıxan proletar yazıçısı da birdən-birə burjua yazıçıları kimi bitkin olsun?

S ə l i m. Hər halda, istedad da lazımdır, yoldaş Bağırov.

M i r c ə f ə r  B a ğ ı r o v (*qəzəblə*). İstedad Allah vergisi deyil. Yaza-yaza yaxşı yazmağı öyrənər... Niyə başa düşmürsən, Səlim, Ayaz kimilərinin canı Osmanlı türklərinin yanındadır. Onlardan mənəvi qida alırlar.

S ə l i m. Lakin bunun üstündə tutub güllələmək də çətindir. Axı, Lenin özü Türkiyə ilə dostluq tərəfdarı olub. Atatürkün xarici imperialistlərlə vuruşuna hüsn-rəğbət bəsləyib.

M i r c ə f ə r  B a ğ ı r o v (*qəzəblə*). Lenin hüsn-rəğbət bəsləyirdi, amma Stalinin zəhləsi gedir... Səlim! Sənin özünün də əhvali-ruhiyyən mənə şübhəli görünür.

S ə l i m (*hiss edilən təlaşla*). Yoldaş Bağırov... mən elə bu gün Ayaz Turanı həbsə alaram...

M i r c ə f ə r  B a ğ ı r o v. Di get... Yadından çıxarma, biz Stalinlə nəfəs alırıq. Stalin cəmiyyəti təzələmək, Yer üzündə yeni dünya yaratmaq istəyir.

S ə l i m (*otaqdan çıxa-çıxa*). Mən "xalq düşməni" damğası basılan adamları tuturam, güllələyirəm. Sibirin uzaq, buzlu çöllərinə göndərirəm. Lakin heç kəs bilmir ki, qorxudan, dəhşətdən gecələr gözümə yuxu getmir. Mən özümün də bir gün, bəlkə bu gün, bəlkə sabah, bəlkə bir ildən sonra tutulub güllələnməyəcəyimdən arxayın deyiləm. Adamların Bağırova sui-qəsd hazırladıqlarını, ya sovet hökuməti əleyhinə, Stalin əleyhinə olduqlarını zorla boyunlarına qoymaq üçün onlara verdirdiyim işgəncələr məni dəhşətə salır.

İ ş ı q  s ö n ü r

## DÖRDÜNCÜ ŞƏKİL

Ayazın toyu. Xumar ağ gəlinlik paltarında həyəcan içində səhnəyə daxil olur. Ayaz da ardınca gəlir.

A y a z (*Xumarın əllərindən tutaraq*). Nə olub, Xumar? Niyə belə həyəcanlısan?

X u m a r. Bilmirəm... Mənə elə gəlir ki, dayım adamların başı üzərindən qəzəblə baxır. Elə bil ki, havada dayanıb. Ah, Ayaz, mən qorxuram... cəsarətim büsbütün yox olub gedib.

A y a z (*qıza təskinlik verir*). Qorxulası bir şey yoxdur, Xumar. Amma gərək evlənmək istədiyimizi ona deyəydik... nə üçün razı olmadın?

X u m a r (*əsəbi həyəcanla*). Çünki razılıq verməyəcəkdi!

A y a z. Nə üçün?

X u m a r. Ayaz! Gəl sevgimizin, qəlbimizin vüsala çatdığı bu xoşbəxt gecəmizdə o barədə danışmayaq. Mənim sevgilim! Mənim Şeyxim! Sən dünyanın ən günahsız, ən mərdanə oğlusan! Mənim tale quşum əbəs yerə sənin çiyninə qonmayıb... Bilirsən, bayaqdan nə düşünürəm? Deyirəm, bəlkə toyumuzdan sonra çıxaq gedək başqa respublikaya... Məsələn, Özbəkistana, Türkmənistana. İkimiz də işləyərik... Orda özümüzü daha sərbəst, azad hiss edərik.

A y a z (*bir an sarsılaraq, kədərlə*). Bilirəm, nə üçün elə düşünürsən, Xumar... Toyumuza dəvət elədiyimiz adamların biri də gəlmədi. Bu da səni təşvişə salır. Amma nahaq! Heç bir günahımız olmadığı halda, vətənimizi, doğma səhnəmizi tərk edib getməyə haqqımız yoxdur! Biz həmişə vətənimizə, xalqımıza sadiq, namuslu adamlar olmuşuq. Qohumlarımın "xalq düşməni" kimi tutulmaları səni qorxudursa, bunun üçün hara... hansı respublikaya qaçmağın mənası yoxdur. Bütün ölkə dəmir hasar içindədir. Gözə görünməz cəhənnəm kabusu tək mənim-sənin deyil, bu dəhşətli hasar içindəki bütün insanların başı üzərində hərlənir. Ona görə də, dəvət elədiyimiz adamları, qorxub, toyumuza gəlmədiklərinə görə qınamıram.

Cabbar əlində gül dəstəsi daxil olur.

C a b b a r. Mənim əzizlərim, mənim gənc aşiqlərim! Vüsala çatdığınız bu gecədə iştirak eləməyi özümə borc bildim. Toyunuzu təbrik eləyirəm! Arzu eləyirəm, ürəkləriniz həmişə şad olsun, həmişə bir-birinizlə fərəhlənəsiniz. Allah sizi dünyalar qədər xoşbəxt eləsin!

X u m a r. Sağ olun, Cabbar əmi! Sağ olun, bizim sədaqətli dostumuz!

A y a z. Cabbar! Qorxmadın toyumuza gəldin? Görürsən, dəvət elədiyim adamların heç biri gəlməyib...

C a b b a r. Eh, qardaşım, onlarda da günah yoxdur, qorxurlar, uşaqları var... mənim kimim var? Bir özüməm, bir qarım... Nədən qorxacağam? Gəlin, şənlənək! Bu dövranın acığına! Bu dünyanın acığına!

Rəqs etmək istərkən, Mayis iki nəfərlə daxil olur.

M a y i s. Toyunuz mübarək, Ayaz Turan!

X u m a r. Sizi bura çağıran olmayıb!

M a y i s. Xumar xanım, sən nə cəsarətli qızsan. Adamlar dayın Səlim Babayevi görəndə qorxularından özlərinə yer tapa bilmirlər. Amma sən ondan xəbərsiz “xalq düşməni”nə ərə gedirsən.

X u m a r (*ondan gözlənilməyən cəsarət və qəzəblə*). Dayımın xəbəri var! Bu oğlanı sevdiyimi bilir! Həm də Ayaz xalq düşməni deyil!

M a y i s. Gözəl Xumar, narahat olma, baxarıq. “Xalq düşməni” olmaz, yenə də gələr, toyunuz davam eləyər.

C a b b a r. İnsafınız olsun, toyu yarımçıq qoymayın.

M a y i s. Oho, Cabbar! Sən də burdasan? Biz elə sənin də dalınca gələcəkdik. Axı, sən Ayazın yaxın dostusan. Özün də komiksən! Gedək, bizim dustaqların sənə ehtiyacı var.

Mayis işarə edir. Onunla gələn cəlladlar Ayazla Cabbarın qolundan yapışırlar.

X u m a r (*özünü irəli atır*). Qoymaram!.. Qoymaram!..

A y a z. Sakit ol, Xumar! Bu ölkədə, azca da olsa, ədalət varsa, mən qayıdacağam. Qayıtmasam, barı, sən yaşa. Yaşa! Başımıza gətirilən faciələri gələcək nəsillərə danışmaq üçün yaşa!

C a b b a r. Eh, qardaşım Ayaz. Bizim sümüklərimiz Nargin adasında sürmə olandan sonra gələcək nəsillər nə biləcək? (*Xumara*) Zəhra qarıma denən məni bağışlasın, üzrlü hesab eləsin, onunla görüşə bilmədim.

X u m a r. Cəlladlar! Cəhənnəmdən gəlmiş cəlladlar! Buraxın nişanlımı! Buraxın!

A y a z. Xumar! Sən həmişə ifa elədiyim rolların mərdliyinə, qüruruna heyran olduğunu söyləyərdin. İndi mən də səndən xahiş edirəm, qoy bu faciəmiz sənin də qürurunu, mərdanəliyini alçaltmasın. Sənə “əlvida” demirəm. Mən günahsızam. Günahsız adamı məhv etmək asan deyil. Mən qayıdacağam.

C a b b a r (*sərxoşluqdan kövrələrək*). Xumar, qarıma denən onunla görüşə bilmədim, məni bağışlasın. Denən, vallah, mən günahsız gedirəm.

M a y i s. Tərpən, Cabbar! Böyük sənətkarınız sizi mərdliyə çağırır. Gedək görək özü necə mərdlik göstərir! (*Ayazla Cabbarı apa-*

*rırlar. Xumar da qapıya sarı cumur. Mayis onun yolunu kəsir*) Gözəl Xumar! Gəlinlik paltarında qalmağınıza təəssüflənməyin! Sən bu xalq düşməninə ərə getməməlisən. Dayının iradəsi belədir.

X u m a r. Xalq düşməni sənsən! Dayım Səlim Babayevdir! (*Yenə qapıya sarı cumur*) Məni də aparın! Mən nişanlımdan ayrılmaq istəmirəm!

M a y i s (*onun yolunu kəsir*). Gözəl Xumar! Sən Ayazla gedə bilməzsən! O cəhənnəmə gedir. Sən isə cənnətə layiqsən. Eşq olsun yaradana. (*Çıxır*)

X u m a r (*fəryadla*). Cəlladlar! Cəhənnəmdən gəlmiş cəlladlar!

İ ş ı q  s ö n ü r

## BEŞİNCİ ŞƏKİL

Mircəfər Bağırovun kabineti. Mircəfər Bağırov dəstəyi qaldırır. Mayis Kazımov da öz otağında dəstəyi qaldırır.

M a y i s. Eşidirəm, yoldaş Bağırov.

M i r c ə f ə r  B a ğ ı r o v (*əsəbi*). Məhəmməd Cuvarlını Moskvada tutub gətirəndən sonra hara salmısınız?

M a y i s. Biradamlıq kameraya, yoldaş Bağırov.

M i r c ə f ə r  B a ğ ı r o v. Gətirin.

M a y i s. Baş üstə! (*Kabinetindən çıxır*)

M i r c ə f ə r  B a ğ ı r o v (*əsəbi halda var-gəl edir*). Beriya haqlıdır! Xalq düşmənləriynən mübarizə aparаrkən, şəhər ziyalılarını bir an gözdən qaçıra bilmərik. Məhəmməd Cuvarlı kimi ziyalı “xalq düşməni” yüz avam kulakdan qorxuludur. Xalq arasında nüfuzu olan belə pantürkistlərin hərəsi Sovet Azərbaycanı üçün bir təhlükədir. (*Cuvarlını gətirirlər*) Cuvarlı, Moskvaya qaçmışdın canını qurtarmağa?

C u v a r l ı. Mən Moskvaya qaçmamışdım, Stalini görüb danışmaq üçün getmişdim.

M i r c ə f ə r  B a ğ ı r o v. Məndən danos verəcəkdin?

C u v a r l ı. Bunun üçün sənin layiqli adamların var, belə işlər mənim əlimdən gəlməz.

M i r c ə f ə r  B a ğ ı r o v. Səni tutub gətirməsəydilər, Stalinlə nə danışacaqdın?

C u v a r l ı. Mən əminəm ki, Azərbaycanın ağıllı ziyalılarını, alimlərini, sayılan, bacarıqlı adamlarını, Azərbaycanda sovet hakimiyyəti quranları, Leninin şəxsən tanıdığı inqilabçıları sizin bir-bir tutub güllələməyinizdən, adamları bu qədər qırmağınızdan Stalinin xəbəri yoxdur...

M i r c ə f ə r B a ğ ı r o v (*bərkdən gülür*). Sən Stalin kimi dahini ölkədəki işlərdən xəbərsiz hesab eləyirsən? Sən başa düşmürsən ki, bizdə bir rəhbər var?! Elə təkcə bunun üstündə səni güllələmək lazımdır. Sən də, sənin xalq düşməni dostların da anlamırsınız ki, sosializmin qələbəsi üçün Stalinə onun ideyaları ilə yaşayan yeni cəmiyyət lazımdır.

C u v a r l ı. Stalinin qolçomağı bir sinif kimi aradan götürmək istədiyindən hamımız xəbərdarıq. Özümüz də ona inanırıq. Lakin bu haqq vermir ki, günahkarı da, günahsızı da ağına-bozuna baxmadan qıralar! Həm də sənin göstərişinlə! Sənin əlinlə!

M i r c ə f ə r B a ğ ı r o v. Cuvarlı! Günahkar kimdir, günahsız kimdir?

C u v a r l ı. Özün yaxşı bilirsən, Mircəfər. İyirminci ildən ötən bu 17-18 ildə sən kamil bir casusluq məktəbi keçmisən!

M i r c ə f ə r B a ğ ı r o v (*qışqırır*). Sualıma cavab ver! Günahkar kimdir, günahsız kimdir?

C u v a r l ı. Bu sualına özün öz əməllərinlə cavab verirsən. Sən Beriyanın əlində ölüm alətinə çevrilmisən. Halbuki, istəsəydin, öz xalqına, azacıq da olsa, kömək eləyə bilərdin!

M i r c ə f ə r B a ğ ı r o v. Mən həmişə xalqıma kömək eləmişəm.

C u v a r l ı. Köməyin nahaq həbslər, nahaq tökülən qanlardan ibarətdirsə...

M i r c ə f ə r B a ğ ı r o v (*qışqırır*). Yox, yox! Stalin Azərbaycan xalqını Cənubi Azərbaycandan, Türkiyə sərhəddindən tamam uzaqlaşdırmaq üçün Sibirə, Qazaxıstanın qumlu çöllərinə sürgün eləmək istəsə necə? Stalin mənim şəxsimdə Azərbaycan xalqının sədaqətinə inandığına görə bunu eləmədi!

C u v a r l ı. Belə çıxır ki, sən Azərbaycan xalqının ən yaxşı oğullarını qırğına verə-verə Stalinin etibarını qazanmısan. Sən 20-ci illərdə Nəriman Nərimanovu da Leninin gözündə ləkələməyə çalışanlardan birisən! Çünki o, Vladimir İliçin ən yaxın silahdaşlarından idi, Şərq xalqlarının rəhbəri kimi böyük nüfuzu vardı!

M i r c ə f ə r  B a ğ ı r o v. Nərimanov qatı millətçi idi!

C u v a r l ı. Nərimanov öz xalqını sevirdi. Azərbaycan xalqının iqtisadiyyatını, mədəniyyətini yüksəltmək üçün daha geniş miqyasda əl-qol açmasını istəyirdi. Buna görə ona millətçi damğası vurmaq olmaz.

M i r c ə f ə r  B a ğ ı r o v. Sən mənə sui-qəsd hazırlayanlardan birisən!

C u v a r l ı. Bu da sənin bir uydurmandır. Özünü şişirtmək üçün yalan, şayiə uydurursan, guya, Azərbaycanda sui-qəsd hazırlayan təşkilat var.

M i r c ə f ə r  B a ğ ı r o v. Var! Sən də onun fəal üzvlərindənsən. Yaxşısı budur öz xoşunla hər şeyi aç, de. Onsuz da boynuna qoyacaqlar.

C u v a r l ı. Mən düşündüyümü dedim. Amma nə faydası? Madam ki, məni tutdurub, bu cəhənnəm quyusuna saldırmısan, demək, səsim heç yana çıxmayacaq. Madam ki, bu qırğından Stalinin də xəbəri var, özü də onun göstərişiynən olur, demək, sən onun əmrini kor-koranə yerinə yetirən şüursuz bir cəlladsan!

M i r c ə f ə r  B a ğ ı r o v (*qışqırır*). Kəsin bunun dilini!

Cuvarlıya əzab verirlər.

C u v a r l ı. Sən alçaqsan, xalq, vətən xainisən! Sən...

M i r c ə f ə r  B a ğ ı r o v. Sus!

C u v a r l ı. Nəsiminin dərisini soydular, amma əqidəsindən döndərə bilmədilər. İndi sən məni yalan danışmağa, əqidəmdən dönməyə məcbur etmək istəyirsən? Sən bir dəstə başkəsənlə oba-oba, kənd-kənd gəzib, Azərbaycan xalqının iqtisadiyyatını, mənəvi sərvətini məhv etdiyin üçün olmaya özünü vacib bir şəxsiyyət hesab edirsən? Yox! Sən çox adi, həm də alçaq bir satqınsan.

Bağırov onu güllə ilə vurur.

M i r c ə f ə r  B a ğ ı r o v. Sus!

C u v a r l ı. Sevinmə ki, məni öldürdün, xalq bizim intiqamımızı səndən alacaq. Yaman alacaq!

İ ş ı q  s ö n ü r

## ALTINCI ŞƏKİL

Səlim Babayevin evi. Xumar gəlinlik paltarında daxil olur. O, taqətdən düşübdür. Addımlarını zorla atır. Mədinə o biri otaqdan gələrək onu görür.

M ə d i n ə (*təəccüblə*). Sənə nə olub, Xumar? Bu nə haldır? Bəs, toyun olmadı? (*Xumar "yox" mənasında başını bulayır*) Niyə? Nə oldu?

X u m a r. Ayazı apardılar.

M ə d i n ə. Hara?

X u m a r. İnsanların gedib-gəlmədiyi cəhənnəmə.

M ə d i n ə. Lap gəlib toy məclisindən apardılar? (*Xumar başı ilə təsdiq edir*) Axı, mən dedim böyük məclis-zad lazım deyil, toyu gizlin eləyin.

X u m a r. Gizlin eləyirdik. Bircə Cabbar gəlmişdi. Enkevededən gələn cəlladlara nə qədər yalvardım məni də Ayazla bir yerdə aparın... Aparmadılar. (*Halsız halda gözlərini bir an yumaraq susur, sonra pıçıltı ilə*) Aman Allah! Dünyada nə insafsız işlər var! Mənim dayım... Anamın doğma qardaşı... Anam deyərdi, uşaqlıqda onlar – bacı-qardaş bir-birilərini çox istərmişlər. Bir-birilərindən ayrılmazmışlar. Bəs necə oldu, dayım... Anamın o sevimli qardaşı bu qədər nainsaf oldu?! (*Halsız halda gözlərini yumur, Mədinə xanım stəkana su töküb gətirir*)

M ə d i n ə. Sakit ol, özünü ələ al.

X u m a r. Mənə zəhər verin, Mədinə xanım, zəhər...

M ə d i n ə (*amiranə*). Özünü ələ al!..

X u m a r. Vallah, daha yaşamaq istəmirəm. Bu gəlinlik paltarında ölmək istəyirəm.

M ə d i n ə. Səbrli ol! Zülm ərşə dirənəndə də, insan gərək mənliyini itirməsin! (*Xumar bir az toxtayır, lakin bu çox davam etmir*) Özünü ələ al, görək nə olur...

X u m a r. Axı, heç kəs o cəhənnəmdən geri qayıtmır... (*Birdən hönkürtü ilə ağlayaraq*) Ax, zalımlar! İnsafsızlar! Bütün fikir-xəyalı öz sənətində olan o kimsəsiz cavan sizə nə yamanlıq eləmişdi? Deyirlər, qədim romalılarda sənət Allahı olurmuş. Ey sənət Allahı! Sən mənim nakam nişanlımı o cəhənnəmdən xilas et! Qırx gün, qırx gecə sənə dua eləyərəm! Qırx gün, qırx gecə!

M ə d i n ə. İnsan ətinə yerikləyən qara qartal sənət ilahəsini çoxdan caynağına alıb aparıb... çoxdan.

X u m a r (*gözlərini qapayaraq mahnı oxuyur*). Hər dəfə biz görüşəndə o, bu mahnını mənə oxudardı. Yox! O, bu mahnını eşitmir... O, bu mahnını daha eşitməyəcək... Ah, yerlərin, göylərin qadir qüvvələri, qoymayın onu mənim əlimdən alsınlar. Mən aciz, yetim bir qızam! Mənə kömək eləyin! Qoymayın mənim gəlinlik paltarım cavan nişanlımın qanına boyansın!

M ə d i n ə. Sakit ol, gülüm! Dünya kar olub! Heç kəs sənin səsini eşitmir. Ürəyini daş elə, yaşa. Tiranın öz qurduğu cəhənnəmdə yanacağı günü görmək üçün yaşa!

X u m a r. Eh, Mədinə xanım, bu dünyada iki gözümdən də əziz nişanlımı görməyəndən sonra o intiqam nəyimə lazımdır? (*Gedir*)

M ə d i n ə (*öz-özünə*). İlahi! Necə olub ki, bu ölkə belə olub? Bu zülmət dünyasında, açılmaz bir qalada oturub, insanların qanını aramsız içən əjdaha, məgər, doymurmu?

İ ş ı q s ö n ü r

## YEDDİNCİ ŞƏKİL

Dövlət təhlükəsizliyi idarəsinin yeraltı həbsxanası. Yarıqaranlıq zirzəmi. Dörd dustaq: məşhur igid Afşar Hüseyn, dövlətli tərəkəmə Hacıqulu, böyük vəzifələrdə olmuş Ədhəm Nəcəfov, Anaşkin. Adamlar həyəcan və qorxu içindədirlər. Hamının qulağı səksəkədədir. Qapının kilidi səslənəndə, adamların üzündəki vahimə daha da dəhşətli olur. Ədhəm Nəcəfov qorxusundan qaçıb çarpayının altına girir. Qapı açılır. Ayazla Cabbarı itələyib salırlar zirzəmiyə.

A f ş a r H ü s e y n (*çarpayıya tərəf*). Nəcəfov, çıx, qorxma. Təzə qonaqlardır. (*Ayaza*) Bu, keçmişdə böyük vəzifə sahibi olub. Yazığı hər dəfə danışdırmağa aparanda, o qədər döyürlər ki, indi qapının kilidi açılanda, qorxusundan qaçıb girir çarpayının altına.

C a b b a r. Ağlını itirib?

A f ş a r H ü s e y n. Yox, ağlı yerindədir. (*Ədhəm Nəcəfov çarpayının altından qorxa-qorxa çıxır. Dikəlib Ayaza baxır. Ayaz irəliləyib onunla əl tutuşmaq istəyir. Lakin əlini qaldırıb, Ayazla görüşmək sanki heç Ədhəm Nəcəfovun ağlına da gəlmir*)

N ə c ə f o v (*pıçıltı ilə*). Səni də tutublar?

A y a z. Görürsünüz ki?

N ə c ə f o v. Səni nə üstündə tutublar?

A y a z. Bilmirəm...

N ə c ə f o v (*eyni vahiməli pıçıltı ilə*). Yəqin, boynuna nə isə qoymaq istəyəcəklər, dəhşətdir, qardaşım...

A y a z. Mən özümdə zərrə qədər də günah görmürəm.

N ə c ə f o v. Sən görmürsən, amma onlar görürlər...

C a b b a r. Elə zor-güc? Adama necə qara yaxmaq olar?

N ə c ə f o v. O... Cabbar. Dünyanı güldürüb əyləndirən sənətkar. Hünərin var, bu cəhənnəmdə bizi güldür.

C a b b a r. Yox, qardaşlar! Yuxuda canavar görmüşəm.

N ə c ə f o v. Canavar?

C a b b a r. Hə, görürəm, Kələkbaz Skapeni oynayıram, amma zalda heç kəs yoxdur... Tək bir canavardı, mənə baxıb gülür.

N ə c ə f o v. Dəhşətli yuxudu...

C a b b a r. Hə, yadıma düşdü. Çər dəymiş lap insan kimi gülürdü... Qəhqəhə çəkirdi.

N ə c ə f o v. Dəhşətdir!..

C a b b a r. Elə o yuxudan sonra ürəyimə damdı ki, başıma bir qəza gələcək.

A y a z. Toya nahaq gəldin! İndi rahat oturmuşdun evində.

C a b b a r. Özünü niyə demirsən? "Xalq düşməni" rolunu oynasaydın, indi rahatca oturmuşdun "Novı Yevropa"da, bala-bala konyak vururdun.

N ə c ə f o v. Nə düşmən? Nə rol?

C a b b a r. Əşşi! Bir nəfər, guya, yazıçı, meydana çıxıb, xalq düşmənləri haqqında pyes yazıb. Elə məhz xalq düşmənindən yazdığı üçün Bağırov onu böyük vəzifəyə qoydurub... Həmin o müəllif Ayaza zəng eləyib ki, gərək xalq düşməni rolunu sən oynayasan! Bu da boyun qaçırıb, deyib, pyes artıq oynanılır, ifaçısı da var, mənə bir lüzum yoxdur... Kişi razılaşmayıb, deyib, mən istəyirəm sən oynayasan! O deyib, bu deyib – olmayıb. Axırda əlahəzrət qeyzlənib deyib: "Eybi yoxdur, oynama! Amma bu tərsliyin sənə baha oturacaq!"

A y a z. Deyirsən, onun işləridir?

C a b b a r. Fil qulağında yatmısan... hə... İki gündən sonra da gəlib, toy məclisindən apardılar...

A f ş a r H ü s e y n. Toyu yarımçıq qoydular?

C a b b a r. Bəli. Nişanlısını ağ gəlinlik paltarında qoyub gəlib.

A f ş a r  H ü s e y n. Məsəl var, qoyun olmayan yerdə keçiyə Kərəməddin bəy deyərlər... Şübhəsiz, o səfsəfəni yazan səndən danos verib... Görürəm, ürəkli oğlansan, o əclafın qabağında özünü sındırma! Polad sınar, əyilməz!

A y a z (*Afşar Hüseynə*). Bəs, sizi niyə tutublar? Axı, sizin banditizmlə mübarizədə göstərdiyiniz igidliklər barədə əfsanələr söyləyirlər.

A f ş a r  H ü s e y n. Qarabağ qaçaqlarını mənim əlimlə tutdular... qırdılar... indi özümü niyə tutublar? Başa düşmürəm?

N ə c ə f o v. Dünya niyə belə olub? Harda qalıb insaf, ədalət, etibar?

A y a z. Bu, qaydadır, hökumətin zülmü artanda insaf, ədalət yaddan çıxır... unudulur.

C a b b a r. Səni niyə tutublar, Hacı? Eşitdiyimə görə, sən həmişə kasıb-kusuba əl tutan, xeyirxah insan olmusan?

H a c ı q u l u. Bacıoğlu, mənim on beş min qoyunum var idi. Yüz dəvəm, beş yüz də atım var idi. Hamısını atalarının malı kimi yığıb apardılar. Qış keçdi, yazda camaat qoyun-quzu otarmaq üçün Haramı düzünə köçürdü. Əlli il idi ki, hər yaz mən də el ilə bir yerdə Haramıya köçürdüm. İndi dan yeri qızaranda, oba köçəndə, ürəyim kövrəldi, keçmiş çoban yoldaşım Mustafa oğlunu səsləyib dedim: ə, Haramıya de ki, tay Hacıqulu gəlmədi. O da cavabında dedi ki, ay Hacı, ürəyimi yaman kövrəltdin! Sənsiz tay Haramı nəyə lazımdır? Qonşumuzda Şirin adlı bir gədəni muzdurkom deyirlər, nə deyirlər, ondan eləyiblər. Gedib enkevedeyə xəbər verib ki, "Hacıqulu kolxozun ziddinədir. Dövlətinin kolxoza qoyulmasına görə hökuməti söyür. Mustafa oğlu kimi yoxsulları yoldan çıxarır". Əşi, bu dünyada insana yaxşılıq yoxdur! O Şirin özü də, atası da, qohum-əqrəbası da eyzən mənim çörəyimlə, südümlə, ayranımla dolanıblar. Bəs, insan da bu qədər nankor olar?

B i r i n c i  m i l i s (*içəri girir*). 1300 nömrəli məhbus, doprosa.

Cabbar çıxır.

İ ş ı q  s ö n ü r

## SƏKKİZİNCİ ŞƏKİL

Səlim Babayevin evi. Xumar qaranlıqda əyləşib. Səhnədə təkcə şam yanır. Mədinə içəri girir.

M ə d i n ə. Xumar, qaranlıqda nə üçün oturmusan? (*İşığı yandırır*)

X u m a r. Keçirin işıqları, Mədinə xanım.

M ə d i n ə. Nə üçün?

X u m a r (*işıqları keçirir*). Ayaz qaranlıq zirzəmidə olduğu halda, mən işığa baxa bilmərəm. Mən də onun kimi zülmətdə olmaq istəyirəm.

M ə d i n ə. Xumar, axı, mən sənə dedim ki, yaşamaq lazımdır.

X u m a r. Mədinə xanım, siz həmişə mənə deyirdiniz ki, həyatda xoşbəxt olmaq istəyirsənsə, heç bir günah iş tutma, heç kəsə yamanlıq eləmə, qismətinə çıxan xoşbəxtliyin ilə kifayətlən. İnsanlar qismətimə çıxan xoşbəxtliyi zorla məndən aldılar. Anam öləndən sonra siz mənə ürək verib, onu da demişdiniz ki, bundan sonra özünü yetim sanma. Sənin Səlim kimi dayın var. Amma dayım özü insafsızlıq eləyib, məni həmişəlik yetim qoydu... Mədinə xanım. (*Çamadanını götürür*)

M ə d i n ə. Xumar, hara gedirsən?

X u m a r. Anamın bir rəfiqəsi var, onlara...

M ə d i n ə (*dərindən nəfəs alaraq*). Başa düşürəm. Sən daha bu evdə qala bilməzsən. Sən o dəhşətli əhvalatdan sonra dayının üzünə baxa bilməzsən. Sənin məhəbbətin Allahın yaratdığı nadir bir gül idi. Bu zəmanənin boğucu havası onu gec-tez məhv edəcəkdi. Amma mənim bacım Şəfiqə xanımgilə gedəcəksən. Biz bu barədə onunla danışmışıq.

X u m a r. Yox, Mədinə xanım, mən heç kəsə yük olmaq istəmirəm.

M ə d i n ə (*acıqlı*). Şəfiqə xanım özgə deyil, mənim bacımdır. Özün də bilirsən ki, o səni necə çox istəyir. Həmişə mənə deyərdi ki, kaş Xumar kimi bir qızım olaydı...

X u m a r. Mədinə xanım...

M ə d i n ə (*qızın sözünü kəsir*). Başqa söz lazım deyil, necə demişəm elə də olacaq. Anan səni mənə tapşırıb. Özün bilirsən ki, biz bir-birimizə necə sədaqətli rəfiqə olmuşuq. Gedək, səni ötürüm...

Çıxırlar.

# İKİNCİ PƏRDƏ

## DOQQUZUNCU ŞƏKİL

Küçə. Xumar ağır addımlarla irəliləyir. Mayis Kazımov vətəndaş paltarında ona yaxınlaşır. Xumar diksinib geri çəkilir.

M a y i s. Salam, Xumar! (*Qız cavab verməyərək yoluna davam etmək istəyir, Mayis onun qolundan yapışır*) Rica edirəm, bir dəqiqə dayanın!

X u m a r (*qəzəblə*). Yaxın gəlməyin! Mənə yaxın gəlməyin! Cani! (*Qolunu onun əlindən qoparır*)

M a y i s. Xumar! Siz məni ən ağır sözlərlə təhqir etsəniz də, öldürsəniz də, haqqınız var. Siz o qədər təmiz, o qədər günahsız məxluqsunuz ki, bu dünyadakı cinayətlərin daxili mahiyyətini, gözə görünməyən mexanizmini dərk eləyə bilməzsiniz. Bilirəm, mən Ayaz Turanı tutmağa gələndə sizinlə çox nəzakətsiz, kobud rəftar eləmişəm.

X u m a r. Siz cəhənnəm adamısınız, başqa cür rəftar eləyə bilməzdiniz!

M a y i s. Düz deyirsiniz, mən başqa cür rəftar eləyə bilməzdim. Amma ona görə yox ki, mən bütün insani hisslərimi tamam itirib cəhənnəm məmuru olmuşam. Ona görə ki, mənimlə Ayazı tutmağa gələn o iki cəllad mənə tabe olsalar da, eyni zamanda, mənim də üstümdə gözətçi idilər. Burada üçüncü şəxs olmadığı üçün sizinlə açıq danışa bilərəm.

X u m a r (*qışqırır*). Bəsdirin! Mən sizi eşitmək istəmirəm!

M a y i s. Mən sizi sevirəm. Mən o ilk faciəli gecədə sizi sevmişəm. Sizinlə təklikdə rast gəlib danışmağa çalışmışam.

X u m a r. Siz... siz cəllad olduğunuz qədər də həyasızsınız!

M a y i s. Xumar! Olan olub, keçən keçib. Həyata fəlsəfi baxın! Bizi Allah, Adəmlə Həvva kimi palçıqdan düzəldib. Sonra axmaq bir zərbə ilə təkrar torpaq olub, yenə torpağa qarışacayıq. Ömər Xəyyam demişkən, yeddi min il bundan qabaq ölənlə bizim fərqimiz olmayacaq! Sizə indi mənim kimi bir kömək, bir hami lazımdır.

X u m a r (*ona dərin bir kinlə baxaraq*). Bircə bilsəydiniz, sizin danışığınızda necə alçaq bir ikiüzlülük hiss edirəm. Siz Ayaz Turan

kimi oğlanı tutub, nişanlısını özünüzə aşna etmək istəyirsiniz. Rədd olun! Rədd olun!

M a y i s. Mən bundan incimirəm. Çünki siz məni öz dediyiniz kimi yalnız bir cəhənnəm adamı kimi görürsünüz.

X u m a r. Mən sizə nifrət edirəm. (*Sürətlə gedir*)

M a y i s (*onun ardınca*). Biz yenə də görüşəcəyik, Xumar!

İ ş ı q s ö n ü r

## ONUNCU ŞƏKİL

Qapının kilidi səslənir, zirzəmiyə vahimə çökür. Ədhəm Nəcəfov qaçıb çarpayının altına girir. Qapı açılır. Mircəfər Bağırov, ardınca Mayis Kazımov və həmin iki cəllad daxil olurlar.

M i r c ə f ə r B a ğ ı r o v (*eynəyin altından zirzəmini nəzərdən keçirərək*). Hanı Nəcəfov?

M a y i s. Qorxusundan qaçıb girib çarpayının altına!

M i r c ə f ə r B a ğ ı r o v (*Mayisə*). Çıxarın onu!

Cəlladlar Nəcəfovu çarpayının altından çəkib çıxarırlar.

N ə c ə f o v (*qorxusundan əsərək*). Mircəfər! Mənə çox əzab verirlər. Dözə bilmirəm.

M i r c ə f ə r B a ğ ı r o v. Nə üçün günahlarını boynuna almırsan?

N ə c ə f o v. Hansı günahlarımı?

M i r c ə f ə r B a ğ ı r o v. Kollektivləşmənin əleyhinə olmağını, Zinovyevin, Trotskinin fikrini təsdiq etməyini...

N ə c ə f o v. Mən kollektivləşmənin əleyhinə olmamışam. Məcburi kollektivləşmənin Leninin fikirləri ilə düz gəlmədiyini demişəm.

M i r c ə f ə r B a ğ ı r o v (*qışqırır*). Xain! Xalq düşməni! Sən nə cəsarətlə Lenini Stalinə qarşı qoyursan? Nə cəsarətlə Stalinin ideyasını təftiş edirsən? Nə cəsarətlə ictimai yığıncaqlarda Stalinin adını çəkmirsən?!

N ə c ə f o v (*qorxuya düşərək*). Mircəfər, sən necə istəmisənsə, mənə o cür dedirdib yazıblar, altından qol da çəkmişəm.

M i r c ə f ə r  B a ğ ı r o v. Hm... demək boynuna almısan. (*Mayisə*) Bu xain boynuna alıb?

M a y i s. Bəli. İmza da eləyib.

M i r c ə f ə r  B a ğ ı r o v (*istehza ilə*). İndi ki, elədi, daha kişiyə əzab verməyin. Aparın qurtarın.

N ə c ə f o v. Mircəfər!

M i r c ə f ə r  B a ğ ı r o v (*qışqırır*). Aparın!

Cəlladlar Nəcəfovu aparırlar. Boğuq bir güllə səsi eşidilir. Sonra cəlladlar gəlirlər.

M i r c ə f ə r  B a ğ ı r o v (*Anaşkinə yaxınlaşır*). Kak dela, Anaşkin?

A n a ş k i n. Mən azərbaycanca çox gözəl bilirəm.

M i r c ə f ə r  B a ğ ı r o v (*istehza ilə*). Hə? Yoxsa, sən özünü internasionalçı kimi göstərmək istəyirsən?

A n a ş k i n. İndi mənim özümü nə cür göstərməyimin mənası yoxdur. Siz mənə ölüm hökmü kəsib, özümə də işgəncə verə-verə qol çəkdirmisiniz.

M i r c ə f ə r  B a ğ ı r o v. Bəs, sən bilmirdin ki, Stalinin əleyhinə çıxan xalq düşmənini qucaqlayıb öpməzlər.

A n a ş k i n. Mən həqiqəti deyirdim. Mən sizin xalqa elədiyiniz zülmə dözə bilməzdim.

M i r c ə f ə r  B a ğ ı r o v. Stalin 1929-cu il dekabr ayının 27-də elədiyi nitqində kulakların bir sinif kimi məhv edilməyə başlandığını elan etdi. 1930-cu ildə "Pravda" qəzeti bizi kulak sinfi ilə ölüm-dirim müharibəsinə çağırırdı. Demək, kulakı bir sinif kimi məhv etmək örtülü qapılar arxasında getmirdi. Hətta, kulaklara cəza vermək üçün onları 3 kateqoriyaya ayırırdılar: Birinci kateqoriyaya daxil olan kulakların özləri güllələnir, ailələri Sibirə sürgün edilirdi. İkinci kateqoriyaya daxil olanların özləri də, ailələri də Sibirin ən uzaq yerlərinə sürgün edilirdi. Üçüncü kateqoriyalar isə, olduqları yerdə bütün səs hüququndan məhrum edilərək cəza çəkirdilər. Nə üçün sən – böyük rus xalqının oğlu, onda səsini çıxarıb etiraz etmirdin?

A n a ş k i n. Çünki Stalin hakimiyyət başına keçən gündən sənin kimi cəlladların vasitəsilə demokratiyanı məhv edərək, bütün ölkəni dəmir hasar içinə salıb, səsini çıxaranı dara çəkirdi. Bəs, sən niyə,

hansı səbəbə Stalinin əlində ölüm aləti olurdun? 20-ci illərdə çekanın sədri olub, günahsız adamları dəstə-dəstə tutub qırırdın?

M i r c ə f ə r  B a ğ ı r o v. Mən Stalinin dediklərinə inanmışam. Mən bu əqidədəyəm ki, sosializmi yalnız Stalinin taktikası, Stalinin fikirləri əsasında qurmaq mümkündür.

A n a ş k i n. Bəs, Leninin dediklərini niyə unudurdun?

M i r c ə f ə r  B a ğ ı r o v (*qışqırır*). Bugünün Lenini Stalindir.

A n a ş k i n. Stalin kimi cəllad Lenin ola bilməz!

M i r c ə f ə r  B a ğ ı r o v (*cəlladlara*). Aparın bunu!

Anaşkini aparırlar.

A f ş a r  H ü s e y n. Mircəfər, mən yadındayam.

M i r c ə f ə r  B a ğ ı r o v (*eynəyinin altından baxaraq*). Afşar Hüseyn?!

A f ş a r  H ü s e y n. Bəli.

M i r c ə f ə r  B a ğ ı r o v. Sonra?

A f ş a r  H ü s e y n. Sonrası budur ki, fikirləşdim yəqin mənim tutulmağımdan sənin xəbərin yoxdur. Enkevedenin adamları gəlib məni tutanda, arvada pıçıldadım ki, Bağırova xəbər ver. O məni yaxşı tanıyır. Görünür, yazıq arvad sənə xəbər çatdıra bilməyib. Yadındadır? Banditizmlə mübarizə aparmağa gəlmişdiniz Qaryaginə. Məni çağırtdırıb dedin ki, "eşitmişəm, sən çox igid adamsan, gərək banditizmlə mübarizədə bizə kömək eləyəsən". Mən də öz obamızdan on beş igid adam götürüb, o baltagirməz Kirs, Ziyarət meşələrində səninlə birlikdə qaçaqlarla vuruşdum. Tək özüm neçəsini vurdum. Əslinə baxsan, o yazıqlar heç quldur deyildilər. Var-yoxları zorla alınıb, kolxoza qoyulandan sonra tutulmağın qorxusundan qaçıb evlərindən didərgin düşmüşdülər. O vaxtdan bəri də əlimdən bir xata-zad çıxmayıb. Bəs, indi nəyə görə məni tutub bura salıblar?

M i r c ə f ə r  B a ğ ı r o v. Ona görə ki, sən təhlükəli adamsan. Sənin kimi adamlara bu dəniz qırağında "SOE" deyirlər, yəni "sosialnı opasnıy element!" Sən varları kolxoza qoyulduğu üçün qaçaq düşmüş adamlara o vaxt güllə atdığın kimi, sabah bir düşmən sözü ilə kolxozu quranlara da güllə ata bilərsən!

A f ş a r  H ü s e y n. O vaxt biz sizə inanırdıq... Deməli, siz "dəliyə yel ver, əlinə bel" – deyə, bizi aldadıb, bir-birimizə qırdırırmışsınız...

M i r c ə f ə r  B a ğ ı r o v (*qəzəblə cəlladlara*). Aparın bunu, hökmü yerinə yetirin!

A f ş a r  H ü s e y n. Eybi yoxdur. Mən günümü görüb, dövranımı keçirmişəm. Ancaq bir gün gələcək ki, indi aldadıb bir-birinə qırdırdığınız bu xalq, boğazına kəndir salıb, səni göydən asacaq!

M i r c ə f ə r  B a ğ ı r o v (*qışqırır*). Aparın!

Cəlladlar Afşar Hüseyni aparırlar.
Uzaqda boğuq güllə səsi eşidilir.

M i r c ə f ə r  B a ğ ı r o v (*Ayaza*). Hə... Bizim məşhur tragik artist özünü necə hiss edir? Nə üçün, o xalq düşmənini səhnədə ifşa eləməkdən boyun qaçırırdın?

A y a z (*hərarətlə*). Ona görə ki, mən o surəti həqiqi sənətə layiq bilmirəm. Mən, ümumiyyətlə, "xalq düşməni" məfhumunun nə demək olduğunu indi də başa düşmürəm.

M i r c ə f ə r  B a ğ ı r o v. Bütün böyük sənətkarlar kimi sən də sadədilsən! Afşar Hüseyn savadsız tərəkəmədir. Böyük Stalinin kulakı, təhlükəli adamları ləğv etmək siyasətini başa düşmür. Bəs, sən nə üçün başa düşmürsən?

A y a z. Mən Leninin siyasətini başa düşürəm.

M i r c ə f ə r  B a ğ ı r o v. Eybi yoxdur. Stalinin siyasətini burada sənə başa salarlar. Bizə hər bir sənət "xalq düşmənlərini" ifşa etmək üçün lazımdır.

A y a z. Sənətkar şüursuz ifşa aləti ola bilməz!..

M i r c ə f ə r  B a ğ ı r o v. Doğrudur, amma məsələ ondadır ki, o şüur haradan, hansı ideyadan işıq alır?! Əgər, sənin ağlın-şüurun Stalinin böyük ideyasından işıq alsaydı, əlbəttə ki, onun düşmənini də məmnuniyyətlə ifşa edərdin! Stalin ideyalarına şübhə ilə, tərəddüdlə yanaşan sənətkar bizə lazım deyil!

Mircəfər Bağırov çıxır.

A y a z. Nələr baş verir, Allah?! Nələr?! Adi bir qarışqanı yaratmağa qadir olmayan insan bir anın içərisində neçə insan ömrünün qətlinə fərman verir? Nələr baş verir, Allah? Sənin yaratdığın, dünyanın əşrəfi sandığın insan canavara dönüb bir-birinin ətini yeyir. Nələr baş verir, Allah! Allah! Allah! (*Yıxılır*)

İ ş ı q  s ö n ü r

ON BİRİNCİ ŞƏKİL

M a y i s. Cabbar, yadındadır, "Sevil" tamaşası gedirmiş. Antrakt zamanı artistlər çıxıb həyətdə dincələndə, Mustafa Mərdanov deyib: gəlin gedək içəri, tərliyik, bizə soyuq dəyər. Sən də demisən, mənə soyuq dəyməz, məndə Nikolay yağı var... demisən, deməmisən?

C a b b a r. Demişəm, zarafat eləmişəm də. Burada nə var ki?

M a y i s. Özünü tülkülüyə qoyma, Cabbar. Nə demək istədiyini yaxşı bilirsən.

C a b b a r. Vallah, bilmirəm axı, nə demək istəmişəm?

M a y i s. Demək istəmisən sovet adamları pis dolandığı üçün hamısı dərdəcər olur, amma mənim canımda Nikolay vaxtından qalma zapas yağ var, ona görə də mənə soyuq dəyməz.

C a b b a r. Pah atonnan! Yəni, doğrudan, mənim sözümdən elə məna çıxır?

M a y i s (*gülür*). Cabbar, özünü lotuluğa vurma.

C a b b a r. Ay nəçənnik, vallah, on il Əflatundan dərs almış olam, yenə elə qəribə fəlsəfə düzəldə bilmərəm.

M a y i s. Eh, Cabbar, yorursan məni. Barı gülməli bir şey göstər, başım ayazısın.

C a b b a r. Nə göstərim, nəçənnik?

M a y i s. Sənin yaman Məşədi İbad oynamağın var idi. Davay duet... Mən Rüstəm bəy, sən də Məşədi İbad... (*Özü oxuyur*) Məşədi İbad, sən bizə xoş gəlib, bizi şad elədin...

C a b b a r (*oxuyur*). A kişi sən öl, bu sən öl...

M a y i s (*kəsir*). Yox, oturan yerdə ləzzəti yoxdur... Qalx, oynaya-oynaya...

C a b b a r (*qalxıb oynaya-oynaya oxuyur*). A kişi sən öl, bu sən öl, həmişə səni yad elərəm.

M a y i s (*bərkdən gülür*). Ay səni, Cabbar, vallah, qiyamət komiksən. Deyirlər, cavanlıqda əntiqə Vəli oynamağın da varmış.

C a b b a r. Düz sözə nə deyəsən?

M a y i s. Davay duet. (*Cabbar gülür*) Nə gülürsən, lotu?

C a b b a r. Nəçənnik, deyirəm, sizdən qiyamət Telli olar.

M a y i s. Cabbar, məni qıza oxşadırsan?

C a b b a r. Çirkin qıza yox ki, göyçək qıza.

M a y i s. Yaxşı, qurtardıq. De görüm, Ayaz Turanın pantürkist olduğunu, həmişə Cavid kimi, Əhməd kimi pantürkistləri tərif lədiyini,

Bağırovu Stalinin cəlladı adlandırdığını, ona sui-qəsd hazırlayanlardan biri olduğunu təsdiq edirsən, ya yox?

C a b b a r. Vallah, billah, mən ömrümdə ondan elə sözlər eşitməmişəm.

M a y i s. Cabbar, axı, indicə boynuna aldın!

C a b b a r. Kim? Mən? Vallah, nəçənnik indi komediya-zad göstərirdik, dedim, yəqin ürəyiniz yumşalar. Daha məni döyə-döyə boynuma qoymazsınız.

M a y i s (*cəlladlara*). Cabbarın dırnaqlarına iynə...

Cabbarın dırnaqlarına iynə batırırlar.

C a b b a r (*qışqırır*). Təsdiq eləyirəm!

M a y i s (*cəlladlara*). Dayanın! (*Kağızı Cabbarın qarşısına qoyur*) Qol çək!

C a b b a r. Ey göylərdən baxan Allah! Özün şahid ol, gör mən bu böhtanlara necə qol çəkirəm. (*Ağlayır*)

M a y i s. Ağlama, Cabbar! Sən indi oldun tragikomik. Aparın!

İ ş ı q s ö n ü r

## ON İKİNCİ ŞƏKİL

Həbsxana. Səlim və Ayaz.

S ə l i m. Nə üçün Şəfi Sadıqovun pyesində "xalq düşməni" rolunu ifa eləmək istəməmisən?

A y a z. Ona görə ki, pyes zəifdir. Sünidir. Müəllif C.Cabbarlının yaratdığı süjeti, obrazları pis şəkildə təkrar edir. "Xalq düşməni" məfhumunun ictimai mahiyyəti də aydın deyil.

S ə l i m. Nə üçün aydın deyil? Həmin obrazın kollektivləşmə əleyhinə olduğu göstərilmir?

A y a z. Göstərilir. Amma kollektivləşmə əleyhinə olmaq hələ xalq düşməni olmaq demək deyil. Çünki bu kollektivləşmə xalqın istəyi, rəyi nəzərə alınmadan, ondan heç nə soruşulmadan məcburi surətdə aparılır. Xalqın böyük bir hissəsi kulak adı ilə məhv edilir. Mən bu həqiqəti bilib, hiss elədiyim halda, Şəfi Sadıqovun istedadsız qələmlə yazılmış saxta surətini necə oynaya bilərəm?

S ə l i m. Demək, sən özün də kollektivləşmənin əleyhinəsən... (*Bu arada Mayis daxil olur, onu görcək qəzəblə*) Sən Stalinin düşmənlərinin – Buxarinin, Zinovyevin dəyirmanına su tökürsən! Sən onların əksinqilabçı ideyalarını təbliğ edirsən!

A y a z. Mən siyasət adamı deyiləm. Bu barədə də birinci dəfədir danışıram.

S ə l i m. Sən iliklərinə qədər əksinqilabçısan! Sən azərbaycanlıların, türk-tatar xalqlarının rus əlifbasına keçməsinin də əleyhinə olmusan!.. (*Qışqırır*) Olmusan, olmamısan?!

A y a z. Mən, ümumiyyətlə, əlifbanın dəyişilməsi və bunun yuxarılardan əmrlə olmasının əleyhinəyəm. Bu, xalqı öz keçmişindən, tarixindən ayırıb uzaqlaşdırır. Az bir zaman ərzində Azərbaycan xalqının əlifbası iki dəfə dəyişdirilib. Etiraz edənləri tutub güllələyiblər. Bununla bizim yeni nəsillərimizi öz tarixi keçmişimizdən həmişəlik qoparıblar! Bu, yalnız ədalətsizlik yox, cinayətdir!

S ə l i m. Yoxsa, sən istəyirdin ki, biz o çətin ərəb əlifbası ilə qalaq!

A y a z. Ərəb əlifbası klassik əlifbadır. Heç bir çətinliyi də yox idi. Çətinliyə qalsa, yapon əlifbası ən çətin əlifbadır. Lakin yaponlar...

S ə l i m. Sən qatı millətçisən! Sən xaricdə olan müsavatçıların agentisən. Sən “türk” adının da “azərbaycanlı” sözü ilə əvəz edilməsinin əleyhinə olmusan.

A y a z. Mən bir millətin adını məcburiyyətlə dəyişməyi ədalətli iş hesab eləmirəm. “Türk” bizim milli adımızdır, biz min illərdən bəri bütün tarixlərə, bütün başqa xalqlara “türk” adı ilə məlum olmuşuq. Nədən ötrü birdən-birə o “azərbaycanlı” sözü ilə əvəz olundu? Məgər, gürcülərə “gürcü” yox, “gürcüstanlı” deyirlər. Ya ingilisə “ingilis” yox, “ingiltərəli” deyirlər? Hər millətin öz adı var. Əgər, Stalin Osmanlı türklərinə görə bizim adımızı dəyişibsə, bu da misli görünməmiş bir ədalətsizlikdir!

Cəllad qalxıb acıqlı nəzərlərlə ona baxır.

S ə l i m (*cəllada*). 1134 nömrəli dustağı! (*Cəllad çıxır. Ayaza*) Sənə məsləhət görürəm, hər şeyi öz xoşunla boynuna alasan! Hamısı birdir, boynuna qoyacaqlar.

Cabbarı gətirirlər. O döyülməkdən, əzab verilməkdən eybəcər hala düşüb.

S ə l i m. Cabbar! Bu dostun haqqında dediklərini indi üzünə de!

C a b b a r. Ayaz! Qardaşım!

S ə l i m (*qışqırır*). Sən təsdiq edirdin ki, Ayaz Turan xalq düşmənidir, xaricdə olan müsavatçıların agentidir. Azərbaycan bolşeviklərinin rəhbəri Mircəfər Bağırovu vətən, millət xaini adlandırırdı.

C a b b a r (*dəhşət içində*). Bəli, bəli, təsdiq edirəm. Təsdiq edirəm, Ayaz Turan xalq düşmənidir. Təsdiq edirəm ki, Ayaz Turan Bağırova sui-qəsd etməyə hazırlaşan dəstəyə daxildir! (*Və birdən Ayaza dəhşətlə baxaraq qışqırır*) Ayaz, qardaşım... məni məcbur elədilər!..

A y a z. Cabbar, qardaşım, sakit ol. Mən sənin sədaqətinə əminəm.

S ə l i m. Aparın!

C a b b a r. Ayaz, bəlkə biz bir də görüşmədik, bağışla...

A y a z. Cabbar, sakit ol... Bunlar indi bizə belə divan tuturlar, vaxt gələcək onlara...

Cabbarı aparırlar.

S ə l i m. Bizə kim divan tutacaq?

A y a z. Kimin divan tutacağının əhəmiyyəti yoxdur. Əsas odur ki, bu, mütləq olacaq. Çünki bu, sizin qurduğunuz diktatura sisteminin əsas qanunlarından biridir.

S ə l i m. Nəyə əsasən belə deyirsən?

A y a z. Bunu dərk etməyə böyük ağıl lazım deyil. Siz elə bir cəhənnəm üsuli-idarəsi yaratmısınız ki, orada qurduğunuz qır qazanlarında gec-tez özünüz yanmalısınız! Başqa cür mümkün deyil!

S ə l i m. Nə üçün mümkün deyil?

A y a z. Çünki diktatorun qurduğu sistem bütün insanları bir-birinə düşmən etmişdir. O, bütün insanlarda bir-birinə etibarsızlıq, şübhə yaradır. Bütün insanları bir-birini keçi qiymətinə satmaq ruhunda tərbiyə edir! Atanı oğula, qardaşı qardaşa qarşı qoyur. Təbii məsələdir ki, bu sistemi davam etdirmək üçün diktatora cəlladları tez-tez dəyişmək, vəzifələrini yerinə yetirmiş köhnə cəlladları yenilərin əli ilə qətl çarxının ağzına vermək lazımdır.

S ə l i m. Axı, nə üçün lazımdır? Bu, diktatora nə üçün lazımdır?

A y a z. Elədiyi saysız-hesabsız qətllərin ağlasığmaz sayını, səbəbsizliyini gələcək nəsillərdən, tarixin amansız mühakiməsindən gizləmək üçün. Təkcə bu son vaxtlara qədər neçə təhlükəsizlik

komissarının biri o birinin başını verib cəhənnəm çarxının ağzına?! Halbuki onların hər biri öz vaxtında diktatorun sevimlisi idi!

S ə l i m. Axı, bu dəhşətli qırğınlar diktatora nə üçün lazım idi?

A y a z. Romanı yandırmaq Nerona nə üçün lazım idi? Ölkələri fəth eləyib tar-mar etmək, bunun üçün milyonları qırğına vermək Hannibalın, Napoleonun nəyinə lazım idi? Bu onların xalqına hansı səadəti verəcək idi? Hansı böyük fateh öz xalqını xoşbəxt eləyib... Fütuhat... qələbə... hamısı diktatorun özü üçündür. Diktatorluq ehtirası doymaq bilməyən nəhəng bir əjdahadır ki, bəşəriyyəti onun zülmündən xilas etmək üçün ancaq onun özünü məhv etmək lazımdır.

Səlim kameradan çıxır.

S ə l i m (*tək*). Xalq həqiqəti başa düşür. Başa düşür ki, bu ölkədə sovet hökuməti əleyhinə işləyən heç bir partiya-zad yoxdur. Lakin heç kəs də səsini çıxara bilmir. Hamı qoyun sürüsü kimi gəlib girir qanlı diktatorun qurduğu qətl çarxının ağzına. Biz isə, əlinə ölüm silahı verilmiş robotlarıq. Lakin biz şüurlu robotlarıq. Biz kimləri öldürdüyümüzü bilirik. Diktatorun məramını dərk edirik. Lakin, bununla belə, onun qətlinə fitva verdiyi milyonları qırırıq. Anaları körpələrindən ayırıb, Sibirin buzlu çöllərinə göndəririk! Ataları ayaqlarından asırıq, biz diktatorun əmrinə tabe olmaya bilmərik! Çünki biz özümüz də məhbusuq!

İ ş ı q s ö n ü r

## ON ÜÇÜNCÜ ŞƏKİL

Küçə. Cabbar Xumara rast gəlir.

X u m a r. Cabbar əmi, səni buraxıblar?

C a b b a r. Buraxmasaydılar ondan yaxşı idi!

X u m a r. Ayazı görmüsən?

C a b b a r. Görmüşəm. Ancaq bizi tez ayırdılar.

X u m a r. Səni nə vaxt buraxıblar?

C a b b a r. Dünən!

Xumar uzaqlaşır.

C a b b a r (*qızın ardınca*). Yalan deyirəm... Çünki məni buraxdıqları bir aydır. O cəhənnəmdə insanı ya öldürərlər, ya da vicdanını məhv eləyib buraxarlar! Ah, Xumar! Bu günahkar dünyanın ən məsum, ən köməksiz məxluqu! Vallah nə qədər yalvardım ki, Ayazın heç bir günahı yoxdur, mənə inanmırsınızsa, öldürün, amma Ayaza böhtan atmağa məcbur eləməyin. Öldürmədilər, amma huşumu itirənə qədər döydülər. Dözdüm, neçə vaxt ac-susuz ayaq üstə durmağa məcbur elədilər, dözdüm, amma dırnaqlarımın arasına iynə düzmələrinə dözə bilmədim! Ona görə də, özümə nifrət edirəm. Nifrət! Nə vaxta kimi adamlardan həqiqəti gizlədəcəyəm? Yox, mən bu gündən insan kimi yaşamayacağam. Həşərat kimi sürünəcəyəm!

İ ş ı q s ö n ü r

## ON DÖRDÜNCÜ ŞƏKİL

Səlim Babayevin evi. O həyəcanlı halda otağa daxil olur.

S ə l i m. Qız evdədir? Ona puldan-zaddan verərsən getsin. Yaxşı olar ki, çıxıb tanınmaz bir yerə getsin. Bu, hər şeydən əvvəl, onun özü üçün lazımdır.

M ə d i n ə. Demək istəyirsən ki, onu da tuta bilərlər?

S ə l i m (*əsəbi halda*). Bilmirəm... Bilmirəm... Necə deyirəmsə, elə də elə!

M ə d i n ə (*ona uzun və son dərəcə kinli bir nəzər salaraq*). Cəlladlar! Cəlladlar!

S ə l i m (*özünü zorla saxlayaraq, pıçıltı ilə*). Yavaş, qonşumuzdakı gədə Mayisin casusudur.

M ə d i n ə. Qoy eşitsinlər. Sizə olan kinimi, nifrətimi gizləməkdən yorulmuşam. Sizin qurduğunuz üsuli-idarə qadının qəlbindəki nəcib hissləri öldürür, onu insaniyyətsiz, soyuq, özü haqqında düşünən, qapalı xudpəsənd bir məxluqa döndərir. Necə oldu Nigar xanım Şıxlinski, Aliyə xanım Qacar, Xurşud xanım Vəzirova, Həmidə xanım kimi xeyriyyə cəmiyyətləri düzəldən, yoxsulların qayğısına qalan, əlacsızlara əl tutan alicənab Azərbaycan qadınları! Onlar general ar-

vadları, qızları idilər. Yəni, indiyə qədər sağ qalsaydılar, tutub güllələyərdiniz, necə ki, bütün ömrünü inqilaba həsr edən bəy qızı Ayna Sultanovaya xalq düşməni adı qoyub güllələtdiniz!

S ə l i m (*pıçıltı ilə*). Rica edirəm, yavaş...

M ə d i n ə. Qulağını aç, eşit. Əgər, Xumarın nişanlısını bu gün azad eləməsən, sənin üçün yaxşı olmayacaq.

S ə l i m (*pıçıltı ilə*). Başa düşürəm, Xumar mənim bacım qızıdır, onun qayğısını mən çəkməliyəm.

M ə d i n ə. Sən qayğı çəkə bilməzsən! Sən cəllad baltasısan! Bax, bir də deyirəm: Xumarın nişanlısını burax! Onun heç bir günahı yoxdur.

S ə l i m. Mən onu buraxa bilmərəm. Əsərində oynamaq istəmədiyi müəllif Bağırova şikayət eləyib. Bağırov da deyib xalq düşmənini ifşa etmək istəməyən o artist özü də xalq düşmənidir. Bununla da, o artistin hökmü verilib.

M ə d i n ə. Şəfi Sadıqovu mən tanıyıram. İstedadsız, alçaq təbiətli demaqoqun biridir. Tribunalarda vicdan-vicdan deyə-deyə bağırır, insanlıqdan dəm vurur, amma özü dünyanın ən xəbis adamıdır.

S ə l i m. O, fəhləlikdən irəli çəkilib. Xalq düşməni kimi tutulan şairləri, yazıçıları ifşa eləyənlərdən biridir.

M ə d i n ə. Sən istedadlı adamlara "müsavatçı", "trotskiçi" adı qoyub tutursan, əgər namuslu kommunistsənsə, bəs, özünün vaxtilə müsavat zabiti olduğunu niyə demirsən? Əgər, müsavatçı olmaq düşmən olmaq deməkdirsə, niyə özünü ifşa etmirsən?

S ə l i m (*bərk qorxur, pıçıltı ilə qışqırır*). Bəsdir, eşidərlər.

M ə d i n ə. Qardaşın inqilab zamanı Almaniyaya qaçıb, indi Hitlerin ordusunda zabitdir, onu niyə demirsən?! Səlim! O oğlanı bu gün buraxdırmasan, mən özüm səni ifşa edəcəyəm! (*Səlim onu tutub özünə sıxır*) Mən səndən iyrənirəm. Sənin əllərindən qan damır.

S ə l i m. Niyə belə danışırsan? Mən ömrümdə sənə güldən ağır söz deməmişəm. Səni dünyanın ən gözəl kurortlarında gəzdirmişəm. Qohumlarım dəfələrlə mənə dedilər ki, Mədinənin uşağı olmur, boşa, ayrısı ilə evlən. Bunun üstündə onlara acıqlandım. İndiyə qədər də bu barədə sənə kiçik bir işarə də olsa, vurmamışam! Çünki səni istəmişəm!

M ə d i n ə. İstəmisən, amma ürəyimdən xəbərin olmayıb. Xəbərin olanda da, əhəmiyyət verməmisən! Talelərinə acıdığım adamlara qarşı sən həmişə soyuqqanlı cəllad olmusan!

Səlim qəfil qadının boğazından yapışıb boğur. Papiros yandırıb çəkir. Sonra irəliləyib onu diqqətlə yoxlayır. Ölmüş olduğuna tamam əmin olandan sonra telefona yaxınlaşıb zəng vurur. İşıq, eyni zamanda, telefon xəttinin o biri ucunda Mayisin üzərinə düşür.

S ə l i m. Mayis!

M a y i s. Bəli, yoldaş komissar!

S ə l i m. Böyük fəlakət üz vermişdir!

M a y i s. Nə olub, yoldaş komissar?

S ə l i m. Mədinə xanım qəfil vəfat eləyib...

M a y i s. Nə danışırsınız...

S ə l i m. Gəldim, gördüm yıxılıb divana. Yaxınlaşıb gördüm çoxdan gedib. Bizim komissarlığın doktorunu tez göndər.

M a y i s. Başa düşürəm... Baş üstə, özüm götürüb gələrəm.

S ə l i m (*Mayisin axırıncı sözlərini təkrar edir*). "Özüm götürüb gələrəm." Özü nə üçün gəlir? Mən ki, bu əclafa demədim özün də gəl.

İ ş ı q s ö n ü r

## ON BEŞİNCİ ŞƏKİL

İş otağı. Mircəfər Bağırovun kabineti. Mayis əlində qovluq gəlir.

M a y i s (*oturmayaraq*). Salam, yoldaş Bağırov.

M i r c ə f ə r B a ğ ı r o v (*ona cavab verməyərək, sərt ifadə ilə*). Nə oldu, Səlim Babayevin məsələsini qurtardın?

M a y i s. Bütün məlumatlar təsdiq olunur, yoldaş Bağırov. Qardaşı Almaniyada gestapoda zabitdir, amma həmişə Rusiyada itkin düşmüş kimi qələmə verib. Özünün də müsavat ordusunda yüksək rütbəli zabit olduğu doğrudur. Dalaşdıqları zaman arvadı Mədinə xanımın hirslənib, bunları dediyini mənim adamım eşidib. Buna görə də, qorxusundan onu öldürüb.

M i r c ə f ə r B a ğ ı r o v. Bəs, nə üçün həkim məlumat verib ki, guya, arvad özü... ürəyindən gedib...

M a y i s. Mən gedib arvadı nəzərdən keçirəndən sonra onun öz əcəli ilə ölmədiyindən şübhələndim. Ona görə də, həkimi dara çəkib, boynuna qoydum, o da etiraf elədi: Mədinə xanımı boğub öldürüblər.

M i r c ə f ə r  B a ğ ı r o v (*qəzəblə qışqırır*). O həkimi boğazından asmaq lazımdır.

M a y i s. Baş üstə.

M i r c ə f ə r  B a ğ ı r o v. Deyirlər, Səlim Babayevin gözəl bir bacısı qızı var...

M a y i s (*gözlərini yerə dikərək*). Bəli, var...

M i r c ə f ə r  B a ğ ı r o v (*eynəyinin altından diqqətlə ona baxaraq*). Gözlərini niyə yerə dikdin? Yoxsa, ona aşiq olmusan? (*Mayis sarsılmış halda susur*) Niyə dinmirsən? Aşiq olmusan o qıza?

M a y i s. Bəli.

M i r c ə f ə r  B a ğ ı r o v (*bərkdən gülərək*). Siz çekistlər aşiq olmağı da bacarırsınız?

M a y i s. İndiyə qədər sizə deməyə cəsarət eləmirdim.

M i r c ə f ə r  B a ğ ı r o v. Nə üçün? Məgər, Bağırovun ürəyi yoxdur?

M a y i s. Sizin böyük ürək sahibi olduğunuza kim şübhə eləyə bilər, yoldaş Bağırov?

M i r c ə f ə r  B a ğ ı r o v. Harada olur o qız?

M a y i s. Yetimdir. Dayısı Səlimgildə olurdu. Səlim Babayev onu evdən qovub.

M i r c ə f ə r  B a ğ ı r o v. İndi olmur?

M a y i s. Yox, Səlim Babayev onu evdən qovub.

M i r c ə f ə r  B a ğ ı r o v. Nə üçün?

M a y i s. Ayaz Turana ərə getmək istədiyi üçün.

M i r c ə f ə r  B a ğ ı r o v. Özünə götürdüyü famildən də məlum olur ki, Ayaz Turan pantürkistdir.

M a y i s. Mənim kəşfiyyatım müəyyən etmişdir ki, Ayaz Turanın ögey anasından olan bir qardaşı da İrandadır!

M i r c ə f ə r  B a ğ ı r o v (*qəzəblə*). Güllələ onu! Onu güllələyib, qızı alarsan!

İ ş ı q  s ö n ü r

## ON ALTINCI ŞƏKİL

Səlimin evi. O, tək-tənha oturub.

S ə l i m. Qorxumdan səhərə qədər yata bilmirəm. Dünən casuslarım mənə xəbər verdilər ki, Mayis srağagün gecə saat birdə Bağırovun yanında olub! Mənim başımın üstündən. Bağırovun Mayislə nə işi ola bilər? Bilirəm ki, mənim casuslarım Mayisi izlədikləri kimi, vəzifəcə məndən kiçik olmasına baxmayaraq, onun da casusları məni izləyirlər. Məndən material toplayırlar. Biz hamımız canavar kimi burun-buruna yatmışıq. Diktatorun gücü də buna nail olmasındadır. Diktator elə bir üsuli-idarə qurmuşdur ki, orada biz insanların daima bir-birini didib-parçalamağının sonu yoxdur. Bu şəraitdə böyük ideya barədə düşünmək heç kəsin ağlına gəlmir. Arvadım məni töhmətləndirir ki, mən də özümdən qaçıb gizlənmək istəyirəm. Üstündə əyləşib, mürəbbəli çay içdiyim bu döşəmənin altındakı cəhənnəm zirzəmisində işgəncə verdiyimiz adamların fəryadını mən gecə yuxuda da eşidirəm... Bununla belə, mən yaşayıram, öldürürəm...

Mayis milis işçiləri ilə içəri girir. Onlar Səlimi aparırlar.

İ ş ı q s ö n ü r

## ON YEDDİNCİ ŞƏKİL

Həbsxana. Səlim Babayev və Mayis.

M a y i s. Səlim, bizim işimizi bildiyin halda, nə üçün bizi də incidirsən, özünü də? Almaniyadakı qardaşının gestapoda zabit olduğunu, onun vasitəsilə özünün də Almaniyanın agenti olduğunu niyə boynuna almırsan?

S ə l i m. Mayis, ölürəm, danışmağa taqətim yoxdur. Bir papiros.

Mayis ona papiros verir və öz alışqanı ilə yandırır.
Səlim Babayev papiros çəkir.

M a y i s. Səlim, Bağırov sənin alman kəşfiyyatına satıldığını Stalinə də deyib. İnkar eləməyin mənası yoxdur.

S ə l i m. Mayis, sən öl, mənim heç bir xarici kəşfiyyatla əlaqəm olmayıb. Sənin əziz canına and içirəm!

M a y i s. Niyə ikiüzlülük edirsən? Mənim canım heç vaxt sənin üçün əziz olmayıb, ola da bilməz. Bilirdim ki, sən öz casusların vasitəsilə haqqımda material toplayırsan. Əgər, mən cəld tərpənib, qabağa düşməsəydim, şübhəsiz, gec-tez, sən məni verəcəkdin güdaza. Səni qınamıram, özün bilirsən ki, bizim işimizin xüsusiyyəti belədir.

S ə l i m. Axı, mən sənin neçə il komissarın olmuşam. Özünə də güldən ağır söz deməmişəm... Vicdanın olsun...

M a y i s (*gülür*). Vicdan... Səlim Babayev vicdandan danışır. (*Gülür*) Arvadın öləndə, sən təcili bizim doktoru çağıranda, mən şübhələndim. Çünki sən də, mən də bilirik ki, bizim doktor elə hadisəyə sən nə cür istəsən, o cür diaqnoz qoyacaq. Ona görə də, özüm onunla gəldim... Hiss elədim ki, sən mənim doktorla gəlişimdən narazı oldun. Belə işlərdə təcrübəli adamlar olduğumuz üçün dərhal hiss elədim ki, Mədinə xanım öz əcəli ilə ölməyib. Üstəlik, sizinlə qapıbir qonşu olan adamım da Mədinə xanımın qışqıra-qışqıra sənə verdiyi ittihamı mənə çatdırdı. Məlum oldu ki, Mədinə xanımı sən özün öldürmüsən! (*Bir kağızı onun qabağına qoyaraq*) Bu da doktorun təzə yazdığı izahat!

S ə l i m. Mədinə xanımı mən öldürmüşəm. Heç bir ər arvadını mənim qədər istəyə bilməzdi... Hamısı birdi, mən öldürməsəydim də, sən onu tutub, Sibirin bir buz cəhənnəmində məhv eləyəcəkdin... Necə ki, biz səninlə Musabəyovun, Sultan Məcid Əfəndiyevin, Ruhullanın... özlərini güllələyib, günahsız arvadlarını Sibirdə məhv olmağa göndərdik. Mədinə xanımı mənim əlimlə bizim üsuli-idarəmiz öldürdü!

M a y i s. Demək, Mədinə xanımı öldürdüyünü etiraf edirsən? Bəs alman casusu olduğunu niyə boynuna almaq istəmirsən? (*Cəlladlara*) Ağıllandırın komissarı!

Cəlladlar Səlim Babayevə əzab verirlər. O, bağırır.

S ə l i m. Mayis, Allahın olsun!

M a y i s. Biz səninlə çoxdan Allahla vidalaşmışıq. İkimiz də cəhənnəmliyik. Boynuna al, komissar. Bilirsən ki, Mayisdən aman gözləmək olmaz! Bizim ürəyimiz çoxdan bərkiyib, daş olub! Yaxşısı budur, hər şeyi boynuna alasan! İyirmi ildən artıqdır ki, bu idarədə işləyirsən... Adi casusluqdan gəlib bu mövqeyə çatmısan. Bilirsən alman casusu olmasan da, gərək boynuna alasan ki, olmusan! Çünki

qardaşın gestapoda zabitdir! Özün də Müsavat partiyasının üzvü, böyük rütbəli zabit olmusan!

S ə l i m. Bağırov da daşnak partiyasının üzvü olub!

M a y i s (*cəlladlara*). İynə! Bütün dırnaqlarına!

S ə l i m. Mayis!

M a y i s (*cəlladlara*). İynə! Bütün dırnaqlarına!

S ə l i m (*Mayisə*). Ver, yazdığınıza qol çəkirəm!

Mayis dərhal yazılı kağızı Səlimin qabağına qoyur,
Səlim oxumadan taqətsiz halda qol çəkir.

M a y i s. Vəssalam... Bununla da komediya qurtardı. Eh, komissar, həmişə fikirləşirəm ki, Peyğəmbər xəbər verib ki, Allah "ərrəh-manirrəhim"dir, yəni, rəhimlidir. Bəs, O, bizim bu qanlı cinayət-lərimizə necə dözür? Əlvida, komissar! Əlvida, dostum!

İ ş ı q  s ö n ü r

## ON SƏKKİZİNCİ ŞƏKİL

Mayisin kabineti.

İ k i n c i  m i l i s. Yoldaş rəis, Xumar Tağıyevanı gətiriblər.

M a y i s. Qoyun gəlsin. Üst-başını nəzərdən keçirin.

İ k i n c i  m i l i s. Aydındır, yoldaş rəis. (*Qapını açaraq Xumara*) Buyurun.

Xumar taqətsiz addımlarla daxil olur. Son dərəcə solğun, üzgün görünür.

M a y i s (*ayağa qalxaraq nəzakətlə*). Buyurun, əyləşin. (*Milisə*) Sən get (*İkinci milis çıxır*) Sizi gətirəndə incitmədilər ki? (*Xumar "yox" mənasında başını bulayır*) Görünür, son hadisələr sizə çox təsir eləyib. Sınıxmısınız. Ancaq, bu, sizin cazibədarlığınızı daha da artırıb. Mən sizin gözəlliyiniz qarşısında baş əyirəm.

X u m a r. Siz məni həbs etməyə gətirtmisiniz?

M a y i s. Siz sürgün olunmalısınız.

X u m a r. Nə üçün?

M a y i s. Çünki xalq düşməninin nişanlısısınız. Dayınız, keçmiş komissar Səlim Babayev də xalq düşməni kimi həbs olundu. Hər şeyi də boynuna aldı.

X u m a r. Mənim atam inqilab veteranı idi. On birinci ordu sıralarında ağ qvardiyaçılara qarşı vuruşmuşdu. Orden də almışdı.

M a y i s (*gülümsəyir*). Xumar, özünüz savadlı qızsınız, bilirsiniz ki, Mərkəzi İcraiyyə Komitəsinin sədri S.M.Əfəndiyev də, Komissarlar Şurasının sədri Musabəyov da, Həmid Sultanov da... Ayna xanım da, son vaxtlar tutulan dövlət xadimlərinin hamısı Azərbaycanda sovet hakimiyyətini quranlardır. Gəlin, mətləbdən uzaqlaşmayaq. Mən sizi sürgün eləyə bilmərəm. Toy zamanı nişanlınız Ayazı tutmağa gələrkən, sizi görəndən bəri bir saat... bir dəqiqə gözümün qabağından getmirsiniz. Siz mənim bütün ixtiyarımı, iradəmi əlimdən almısınız. Mən sizi sürgün eləyə bilmərəm... Özümü öldürərəm, amma sizi sürgün eləmərəm.

X u m a r. Siz bilirsiniz ki, mən nişanlımı sevirəm.

M a y i s. Madam ki, toyunuz baş tutmadı, neyləmək olar? Bu dünyada kim taleyin hökmündən qaçıb qurtara bilib? Mən etiraf edirəm ki, Ayaz sizə layiq oğlan idi... Ancaq nə etməli ki? Siz mənim sevgimi qəbul eləyin... Köləniz ollam... Bu sallaqxanada xidmət eləməyimə baxmayın. Mən də insanam. Mən də sevməyi bacarıram. Sizi görəndə bu dərəcədə vurulmağıma təəccüb elədim. Çünki mən elə bilirdim, bu cəhənnəm cəlladı olmaq mənim qəlbimi, bütün insani duyğularımı qurudub məhv eləyib. Elə bilirdim, daha mən adamların boynunu vurmaq üçün əlinə balta verilən robotdan başqa bir şey deyiləm... Mən sizi sevirəm... Dəli kimi, divanə kimi...

X u m a r. Mən ölənə kimi nişanlımı gözləyəcəyəm.

M a y i s. Xumar! Siz dünya gözəlisiniz, özünüzə heyfiniz gəlsin!

X u m a r. Mənə onsuz həyat yoxdur.

Ağır pauza. Mayis nəsə demək istəyir.
Çətinlik çəkir. Xumar həyəcanla ona baxır.

M a y i s. Siz o qədər gözəl, o qədər zərif, o qədər cazibədarsınız ki, doğrusu, nə deyəcəyimi bilmirəm.

X u m a r (*birdən canlanaraq*). Yox, deyin! Mən daha heç nədən qorxmuram! Siz məni həbs edirsiniz?

M a y i s. Xeyr, dedim ki, mən sizi sürgün etməliyəm.

X u m a r. Haraya?

M a y i s. Sibirə!

X u m a r. Siz mənim nişanlımı neylədiniz?

M a y i s (*tərəddüdlə*). Hələ ki, həbsxanadadır.

X u m a r. Necə yəni hələ ki?

M a y i s. Demək istəyirəm ki, onun işinin nə ilə qurtaracağını deyə bilmərəm.

X u m a r. Nə üçün onunla görüşməyə icazə vermirsiniz?

M a y i s. Bizim bu lənətə gəlmiş işimizin qaydası belədir.

X u m a r. Siz o cür günahsız adamı məhv edərkən, az da olsa, vicdan əzabı çəkmirsiniz?

M a y i s. Onu sizin öz dayınız Səlim Babayev istintaq edirdi. Mən onu dayınızın əmri ilə həbs etdim. Dayınız sizin toy elədiyinizi eşidən kimi, ər-arvad olmağınıza imkan verməmək üçün toy gedə-gedə oğlanın həbs olunmasını əmr elədi.

X u m a r. Siz nəyisə məndən gizlədirsiniz. Ayaz sağdır? (*Mayis susur*) Ayaz sağdır? Cavab verin!

M a y i s. Mən sizin əsassız xəyallarla yaşamağınızı istəmirəm. Ona görə də, sizi aldada bilmərəm. Hələ dayınız Səlim Babayev iş başında ikən onun bilavasitə təkidi ilə Ayaza güllələnmək kəsilmişdir. Hökm də təsdiq edilmişdir!

Ağır pauza. Xumar halsız halda yıxılır. Mayis stəkana su tökərək ona yaxınlaşır.

M a y i s. Özünüzü ələ alın Xumar, için!

X u m a r (*gözlərini açaraq əli ilə stəkanı kənara itələyir. Sakit səslə*). Onu nə vaxt güllələyəcəklər?

M a y i s. Yəqin ki, sabah. Özünüzü ələ alın. İnanın ki, bu işdə mənim təqsirim yoxdur. Siz özünüzü taleyin dözülməz sistemi ilə məhv etməyin. (*Diz çökür*) Mən and içirəm... Bütün həyatımı, səadətimi, bu dünyada ancaq sizə həsr edəcəyəm. And içirəm! İnanın mənə! Olan olub. Özünüzü həlak eləməyin. İstəyirsiniz sizi götürüb başqa ölkəyə qaçım. Nə cür istəyirsinizsə, elə eləyim...

X u m a r (*qəribə bir sakitliklə*). Əgər, sizin dediklərinizdə zərrə qədər həqiqət varsa... Əgər, məni, doğrudan da, istəyirsinizsə, icazə verin onunla vidalaşım... (*Mayis susur*)

İ ş ı q s ö n ü r

## ON DOQQUZUNCU ŞƏKİL

M a y i s (*ikinci milisə*). Ayaz Turanın görüşdən sonra ölüm hökmünü bu gün yerinə yetirin. Güllələyin!

İ k i n c i m i l i s. Baş üstə!

M a y i s. Amma bir kimsə bilməsin! Qohumlarından soruşan olsa, deyərsiniz ki, göndərilib sürgünə!

İ ş ı q s ö n ü r

## İYİRMİNCİ ŞƏKİL

Yer altında həbsxana. Ayaz təkadamlıq kameradadır. Qapı açılır, Xumar daxil olur. O, toy gecəsindəki gəlinlik paltarındadır. Onlar səssiz qucaqlaşırlar.

A y a z. Ölkədə baş verən bu hadisələrin sonu nə ilə qurtaracaq, ilahi? İnsanların mənəvi gözəllikləri məhv edilir. Ədəbiyyat, incəsənət saxtalaşdırılır. Xalqın həqiqi ziyalıları, istedadlı yazıçıları, şairləri, sənətkarları həbsxanalar küncünə atılır, məhv edilir, güllələnir, sıradan çıxarılır. Əvəzində isə, xalqına, millətinə alçaq böhtanlar yazmaqla mənsəb, vəzifə qazanan alçaq millət satqınları, adlarını yazıçı qoyan alçaq cızma-qaraçılar vəzifə qazanır, irəli çəkilir. Bütün bu işlərin sonu nə ilə qurtaracaq, ilahi? Nə ilə? (*Xumara*) Mən, onsuz da, bu dünyadan sənin böyük məhəbbətinlə gedirəm, Xumar! Nə üçün özünə əzab verib bu cəhənnəmə enirdin?

X u m a r. Mənim sevgilim! Mən səninlə vidalaşmağa gəlməmişəm. Mən səninlə getməyə gəlmişəm. Necə ola bilərdi ki, mən sənsiz qalaydım. (*Oğlanı təkrar-təkrar öpür*)

A y a z. Görürsənmi, xoşbəxtliyin ömrü nə qədər qısaymış, Xumar. Səninlə birinci dəfə görüşdüyümüz anlar, elə bil, bir saat bundan qabaqmış...

X u m a r. Yox, Ayaz, bizim səadətimizin ömrü əbədidir. Mən o əbədiyyətə sənin mənə aldığın bu toy paltarında gedirəm.

A y a z. Yox, Xumar! Sən yaşayacaqsan. Sən məni hər gün xatırlayacaqsan. İndi mənim üçün ən böyük təsəlli budur.

X u m a r. Mən sənsiz yaşaya bilməzdim, Ayaz. Qoy cəlladlar, qəddar insanlar bizi məhv olmuş sanmasınlar! Mən inanıram! İna-

nıram ki, bizim ruhlarımız, bizim məhəbbətimiz hansı başqa bir dünyada isə əbədi yaşayacaqdır! Elə bir dünyada ki, orda onlara cəlladların, qəddarların, insan əti yeyən əjdahaların gücü çatmayacaqdır! (*Paltarının harasındansa iki balaca dərman çıxarır. Birini özü udur, o birini Ayaza verir*) Bu da sənin!

A y a z. Necə? Zəhər?

X u m a r. Sus... Cəlladlar bizi pusurlar.

Ayaz ona dərin bir nəzər salaraq, tərəddüd etmədən dərmanı udur.

A y a z (*qızın boynunu qucaqlayaraq*). Mənim sevgilim! Uçaq ərşi-əlaya! Orada bizi bu gözəl dünyanın əbədi ülviyyəti gözləyir. Orada bizi əbədi azadlıq gözləyir!

Bir-birinin ağuşunda bihuş olurlar.

P ə r d ə

*1989*

# HÖKMDAR VƏ QIZI

*1990-cı il yanvar ayının 20-də Bakıda*
*qəfildən güllələbaran edilmiş Azərbaycan*
*şəhidlərinin əbədi xatirəsinə ithaf edirəm.*

***İlyas ƏFƏNDİYEV***

*XVII əsrin xronikası*

İ Ş T İ R A K  E D İ R L Ə R

İ b r a h i m  x a n
T u b u  x a n ı m
A ğ a b ə y i m  a ğ a
S a d a y  b ə y
S ə l t ə n ə t  b ə y i m
Ə b ü l f ə t  a ğ a
M i r m ö h s ü n  a ğ a
C a v a d  x a n
K ə l b ə l i  x a n
M ə h ə m m ə d  x a n
H ü s e y n q u l u  x a n
H a y k a n u ş
S i s y a n o v
L i s a n e v i ç
V a n y a
X i d m ə t ç i l ə r,
R u s  ə s g ə r l ə r i
Y a v ə r l ə r

**BİRİNCİ ŞƏKİL**

Şuşa qalası. İbrahim xanın iqamətgahı. Ağaməhəmməd şahın Şuşanın istilası zamanı Balakənə qaçmış İbrahim xanın Ağa Məhəmməd şah öldürüləndən sonra təkrar sağ-salamat Şuşaya qayıtması münasibətilə sarayda şadyanalıq. Musiqi. Cavanlar rəqs edirlər. Xanın qızları Ağabəyim ağa və Səltənət bəyim də, Cavadxanın oğlu Hüseynqulu xan da, Qaradağ atlılarının gənc sərkərdəsi Saday Şirxan oğlu da onların arasındadır. Axund Mirmöhsün ağa zərif parçadan tikilmiş ağ libasda, ağ əmmamədə səhnənin yuxarısında görünür.

M i r m ö h s ü n  a ğ a. Camaat! Əlahəzrət hökmdarımız İbrahim ağa Balakəndən bütün ailəsilə sağ-salamat qayıdıb təkrar öz taxt-səltənətinə sahib olması münasibətilə xalqa əfvi ümumi əta eləyib zindandakı məhbusların azadlığı barədə sərəncam verir.

S ə s l ə r. Allah xanın ömrünü uzun eləsin!

S ə s l ə r. Allah xanı həmişə öz taxt-səltənətində bərqərar eləsin!

S ə s l ə r. Adil hökmdarımız İbrahim xana eşq olsun!

İbrahim xan ağır addımlarla səhnənin hündürlüyündə görünərək camaata əl edir.

İ b r a h i m  x a n. Camaat, mən sizin sədaqətinizə həmişə əmin olmuşam. Qəhrəman Qarabağ camaatı heç bir zaman satqın olmamışdır. Azərbaycan türkləri heç bir zaman namərd olmamışdır. Onu da sizin nəzərinizə çatdırmaq istəyirəm ki, mənim və ailəmin Balakəndən bura sağ-salamat gəlib çıxmağımız ancaq Qaradağ atlılarının və onun cavan sərkərdəsi Saday Şirxan oğlunun igidliyi sayəsində mümkün olmuşdur. Saday Şirxan oğlu üç dəfə şəxsən özü özünü ölüm təhlükəsinə məruz qoyaraq, bizi xilas etmişdir.

S ə s l ə r. Yaşasın Saday Şirxan oğlu!

S ə s l ə r. Sağ olsun Qaradağ igidləri!

İ b r a h i m  x a n. Ona görə də, mən, ədalət naminə, Saday Şirxan oğluna və onun bütün törəmələrinə bəylik rütbəsi verirəm.

S a d a y  b ə y. Sağ olsun adil hökmdarımız İbrahim xan.

İ ş ı q  s ö n ü r

## İKİNCİ ŞƏKİL

Ağabəyim ağa və Saday bəy.

A ğ a b ə y i m  a ğ a. Saday bəy, biz səni dübarə təbrik edirik. Çox şadam ki, sənə birinci dəfə mən Saday bəy deyirəm.

S a d a y  b ə y. Təşəkkür edirəm, Ağabəyim ağa. Ancaq mən əlahəzrət xanı və ailəsini düşməndən mühafizə edərkən, “bəylik” rütbəsi barədə düşünməmişəm.

A ğ a b ə y i m  a ğ a. Saday bəy, mənim bacım da, hətta, Hüseynqulu xan da bilirlər ki, mən səni öz atlılarınla Balakənə – bizim köməyimizə gəldiyin vaxtdan qabaq tanıyıram. Onda sən bəy deyildin.

S a d a y  b ə y. Rica edirəm mənə bəy deməyin, sadəcə, adımı deyin.

A ğ a b ə y i m  a ğ a. Yox. Deyəcəyəm. Uca, sarp qayalar arasında düşmənlərlə vuruşa-vuruşa bu gözəl Şuşa qalasını tikdirən Xan babam Pənah xanın da əvvəli Qarabağın Sarıcallar obasından çıxmış adi-sadə igid bir oğlan idi. O da xanlıq rütbəsinə gedən çətin yolları öz qılıncı ilə açmışdır. Sən də o adı öz igidliyinlə almısan.

S a d a y  b ə y. Pənah xanın igidlikləri haqqında bizim Qaradağ mahalında da əfsanələr danışırlar.

A ğ a b ə y i m  a ğ a. Saday bəy, böyük bir dəstə Qaradağ atlısı Balakənə – bizim köməyimizə gələndə, mən eyvanda durub tamaşa edirdim. Qabaqda gələn ucaboylu boz atın üstündəki arıq oğlanın dəstənin sərkərdəsi olduğunu biləndə, əvvəl nə üçünsə təəccüb elədim... Sonra birdən-birə mənə elə gəldi ki, bu oğlanı harada isə görmüşəm... Və sevmişəm...

S a d a y  b ə y. Siz şahlara layiqsiniz, Ağabəyim ağa.

A ğ a b ə y i m  a ğ a. Saday bəy, sən mənim nişanlım olmaq istərdin?

S a d a y  b ə y. Ağabəyim ağa, siz dünyanın ən nəcib xanımısınız. Xan atanız, bizim hökmdarımız sizi adi bir tərəkəmə oğluna verməz. Bunu bildiyim üçün mənim böyük məhəbbətim qəlbimin dərinliklərində taleyinə tabe olub.

A ğ a b ə y i m  a ğ a. Danış, Saday bəy. Mənim səadətim olan bu hissin sənin qəlbinə haradan, necə daxil olduğunu danış.

S a d a y  b ə y. Keçən yay siz Topxana meşəsində dincəlirdiniz. Mən bir dəstə atlı ilə Qaradağ xanından hökmdarımız İbrahim xana hədiyyə gətirirdim. Siz də böyük ipək çadırın qapısında uca palıdın kölgəsində dayanıb fikirli-fikirli Kirs dağlarına baxırdınız. Siz o qədər gözəl görünürdünüz ki, mən Peyğəmbərimiz Rəsul Allahın "Əhsənülxaliqin" sözlərini bilaixtiyar təkrar etdim.

A ğ a b ə y i m  a ğ a. Peyğəmbər əleyhissalam sonra Ayişə ilə izdivac etdi. Demək...

S a d a y  b ə y. Dedim ki, siz şahlara layiqsiniz, Ağabəyim ağa.

A ğ a b ə y i m  a ğ a. Sən indi adi bir tərəkəmə oğlu deyilsən. Sən hökmdarın ailəsini və özünü üç dəfə ölümdən qurtarmış igidlər igidi Saday bəysən. Mən yolda sənin düşmən nəfərlərilə necə qılınclaşdığını gördüm. Mənə elə gəlirdi ki, sən bizi xilas etmək üçün Allah tərəfindən göndərilmiş fövqəlbəşər bir məxluqsan.

S a d a y  b ə y. Mən son nəfəsimə qədər sizin keşikçiniz olacam.

A ğ a b ə y i m  a ğ a. Yox. Sən mənim nişanlım olacaqsan. Xan atasının əziz xələfi olan Ağabəyim ağanın iradəsi belədir. (*Uzaqlara baxaraq*) O nə karvandır? Bizim yerlilərə oxşamırlar.

S a d a y  b ə y (*diqqətlə baxaraq*). Tehran karvanına oxşayır.

İ ş ı q  s ö n ü r

**ÜÇÜNCÜ ŞƏKİL**

Səltənət bəyim və Hüseynqulu xan gəlirlər.

H ü s e y n q u l u x a n. Səltənət bəyim, sənin nişanlın sağ-salamat gəlib çıxdığınız üçün, öz gözəl sevgilisini təbrik etməyə əli boş gəlməyib... Yerişinə, duruşuna vurulduğun "qumral ürgəsini" sənə hədiyyə gətirib.

S ə l t ə n ə t b ə y i m (*heyranlıqla*). O... Hüseynqulu xan. Mən inanmaram ki, mənim cavan nişanlım dünyada bütün gözəllərin gözəli olan "qumral ürgədən" ayrıla bilsin.

H ü s e y n q u l u x a n. Mən "qumral ürgədən" ayrılmıram. Mən onu sənə, öz sevgilimə bağışlayıram.

S ə l t ə n ə t b ə y i m. Sağ ol, mənim igidim... Gedək. Qumral ürgənin üstündə qızıl quş kimi uçacam. (*Səltənət bəyimlə Hüseynqulu xan getmək istəyirlər. Tubu xanım daxil olur*)

T u b u x a n ı m. Qızım, mən eşidirəm ki, sən Cavad xanın gənc oğlu Hüseynqulu xanı nişanlı adlandırırsan...

S ə l t ə n ə t b ə y i m. Bəli, ana, adlandırıram. Axı, mən hiss edirəm ki, sənin də, Xan atamın da meyliniz belədir. Səndən nə gizlin, mən də... onu çox sevirəm.

T u b u x a n ı m. Mən bunu bilirəm. Ancaq nəzərə al ki, biz sizi hələ rəsmi nişanlamamışıq. Qabaqda böyük bacın Ağabəyim ağa var... Dədə-baba adətimizə görə...

S ə l t ə n ə t b ə y i m. Başa düşürəm ana: "Əvvəl böyük bacı, sonra kiçik bacı."

T u b u x a n ı m. Hüseynqulu xan ləyaqətli övladdır, mənim də xoşuma gəlir.

S ə l t ə n ə t b ə y i m. Atası Cavad xan kimi igiddir, uzaq şimaldan bizim gözəl vətənimizə göz dikən düşmənlərin gözlərinə güllə sıxmağa hazırdır. O da mənim kimi vətənimizin gözəlliklərinə, igid atlarına heyrandır.

T u b u x a n ı m. Əlbəttə, igid nəslinə çəkər... Cavad xanın qəhrəmanlığına nə söz ola bilər? Ancaq həddindən artıq inadkardır.

S ə l t ə n ə t b ə y i m. Bilirəm, nəyə işarə vurursan, ana. Cavad xan qoşun çəkib vətənimizi işğal etməyə gələn çar generalı Zubovu xan atamın duz-çörəklə qarşılamasına dözə bilməzdi...

T u b u  x a n ı m (*əsəbi*). Xan atan nə etdiyini bilirdi... Cavad xan uzun illərdən bəri ölkəni ağılla idarə eləyən İbrahim xanla hesablaşmalı idi. Xan atanın siyasətini mühakimə etmək yaramaz. Sənin isə, belə düşünməyin heç yaramaz. Eşitdinmi: yaramaz. (*Tubu xanım əsəbi halda çıxır*)

İ ş ı q  s ö n ü r

## DÖRDÜNCÜ ŞƏKİL

İbrahim xanın iqamətgahı.İbrahim xan və
Mirmöhsün ağa səhnəyə daxil olurlar.

M i r m ö h s ü n  a ğ a. Əlahəzrət! Çapar, İran şahənşahı Fətəli şahdan sizə namə gətirib.

İ b r a h i m  x a n. Maraqlıdır. Mirmöhsün ağa, oxu görək nə məsələdir?

M i r m ö h s ü n  a ğ a (*naməni açıb oxumağa başlayır*). Əzəmətli, şöhrətli Qarabağ hakimi İbrahim xan həzrətlərinə şahənşah İran – əzəmətli Fətəli şahdan salam. İbrahim xan, hökmdarımız Ağa Məhəmməd şah Qacarın cənazəsini hörmətlə Tehrana göndərməyinizdən xeyli məmnunam. Şöhrətli Qarabağ xanlığı ilə dostluq və himayədarlıq münasibətini daha da möhkəmləndirmək üçün İbrahim xanın gözəl qızı Ağabəyim ağa ilə izdivac arzusunda olduğumu bildirirəm. Ağabəyim ağanın ağlı, fərasəti mənə məlum olduğundan və o, məhz sizin – İbrahim xanın qızı olduğundan, onu özümə baş hərəm etmək fikrindəyəm. Oğlunuz Əbülfət ağanı da öz sarayıma dəvət edirəm.

Qısa pauza.

İ b r a h i m  x a n. Mirmöhsün ağa necə fikirləşir?

M i r m ö h s ü n  a ğ a. Əlahəzrət! Sizin taxt səltənətinizin İran şahı ilə qohumluğu, əlbəttə ki, Azərbaycan xalqı üçün xeyli xeyirli olar. Bir halda ki, şah özü də Azərbaycan türküdür. Ancaq...

İ b r a h i m  x a n. Ancaq...

M i r m ö h s ü n  a ğ a. Ancaq, əlbəttə ki, əgər, qızınız bu izdivaca razılıq verərsə... Ağabəyim ağa vəzir kimi ağıllı bir qızdır. Onun şah

sarayında olması güman edirəm ki, sizin səltənətinizlə İran şahı arasındakı dostluğun daha da rövnəq tapmasına kömək edər.

İ b r a h i m  x a n. Mən istərdim bu dostluq gözəl Azərbaycan torpağını yüz yerə parçalamış, bir-birinə düşmən kəsilmiş bədbəxt xanlarımızı birləşdirib vahid, müstəqil bir dövlət yaratmaqda mənə kömək eləsin. Lakin İran şahı özünə bitişik ikinci, qüvvətli bir müsəlman dövlətinin yaranmasına razı olarmı?

M i r m ö h s ü n  a ğ a. Əlahəzrət! Fətəli şah özü də türk olduğu üçün başqa millətin padşahı ilə qonşu olmaqdansa, özünə qohum olan, öz millətindən olan bir dövlətlə qonşu olmağı üstün tutar.

İ b r a h i m  x a n (*əsəbi*). Mirmöhsün ağa, İran şahları – Nadir də, Ağa Məhəmməd də, Fətəli şahın özü də türk olduqlarını çoxdan unutmuşlar. Axı, sən bunu bilirsən.

M i r m ö h s ü n  a ğ a. Bəli, əlahəzrət, unutmuşlar. Fəqət bunun təqsiri bizim bəzi məhdud düşüncəli ruhanilərimizdə olmuşdur. Onlar heç bir zaman ərəbin ərəb, farsın fars, türkün türk olduğunu dillərinə, fikirlərinə gətirməmişlər. Milli təfəkkürü, milli səciyyəni, milli ruhu unudaraq, hamını müsəlman adlandırmaqla kifayətlənmişlər. Axı, böyük Allah havayı yerə bəşəriyyəti müxtəlif millətlər şəklində yaratmamışdır.

İ b r a h i m  x a n. Allah rəhmət eləsin Şah İsmayıl Xətaiyə. İran şahlarından yalnız o, türk olduğunu unutmadı.

M i r m ö h s ü n  a ğ a. Əlahəzrət! Elə zənn edirəm ki, Ağabəyim ağanın ağıllı, fərasəti Fətəli şaha türk olduğunu təlqin edər. Siz, Fətəli şah taxta çıxan kimi, Ağa Məhəmməd şahın cənazəsini hörmətlə Tehrana göndərməkdə çox ağıllı hərəkət elədiniz. Fətəli şah ağıllı adamdır. O bilir ki, yalnız Qarabağ deyil, Şirvan, Şəki, Gəncə, İrəvan, Naxçıvan, Xoy, Qaradağ, Təbriz, Ərdəbil, Marağa, əsasən, sizə tabedirlər. Onu da bilməmiş deyil ki, Dağıstan və Avar hakimi Ümmə xanın bacısı ilə izdivacınız hakimiyyətinizi daha da qüvvətləndirmişdir. Əlahəzrət, güman edirəm ki, Fətəli şahla dostluq münasibəti bütün Azərbaycan xanlıqlarını sizin hakimiyyətinizdə qəti birləşməyə kömək edər.

İ b r a h i m  x a n. Mən buna şübhə edirəm, Mirmöhsün ağa. İran şahı Təbrizdən, Xoydan, Marağadan əl çəkməz. Ona görə də, rus padşahı Yekaterinanın əmri ilə general Zubov gəlib Dərbəndi alanda,

mən oğlum Əbülfət ağanı böyük hədiyyələrlə onun yanına göndərib öz ixlasımı ona izhar etdim.

M i r m ö h s ü n a ğ a. Əlahəzrət, Zubov Dərbənd qalasını bir dost kimi yox, bir istilaçı padşah generalı kimi silah gücünə almışdı.

İ b r a h i m x a n. Mən İran şahı ilə də, rus padşahı ilə də dostluq tərəfdarıyam.

İ ş ı q s ö n ü r

## BEŞİNCİ ŞƏKİL

İbrahim xanın iqamətgahı. İbrahim xan və Ağabəyim ağa.

İ b r a h i m x a n. Mənim istəkli, ağıllı qızım, özün bilirsən ki, sənin hər bir arzun mənim üçün əziz olmuşdur. Budur, indi Allahın köməkliyi ilə böyüyüb boya-başa yetmisən. Allahın buyurub, Peyğəmbərin xəbər verdiyi kimi, daha ərə getmək yaşına çatmısan. Fətəli şah elçi göndərib səni özünə baş hərəm etmək istəyir. (*Pauza*) Şah, qardaşın Əbülfət ağanı da öz sarayına dəvət edir.

A ğ a b ə y i m a ğ a. Xan atam! Sən lap körpəliyimdən məni o qədər nazlandırmısan ki, heç bir arzumu, heç bir istəyimi səndən gizlətməmişəm. İndi də gizlətmək istəmirəm.

İ b r a h i m x a n. Əlbəttə, gizlətməməlisən.

A ğ a b ə y i m a ğ a. Mən Fətəli şah həzrətlərinə zövcə olmaq istəmirəm.

İ b r a h i m x a n. Nə üçün? Gərək ki, şəklini görmüsən. Bir kişi kimi xoşuna gəlmir?

A ğ a b ə y i m a ğ a. Məsələ onda deyil, xan ata.

İ b r a h i m x a n. Bəs nədədir? Çəkinmə. Ürəyində hər nə varsa, de.

A ğ a b ə y i m a ğ a (*birdən xanın qarşısında diz çökərək*). Xan ata, sənin mənə olan məhəbbətindən qüvvət alıb, deməyə cəsarət edirəm ki, mənim ürəyim başqa bir şəxsdədir.

İ b r a h i m x a n. Xub. Kimdir o xoşbəxt insan ki, mənim əziz qızımın ürəyi ona belə bənd olub.

A ğ a b ə y i m a ğ a. O, Qaradağ atlılarının sərkərdəsi Saday bəydir, xan ata...

Qısa pauza.

İ b r a h i m x a n. Saday bəy ləyaqətli oğlandır. Üç dəfə məni və mənim ailəmi ölümdən xilas etdiyi üçün ona çox, borcluyam. Lakin qızım, Şirxan oğlu Saday neçə min illik İran taxt-səltənətinin şahı deyil.

A ğ a b ə y i m a ğ a. Xan ata, sənin nə ləl-cəvahiratın, nə səltənətinin əzəməti İran şahınınkından əskik deyil. Azərbaycan igidləri sənin başına and içirlər. Ona görə də, güman etmirəm ki, şöhrətli xan atam məni ancaq Fətəli şah olduğu üçün ona vermək istəyir.

İ b r a h i m x a n. Mənim ağıllı qızım. Sənin fəxrlə yad elədiyin Azərbaycan igidləri bilirsən ki, həmişə mənim də iftixarım olublar. Mən də həmişə Qarabağ, Qaradağ igidlərilə, Təbriz, Naxçıvan, Şəki, Şirvan igidlərilə fəxr etmişəm. Lakin bizim faciəmiz ondadır ki, bu igidlər bütün bir xalq halında birləşməyiblər. Ayrı-ayrı xanlıqlara bölünüblər. Sən onu da bilirsən ki, mənim həmişə ən yüksək amalım bu xanlıqları birləşdirib Azərbaycan türklərinin yenilməz, qüdrətli dövlətini yaratmaq olmuşdur. Mən böyük Şah İsmayılın əkdiyi toxumları göyərtmək istəyirəm...

A ğ a b ə y i m a ğ a. Ax, xan ata, sənin bu böyük amalın həmişə mənim də şirin xülyalarım olub.

İ b r a h i m x a n. Nə eləyəsən ki, bizim xanları bir amal ətrafında birləşdirmək mümkün deyil, hərəsi bir tərəfə çəkir. Hərəsi bir hökmdar olmaq istəyir.

A ğ a b ə y i m a ğ a. Onları birləşməyə məcbur etmək lazımdır.

İ b r a h i m x a n. Doğrudur. Lakin mənə kömək lazımdır. Mən Fətəli şahla ona görə qohum olmaq istəyirəm ki, Azərbaycan xanlıqlarını birləşdirib, vahid, bir dövlət yaratmaqda o mənə kömək eləsin. Əgər, sən onun zövcəsi olarsansa, o, bu köməyi mənə vəd edər.

A ğ a b ə y i m a ğ a. Xan ata, o oğlan adi tərəkəmə içindən çıxmış bir igiddir. Sənin kimi qüdrətli hökmdarın istəkli qızı olan mənim onu istəməyim məni öz gözümdə göylərə qaldırmışdı. Mənə fövqəladə azad bir səadət kimi görünmüşdü. İndi onu atıb şaha ərə getmək...

İ b r a h i m x a n. Vətən borcu, vətən şərəfi o qədər böyük, o qədər müqəddəs bir hissdir ki, ona əmr etmək olmaz. O gərək insanın öz qəlbindən gəlsin. Ona görə də, mən səni məcbur eləyə bilmərəm. Rus padşahının generalı Dərbənd qalasını alıb oturub orda. Bu, yəqin ki, onun Qafqaz yürüşünün sonu deyil, hər şey öz ixtiyarındadır, qızım. (*Çıxır*)

A ğ a b ə y i m  a ğ a. Ey böyük Yaradan! Nə üçün sən məni bu qədər çətin imtahana çəkirsən? Əgər, belə olacaq idisə, nə üçün o igidin məhəbbətini mənim qəlbimə bu qədər hakim edirdin? Vətən məni köməyə çağırır. Mən onun övladıyam. Mən onun çağırışına əməl eləməsəm, cəhənnəmlərə layiq bədnam bir məxluq olaram. İlahi! Bu imtahandan mənim mərd çıxmağıma kömək elə. (*Göz yaşları içində divana yıxılır*)

İ ş ı q  s ö n ü r

## ALTINCI ŞƏKİL

Eyni məkan. Ağabəyim ağa ilə Saday bəy.

A ğ a b ə y i m  a ğ a. Saday bəy, bir Allah bilir ki, mən sənin məhəbbətinlə özümü nə qədər xoşbəxt sanırdım. Necə xoşbəxt xəyallara dalırdım. Sən igidsən, dözəcəksən. Ancaq o qürbətdə səndən, bu gözəl Qarabağdan həmişəlik ayrı düşmək mənim üçün çətin olacaq... Çox çətin olacaq, Saday bəy. Vətənin gələcəyi dardadır. Rus padşahı Yekaterina Qafqazı və eləcə də Azərbaycanı istila etmək, Osmanlı imperiyasının yolunu kəsmək cəhdini artıq gizlətmir. İbrahim xanın, atamın isə, güclü bir arxası, köməyi yoxdur. Yəqin ki, sən mənim nə demək istədiyimi...

S a d a y  b ə y. Başa düşürəm. Siz başqa cür hərəkət eləyə bilməzdiniz.

A ğ a b ə y i m  a ğ a. Qoy böyük Allah hər ikimizin qəlbinə qüvvət versin.

S a d a y  b ə y. Amin! Əgər, yeddi canım olsaydı, yeddisini də vətənimiz uğrunda qurban verərdim, məhəbbətimdən keçməzdim. Lakin böyük Yaradan bizə bir can verib. Siz düz buyurursunuz, vətənsiz o can bizi xoşbəxt eləyə bilməzdi. Əmin ola bilərsiz, Təbriz, Xoy, Qaradağ igidləri hər an sizin qulluğunuzdadır. Siz özünüzü Tehranda yalqız hiss eləməyin. Tərəkəmə oğlu Saday və onun dostları həmişə sizinlədir.

A ğ a b ə y i m  a ğ a. Böyük Allah sizin qılınc çalan qolunuza qüvvət versin.

S a d a y  b ə y. Böyük Yaradan sizi vətənimizin azadlığı ilə xoşbəxt eləsin, Ağabəyim ağa.

İbrahim xanın iqamətgahı.

Böyük toy məclisi. Ağabəyim ağanı Fətəli şaha gəlin köçürürlər. Cavanlar rəqs edirlər. Səltənət bəyim də, Hüseynqulu xan da, başqa cavanlar da buradadırlar. Hamı böyük şənlik içindədir. Yalnız Qaradağ atlılarının sərkərdəsi Saday bəy xeyli aralıda təkcə dayanıb bu şənliyə tamaşa edir. İbrahim xanın arvadı Tubu xanım və gəlinlik paltarında olan gözəl Ağabəyim ağa saray xadimlərinin müşayiətilə saraydan çıxırlar. Əbülfət ağa İbrahim xana yaxınlaşır.

İ b r a h i m x a n. Oğlum Əbülfət, sən neçə minillik tarixi olan İran taxt-səltənətinə Azərbaycan xalqının bir nümayəndəsi kimi gedirsən. Sən atan İbrahim xanın adına layiq hərəkət etməlisən.

Ə b ü l f ə t a ğ a. Bilirəm, xan ata. Amma, xan ata, mən vaxtilə Altay dağlarından tutmuş Karpat dağlarına qədər uzanan ölkələrə hökm etmiş Çingiz xanın, Şərqdən Qərbə qədər bütün dünyanı titrədən Əmir Teymurun nəslindən olduğumu unutmamışam.

İ b r a h i m x a n. Əhsən! Əhsən, oğlum! Amma çalış ki, düşmənlər öz işləri üçün səndən istifadə etməsinlər.

Ə b ü l f ə t a ğ a. Baş üstə, xan ata. Mənimçün hər şey aydındır.

İ b r a h i m x a n. Yaxşı, bəs, biz neyçün dayanmışıq? Axı, sən yola hazırlaşmalısan.

İbrahim xan və Əbülfət ağa gedirlər. Tubu xanımla Ağabəyim ağa səhnəyə daxil olurlar.

T u b u x a n ı m. Qızım, indi səni Tehrana yola salarkən, yeganə təsəllim odur ki, o qərib şəhərdə ağlın, kamalın hər zaman sənə kömək olacaq. Nə etməli, qızım, biz xanzadə qadınların taleyi çox zaman belə olmuşdur. Bizə xoşbəxtlik, sevinc müjdəsi gətirən məhəbbət göyərçini taleyin hansı oxuna isə hədəf olmuşdur. O oğlanı unut. Mən də qadınam, bilirəm ki, bu asan deyil. Ancaq çalış unut. Qoy bu köməksiz vətənimizin səadəti uğrunda göstərdiyin fədakarlıq sənin təsəllin olsun. Səni xoşbəxt eləsin. Bilirsən ki, əgər, sən özün vətənimizin böyük taleyi üçün məhəbbətini fəda eləyib bu izdivaca razılıq verməsəydin, xan atan səni məcbur eləməyəcəkdi. Sənin sevdiyin oğlanın da xətri xan atanın yanında əzizdir... Ancaq nə etməli...

A ğ a b ə y i m a ğ a. O mərd igiddir, ana. Bu nisgilli ayrılığa o da mənim kimi dözəcəkdir. O mənim xan atamdan da rəncidəxatir olmadı. Çünki bizim məhəbbətimizi Allah vətənimizə qurban elədi.

T u b u x a n ı m. Qoy böyük Allah vətənimiz üçün hər cəfaya hazır olan igidlərimizin himayədarı olsun.

İbrahim xan, Mirmöhsün ağa və başqa saray əyanları saraydan çıxırlar. Ağabəyim ağa xan atasının qarşısında diz çöküb əlindən öpür. Xan onu qaldırıb alnından öpür. Sonra Əbülfət ağa yaxınlaşıb atasının qarşısında diz çökür. Xan onu da qaldırıb alnından öpür. Musiqi sədaları altında səhnə dəyişir. Şuşa qalasının Ağdama baxan tərəfində qala divarlarının üstündə tək-tənha dayanmış Saday bəyi görürük. O, arana gedən yola baxaraq, Ağabəyim ağanın çox uzaqdan eşidilən məşhur bayatısına qulaq asır:

Əzizim Qarabağ,
Şəki, Şirvan, Qarabağ,
Tehran cənnət də olsa,
Yaddan çıxmaz Qarabağ.

İ ş ı q s ö n ü r

## YEDDİNCİ ŞƏKİL

İbrahim xanın iqamətgahı. İbrahim xan taxtda əyləşib.
Mirmöhsün ağa da buradadır. Xidmətçi daxil olur.

X i d m ə t ç i. Əlahəzrət, Naxçıvan xanı Kəlbəli xan, İrəvan hakimi Məhəmməd xan hüzurunuza təşrif gətiriblər.

İ b r a h i m x a n. Buyursunlar.

Xidmətçi çıxır. Kəlbəli xanla Məhəmməd xan daxil olub,
İbrahim xana xanlıq təmkini ilə təzim edirlər.

İ b r a h i m x a n. Qarabağa təşrif buyurduğunuzu eşidib, şad oldum, ağalar. Nə əcəb sizdən?

K ə l b ə l i x a n. Biz səninlə məsləhətləşməyə gəlmişik, İbrahim xan. Rus padşahının böyük generalı Sisyanov gəlib Tiflisdə əyləşib.

M ə h ə m m ə d x a n. O Naxçıvan xanlığından da, bizim İrəvan xanlığından da tələb edir ki, padşahına tabe olaq.

Pauza.

İ b r a h i m x a n. Mən bunu iki gün bundan qabaq bilmişəm. Bəs, siz nə fikirdəsiniz?

K ə l b ə l i x a n. Naxçıvan xanlığı heç bir padşaha tabe olmaq istəmir.

İ b r a h i m x a n. Siz necə düşünürsünüz, Məhəmməd xan?

M ə h ə m m ə d  x a n. İrəvan xanlığı da heç bir padşaha tabe olmaq istəmir, İbrahim xan. Bilirsiniz ki, nə siz, nə də biz heç vaxt xaçpərəst tayfasına düşmən münasibət göstərməmişik. Yekaterinanın vaxtında onun böyük generalı Qafqaza gələndə sən hörmətli elçilərlə generala hədiyyələr göndərdin. Öz ixlasını bildirdin. Mən də dünyanın müxtəlif yerlərindən İrəvana gələn, yer-yurd istəyən ermənilərin heç birini rədd etməmişəm. Lakin biz öz istiqlaliyyətimizi itirə bilmərik.

K ə l b ə l i  x a n. İbrahim xan, sən İran şahı Fətəli şahla qohum olmusan. Oğlun Əbülfət ağa da hal-hazırda onun sarayında xanlıq vəzifəsindədir. Deyirlər ki, şah, qızınız Ağabəyim ağanın ağıl-fərasətinə valeh olub, onu baş hərəm təyin eləyib. Deyirlər, şah hər bir dövlət tədbirini də Ağabəyim ağa ilə məsləhətləşir. Əgər, Fətəli şah bizə kömək eyləyəcəyini vəd edərsə, biz də Sisyanovun təklifini rədd edərik.

M ə h ə m m ə d  x a n. Mən də Kəlbəli xanla həmfikirəm. Bizə özü də türk olan İran şahının köməyi lazımdır.

M i r m ö h s ü n a ğ a. Xanlar! Bağışlayın ki, mən sizin işlərinizə müdaxilə edirəm.

K ə l b ə l i  x a n. Buyurun, axund. Sizin sözləriniz bizim üçün qiymətlidir.

M i r m ö h s ü n  a ğ a. Mütəşəkkirəm, cənab Kəlbəli xan. Hörmətli ağalar, İbrahim xan dəfələrlə siz Azərbaycan xanlarına müraciət eləyib, təklif elədi ki, gəlin nə şərtlərlə istəyirsinizsə, bütün xanlıqları birləşdirib vahid Azərbaycan dövləti yaradaq, hətta, İbrahim xan onu da buyurdu ki, istəyirsiniz biz də, Nadir şah Əfşarın vaxtilə Muğanda çağırdığı kimi, məclis çağırıb bu məsələni orada, bütün xalq nümayəndələrinin iştirakı ilə həll eləyək. Heç kəs əlahəzrət İbrahim xanın ağıl səlimilə elədiyi bu təklifə qol qoymadı. Əgər, siz xanlıqlar birləşib vahid bir dövlət təşkil etsəydiniz, indi sizin güclü bir ordunuz olardı. Siz xanlar birləşmək istəmədiniz. Hörmətli ağalar, siz unutdunuz ki, Peyğəmbər əleyhissalam yüzlərcə yerə bölünmüş ərəb qəbilələrini birləşdirməsəydi, islam dünyası o qədər vüsətli qələbələrə nail ola bilməzdi.

M ə h ə m m ə d  x a n. Mirmöhsün ağa, sizin sözləriniz həqiqətdir. Ancaq indi bu barədə düşünmək daha gecdir. Rus generalı bizim rus padşahına tabe olmağımızı tələb edir. Biz isə bunu istəmirik.

K ə l b ə l i  x a n. Biz öz azadlığımızı itirmək istəmirik.

Cavad xan daxil olur.

C a v a d  x a n. Salam, ağalar.

İ b r a h i m  x a n. Əleykəssalam, Cavad xan. Bu gün mənə xəbər çatdı ki, general Sisyanov səndən Gəncə qalasının təslim olmasını tələb edir.

C a v a d  x a n (*acıqlı*). Bəli, tələb edir. Bu, rus padşahının istila siyasətinin davamıdır... Yekaterinanın əmri ilə general Zubov Qafqaza yeriyib, Dərbəndi mühasirə eləyəndə, mən sizə dedim ki, təcili surətdə qoşunlarımızı birləşdirib Dərbəndin köməyinə getməliyik, heç kəsdən səs çıxmadı. Zubov Dərbəndi alandan sonra bizim ağsaqqalımız İbrahim xan ona hörmətli elçilərlə qiymətli hədiyyələr göndərib rus padşahına ixlasını bəyan etdi. Budur, indi də Sisyanov... Ağalar, böyük türk sərkərdəsi Ağa Məhəmməd şah da rus padşahının Azərbaycanı istila etmək siyasətinin qarşısını almaq üçün Qarabağa, Tiflisə hücum etmişdi. İbrahim xanın çar generalı Zubovu o cür ixlası, hədiyyələrlə qarşılamağı, rus padşahına tabe olmağa hazır olduğunu bildirməsi Ağa Məhəmməd şahı əsəbiləşdirmişdi. Qarabağlıların onu öldürməyi böyük tarixi səhv idi. Ancaq, ağalar, biz öz səhvlərimiz barədə mübahisəyə başlasaq, uzun çəkər. Vaxt gözləmir. Mən yenə də sizə müraciət edirəm. Gəlin bir dəqiqə itirmədən, döyüş qüvvələrimizi birləşdirib, Sisyanova cavab verək. Mən sizi inandırıram ki, çarın istilaçı qoşununun dalı gəlib çıxana qədər biz Sisyanovu qovub Azərbaycan sərhədlərindən xeyli uzaqlaşdıra bilərik.

Ağır sükut.

İ b r a h i m  x a n. Cavad xan mənə ağır ittihamlar verir. Ancaq, ağalar, gəlin ədalətlə danışaq, hər cürə silahı, böyük qoşunu olan iki böyük dövlətin arasındayıq. Ona görə, mən çalışırdım ki, biz bütün Azərbaycan xanlıqlarını birləşdirib, vahid, güclü bir dövlətə çevirək.

M i r m ö h s ü n  a ğ a. Əlahəzrət İbrahim xan düz buyurur, ağalar. Min dəfə təəssüf ki, heç bir xan dünya siyasətini nəzərə almadı. Öz məhdud hakimiyyətinə uyaraq, beş ildən, on ildən sonra onu nə gözləyə biləcəyi haqqında düşünmədi.

İ b r a h i m  x a n. Ona görə də, indi biz bu iki dövlətdən birinə iltizam eləməliyik. Çox fikirləşəndən sonra mən bu qərara gəlmişəm ki, biz rus padşahıyla daha tez dil tapıb dost ola bilərik.

C a v a d  x a n. Nəyə görə?

İ b r a h i m  x a n. Ona görə ki, bütün Azərbaycan ölkəsinə sahib olmaq, onu İran dövləti ilə birləşdirmək İran şahlığının çoxdankı arzusudur. Bizim hər ikimiz müsəlman ölkəsiyik. Biz rus padşahından daha asan istiqlaliyyət ala bilərik.

K ə l b ə l i  x a n. İbrahim xan, İran şahının özü də türkdür. İran xalqının əksəriyyəti türkdür, türkcə danışır. Bizim adət-ənənələrimiz, dinimiz birdir. Elə güman edirəm ki, biz İranla, xüsusən Fətəli şahla daha tez dil taparıq.

M ə h ə m m ə d  x a n. Biz demək olar ki, bir torpaqda yaşayırıq. Rus padşahının paytaxtı ilə bizim aramızda üç min verstə qədər məsafə var. Dinimiz ayrı, dilimiz ayrı...

C a v a d  x a n. Ağalar, əgər, siz gələcək istiqlaliyyət haqqında düşünürsünüzsə, bu, xam xəyaldır. Gəlib torpağımızda kök salan, qalalarımızda hakim olan heç bir dövlət təzədən bizə istiqlaliyyət verməz. Ona görə də, nə rus padşahı, nə də İran şahı.

İ b r a h i m  x a n (*ani dərin düşüncədən sonra*). Cənab xanlar, siz uzaq yoldan gəlib yorulmusunuz. Buyurun, bir az istirahət eləyin, sonra söhbətimizi davam etdirərik.

Kəlbəli xan, Məhəmməd xan, Cavad xan və Mirmöhsün ağa gedirlər.

İ b r a h i m  x a n (*tək*). Heç kəs məni başa düşmür. Xalqımızın həqiqi azadlığı çətin tilsimə düşmüşdür. Azərbaycan xalqı qəvidir, igiddir. Lakin onun qılıncı nə qədər iti olsa da, iki divin pusqusunda dayandığı bu tilsimi qan tökməklə sındıra bilməz. Mən igidlərin qılıncını sülh siyasəti ilə əvəz etmək istəyirəm. Bizim nicat yolumuz budur. Ona görə də, gözümün işığı olan ağıllı qızımı İran şahına ərə verdim. Ona görə də, rus generalı Zubova qiymətli hədiyyələr göndərib, rus padşahına öz ixlasımı bəyan etdim. İndi eyni siyasəti general Sisyanovla da aparmaq istəyirəm. Nə üçün məni başa düşmürlər? Nə üçün?.. Nə üçün?..

İ ş ı q  s ö n ü r

## SƏKKİZİNCİ ŞƏKİL

İranda Fətəli şahın iqamətgahı. Ağabəyim ağanın otağı. Ağabəyim ağa həyəcanla səhnəyə daxil olaraq, pəncərənin pərdəsini qaldırıb bayıra baxır.

Yarın gecə vaxtında xoş əhvalını gördüm,
Vurmuşdu könül şişəsinə balını gördüm.
Naz eyləməyin hər cürə minvalını gördüm,
Açdım sinəsin, sinədəki xalını gördüm.
Yasər bu imiş, bəs, niyə aləm Həccə getdi,
Əfsus ki, yarım gecə gəldi, gecə getdi,
Heç bilmədim ömrüm necə gəldi, necə getdi.

A ğ a b ə y i m a ğ a (*pıçıltı ilə*). Odur, Saday bəy... Bu nə deməkdir ilahi, bu gecə mən o oğlanı yuxumda görmüşdüm... İndisə özünü barigahda görürəm... O nə üçün gəlmişdir? Ey böyük Allah, mənim onu yuxuda görməyimi ərimə xəyanət hesab etmə. Sənə əyandır ki, mən həmişə onun haqqında düşünməməyə çalışıram. Ərimlə aramızda heç bir gizli sirr qalmasın deyə, mən vaxtilə o oğlanı sevdiyimi şaha bəyan etdim. Şah alicənab insandır, gülümsəyib dedi ki: “Eybi yoxdur. Qız vaxtı belə hallar olar...” Ey böyük Allah. O oğlan barədə heç bir fikrin, heç bir hissin mənim qəlbimə yol tapmamasına kömək elə.

Saday bəy daxil olur və Ağabəyim ağanın qarşısında diz çökərək təzim edir.

A ğ a b ə y i m a ğ a. Qalx, Saday bəy. Mən bu gecə səni yuxumda görmüşdüm. İndi sarayda sağ-salamat gördüyümə çox şadam. Əyləş. Azərbaycandan, Qarabağdan həyəcanlı xəbərlər alırıq, Saday bəy... Deyir çar generalı Sisyanov gəlib Azərbaycan sərhədinə çatıb...

S a d a y b ə y. Sisyanov sərhədimizi keçib Gəncə qalasının açarını və Cavad xanın rus çarına tabe olmasını tələb edir.

A ğ a b ə y i m a ğ a. Cavad xan nə cavab verir?

S a d a y b ə y. Cavad xan Sisyanovun tələbini qəzəblə rədd edərək, onunla vuruşmaq üçün hökmdarımız İbrahim xandan kömək istədi...

A ğ a b ə y i m a ğ a (*səbrsiz halda*). Nə cavab verdi xan atam?

S a d a y b ə y (*soyuq tərzdə*). İbrahim xan üstüörtülü bildirib ki, rus padşahına tabe olmaq lazımdır...

A ğ a b ə y i m  a ğ a (*əsəbi halda*). Ola bilməz! Daima bütün xanlıqları birləşdirib müstəqil Azərbaycan dövləti yaratmaq və bu işdə İran şahlığına arxalanmaq fikrilə hərəkət edən xan atam necə oldu ki, birdən-birə rus çarına tabe olmaq qərarına gəldi? Ola bilməz! Ola bilməz!

S a d a y  b ə y. Təəssüf ki, həqiqətən belədir. Mənim bura gəlməkdə məqsədim sizin köməyinizlə Fətəli şah həzrətlərindən kömək istəməkdir. Biz Qaradağ atlıları da Cavad xanın köməyinə gedirik. Cavad xan nə qədər ağıllı, igid olsa da, ağır silahlı, top-tüfənglə silahlanmış, sayca çox olan çar qoşununun qabağını kəsə bilməz. Biz Cavad xanla birlikdə son nəfəsimizə qədər vuruşacayıq. Biz Şimaldan gəlib, vətənimizə, torpağımıza hakim olmaq istəyən rus çarına kölə ola bilmərik.

A ğ a b ə y i m  a ğ a. Saday bəy, biz mənim xan atamın iradəsilə canımızdan əziz olan məhəbbətimizi vətənimizin azadlığına, onun arxasız, tək qalmamasına qurban vermişik. Fətəli şah həzrətləri bunu bilir. Mən hər şeyi ona danışmışam. Fətəli şah namərd hökmdar deyil. O, Azərbaycana kömək edəcəkdir. O, bunu mənə vəd etmişdir.

S a d a y  b ə y. Bu kömək böyük İran dövlətinin özünə də çox vacibdir.

A ğ a b ə y i m  a ğ a. Fətəli şah bunu da bilir. Fətəli şah rus çarının şimaldan gəlib İranın qapıbir, dinbir qonşusu olan Azərbaycana hakim olmasına yol verməz.

Əbülfət xan həyəcanlı halda gəlir.

Ə b ü l f ə t  x a n (*Saday bəyi görərək*). O... Saday bəy, səni gördüyümə çox şadam. *(Ağabəyim ağaya*). Bu saat Azərbaycandan mənim yanıma təcili qasid gəlib xəbər verdi ki, çar generalı Sisyanov Gəncə qalasını mühasirəyə alıb, Cavad xandan açarı tələb edir.

A ğ a b ə y i m  a ğ a (*qızğın*). Və bizim hökmdar atamız İbrahim xan Cavad xana kömək etmək istəmir.

S a d a y  b ə y. Bəli, istəmir. O biri xanlar da yəqin ki, əlahəzrət hökmdarımıza baxdılar... (*Ağabəyimə*) Ağabəyim ağa, icazənizlə mən getdim. Atlılarım məni gözləyirlər. Gəldim hər şeyi olduğu kimi sizə çatdırım. Biz bilirik ki, sizin fikriniz şah həzrətləri üçün qiymətlidir. (*Təzim edərək çıxır*)

A ğ a b ə y i m a ğ a. Əbülfət xan, qardaşım, xan atamız çox böyük, tarixi səhv edir. Azərbaycanı rus çarının hakimiyyətinə vermək... bu dəhşətdir, qardaşım, gələcək nəsillər bizi lənətləyəcəklər.

Ə b ü l f ə t a ğ a. Buna görə mən təcili sənin yanına gəlmişəm. Şah həzrətləri ilə tez danışmaq lazımdır. Bir dəqiqə gecikmədən şah Azərbaycana kömək üçün qoşun göndərməlidir.

A ğ a b ə y i m a ğ a. Sən də mənimlə gedək şahın hüzuruna. (*Gedirlər*)

İ ş ı q s ö n ü r

## DOQQUZUNCU ŞƏKİL

İbrahim xanın iqamətgahı. Vanya daxil olur.

İ b r a h i m x a n. Nə xəbərlə gəlmisən, Vanya yüzbaşı?

V a n y a. Gecə-gündüz əlahəzrətin kölgəsində dolanıb, onun böyük səltənətinə xidmət eləmək səadətini Allah Vanya yüzbaşıya çox görməsin. Siz və sizin qəhrəman atanız Pənah xan, Qarabağın Dumu, Tuğ, Hadrut, Xankəndi, Daşaltı kimi səfalı yerlərində biz erməni gəlmələrinin yerləşib, ev-eşik tikib, kəndlər salmağımıza kömək eləmisiniz.

İ b r a h i m x a n (*səbrsiz halda*). Yaxşı, Vanya yüzbaşı, sən bu sözləri mənə çox ərz eləmisən. Sonra?

V a n y a. Əlahəzrət! İnsan gərək yaxşılığı unutmasın. Əlahəzrətə məlumdur ki, mənim gətirdiyim xəbərlər Allahın köməkliyilə həmişə düz çıxıb.

İ b r a h i m x a n. Hələ ki, düz çıxıb.

V a n y a. Mərhəmətli hökmdarımıza məlum olsun ki, Fətəli şahın xeyli böyük qoşun dəstəsi gecələrin bərk qaranlıq keçməsindən istifadə edərək, Naxçıvan və İrəvan xanlıqları sərhədlərinə tərəf hərəkət etməkdədir.

İ b r a h i m x a n. Sonra?

V a n y a. Sonrasını deməyə cəsarət etmirəm, əlahəzrət...

İ b r a h i m x a n (*qalxaraq, qəzəbli halda*). Qorxma, söylə.

V a n y a. Sizin oğlunuz Əbülfət xanın başçılığı ilə beş min nəfərlik şah qoşunu da Qarabağın Tuğ kəndinə tərəf yeriyir.

İ b r a h i m  x a n. Hardan bildin ki, o qoşunun başçısı mənim oğlum Əbülfət xandır?

V a n y a. Əlahəzrət, mənim xəbərçilərim çox bic dığalardır. Özləri də əlahəzrətin övladlarını yaxşı tanıyırlar... Onlar Tuğ, Kirs meşələrilə sürünə-sürünə, ağacdan-ağaca dırmaşa-dırmaşa qoşunun qərargahına xeyli yaxınlaşıb Əbülfət xanı aydın görüb tanıyıblar. Bizim Karapet keşişin oğlu...

İ b r a h i m  x a n (*əsəbi halda*). Nə deyir keşişin oğlu Ərtün?

V a n y a. Deyir mənim ağlımca Əbülfət xanın qoşunu Qarabulağı keçib Şuşa və Gəncə qalalarına tərəf gedəcək.

İ b r a h i m  x a n. Səncə, İran qoşununun Quzey Azərbaycana bu cür yeridilməsindən Fətəli şahın məqsədi nə ola bilər?

V a n y a. Əlahəzrət, siz biz erməni xalqına o qədər böyük iltifat göstərmisiniz ki, gərək sizin sadiq qulunuz Vanya yüzbaşı görüb hiss elədiklərini, ağlının dərk elədiyini olduğu kimi sizə ərz eləsin. Cənabınıza məlumdur ki, Fətəli şah əslən türk olsa da, Ağa Məhəmməd şah zamanında olduğu kimi, onun da bütün dövlət işləri farsca gedir. Özü farsca danışır. Demək, şah özü, bir növ, farslaşmışdır. O da əlahəzrətə məlumdur ki, farsların qədim dövrdən bəri türklərlə araları yoxdur. Onlar türkləri öz mədəniyyətlərindən xeyli aşağı hesab edirlər.

İ b r a h i m  x a n (*qəzəbli halda*). Onlar bunu açıq etiraf eləməyə cəsarət eləməzlər.

V a n y a. Əlbəttə ki, əlahəzrət, açıq etiraf eləməzlər. Ancaq əlaltından işlərini görürlər. Şah da tamamilə fars təsirində olduğu üçün, istəyir ki, həm Güney Azərbaycanı, həm də Quzey Azərbaycanı istila eləyib, tamam İran "şiri xurşidinə" tabe eləsin. Əlahəzrət, İranda farslar türklərdən az olsalar da, hökumətin siyasətinə təsirləri güclüdür. Ərz elədiyim kimi, dilləri İranda hakim dövlət dilidir. Bu isə, çox mühüm məsələdir.

İ b r a h i m  x a n (*öz-özü ilə danışırmış kimi*). Bəs, şahın bütün dövlət işlərində iştirak eləyən ağıllı qızım Ağabəyim, qəhrəman oğlum Əbülfət nə düşünür? Məgər onlar bilmirlərmi mənim yeganə arzum bütün xanlıqları birləşdirib müstəqil Azərbaycan dövləti yaratmaqdır? (*Qəzəblə*) Necə olub ki, Fətəli şah məhz mənim oğlumun komandası ilə Quzey Azərbaycana beş min qoşun göndərir? Doğrudanmı istila məqsədilə?

V a n y a. Yəqin, əlahəzrətə məlumdur ki, Fətəli şah da Nadir şah kimi, Ağa Məhəmməd şah kimi tamam fars təsirində olduqları üçün heç vaxt razı olmazlar ki, Azərbaycan İrandan tamam ayrılıb, müstəqil bir dövlət olsun... Əlahəzrət, qulluğunuza ərz edim ki, mən bu barədə düşünərkən, həm də bizim erməni xalqının taleyini nəzərdə tuturam. Yenə də təkrar edirəm ki, siz bizim yazıq ermənilərin İranda, Qarabağda yerləşib, özlərinə güzəran düzəldib yaşamalarına imkan yaratmısınız... Əgər, Allah eləməmiş, bütün Azərbaycan İran şahının əlinə keçsə, onlar buna razı olmazlar.

İ b r a h i m  x a n (*öz-özünə*). Bu xristian haqlıdır. Fətəli şah Quzey və Güney Azərbaycanın birləşib, onun qulağının dibində müstəqil bir dövlət olmasına dözməz. (*Pauza. Vanyaya*) Sən bu gün təğyiri-libas olub, xəlvətcə Əbülfət xanın qərargahına gedib, ona deyərsən ki, mən təcili onu görmək istəyirəm.

V a n y a (*bərk qorxaraq*). Mənim çox zirək, yol-yolağı bilən xəbərçi dığalarım var. Əlahəzrətin icazəsilə onlardan lap bacarıqlısını bu saat göndərərəm.

İ b r a h i m  x a n. Bu görüşü heç kəs bilməməlidir. Özün getməlisən. Əbülfət xana deyərsən ki, mənimlə məxfi görüşməlidir. Tərpən.

V a n y a (*bərk qorxaraq*). Əlahəzrət, Əbülfət ağanın qərargahına çatana qədər qoşun əhli məni tanıyıb tuta bilər.

İ b r a h i m  x a n. Elə et ki, tanıya bilməsinlər. Farsca da, azərbaycanca da təmiz danışırsan.

V a n y a (*bərk qorxaraq*). Əlahəzrət, ədəbsizlik eləyirəm, o qızılbaş hərbiyəlilər çox amansız olurlar. Məndən şübhələnib, soyundurub görsələr ki, müsəlman deyiləm...

İ b r a h i m  x a n. Elə et ki, şübhələnməsinlər.

V a n y a (*dili topuq vura-vura*). Əlahəzrət...

İ b r a h i m  x a n. Qurtardıq... Gedə bilərsən.

İ ş ı q  s ö n ü r

## ONUNCU ŞƏKİL

İbrahim xanın iqamətgahı. Mirmöhsün ağa ilə Cavad xan səhnəyə daxil olurlar.

İ b r a h i m x a n. Getdikcə çox mürəkkəb vəziyyət yaranır. Biz Ağa Məhəmməd şahın törətdiyi dəhşətlərdən sonra yenə fəlakətlərə düçar ola bilərik. Aldığım məlumata görə, Qızılbaş qoşunu Naxçıvan, İrəvan və Qarabağ sərhədlərinə doğru irəliləməkdədir. (*Gizli əsəbiliklə*) Cavad xan, hal-hazırdakı vəziyyətdən çıxmaq üçün sən nə təklif edərdin?

C a v a d x a n. Əgər, siz və eləcə də Şəki, Şirvan xanları – hər bir xanlıqdan mənə iki min nəfər atlı versəniz, ha eləyib Sisyanova əlavə kömək gəlib çatınca, mən onu ölkədən qovub çıxarardım.

İ b r a h i m x a n. Sərhəddimizə çatan Qızılbaş qoşunu ilə neylərsən?

C a v a d x a n. Bu sonrakı məsələdir. Mən elə zənn edirəm ki, sənin kürəkənin Fətəli şahla biz vətənimizin xeyrinə dil tapa bilərik. Mən qızınız əlahəzrət Ağabəyim ağanın ağlına inanıram. O bizə kömək edər.

M i r m ö h s ü n a ğ a. Mən şimalda yaşayan rus milləti haqqında fəna bir söz deyə bilmərəm. Çünki bütün millətləri bir olan Allah yaradıb. Lakin rus padşahının Qafqaza və eləcə də, Azərbaycana ağır toplarla, yeni əsləhə ilə silahlanmış qoşun yeritməsi ciddi şübhə doğurur. Mən əlahəzrət hökmdarımız İbrahim xanın icazəsi ilə bu şübhəmi bəyan etməyi özümə borc bilirəm. Əgər, rus generallarının bu yürüşü sülh naminədisə, nə üçün Zubov da, Sisyanov da, birinci növbədə, bizim ata-babalarımızın tikdirdikləri qalaların açarlarını tələb eləyib, orada öz qoşunlarını yerləşdirmək istəyirlər? Nə üçün bütün xanların rus generallarına tabe olmağını istəyirlər? Ağır silahlarla, güclü qoşunla gəlib bizim qalalarımızda yerləşəndən sonra, çar generallarının hökmranlıq eləmələrinin bizi nə vəziyyətə salacağını təsəvvür eləyin. Allah-təala hər cürə köləliyin əleyhinədir, əlahəzrət İbrahim xan. Siz xalq qarşısında, gələcək nəsillər qarşısında məsulsunuz. Onu da bilin ki, bizim behişt kimi gözəl vətənimizə, onun məhsuldar torpağına, bitməz-tükənməz sərvətlərinə silahla sahib olan hər hansı hökmdar ondan daha əl çəkməz. Gələcək nəsillər bu ağaların zülmünü, sitəmini gördükcə, onları vətənə buraxan bizlərə lənətlər oxuyar...

İ b r a h i m  x a n. Mən rus padşahlığının himayəsi haqqında danışarkən, Azərbaycanın öz istiqlaliyyətindən əl çəkib, sözsüz ona tabe olmaq fikrindən çox uzağam. Mən, birinci növbədə, rus çarına bildirməliyəm ki, “biz onunla ancaq bərabər hüquqda səmimi dost ola bilərik”.

C a v a d  x a n (*əsəbi*). İbrahim xan, rus generalları Azərbaycanı işğal eləyəndən sonra rus padşahı səninlə dostluq mükaliməsinə girməz.

İ b r a h i m  x a n. Mən günü sabahdan bu barədə təşəbbüsə başlayacağam. Mən o vaxt general Zubovla da bu dostluq barədə danışmışdım. O mənim fikrimi təkzib etmişdi...

C a v a d  x a n. İbrahim xan, axırıncı dəfə təklif edirəm: təcili surətdə hazır atlılarımızı birləşdirib, Sisyanovu qovmaq üçün, lazım gəlsə, sərhədimizdə olan Fətəli şah qoşunları ilə də birləşmək lazımdır.

İ b r a h i m  x a n. Mən general Sisyanovla görüşüb danışmamış heç bir qərara gələ bilmərəm.

C a v a d  x a n (*əsəbi halda qalxaraq*). İbrahim xan, mən görürəm ki, məsələnin nə qədər ciddi olduğu nə sizi, nə də sizin nüfuzunuza hörmət eləyən möhtərəm xanları mənim qədər narahat eləmir. Ona görə də, mən gedirəm və sizi xəbərdar edirəm ki, mən son nəfəsimə qədər rus padşahının qoşunu ilə vuruşacağam. Mən Mirmöhsün ağanın dediyi gələcək nəsillərin əbədi lənətinə məruz qalmaq istəmirəm. Mən türk namısını, Azərbaycan torpağını axırıncı gülləmə qədər müdafiə edəcəyəm. (*Sürətlə çıxır*)

İ ş ı q  s ö n ü r

## ON BİRİNCİ ŞƏKİL

İbrahim xanın iqamətgahı. On səkkizinci əsrin hərbi paltarında olan gənc Hüseynqulu xan iti addımlarla daxil olur.

H ü s e y n q u l u  x a n (*qonşu verandaya*). Səltənət bəyim.

S ə l t ə n ə t  b ə y i m (*yüyürərək, sevincli halda gəlir*). Ah, ilahi! Kaş mənim bütün arzularım belə çin olaydı. Daşaltından qırxpilləkənlə Cıdır düzünə qalxırdıq. Mən kənizlərimə deyirdim: “Qızlar, nə

olardı, gedib görəydik Hüseynqulu xan gəlib...” (*Hüseynqulu xanın geyiminə diqqət yetirərək*) Bu nədir, məgər, müharibəyə gedirsən?

H ü s e y n q u l u x a n (*ötkəm gənclik sevinc və qüruru ilə*). Gedəcəm. General Sisyanov atam Cavad xana ultimatum göndərib ki, qalanı ona təhvil verib, rus padşahına tabe olaq. Biz də müharibə eləyib, ona öz həddini bildirəcəyik.

S ə l t ə n ə t b ə y i m. Allah sizə kömək olsun, mənim cavan xanım. Yəqin ki, xan atam da, ona tabe olan xanlıqlar da sizə kömək eləyəcək?..

H ü s e y n q u l u x a n. Yox. Kömək eləməyəcəklər. Atam onlara müraciət elədi. Amma heç birindən səs çıxmadı. Biz tək vuruşacağıq. Sisyanovun qoşunu Gəncə qalasına gedən yolları tutub. Mən dağlarla, meşələrlə səninlə görüşməyə gəldim. Fikir elədim ki, müharibədi, birdən vurarlar, səni görmərəm.

S ə l t ə n ə t b ə y i m. Oy, Allah eləməsin. Sənə gələn qada mənə gəlsin. Mənim nişanlım. Mənim igid xanım. Mən sənin hicranına bir dəqiqə də dözmərəm. Bir ucu Təbriz, bir ucu Dərbənd, neçə xanlıq atamın bir sözü ilə nə qədər qoşun çıxara bilər... Doğrudanmı, xan atam bu dar gündə Cavad xana kömək etmək istəmir?

H ü s e y n q u l u x a n. İbrahim xan rus padşahına tabe olmaq istəyir. Onun ürəyi rus padşahı ilədir.

S ə l t ə n ə t b ə y i m. Nə üçün? Axı, rus padşahı neçə min verst bizdən uzaqda – buzlar ölkəsindədir. Biz heç rusu nə görmüşük, nə də tanıyırıq. Axı, nə üçün onlar şimaldan gəlib bizə ağalıq eləməlidirlər?

H ü s e y n q u l u x a n. Biz heç kəsə qul olmayacayıq, Səltənət bəyim. Biz son nəfəsimizə qədər vuruşacayıq. Türk xalqı heç bir zaman heç bir yadelli padşaha qul olmayıb.

S ə l t ə n ə t b ə y i m. Bəs, nə üçün mənim hökmdar atam bizim gözəl vətənimizin rus padşahına tabe olmağını istəyir? Yox. Mən buna inanmaram. O, Ağa Məhəmməd şaha tabe olmaq istəmədiyi halda, indi rus padşahına tabe olmaq istəyir? Ola bilməz!

H ü s e y n q u l u x a n. Artıq bu barədə düşünmək gecdir, Səltənət bəyim. Salamat qal. Mən düşmənlə vuruşduqca, sən daima gözümün qabağında olacaqsan.

S ə l t ə n ə t b ə y i m. Yox. Mən sənin yanında olmaq istəyirəm. Mən də səninlə birlikdə düşmənlə vuruşmaq istəyirəm. Sən məni də

özünlə apar. Özün bilirsən ki, nişana atmaqda heç bir igiddən geri qalmıram. Mən də gedirəm.

H ü s e y n q u l u x a n (*gülümsəyir*). Bu, mümkün deyil.

S ə l t ə n ə t b ə y i m. Sənin mənə bağışladığın qumral ürgəni minib kənizlərimlə birbaşa Gəncə qalasına çapacam. Qarabağdan Gəncəyə gedən dağ yollarına mən də bələdəm. Xan atam o yerlərdə ov eləyəndə, mən də onun izdihamında olardım. Mənim kənizlərim də çox igid bəy qızlarıdır. Mütləq gələcəyik.

H ü s e y n q u l u x a n (*gülümsəyir*). Sənin qəhrəman təbiətin məni düşmənlə vuruşa tələsdirir. Hələlik, mənim nişanlım. Xan atalarımız bizi, hələlik, rəsmi nişanlamasalar da...

S ə l t ə n ə t b ə y i m. Biz özümüzü nişanlamışıq. Qoy böyük yaradan bu günahsız nişanı uğurlu eləsin.

H ü s e y n q u l u x a n. Mən bilirəm ki, sən bir sözü dedin, eləyəcəksən. Amma bizim davaya gəlmək istədiyini qoy zarafat hesab eləyək.

S ə l t ə n ə t b ə y i m. Yox... gələcəm.

H ü s e y n q u l u x a n . Sən mənim canım, heylə şey eləmə.

S ə l t ə n ə t b ə y i m. Oy, canına qurban kəsilim. Mənim igid nişanlım!

Hüseynqulu xan Səltənət bəyimə təzim edərək iti addımlarla gedir.

İ ş ı q s ö n ü r

## ON İKİNCİ ŞƏKİL

İbrahim xan öz otağında təkdir, hiss olunur ki, fikri uzaqlardadır. Səltənət bəyim daxil olub, atasının qarşısında diz çökərək, əlindən öpür.

S ə l t ə n ə t b ə y i m. Dedilər məni soruşmusan. Biz Cıdır düzündə oğlanlarla qaçmaqda ötüşürdük.

İ b r a h i m x a n. Oğlanlarla?

S ə l t ə n ə t b ə y i m. Bəli. Oğlanlarla ötüşməyə özün icazə vermisən...

İ b r a h i m x a n. Elədir.

S ə l t ə n ə t b ə y i m. Sabahdan oğlanlarla nişana atmaq yarışı da keçirəcəyik.

İ b r a h i m  x a n (*gülümsəyir*). Ohoo... Yoxsa, siz düşmənlə vuruşmağa hazırlaşırsınız...

S ə l t ə n ə t  b ə y i m. Nə olsun ki, hazırlaşırıq... Deyirlər ki, sən zəhləm gedən çar qoşunlarının Azərbaycana, Qarabağa... hətta, basılmaz Şuşa qalasına daxil olmasına icazə vermisən?

İ b r a h i m  x a n (*ciddi*). Bilirsən, qızım, sənin siyasətlə məşğul olmaq vaxtına hələ çox var. Səni dövlət sirlərini müzakirə üçün çağırmamışam. Deyirlər, sən Cavad xanın oğlu Hüseynqulu xana qədərindən artıq hüsnü-təvəzzöh göstərirsən, elədirmi?

S ə l t ə n ə t  b ə y i m (*ötkəm*). Bəli... elədir.

İ b r a h i m  x a n. Afərin. Sənin mərdanə cavabın həmişə mənə xoş gəlir. Bilirəm, sizin dostluğunuz o oğlanla dərs aldığınız zamandan başlayıb.

S ə l t ə n ə t  b ə y i m. Elədir, bəli...

İ b r a h i m  x a n. İndi istəyirəm biləsən ki, sizin münasibətiniz, sadəcə, bu dostluqdan o yana gedə bilməz.

S ə l t ə n ə t  b ə y i m. Mən bunu necə başa düşüm, ata?

İ b r a h i m  x a n. Yəni, biz Cavad xanla qohum ola bilmərik.

S ə l t ə n ə t  b ə y i m. Nə üçün, ata?

İ b r a h i m  x a n. İcazə ver, "nə üçünlüyünü" mən özüm bilim.

S ə l t ə n ə t  b ə y i m (*həyəcanla*). Ata, Cavad xanın igidliyi, vətənpərvərliyi dillərdə deyilir. Onun general Sisyanova verdiyi cavab hamını, biz Qarabağ camaatını da heyran etmişdir.

İ b r a h i m  x a n (*qəzəblə*). Bəsdir. Sən onun oğlu ilə izdivac etməyəcəksən! Qurtardıq! Gedə bilərsən!

Səltənət bəyim çıxır. İbrahim xan tək qalır.

İ ş ı q  s ö n ü r

## ON ÜÇÜNCÜ ŞƏKİL

General Sisyanovun qərargahı. General böyük çadırda var-gəl edir.
Mayor Lisaneviç daxil olaraq hərbi təzim edir.

L i s a n e v i ç. Bizim kəşfiyyatçılar bir nəfər erməni tutublar. Onun verdiyi məlumata görə, İbrahim xan Cavad xana kömək göstərməkdən imtina eləyib.

S i s y a n o v. Nə səbəbə?

L i s a n e v i ç. Səbəbini bilmir.

S i s y a n o v. Belə çıxır ki, İbrahim xanın rus padşahına tabe olmaq arzusu həqiqətə uyğundur?

L i s a n e v i ç. Belə görünür. İbrahim xan bu arzusunu general Zubova da bəyan etmişdi.

S i s y a n o v. Çağır o ermənini bura.

Lisaneviç çıxır. General papiros yandırır.
Lisaneviç iki əsgərlə Vanyanı gətirir.

S i s y a n o v (*Vanyaya*). Sən Qarabağdan niyə qaçmısan?

V a n y a. Mən əlahəzrət rus padşahına xidmət eləmək istəyirəm.

S i s y a n o v. Nə üçün?

V a n y a. Əlahəzrət, ona görə ki, rus padşahı ilə dinimiz, məzhəbimiz birdir. Türklər isə bizim düşmənimizdir.

S i s y a n o v. Nə üçün? Türklər sizin Qarabağda, İrəvanda yerləşib kəndlər-obalar salmağınıza imkan veriblər. Sizə toxunmurlar.

V a n y a. Əlahəzrət...

S i s y a n o v. De görüm, bizim qərargaha səni kim göndərib?

V a n y a (*qorxmuş halda*). Mənim bura gəlməkdə yeganə məqsədim əlahəzrət rus padşahına qulluq eləməkdir. Axı, əlahəzrətin ordusunda erməni millətindən də vəzifəli şəxslər olub.

S i s y a n o v (*Lisaneviçə*). Qoy bu qoçağa həqiqəti dedirtsinlər.

V a n y a (*bərk qorxaraq dalbadal xaç çevirir*). Astvas du bahi, astvas du bahi. (*Əsgərlər onu döyürlər*) Əlahəzrət, mən gəlmişəm sizin Gəncə qalasını almağınıza bələdçilik eləyəm. Mən Qalaya gedən bütün gizli yolları bilirəm.

S i s y a n o v (*gülümsəyir*). A... yoxsa, sən məlik olmaq istəyirsən?

V a n y a. Mən əlahəzrət generalın bu mərhəmətinə ona edəcəyim xidmətimlə nail olmaq istəyirəm. Qoy gələcək erməni məlikləri bilsinlər ki, bu şərəfli adı onların babasına mərhəmətli rus generalı verib.

S i s y a n o v. Oho... Sən tarixə düşmək istəyirsən...

V a n y a. Əlahəzrət, tarix barədə bizimki heç vaxt gətirməyib. Biz tarixə həmişə məyus halda düşmüşük.

S i s y a n o v. Təqsir özünüzdədir. Ayağınızı yorğanınıza görə uzatmırsınız. Siz Armeniya ideyası üçün ağlasığmaz dərəcədə böyük

coğrafi sahə nəzərdə tutursunuz. Siz Böyük Don Kixotdan ağıl götürsəydiniz, yaxşı olardı. Bizdə məlumat var ki, sən İbrahim xana xidmət edirsən. Nə oldu ki, qaçdın?

V a n y a. Əlahəzrət, məlumatınız doğrudur. Ancaq mən ermənilərin bir lideri kimi çalışıram Fətəli şahla İbrahim xanın arası dəysin, yəni, İbrahim xan Fətəli şaha inanmasın, düşmən olsun ona.

S i s y a n o v. Nə üçün? Bu ermənilərə nə xeyir verə bilər?

V a n y a. Əlahəzrət, ərz elədim ki, türklər bizim ənənəvi düşmənimizdir. Fətəli xan da türkdür. Əgər, o, İbrahim xanın Xəzər dənizi sahilində, Təbrizdən tutmuş Gürcüstana qədər olan böyük bir ərazidə Azərbaycan dövləti yaratmasına kömək eləsə, Qafqaz erməniləri tamam məhv olarlar. Bir tərəfdən Osmanlı türklərinin, o biri tərəfdən də Qafqaz türklərinin hakimiyyəti... Biz istəyirik ki, rus padşahı Fətəli şahla İbrahim xanın arasındakı düşmənçilikdən istifadə eləyib, Qafqazı istila eləsin.

S i s y a n o v. Və siz ermənilərin İranda erməni dövləti yaratmağına kömək göstərsin. Eləmi?

V a n y a. Bəli... Bəli. Əlahəzrət, bəli.

S i s y a n o v (*əsgərlərə*). Aparın bu qonağı yedirdin-içirdin. (*Vanyaya*) Əgər, sənin bələdçiliyin dürüst olmazsa...

V a n y a. Astvas du bahi. O zaman boynum sizin şöhrətli qılıncınız altındadır, əlahəzrət. Ancaq sizə bir məsləhətim var.

S i s y a n o v. Nə məsləhətdir o?

V a n y a. Bu gün müsəlmanların orucluq bayramıdır. Axşam molla minarədən azan verən kimi, bütün müsəlmanlar süfrə başında əyləşib cürbəcür yeməklərlə oruclarını açacaqlar. Sizin üçün bu çox əlverişli hücum məqamı olar.

S i s y a n o v. Molla saat neçədə oxuyacaq?

V a n y a. Axşam saat yeddidə, əlahəzrət.

S i s y a n o v. Yaxşı. (*Əsgərlərlə Vanya çıxırlar. Mayor Lisaneviçə*) Tapşır bu hərifin heç bir hərəkətini gözdən qoymasınlar. Deməli, Qalaya qəti hücum üçün hər şey hazırdır?

M a y o r. Tamamilə, əlahəzrət.

S i s y a n o v. Cavad xan Azərbaycan xanlarının ən barışmazı, imperator hökumətinin ən amansız düşmənidir. Deyirlər, özü də çox igiddir, cəsarətli adamdır. Bu vuruşda biz onu məğlub etsək, başqa xanların gözünün odunu almış olarıq. Bütün yaxın-uzaq Şərqə yol

açmaq üçün Dağıstanı, Azərbaycanı, Gürcüstanı, bir dəqiqə də vaxt itirmədən istila eləyib, rus padşahına tabe etmək lazımdır. Cavad xandan sonra yolumuz birbaşa Bakıyadır. (*Saatına baxır*) Müsəlmanların oruclarını açmalarına az qalır. Qoy döyüş şeypuru çalınsın.

Mayor Lisaneviç sürətlə çıxır. Döyüş şeypuru guruldayır. Səhnə arxasından zabitlərin komanda səsləri eşidilir.

İ ş ı q s ö n ü r

## ON DÖRDÜNCÜ ŞƏKİL

Səhnə od-alov saçan döyüş cəbhəsinə çevrilir. İşıq gah vuruş meydanında qəzəblə atışan cavan Hüseynqulu xanı, gah düşmən cəbhəsində topun arxasında dayanmış Sisyanovu, gah da gizli yolla rus əsgərlərinə bələdçilik eləyən Vanyanı işıqlandırır.

Səltənət bəyim Hüseynqulu xanı axtarır.

S ə l t ə n ə t b ə y i m. Hüseynqulu xan... Hüseynqulu xan...

Hüseynqulu xan səhnə arxasından daxil olur.

H ü s e y n q u l u x a n. Səltənət bəyim. Axı, mən səndən xahiş etmişdim ki, gəlməyəsən.

S ə l t ə n ə t b ə y i m. Mən gəlməyə bilməzdim. Biz bir bölük Qarabağ cavanları sizin köməyinizə gəlmişik. (*Səhnənin arxasına işarə ilə*) Odur, yoldaşlarımız da qalaya doğru çapırlar. Ah, dəhşətdir. Hüseynqulu xan, fikirləşirəm ki, əgər, şimal generalları vətənimizi işğal eləsələr, biz buna necə dözəcəyik?

H ü s e y n q u l u x a n. Onu atan əlahəzrət İbrahim xandan soruşmaq lazımdır. Atam Cavad xan İbrahim xandan kəskin rədd cavabı alandan sonra özü xalqa müraciət etdi. Bütün gənclər atamın çağırışı ilə gəlib son damla qanlarına qədər düşmənlə vuruşacaqlarına and içdilər. Rus padşahının generalı arvad-uşaqlarımızı əsgərlərinə qırdırır. Minarədən azan çağıran mollamızı top atəşinə tutdurur. Qardaşlar, əgər, qonşu xanlar bizə kömək üçün arxadan qoşun göndərsəydilər, biz bu cəlladların öhdəsindən gələ bilərdik. Sən burda qal.

Qardaşlar, mən Hüseynqulu xan atam Cavad xanla, sizinlə birlikdə son damla qanımıza qədər vuruşacayıq.

S ə l t ə n ə t  b ə y i m. Hüseynqulu xan. Mənim cavan nişanlım. Mən də səninlə son nəfəsimə qədər vuruşacağam.

Atəş yenə dəhşətlə guruldayır. Hüseynqulu xana güllə dəyir. Səltənət bəyim ona tərəf atılır. Ona da güllə dəyir. Bir an başını qaldırıb nə isə demək istəyir və yenidən ona güllə dəyir. Tüstü içində hər şey görünməz olur.

İ ş ı q  s ö n ü r

## ON BEŞİNCİ ŞƏKİL

İbrahim xanın iqamətgahı. Hiss olunur ki, İbrahim xan həyəcan içindədir. Tubu xanım dərin kədər içində əllərilə üzünü qapamışdır.

İ b r a h i m  x a n (*qəzəblə*). Təqsir Cavad xanın özündə oldu. Mən dəfələrlə ona dedim ki, rus padşahına tabe olmaq lazımdır. Biz onun top-tüfənglə mükəmməl silahlanmış böyük qoşununa cavab verə bilmərik. Mənim qızım Səltənət bəyim də onun səhvinin qurbanı oldu.

T u b u  x a n ı m (*əllərini üzündən götürərək qışqırır*). Yox, mənim qızım bütün o igidlərlə birlikdə sənin qurbanın oldu. Cavad xan əsl türk oğlu idi. O, min verstlərlə uzaqdan qoşun çəkib arvad-uşağınızı qırmağa, namusunuzu hərrac eləməyə, torpağınıza sahib olmağa gələn çar cəlladlarına təslim ola bilməzdi.

İ b r a h i m  x a n. Xanlar mənim şah olacağımdan qorxurdular... Mən dəfələrlə onları inandırmağa çalışırdım ki, mən şah olmaq fikrindən uzağam. Mən Azərbaycanın müstəqil, azad dövlət olmasını istəyirəm.

T u b u  x a n ı m. Allah-təala haqqın tərəfdarı olduğu üçün, Qurani-şərif bizi haqqa, ədalətə çağırdığı üçün, mən də həqiqəti sənə deməyə borcluyam. Cavad xan da, bizim qızımız da, Gəncə qalasındakı şəhidlər də siz xanların arasındakı təfriqəçiliyin qurbanı oldular.

İ b r a h i m  x a n. Mən Cavad xana dedim ki, səbr eləsin, mən əvvəlcə Sisyanovla görüşmək istəyirəm...

İ ş ı q  s ö n ü r

## ON ALTINCI ŞƏKİL

Vanya yüzbaşının evinin yaşıl tənəklər arasında görünən eyvanı. Vanya libasını dəyişib, özünü azərbaycanlı kəndli şəklinə salıb. Güzgü qabağında dayanaraq, üzünə qoyduğu uzun saqqalı düzəldir. Arvadı Haykanuş daxil olur.

V a n y a (*gözünü güzgüdən çəkməyərək*). Ətrafda bir səs-səmir eşidilmir ki?

H a y k a n u ş. Gecənin yarısıdır, hamı yuxudadır...

V a n y a. Adam qaraltısı-zadı görünmür ki?

H a y k a n u ş. Elə qaranlıqdır ki, göz-gözü görməz... Niyə demirsən ki, yenə hansı cəhənnəmə hazırlaşırsan?

V a n y a. Haykanuş, sənə demişəm ki, Vanya yüzbaşı neyləyirsə, erməni xalqının gələcəyi üçün eləyir.

H a y k a n u ş. Gah ruslara işləyirsən, gah türklərə, gah iranlılara. Bir gün də keçəcəksən türklərin çənginə, boğazını üzüb tullayacaqlar, kim bilir, hansı dərəyə. Axı, türklər bizə neyləyir? Oturmuşuq arxayınca ev-eşiyimizdə... Heç kəs bizə gözün üstə qaşın var demir. İbrahim xan səni yüzbaşı elədi...

V a n y a. Haykanuş, bilirəm, xankəndli Hacı Mehdinin oğlu Xasaya aşiq olduğun üçün həmişə türklərin tərəfini saxlayırsan... Karapet keşiş olmasaydı, gedəcəydin ona ərə... Onlar da səni döndərib eləyəcəydi müsəlman...

H a y k a n u ş (*acıqla*). Lap yaxşı eləyərdim... Karapet keşişi Allah öldürsün.

V a n y a. Mayor Lisaneviçin səndən yaman xoşu gəlir. Deyir, Vanya tvaya jena oçen vkusnaya... Mən də dedim “peşkəşdir sizə”.

H a y k a n u ş. Neynirəm onu, ağrım ürəyinə, donuza oxşayır.

V a n y a (*gülür*). Haykanuş, donuz ətinin kababını məndən çox yeyirsən, amma özünü pisləyirsən?

H a y k a n u ş (*nazlana-nazlana*). General olsaydı, başqa məsələ.

V a n y a. Haykanuş, pillə-pillə də... Əvvəl mayor, sonra general. (*Gülür*)

H a y k a n u ş. Kül başına, yaman da kişisən...

V a n y a. Haykanuş, siyasət lazımdır, ruslar bizim dinbir köməyimizdir.

H a y k a n u ş. Kim olurlarsa-olsunlar... Mənim o donuzsifət mayordan zəhləm gedir.

V a n y a. Görürəm... İndi də Xasayı görəndə özünü itirirsən. Heç vəchlə səni başa sala bilmirəm ki, türklər bizim dədə-baba düşmənimizdir. Onu bil ki, mənim – Banazurlu Vanyanın bu gün erməni xalqı barədə elədiyim işlər üçün iki yüz il bundan sonra gələn balalarımız dua eləyəcəklər. (*Saata baxır*) Yaxşı, Haykanuş, vaxt keçir, mən gedirəm.

H a y k a n u ş (*acıqlı*). Hara?

V a n y a. Tuğa, Əbülfət xanın hüzuruna. Soruşan olsa, deyərsən "gedib Qəcər kəndinə...". Di salamat qal. (*Gedir*)

İ ş ı q s ö n ü r

## ON YEDDİNCİ ŞƏKİL

Əbülfət xanın qərargahı. Əbülfət xan çadırdadır. Yavər daxil olur.

Y a v ə r. Bir kəndli gəlib, deyir xan üçün vacib xəbər gətirmişəm.

Ə b ü l f ə t x a n. Qoy gəlsin.

Yavər çıxır, Vanya daxil olur. Əbülfət xan ona diqqət yetirir.

Ə b ü l f ə t x a n. Vanya yüzbaşı, nəyə gəlmisən?

V a n y a. Böyük hökmdarımız əlahəzrət İbrahim xanın buyuruğu ilə gəlmişəm. Xan həzrətləri sizi təcili görmək istəyir.

Ə b ü l f ə t x a n. Nəyə görə?

V a n y a. Xan həzrətləri, siz bir tikə vaxtınızdan mənim gözümün qabağında böyümüsünüz. Mənim böyük hökmdarımız İbrahim xana olan sədaqətim də cənabınıza məlumdur. Ona görə də, böyük atanızın taxt-tacı xeyrinə nə düşünürəmsə, onu deməliyəm.

Ə b ü l f ə t x a n. De, qulaq asıram.

V a n y a. Mən hiss elədim ki, əlahəzrət İbrahim xanın meyli ruslara sarıdır. Ona görə də, Sisyanovu Azərbaycandan çıxarmağa kömək üçün Fətəli şahın sizin komandanlığınızla Azərbaycana beş min qoşun göndərməsinə əsəbiləşmişdir.

Ə b ü l f ə t x a n (*qızğın*). Yalan deyirsən. Xan atam rus padşahının tərəfdarı ola bilməz.

V a n y a. Xan həzrətləri, atanızın sadiq rəiyyəti olan Vanya yüzbaşı sizə yalan söz deyə bilməz. Rus generalı Zubov gəlib Dərbənd

qalasını alanda, əlahəzrət İbrahim xan sizi gözəl hədiyyələrlə onun hüzuruna göndərib, rus padşahına tabe olmağa hazır olduğunu bildirməmişdi?

Ə b ü l f ə t  x a n (*acıqlı*). Xan atam sonra öz fikrini dəyişib, Fətəli şahla dostluq istəyirdi. Əgər, elə olmasaydı, bacım Ağabəyim ağanı ona ərə verməzdi. Məni şahın sarayına buraxmazdı.

V a n y a. Xan həzrətləri, mən necə yalan danışa bilərəm? Böyük hökmdarımız İbrahim xan biz ermənilərin həmişə himayədarı olmuşdur. Məni yüzbaşı etmişdir. Mən can-dildən Xan həzrətlərinə ərz edirdim ki, Azərbaycanın səadəti İran şahı ilə dostluqdadır. Axı, deyirdim Fətəli şah özü də, İran camaatının əksəriyyəti də türkdür.

Ə b ü l f ə t  x a n. Yaxşı, çıx gözlə, mən fikirləşməliyəm.

V a n y a. Əlbəttə. İndi elə mürəkkəb vaxtdır ki, fikirləşmək lazımdır.

Ə b ü l f ə t  x a n (*səbrsiz halda*). Yaxşı, qurtardıq. (*Vanya çıxır*) İlahi! Sən mənim xan atamın düzgün yol tutmağına kömək elə! Azərbaycan xalqı rus padşahına kölə ola bilməz!

İ ş ı q  s ö n ü r

## ON SƏKKİZİNCİ ŞƏKİL

İbrahim xanın iqamətgahı. Yavər daxil olur.

Y a v ə r. Əlahəzrət, oğlunuz Əbülfət xan hüzurunuza müntəzirdir.

İ b r a h i m  x a n (*sərt*). Qoy buyursun.

Yavər çıxır. Əbülfət xan hərbi geyimdə daxil olub,
diz çökərək təzim edir.

İ b r a h i m  x a n. Nə cəsarətlə sən beş min Qızılbaş qoşunu ilə Qarabağ sərhəddini keçib Tuğ kəndində dayanmısan? Nədir Fətəli şahın məqsədi?

Ə b ü l f ə t  x a n. Fətəli şah general Sisyanovun Quzey Azərbaycanı istila etməsinə imkan verməmək üçün mənim komandam altında olan həmin qoşunu sizə kömək üçün göndərib. Naxçıvan, İrəvan sərhəddinə gedən qoşuna özü komandanlıq edəcək.

İ b r a h i m  x a n (*qəzəblə*). Sizi kim dəvət eləyib?

Ə b ü l f ə t x a n. Ərz elədim ki, biz köməyə gəlmişik. Təəssüf ki, gecikmişik. Biz vaxtında özümüzü yetirsəydik, yəqin ki, qəhrəman Cavad xanın, o igid şəhidlərin, yazıq cavan bacımın başına o faciə gəlməzdi. Biz general Sisyanovdan onların qanını alacayıq. Xan ata, sən məndən soruşursan ki, "sizi kim dəvət eləyib?" Bəs, iki-üç min verst bizdən uzaq, bizə tamam yad rus padşahını Azərbaycana kim dəvət eləyib?

İ b r a h i m x a n. Mən rus padşahına tabe olmağı İran şahənşahına tabe olmaqdan üstün tuturam. Mənim qəbul etdiyim son qərar bundan ibarətdir.

Ə b ü l f ə t x a n. Xan ata, soruşmağa cəsarət edirəm: sən nəyə görə bu qərara gəlmisən?

İ b r a h i m x a n. Ona görə ki, rus padşahı Azərbaycan xanlıqlarını birləşdirib, vahid bir dövlət yaratmaqda mənə kömək edəcəyinə söz verib. Fars təsirində olan İran şahları isə, ona bitişik sahədə vahid, müstəqil türk dövlətinin yaranmasına razı olmazlar.

Ə b ü l f ə t x a n. Xan ata, sən elə bilirsən rus generalları Azərbaycan xanlıqlarını birləşdirib vahid dövlət yaratmaqda sizə kömək eləyəndən sonra, onu sənə təhvil verib gedəcəklər? Yox, əziz xan ata. Getməyəcəklər. Onlar Azərbaycanı müstəmləkə eləyəcəklər. Necə ki, ingilislər böyük Hindistanı elədilər. Onlar Azərbaycanın sərvətlərini, varını daşıyıb aparacaqlar şimala. Siz xanların da onlara bir söz deməyə ixtiyarınız olmayacaq.

İ b r a h i m x a n. Yox, ruslar o dərəcədə namərdlik eləməzlər. Mən rus padşahının səmimiyyətinə inanıram.

Ə b ü l f ə t x a n. Xan ata, neçə illik təcrübəyə malik hökmdarsınız. Bilirsiniz ki, siyasət yalnız səmimiyyətə, əhd-peymana, hətta, müqavilələrə də arxayın ola bilməz.

İ b r a h i m x a n. Biz vahid, müstəqil dövlət olandan sonra, əgər, rus padşahı əhdinə vəfa eləməsə, namərdlik eləsə, biz onunla ölüm-dirim vuruşuna başlarıq. Və Allahınköməkliyi ilə qalib gələrik.

Ə b ü l f ə t x a n. Ata, axı, o vaxtacan onlar da bekar oturmayacaqlar. Bu gözəl ölkəmizin azadlığını, açar-kilidini yadelli qəsbkara tapşırmaq olmaz. Bu, Azərbaycan xalqına xəyanət olar.

İ b r a h i m x a n (*birdən qəzəblənərək*). Mən sənə əmr edirəm: qoşunu Azərbaycan sərhəddindən çək geri!

Ə b ü l f ə t  x a n. Mən bunu eləyə bilmərəm. Mən öz xalqıma köməyə gəlmişəm. Mən qəsbkar Sisyanovdan Cavad xanın, cavan Hüseynqulu xanın, bacım Səltənət bəyimin, Gəncə qalasında şəhid olan qəhrəmanların intiqamını alacam.

İ b r a h i m  x a n (*daha qəzəblə*). Əmr edirəm, qoşunu çək geri!

Ə b ü l f ə t  x a n. Sənin bu əmrin xalqa xəyanətdir, xan ata. Mən xain ola bilmərəm. Allah divanından qorx, xan ata. Bacım Səltənət bəyimin günahsız axıdılan qanı hələ qurumayıb.

İ b r a h i m  x a n (*Əbülfətə qışqırır*). Rədd ol! Rədd ol! Qoy mənim igid Qarabağ atlılarım sənin beş min Qızılbaş qoşununa divan tutsun! Qoy sənin boynunu onların qılıncı vursun! İtil gözümdən, rədd ol!..

İ ş ı q  s ö n ü r

## ON DOQQUZUNCU ŞƏKİL

Kürəkçay sahilində general Sisyanovun qərargahı. Böyük çadır.
General Sisyanov, mayor Lisaneviç və Vanya.

S i s y a n o v. Vanya Hamparsimoviç, Cavad xanla vuruşumuzda və onu məğlub etməyimizdə öz bələdçiliyinlə bizə çox kömək elədiyin üçün əlahəzrət rus padşahı adından səni və bütün nəslini “Məlik” titulu ilə təltif edirəm.

V a n y a. General həzrətlərinə ərz olsun ki, mən və mənim yeddi arxa dönənim həmişə böyük imperatorun sadiq nökərləri olacayıq.

S i s y a n o v. İbrahim xanla Fətəli şah arasındakı münasibət barədə verdiyin məlumatlar da dürüst olduğu üçün səni beş qızılla təltif edirəm.

Mayor qızılları verir.

V a n y a (*təzim edərək*). Əlahəzrət, sizin mərhəmətiniz o qədər böyükdür ki, sevincdən ağlamaq istəyirəm. (*Ağlayır*)

S i s y a n o v. O... Məlik Vanya. Sən nə emosional adamsan...

Vanyaya araq töküb verir. Vanya içir.

S i s y a n o v. Necədir rus arağı?

V a n y a. Bizim tut arağından da tünddür.

S i s y a n o v. Onda birini də iç.

Vanya içir və hiss olunur ki, dəmlənir.

V a n y a (*sərxoş gülüşlə*). Hi-hi... Əlahəzrət, “Məlik Vanya” sözünü birinci sizin ağzınızdan eşitmək məni o qədər sevindirir ki, şadlığımdan oxumaq istəyirəm...

S i s y a n o v. Nə olar, oxu. Mən ermənilərin necə oxumaqlarını eşitmək istəyirəm.

Vanya Sayat Novanın azərbaycanca olan qoşmalarından birini oxuyur.

S i s y a n o v. Məlik Vanya, bu ki, türk mahnısıdır?

V a n y a. Xeyr, əlahəzrət, Sayat Nova xalis ermənidir. Ancaq bu evi tikilmiş gözəl mahnılarının çoxunu türk dilində yazıb... (*Oxuyur*) Eh, əlahəzrət, biz erməni xalqının dərdi böyükdür. Öz vətəni, öz əli, öz başı olan başqa millətlərə nəsib olan xoşbəxtlik bizə qismət olmayıb. Dünyanın hər yerinə səpələnmiş biz ermənilər yurdsuz-yuvasız olmuşuq. Heç özüm də bilmirəm niyə belə olmuşuq!

S i s y a n o v. Ona görə ki, siz axmaqlar həmişə boş xülyalarla yaşayırsınız. Bilmirsiniz ki, “Velikaya Armeniya” yaratmaq lazımdır!

V a n y a. Qoymurlar, əlahəzrət, türklər dənizlərdən dənizlərə hər yeri tutublar. Əlahəzrət, onlar bizə düşməndirlər.

S i s y a n o v. Məlik Vanya, sən Qafqazda yaşayan ermənilərin liderlərindənsən. Xalqını başa sal. Qoy onlar İrəvan xanlığında, Karsda, Ərzurumda birləşib Ermənistan dövləti yaratmağa təşəbbüs etsinlər. O zaman əlahəzrət rus imperatoru da sizə kömək edər. İndisə, İbrahim xan mənimlə görüşmək üçün bura gələcək. O səni burda görməməlidir. Xanın bütün hərəkətlərini İran hökumətinə və bizə münasibətini dürüst izləməyi sənin kəşfiyyatına tapşırıram. Diqqətli ol, Məlik Vanya. Unutma ki, bizə verdiyin məlumatlar düz olmasa...

V a n y a. Astvas du bahi... Astvas du bahi... Astvas du bahi.

S i s y a n o v. Sənin bütün əlaqən mayor Lisaneviç ilə olacaq. Yaxşı, qurtardıq. (*Vanya gedir. Lisaneviçə*). İmperatorun çoxdankı fikridir ki, Türkiyə ilə Azərbaycan, ümumiyyətlə, bütün Qafqaz sərhədi ilə Türkiyə sərhədi arasında bir erməni dövləti yaratsın. Bu barədə təbliğatı gücləndirmək lazımdır.

L i s a n e v i ç. Əlahəzrət, bu, hər şeydən əvvəl, bizim bütün Qafqaza, o cümlədən gedib Farsistana bitişən Azərbaycana hakim olmağımızdan asılıdır.

Yavər daxil olur.

Y a v ə r. Əlahəzrət, İbrahim xanın karvanı artıq görünməkdədir.

S i s y a n o v (*Lisaneviçə*). Xanı çox hörmətlə qarşılamaq lazımdır. (*Yavərə*) Deyin mənim rəsmi libasımı, qılıncımı gətirsinlər.

Yavər sürətlə çıxır.

İ ş ı q s ö n ü r

## İYİRMİNCİ ŞƏKİL

Sisyanovun qərargahı. General Sisyanov Şəki hakimi Səlimxan və üç nəfər əyanın müşayiətilə gələn İbrahim xanı təntənə və hörmətlə qarşılayır.

S i s y a n o v. Cənab İbrahim xan, sizin rus dövlətinə olan ixlasınız əlahəzrət imperatoru xeyli məmnun etmişdir. Sizin və Şəki xanının böyük rus padşahına müharibəsiz tabe olmağınızı biz həmişə yüksək qiymətləndirəcəyik.

İ b r a h i m  x a n. Əlahəzrət rus padşahı və onun böyük generalı bizim sədaqətimizə həmişə əmin ola bilərlər.

S i s y a n o v. Əlahəzrət rus padşahı və onun generalları sizin bu sədaqətinizi qoruyacaq və hökmdar İbrahim xanın bütün xanlıqları birləşdirərək, Azərbaycan dövləti yaratmağına kömək edib, həmişə onunla dost olacaq.

İ b r a h i m  x a n. Cənab general, siz də bizim, vahid, müstəqil bir dövlət olandan sonra rus padşahının sədaqətli dostu olacağımıza arxayın ola bilərsiniz. Cənab general, Azərbaycan xalqı igiddir, mərddir. Azərbaycan xalqı heç bir zaman dosta xəyanət etməmişdir.

S i s y a n o v. Cənab xan, sizin qızınız Ağabəyim ağa Fətəli şahın baş hərəmidir. Özü də böyük ağıl-zəka sahibi olduğu üçün deyirlər hər işdə, hətta, daxili-xarici siyasətdə də Fətəli şaha böyük təsiri var. Fətəli şah özü də sizin kimi türkdür. Deyirlər Ağabəyim ağa İngiltərə Kraliçası ilə, hətta, Napoleonun arvadı ilə də məktublaşır...

İ b r a h i m  x a n. Cənab general, nə demək istədiyinizi başa düşürəm. Lakin cənabınıza məlum olsun ki, hələ böyük imperatriça Yekaterina həzrətlərinin vaxtında mən gəlib Dərbənd qalasını alan general Zubova məktub yazaraq, rus padşahına tabe olmağa hazır olduğumu bildirmişəm.

S i s y a n o v. Doğrudur, bu, mənə məlumdur.

İ b r a h i m  x a n. Onda Ağabəyim ağa sarayda qız idi. Fətəli şahın hərəmi olacağı da heç kəsin ağlına gəlmirdi.

S i s y a n o v (*zarafatyana bir tonla*). Bu da mənə məlumdur. Lakin, cənab xan, deyirlər hər zamanın bir hökmü var... Naxçıvan hakimi Kəlbəli xanla İrəvan hakimi Məhəmməd xan rus imperatoruna tabe olmaq haqqında mənimlə bağladıqları əhdnaməni pozaraq, Babaxanoğlunun komandanlığı altında bizə hücum eləyən Fətəli şah qoşununa yardım elədilər.

İ b r a h i m  x a n. Yəqin cənabınıza məlumdur ki, şah onun sarayında xan vəzifəsində olan oğlum Əbülfət xanın komandası altında, Sizə qarşı vuruşda mənə kömək üçün beş min qoşun göndərmişdir. Mən ona qoşunu geri çəkməyi əmr etdim. Əməl etmədikdə müharibə elədim. Mənim qəhrəman Qarabağ atlılarım Qızılbaş qoşununu məğlub eləyib pərən-pərən saldı. Əbülfət xan da qaçıb Arazın o tayına keçdi. Cənab general, mən sizin kəlamınızda bəzi şübhə kölgəsi hiss edirəm. Biz Azərbaycan türkləri namuslu adamlarıq. Mən sizdən gizlətmirəm. Əgər, Şah İsmayıl Xətai ikinci dəfə dünyaya gəlib, İranda şah olsaydı, mən başda olmaqla, biz Azərbaycan türkləri məmnuniyyətlə onun dövlətilə birləşməyə razı olardıq. Çünki Şah İsmayıl Xətai öz xalqının oğlu idi. Öz dilinin, öz milli ənənələrinin sahibi idi. Hakimiyyətə keçən kimi Azərbaycan türklərinin dilini dövlət dili elan etdi. Dövlət müəssisələri xalqın öz dilində fəaliyyət göstərməyə başladı. Təəssüf ki, əslən türk olan o biri şahlarda biz bunu görmədik, onlar fars əfsunundan xilas ola bilmədilər, millətcə türk olan böyük sərkərdə Ağa Məhəmməd şah ölərkən son sözünü də farsca dedi. Əlahəzrət! Biz öz dilimizin, öz torpağımızın sahibi olmaq istəyirik. Təkrar edirəm ki, rus padşahı bu böyük amalımızda bizə kömək edərsə, biz də onun sadiq dostu olarıq.

S i s y a n o v. Cənab xan, mən də təkrar edirəm ki, siz bu barədə əlahəzrət rus imperatorunun hər cürə köməyinə arxayın ola bilərsiniz.

İ b r a h i m  x a n. Cənab general, mən əminəm ki, sizin sözünüz alicənab zadəgan sözüdür.

S i s y a n o v. Əlahəzrət imperator sizə general-leytenant, oğlanlarınız Məhəmmədhəsən xana və Mehdiqulu xana general-mayor, kiçik oğlunuz Xanlar xana polkovnik rütbəsi əta etmişdir.

İbrahim xan susur. Hiss olunur ki, Sisyanovun bu
iltifatı onun izzəti-nəfsinə toxunur.

S i s y a n o v. İcazənizlə sizi ilk dostluğumuzun şərəfinə düzəlmiş ziyafətə dəvət edirəm. Müsəlman adətlərini bildiyimdən, sizin üçün əlavə türk aşpazları gətirtmişəm. Buyurun.

İbrahim xan tutulur. Onlar ziyafətə gedirlər. Sisyanovun qərargahı. Lisaneviç,
Sisyanov, Saday bəy, İbrahim xan.

S i s y a n o v. Cənab xan, gərəkdir ki, diplomatiyada hər şey aydın olsun... Ona görə də, icazə verin mayor Lisaneviç bizim, yəni, rus padşahlığının şərtlərini sizə bəyan etsin.

L i s a n e v i ç (*rus hökumətinin şərtlərini oxuyur*).

1. İbrahim xan bütün dövlətlərlə əlaqəsini qəti kəsib, tamam dünya miqyasında yalnız rus dövlətinə tabe olur.

2. İbrahim xan qonşu hökumətlərlə ancaq rus sərdarının icazəsi ilə münasibət saxlaya bilər. Onların məktublarına ancaq rus sərdarının icazəsi ilə cavab verə bilər.

3. Qarabağda olan rus qoşunu üçün xan ucuz qiymətə buğda aldırmalı və qoşunu mənzil ilə təmin etdirməlidir.

4. Xan ildə rus xəzinəsinə 80.000 əşrəfi xərac verməlidir.

5. Rusiya Qarabağ camaatının və xanın mühafizəsini öz üzərinə götürür. Bu məqsədlə, daimi olaraq, Qalada 500 nəfərdən ibarət rus qoşunu olacaqdır.

Saday bəy irəli yeriyərək İbrahim xana təzim edir.

S a d a y  b ə y. Xan ağa, mayorun sizə təqdim etdiyi bu əhdnamədən belə çıxır ki, Qarabağ, bütün Azərbaycan rus padşahının müstəmləkəsi olmalıdır. Sizin qırx il hökmdarı olduğunuz müstəqil Azərbaycan xalqı bunu qəbul eləyə bilməz. Qoy rus padşahı bilsin ki, Azərbaycan xalqı heç bir zaman heç bir dövlətə qul olmamışdır, heç bir dövlətə müstəmləkə olmamışdır. Biz bura gələrkən, mən və mənim atlılarım elə güman

edirdik ki, bu Sisyanov biz azərbaycanlılarla zəhmətkeş rus xalqı arasında dostluq, əməkdaşlıq əlaqəsi yaratmağa gəlib.

İ b r a h i m  x a n (*qəzəblə*). Sus! Sənə kim icazə verib ki, öz hökmdarının hüzurunda belə qələtlər eləyəsən?

S a d a y  b ə y. Xan ağa, əgər, bu əhdnaməni qəbul eləsən, sən daha hökmdar deyilsən. Sən rus padşahının əmrinə tabe, onun gücsüz bir əyalət məmurusan.

İ b r a h i m  x a n. Çıx bayırda mənim hökmümü gözlə.

S a d a y  b ə y. Yox, xan ağa, mən daha sənin hökmünü gözləməyəcəm. (*İti addımlarla çıxır*)

S i s y a n o v. Mayor Lisaneviç, çıx gör bu qoçaq üsyançı nə etmək fikrindədir? Cənab xan, qoy bu oğlanın bu cür ötkəm danışığı sizi çaş-baş salmasın. Rus çarı bütün Azərbaycan xanlıqlarını birləşdirib, sizin hökmranlığınız altında vahid bir dövlət yaranmasını istəyir. Əmin ola bilərsiniz ki, o zaman Rusiya sizin böyük dostunuz kimi daha qalalarınızda rus qoşun hissələri saxlamağa da lüzum görməyəcək. Siz buna inanın, cənab İbrahim xan.

İ b r a h i m  x a n (*sarsılmış halda*). Mən Rus padşahının alicənablığına inanıram.

İ ş ı q  s ö n ü r

## İYİRMİ BİRİNCİ ŞƏKİL

Sisyanov böyük ipək çadırda tək var-gəl edir. Mayor Lisaneviç daxil olur.

S i s y a n o v. Getdilər?

L i s a n e v i ç. Bəli. Cənab general, mən həmişə bu əqidədə olmuşam ki, bu türk xanlarına heç bir zaman etibar eləmək olmaz.

S i s y a n o v. Doğrudur. Çünki bizim işimiz ədalətin hökmüdür. Əgər, biz bu türk xanlıqlarını öz himayəmizə almasaq, onlar daima birbirlərini didib parçalamaqla böyük sivilizasiyanın inkişafına mane olacaqlar. Ona görə də, tabe olmaq istəməyənə divan tutmaqla o birilərinə də dərs vermək lazımdır. Biz Cavad xana rəhm eləyə bilməzdik.

L i s a n e v i ç. General həzrətləri! Böyük dövlətlər üçün rəhm şərti bir şeydir. Böyük dövlətlər, birinci növbədə, öz qüdrətinin

qayğısına qalmalıdır. Uşaqlıqda mən "heyvanat parkında" şirlərin nə qədər ət yediklərinə baxıb fikirləşirdim ki, burada bu qədər ətlə doymayan bu şirlər bəs meşədə marallar, ceyranlar olmasaydı nə edərdilər? Demək, zəiflər güclülərə tabe olmalıdır.

S i s y a n o v. Yox, mayor. Biz zəifləri parçalayıb udmuruq... Məhz biz – böyük rus dövləti onları daha qəddar yırtıcılardan mühafizə edirik.

L i s a n e v i ç. Məlik Vanya deyir ki, İbrahim xanın Fətəli şahla gizli əlaqəsi var. Bir erməni arvadı gecə xan qərargahına yad bir adamın gizlincə daxil olduğunu görüb. Məlik Vanyaya əmr etdim ki, bu əlaqənin nədən ibarət olduğunu təcili surətdə dürüst öyrənib mənə xəbər versin.

S i s y a n o v. Məlik Vanyadan başqa siz özünüz də son dərəcə sərvaxt olun. Xan tərəfdən xəyanət gördükdə, ona dərhal amansız divan tutmaq lazımdır. Mən Bakının üstünə gedirəm. İmperator bizi tələsdirir. Qafqazın işğalını tezliklə başa çatdırmalıyıq. Böyük Yekaterinanın başladığı işi sürətləndirməliyik. Rusiya gözləyə bilməz. İmperator ordusu ikibaşlı qartalın hakim baxışları zillənən uzaqlara doğru ildırım sürətilə irəliləməlidir.

Gurultulu istila musiqisi.
İ ş ı q s ö n ü r

## İYİRMİ İKİNCİ ŞƏKİL

Böyük ipək çadır. İbrahim xan və Ağabəyim ağa.

İ b r a h i m x a n. Sən nə üçün gələcəyini qabaqcadan xəbər verməmisən, qızım. Biz səni Araz qırağında şahın baş hərəminə layiq təntənə ilə qarşılardıq.

A ğ a b ə y i m a ğ a. Mən Gəncə qalasında həlak olan şəhidlərin məzarını ziyarətə gəlmişəm, xan ata. Onların yası içində mənə təntənə lazım deyil.

Ağır pauza.

İ b r a h i m x a n. Cavad xan özü təqsirkar oldu, qızım, mənim məsləhətimə baxmadı.

A ğ a b ə y i m  a ğ a. Cavad xan sizin məsləhətinizə baxıb, rus padşahına tabe ola bilməzdi.

İ b r a h i m  x a n. Başqa yol yox idi.

A ğ a b ə y i m  a ğ a. Yox, xan ata. Yol var idi. Əgər, siz və sizin təsiriniz altında olan xanlar birləşsəydiniz...

İ b r a h i m  x a n (*onun sözünü kəsir*). "Birləşsəydiniz..." (*Qışqırır*) Birləşmək istəmirdilər! Başa düşürsənmi, istəmirdilər!

A ğ a b ə y i m  a ğ a. Xan ata, siz məni öldürə də bilərsiniz. Amma mən həqiqəti deməyə bilmirəm. Əgər, şəxsən siz, birinci olaraq, əvvəl general Zubovu, sonra da cəllad Sisyanovu duz-çörəklə qarşılamağa, igidlərin mindiyi Azərbaycan atlarını onlara hədiyyə verməyə qədər tənəzzül etməsəydiniz, xanları birliyə, qəti mübarizəyə çağırsaydınız, onlar sizi eşidərdilər. Siz İrəvan hakimi Məhəmməd xana, Naxçıvan hakimi Kəlbəli xana məsləhət görmüşdünüz ki, onlar da çara tabe olsunlar. Onlar da Sisyanovla tabe olmaq barədə müqavilə bağladılar. Ancaq tezliklə səhvlərini başa düşüb bu əhdnaməni pozaraq, Sisyanovla vuruşub onu məğlub etdilər.

İ b r a h i m  x a n. Mən bilirəm, hiss edirəm ki, sən Fətəli şahın siyasətilə danışırsan. (*Qəzəblə*) Mən Fətəli şahın Azərbaycan türklərini adam hesab eləməyən, onlara yuxarıdan aşağı baxan siyasətini qəbul eləyə bilmərəm. Əgər, Fətəli şah səni bunun üçün bura göndəribsə, nahaq zəhmət çəkmisən.

A ğ a b ə y i m  a ğ a. Xan ata, ərz elədim ki, mən rus generalının topa tutduğu şəhidlərin məzarını ziyarətə gəlmişəm və bu gün Gəncəyə gedəcəyəm. Ancaq, xan ata, Fətəli şah da, Nadir şah da Qacar kimi Azərbaycanı şimal padşahının istilasından qorumaq istəyir. Onlar özləri də türkdürlər.

İ b r a h i m  x a n. Fars təsiri onlarda türklükdən əsər qoymayıb.

A ğ a b ə y i m  a ğ a. Düz deyil, ata. Şah İsmayıl Xətaini xatırlayın. Nə üçün unudursunuz ki, İran xalqının yarıdan çoxu türkdür. Xan ata, cəsarət edirəm soruşmağa, əgər, cənabınız Fətəli şaha ürək qızdırmırdısa nə üçün... nə üçün mənim məhəbbətimi onunla izdivacıma qurban verdiniz?

İ b r a h i m  x a n. Zənn edirəm ki, izdivac sənin üçün uğursuz olmayıbdır. İran şahının hərəmini indi bütün dünya tanıyır. Onun siyasətə müdaxiləsilə böyük diplomatlar maraqlanır. Kraliçalar onunla dostluq yaratmağı arzu edirlər...

A ğ a b ə y i m  a ğ a (*dərin kədərlə*). Xan ata, hüzurunuzda belə açıq danışmağımı əfv buyurun. Əgər, vətənimizin taleyilə bağlı olduğuna inanmasaydım... Məhəbbətimizi yüz belə şahzadəliyə dəyişməzdim. Ancaq siz məni inandırmışdınız.

İ b r a h i m  x a n (*mülayim*). Nə etməli qızım... siyasət gündə yüz dəfə istiqamətini dəyişən küləyə bənzəyir...

A ğ a b ə y i m  a ğ a. Bəlkə də elədir... Ancaq mən Cavad xan kimi xalq qəhrəmanını, yenilməz Azəri igidlərini, arvadları, körpə uşaqları top atəşinə tutub güllələbaran etdirən cəllad bir generalın görüşünə getməyi, onun şadlıq məclisində iştirak etməyi Azərbaycan xalqına qarşı dəhşətli bir xəyanət hesab edirəm. İlahi, vətənimiz bu həqarətə necə dözdü? Nə üçün ildırımlar çaxıb o şadyanalıq məclisini kül eləmədi? (*Qışqırır*) Gələcək nəsillər siz xanlara lənətlər oxuyacaq! Sizin ruhlarınız ədalət məngənəsində daima əzab çəkəcək! Sizin nəslləriniz Azərbaycan analarının üzlərinə baxa bilməyəcəklər!

İ b r a h i m  x a n (*qəzəblə*). Rədd ol! Rədd ol burdan!

A ğ a b ə y i m  a ğ a. Vurdur mənim boynumu, xan ata! Hər halda, bu, bütün bir xalqı yadelli bir qəsbkarın çəngəlinə keçirmək qədər ağır cinayət deyil!

İ b r a h i m  x a n (*qəzəblə*). Sus!

A ğ a b ə y i m  a ğ a. Yox, xan ata! Susmayacağam! Gələcək nəsillərin bizə lənətlərlə verəcəyi dəhşətli ittihamı eşidirəm. Onlar sizə deyirlər ki, siz, şəxsən siz, İbrahim xan, Azərbaycanda şahlıq səviyyəsində qüdrətli bir hökmdar idiniz. Qarabağ, Gəncə, Şəki, İrəvan, Lənkəran, Naxçıvan, Qaradağ, Təbriz, Xoy, Ərdəbil, Marağa sizin hökmünüzə tabe olan varlı xanlıqlar idi. Siz qırxillik hakimiyyətiniz müddətində mükəmməl silahlanmış güclü bir ordu yarada bilərdiniz. Buna nümunə Türkiyə, İran kimi mükəmməl orduya malik dövlətlər var idi. Nəhayət, siz, heç olmazsa, rus padşahı Yekaterinanın Qafqazı istila üçün göndərdiyi ilk generalın Azərbaycana doğru hərəkət etdiyini eşidən kimi bütün Azərbaycan xalqını ayağa qaldıra bilərdiniz. O zaman qəhrəman ləzgi, çeçen, inquş xalqları da sizə qoşulacaq idi. Siz bunu etmədiniz. Siz Azərbaycanı, gözəl Qarabağı müstəmləkə etməyə gələn rus generallarını duz-çörəklə qarşıladınız. Siz dünyanın müxtəlif yerlərinə səpələnmiş paxıl, qorxaq bir tayfa olan erməniləri töhfə təbərciyi eləyib, Azərbaycanın mənzərəli torpaqlarını onlara bağışladınız. Ermənilər isə, o yerlərdə kənd salıb ruslara casusluq etdilər. Ax, xan ata. Gələcək nəsillər Gəncəni, qəhrəman Cavad xanı top

atəşinə tutan cəllad rus generalının sizə, oğlanlarınıza general rütbələri verməsini, sizin bunu minnətdarlıqla qəbul etmənizi həqarətlə xatırlayacaqlar.

İ b r a h i m  x a n (*birdən ölgün səslə*). Yaxşı, kifayətdir. (*Ağabəyim ağa kəskin hərəkətlə çıxır. Ağır pauza*) Doğrudanmı, mən Azərbaycana xəyanət edirəm? Mənim bu ağıllı qızım nə haqla mənə bu qədər ağır ittiham verir? (*Qışqırır*) Nə haqla? Doğrudanmı, mən xalqıma xəyanət etmişəm?

Xan dəhşət içində qapıya tərəf addımlayır. Birdən gözünə ölmüş qızı Səltənət bəyim görünür.

S ə l t ə n ə t  b ə y i m i n  x ə y a l ı. Mən səndən incimişəm, ata. Axı, mən sənin sevimli qızın idim. Sən həmişə mənə gözəl hədiyyələr bəxş edərdin... Nə üçün mənim cavan nişanlımın atası Cavad xana kömək eləmədin? Cavad xan igidlər içində bir igid idi. Əgər, sən də ona kömək eləsəydin, namərd düşmən ona qalib gələ bilməzdi. Mən də səndən, gözəl Qarabağdan belə uzaq düşməzdim. Burada cavan nişanlım Hüseynqulu xanı hey axtarıram, tapa bilmirəm...

İ b r a h i m  x a n (*qışqırır*). Mən aldanmışam, qızım! Yox, dayan! Getmə!

İ ş ı q  s ö n ü r

## İYİRMİ ÜÇÜNCÜ ŞƏKİL

Vanyanın evi. Vanya güzgü qabağında özünü keşiş qiyafəsinə salır. Haykanuş gəlir.

H a y k a n u ş. Vartan, özünü indi də keşiş donuna salıb bu qaranlıqda hara cəhənnəm olursan?

V a n y a (*gülür*). Hi-hi... qaranlıqda görənlər elə biləcək keşiş Karapetəm... Axı, o, dua oxumaq üçün tez-tez Lisaneviçin qarnizonuna gedir.

H a y k a n u ş. O donuza oxşayan mayor, yenə, nə isə, bir qazan qaynadır...

V a n y a. Ağzını xeyirliyə aç, Haykanuş. Mən bizim yazıq erməni xalqımız üçün çox böyük işlər görürəm, başa düş. Erməni xalqı Vanya yüzbaşını unutmayacaq.

H a y k a n u ş. Bah... bah... gözlə, tarixə düşəcəksən...

V a n y a. Əlbəttə, düşəcəm.

H a y k a n u ş. Sənə məktub var. (*Yeşikdən məktub çıxarıb verir. Vanya açıb baxır*)

V a n y a (*həyəcanla*). Bah. Katalikosdandır. Başa düşürsən, katalikosdan.

H a y k a n u ş. Nə yazır?

V a n y a (*məktubu oxuyur*). "Böyük Allahımız İsus Xristosun sadiq bəndəsi, erməni xalqının namuslu oğlu Vartan Ambarsumoviç, sən xalqımız üçün fədakarlıqlar göstərirsən. Gələcək nəsillər bunu unutmayacaqlar.

Əziz oğlumuz Vartan. Bu saat tarixin elə anıdır ki, gərək sən və yoldaşların hər vasitədən istifadə edib, çalışasınız ki, İbrahim xan hakimiyyəti ilə Fətəli şah hakimiyyəti dost olmasınlar. Həmçinin rusları da Qafqaz türklərinin əleyhinə təhrik etmək lazımdır. Bunun üçün sən təcili general Sisyanovla görüşməlisən. Qafqazdakı ermənilərin sayı hələlik heç otuz minə də çatmır. Biz bununla Qafqazda müftəçi erməni dövləti düzəldə bilmərik. Dünyanın hər tərəfindən erməniləri Qafqaza dəvət etmək lazımdır." (*Vanya məktubun ardını səssiz oxuyur*)

H a y k a n u ş. Bərkdən oxu.

V a n y a. Gerisi sənə lazım deyil. (*Gedir*)

İ ş ı q s ö n ü r

## İYİRMİ DÖRDÜNCÜ ŞƏKİL

Gecədir. Lisaneviç və Vanya gizli yerdə görüşürlər.

V a n y a (*hərarətlə*). Cənab mayor, mən dediklərimə başımla cavabdehəm. İbrahim xanın "Xan bağına" köçməsində məqsədi Arazın o tayına qaçaraq, Fətəli şahın qoşunu ilə birləşib, Azərbaycana daxil olmuş rus qoşun hissələrini qəfil hücumla qırmaqdır. Məndə dürüst məlumat var ki, Fətəli şahın oğlu Abbas Mirzənin başçılığı altında İran qoşunu Gəncəyə doğru hərəkət edir.

L i s a n e v i ç. Xan mənə dedi ki, özünü yaxşı hiss etmədiyi üçün Şuşadan bir az aşağı yenib, bir neçə gün açıq havada istirahət etmək istəyir.

V a n y a. O sizi aldadır. Əgər, elə isə, nə üçün oğlanları Məhəmmədhəsən xanla Mehdiqulu xanı seçmə atlıları ilə qalada gözətçi qoyub, bütün ailəsini, hətta, körpə uşaqlarını da özü ilə götürüb?

L i s a n e v i ç. Əgər, xanın bizə qarşı bu cür cinayətkar niyyəti var idisə, oğlu Əbülfət ağanın komandası ilə Fətəli şah ona beş min nəfərdən ibarət qoşun kömək göndərəndə niyə onlarla birləşib bizə hücum etmirdi?

V a n y a. Cənab mayor, İbrahim xan əvvəl rus padşahına tabe olmaq istəyirdi, bunun üçün, siz buyuran kimi, şahın köməyə göndərdiyi qoşunu qəbul etməyib, hətta, onunla vuruşdu. Amma Fətəli şah bic adamdır. İşi belə görəndə, çox hiyləgər diplomat olan öz baş hərəmi Ağabəyim ağanı atasını yola gətirmək üçün dərhal Qarabağa göndərdi. O da iradəsi o qədər də güclü olmayan İbrahim xanı istədiyi kimi sizin əleyhinizə döndərdi. O hiyləgər gözəlin dərhal Qarabağa gəlməsini eşidəndə arvadım Haykanuşa dedim: "Astvas du bahi. O, yəqin burada bir qazan qaynadacaq..." Cənab mayor, o biz ermənilərin də düşmənidir. Yekaterina həzrətləri bizim Eçmiadzində əyləşən ruhani atamıza söz vermişdi ki, İrəvanda erməni dövləti yaratmaqda bizə kömək edəcək. O böyük imperator vəfat eləyəndən sonra məhz Ağabəyim ağanın siyasəti ilə Fətəli şah İrəvan, Naxçıvan xanlıqlarını gücləndirməyə başladı.

L i s a n e v i ç. Mənə tarix açma, Məlik Vanya. Qısa de görüm, bu saat biz neyləməliyik? İndiki vəziyyətdə İbrahim xanın qaçıb Fətəli şahın qoşunu ilə birləşməsi bizə kömək gələnə qədər mənim buradakı qarnizonum üçün çox təhlükəli olar...

V a n y a. Bəli. Onlar sizi hər tərəfdən mühasirəyə alıb qırarlar. Ona görə də, bir dəqiqə vaxt itirmədən İbrahim xanı ailəsi ilə birlikdə son nəfərinə qədər qırmaq lazımdır.

L i s a n e v i ç. Sənin sözündən belə çıxır ki, indi biz onları dərhal ortadan götürməsək, xan qaçıb Fətəli şahın qoşunu ilə birləşsə, onlar bizi qıracaqlar?

V a n y a. Son nəfərinizə qədər. Türklər çox amansız millətdir. Gecənin qaranlığında güllə səslərinin eşidilməməsi üçün onları doğramaq lazımdır.

İ ş ı q s ö n ü r

## İYİRMİ BEŞİNCİ ŞƏKİL

Gecədir. İbrahim xanın iqamətgahı. İbrahim xan ibadət paltarındadır. Bu zaman Tubu xanım daxil olur.

T u b u  x a n ı m. Niyə yatmırsan, İbrahim? Gecədən xeyli keçir.

İ b r a h i m  x a n. Bu gecənin dərdi çox böyükdür, Tubu. Elə bil ki, onun bizim çadırları bürüyən qaranlığı mənə dəxli olmayan tamam yad bir dünyadır. Bu, mənim ürəyimi sıxır... sıxır.

T u b u  x a n ı m. Bu, o uğursuz Kürəkçay hadisəsinin sənin mərd qəlbinə çökən ağırlığıdır, İbrahim. O çar generalı o cür həyasızlıqla qüdrətli Azərbaycan hökmdarına müstəmləkə təkliflərini bəyan edəndə, ellər igidi Pənah xanın oğlu İbrahim xanın onun düz ağzının içinə bir güllə sıxmadığına mən təəccüb edirəm.

İ b r a h i m  x a n. Bir an mənim ağlıma gəldi. Ancaq onun top-tüfənglə mükəmməl silahlanmış ordusunun Qarabağ camaatını uşaqdan-böyüyə qılıncdan keçirəcəyini düşünüb susdum...

T u b u  x a n ı m. Kürəkçay hadisəsi bütün Qarabağı ayağa qaldırmışdır. Xalq həyəcan içindədir. Mən hiss edirəm ki, hətta, arvadlar da bu saat düşmənlə vuruşa hazırdır. Mirmöhsün ağa mənə dedi ki, sən o həyasız generalla vuruşa hazırlaşırsan. Onu bil ki, Fətəli şah da sənə bu işdə kömək edər.

İ b r a h i m  x a n (*qızğın*). Mən heç bir hökumətin ikiüzlü köməyini istəmirəm. Mən sayca farslardan çox olan bütün Azərbaycan xalqını son ölüm-dirim vuruşuna çağıracağam. Azərbaycan xalqı Cavad xan hadisəsinin də, şimaldan gələn düşmənin də nə demək olduğunu gördü.

T u b u  x a n ı m. Mən bu son, qəti döyüşdə sənə xeyir-dua verirəm. Mən də sənin ordunun qabağına düşüb onları qəti intiqama çağıracağam. Adi bir düşmən generalı Azərbaycan xalqının böyük hökmdarı İbrahim xanı təhqir etmişdir. İndi isə, xahiş edirəm, yat, dincəl.

İ b r a h i m  x a n. Sən get. Mən bir az tək qalmaq istəyirəm.

Tubu xanım gedir. İbrahim xan diz çöküb Allaha ibadət edir.

İ b r a h i m  x a n. Ah, mən aldanmışam. Mən xalqıma xəyanət etmişəm. Ar olsun sənə, İbrahim, 40 ildən çox Qarabağın – Azərbaycanın ən böyük bir hissəsinin hökmdarına rus generalı özündən də

kiçik rütbə verəndə bildim ki, aldanmışam. Nə üçün mən Kürəkçayda qılıncımı çıxarıb onun boynunu vurmadım, nə üçün? Ah... Aman, Allahım... İndi mənim ruhum gələcək nəsillər qarşısında nə cavab verəcək? İlahi sən böyük olduğun üçün böyük günahları da bağışlayansan. Mən elə edəcəyəm ki, sən məni bağışlayasan...

Atam Pənah xan ölərkən məni yanına çağırıb dedi: "Oğul, vətən, torpaq darda olanda qılınc qında qalmaz..." Hələ mən sağam, hələ ölməmişəm, indi mən bütün Azərbaycan xalqını ayağa qaldıracağam, ölüm-dirim mübarizəsinə... Ey böyük Yaradan, intiqamımı qəbul et...

İ ş ı q s ö n ü r

## İYİRMİ ALTINCI ŞƏKİL

Gecə. İbrahim xan ailə üzvlərilə birlikdə böyük ipək çadırdadır.
Xidmətçi həyəcanla daxil olur.

X i d m ə t ç i. Xan həzrətləri, əsgərlər çadırı əhatə eləyirlər.

Çadırda həyəcan... Qarmaqarışıqlıq, İbrahim xan irəli yeriyir.
Lisaneviçin komandası eşidilir.

L i s a n e v i ç. Doğra!

Əsgərlər siyirməqılınc çadıra dolub birinci xanı vururlar, sonra ailə üzvlərini doğrayırlar. İşıq Tubu xanımın üstünə düşür.

T u b u x a n ı m (*Lisaneviçə*). İnsafın olsun, heç olmasa, bu uşağa rəhm elə.

L i s a n e v i ç (*qışqırır*). Doğra! İkisini də! *(Əsgərlər Tubu xanımı da, uşağı da vururlar*)

İşıq İbrahim xanın üzərinə düşür.

İ b r a h i m x a n (*güclə dikəlib qışqırır*). Ey mənim qəhrəman millətim! Eşit! Mən yadelli düşmənə inanıb, sənə xəyanət etdiyim üçün...

L i s a n e v i ç (*qışqırıb onun sözünü kəsir*). Doğra!

Əsgər xanı qılıncla təkrar vurur. Bayırda at ayağının tappıltıları,
güllə səsləri eşidilir. Səhnə tüstü içində görünməz olur və dəyişir.

İbrahim xanın çadırı.Ağabəyim ağa gözlərini yarı qapayaraq sükut içində dayanmışdır.

B a y ı r d a s ə s l ə r. Saday bəy, ortadan çıxmaq istəyən iki əsgəri də tutduq.

S ə s. Mayor Lisaneviç qaçıb özünü erməni kəndinə saldı. Kəndi nə qədər axtardıqsa, tapılmadı. Ağdam, Qarabulaq yollarına da atlılar çapdı.

İ ş ı q s ö n ü r

## İYİRMİ YEDDİNCİ ŞƏKİL

Ağabəyim ağa qara paltarda kənizləri ilə birgə səhnəyə daxil olur. Saday bəy ilə Əbülfət xan da oradadırlar.

A ğ a b ə y i m a ğ a. Bu nə dəhşətdir, ilahi! Azərbaycan torpağında axıdılan bu günahsız qanlar bəs deyilmi? Ey böyük yaradan, sənin dərgahında mənim günahım necə böyükdür ki, mənə bu qədər əzab verirsən? Gör neçə ildir ki, mən bu qara libasdan çıxa bilmirəm? Əvvəl bu dünyadan nakam köçmüş bacım Səltənət bəyim... Sonra da... Yerlər, göylər bu dəhşətə necə dözdü, necə? Elə bil, məni dəmir məngənə arasına qoyub sıxırlar. Qoy böyük Yaradan sizin kimi Azərbaycan igidlərinin qılıncını əlindən salmasın. Bu yalnız bizim faciəmiz deyil. İbrahim xanın rus padşahının sözlərinə inanıb, ona tabe olması bizim gələcək nəsillərimizin də faciəsidir. İbrahim xanın bu səhvi onları da tarixin müşkül tilsiminə saldı. Mənim əziz həmvətənlərim, Azərbaycan türkləri heç bir zaman yadelli padşahın zülmünə tabe olmayacaq. Həmişə vətənin azadlığı uğrunda vuruşacaq.

Dalbadal atılan güllə səsləri altında səhnə qaranlıqlaşır.

P ə r d ə

*1991*

# KİTABDAKILAR

## PYESLƏR

